*Bu kitab "Əli bəy Hüseynzadə. Siyasəti-fürusət" (Bakı, "Elm", 1994), "Əli bəy Hüseynzadə. Qırmızı qaranlıqlar içində yaşıl işıqlar" (Bakı, "Azərnəşr", 1996), "Əli bəy Hüseyzadə. Türklər kimdir və kimlərdən ibarətdir?" (Bakı, "Mütərcim", 1997), "Əli bəy Hüseynzadə. Qərbin iki dastanında türk" (Bakı, "Ağrıdağ", 1998) və digər nəşrlər əsasında təkrar nəşrə hazırlanmışdır*

Transliterasiya və tərtib edəni: **Ofeliya Bayramlı**
Elmi redaktoru və izahların müəllifi: **Azər Turan**

**ISBN 978-9952-34-162-1**

**079.4754-dc22**
Azərbaycan ədəbiyyatı – Publisistika

**Əli bəy Hüseynzadə. Seçilmiş əsərləri.**
Bakı, "Şərq-Qərb", 2007, 480 səh.

Böyük fikir adamı, publisist, filosof, şair, həkim, rəssam... Əli bəy Hüseynzadənin "Seçilmiş əsərləri"nə müxtəlif illərdə yazdığı bədii-publisistik irsindən nümunələr daxil edilmişdir.

XX yüzildə Türk dünyası üçün misilsiz əhəmiyyət kəsb edən türkləşmək, islamlaşmaq, avropalaşmaq təliminin yaradıcısı olmuş bu dahi şəxsiyyətin əsərləri istər elmi-ədəbi, istərsə də milli məfkurə tariximizin öyrənilməsi baxımından əsas qaynaqlardan hesab olunmaqdadır.



Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**"Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında"**
12 yanvar 2004-cü il tarixli sərəncamı
ilə nəşr olunur və ölkə kitabxanalarına
hədiyyə edilir

# ƏLİ BƏYİN İRSİ VƏ VARİSLƏRİ...

Bayrağımızdakı üç rəngin üçünün də rəssamı Əli bəydir. Milli gerbimizdəki boya simvolikası da onun **"türkləşmək, islamlaşmaq, avropalaşmaq"** – düsturunun rəngdə ifadəsindən başqa bir şey deyildir. Şübhəsiz, söhbət yalnız boyadan və kətandan getmir, həm də təməldən, bünövrə daşından, dəmir özüldən gedir: Əli bəy Azərbaycanda yox, bütün türklük miqyasında qövmi özünüdərkin, istiqlal düşüncəsinin təkcə rəssamı deyil, həm də memarıdır... Məhz bu mənada nəinki Məhəmməd Əmin və Nəriman Nərimanov, üstəlik, Ziya Gökalp və Kamal Atatürk də Əli bəy Hüseynzadədən başlayır.

Azərbaycanda milli bir ideologiya səviyyəsində türkçülüyün ilk dəfə hərəkətə gəldiyi qatarın sükanı arxasında hamıdan əvvəl Əli bəyi görürük və bu qatar sonralar bütün Qafqazdan, Orta Asiyadan, Anadoludan keçir. Öz hərəkətində milli-mənəvi mədəniyyətin bütün əsas qatlarını – elmi, sənəti, fəlsəfəni, sosiologiyanı... birləşdirir.

İyirminci yüz ilə ədəbiyyat da Əli bəyin nişan verdiyi körpüdən keçib daxil olur. Üç təmələ – qırmızı, mavi və yaşıl sütuna söykənən körpünün üzərində və bu üç rəngin işığı altında biz bu gün də sabaha, irəliyə, mənzilbaşına yol axtarırıq.

**İttihad – qüvvət – tərəqqi!** – Əli bəyin "Turan" idealında bədii spektr – üç sütun və üç rəng – bu üç mərhələ kimi də bir-birini əvəz edir, izləyir və tamamlayır: "Bir millət üçün hər şeydən əqdəm arzu ediləcək şey qüvvətdir. Zəmanəmizdə millətlərin səlaməti-səadətinə yeganə vasitə budur". Məhz qüvvət üçün tərəqqi, tərəqqi üçün isə ittihad (birlik!) lazımdır. Odur ki, Əli bəy, elə bil bu günümüzü görərək, hələ o vaxtdan elan edirdi: **"Əvvəl tərəqqi!"** Təsadüfi deyil ki, o, məhz "İttihad və tərəqqi" firqəsinin əsasını qoyur. Bu ittihadın və tərəqqinin məramında **"Turan"** sözü yazılmışdı, dünyadakı bütün türklərin iqtisadi, ədəbi, mədəni birliyi sözü yazılmışdı.

"Turan" deyəndə Əli bəy, hər şeydən əvvəl, əlbəttə vahid mənəvi məkanı görür və bütün türklər üçün sabit, monolit, dəyişməz mənəvi Vətəni nəzərdə tuturdu. Bu Vətənin ərazisi – vahid islam idi, vahid türk kültürü, dili və mənəviyyatı idi. Bəlkə də məhz Əli bəyin bu təlimindən sonra Atatürk öz məşhur millət tərifini və düsturunu söyləmişdi: "Türkiyə Cümhuriyyətinin təməli kültürdür" və məhz kültür baxımından "milli mənliyini bilməyən millətlər başqa millətlərin şikarıdır".

Qərb-Şərq konteksti, əlaqə və təsirdə miqyas və nisbət problemi Əli bəydə bütöv bir konsepsiya təşkil edir. "...Biz avropalıların ədəbiyyatlarına, sənayelərinə, ülum və maariflərinə, kəşfiyyat və ixtiraatlarına müraciət etmək istiyoruz, özlərinə deyil. Biz istəyiriz ki, İslam ölkəsinə onların beyinləri, dimağları girsin, boğazları, mədələri girməsin. Biz istəriz ki, ölkəmiz onların beyinlərini həzm etsin, yoxsa mədələrində həzm olunmasın".



Avropaçılığa meyil məsələsində bəzən müasir Türkiyədə və Azərbaycanda özünü göstərən açıq-aşkar aludəlik və ifratçılıq hallarının mənbəyini Əli bəy hələ o zamandan görmüş, türklüyü və islamı ayıq-sayıq olmağa çağırmışdı: "...türklük və islam dairəsində tərəqqi etmək istiyoruz. Biz arzu ediriz ki, bizim tərəqqimizə baxıldıqda "türk və müsəlmanlar nə gözəl tərəqqi ediyorlar" denilsin, yoxsa "türklər, müsəlmanlar irtidad ediyor, firəngləşiyorlar" denilməsin!"

**"Türklər kimdir və kimlərdən ibarətdir?"** – bu sorumun içində elə biz istəyən **suala da cavab vardır:** "Əli bəy kimdir və onun "türk" anlamı nələrdən ibarətdir?"

* * *

Əli bəyin Azərbaycan (və bütünlükdə türk) amalına həsr etdiyi məqalələr çoxdur. Həmin ideya həmin irsdən ən davamlı əsəb siniri, ana damar kimi keçir. Və maraqlıdır ki, bu səadətə doğru yolda o, türk xalqlarını gözləyən sınaq və maneələri də əvvəldən görür və xəbər verir.

Türklük tarixində hadisə adlandırılan "Məktubi məxsus"da türklüyə və türkə, onun adına, dilinə, tarixinə və coğrafiyasına münasibət barədə indi də öz nəzəri və metodoloji əhəmiyyətini qoruyub saxlayan müdrik müşahidələr var. Ümumiyyətlə, Azərbaycanın ilk linqvistik və tarixi-coğrafi xəritəsi C.Məmmədquluzadənin, Türk dünyasınınkı isə Əli bəy Hüseynzadənin əsərlərində cızılmışdır. "Türk kimdir və kimlərdən ibarətdir" – bu ad altında Ə.Hüseynzadənin yalnız bir əsərini yox, bütün əsərlərini toplayıb nəşr etmək olar. "**Türk** var, **moğol** var, fəqəq **tatar** yoxdur. Krımlılar, kazanlılar, orenburqlular və sairə həp türk oğlu, türkdürlər..."

Maraqlıdır ki, Əli bəy "qan tökdükləri üçün" Çingizlərə və Teymurlara, adının əvvəlində "mirzə" sözü, sonunda isə "ov" şəkilçisi olduğu üçün Axundovlara münasibətdə hələ o vaxtdan özünü göstərən ifratlara və əyrilərə dəqiq məntiqi cavablar verir, mədəniyyətə və tarixə münasibətdə millilik problemini sağlam elmi-nəzəri əsaslarda irəli sürməyin nümunəsini göstərir: "Qafqaz türklərinin Molyeri (Moeliere) bulunan müdhikənevisi – şəhir Mirzə Fətəli Axundovun adının başında "Mirzə" var, yaxud axırında "ov" var deyə əcəm, əcəmləşmiş, yaxud ruslaşmış nəzəriylə baxıb tanımamaq, təkrir etməmək, türk olduğunu, türkcə yazdığını türklərə xidmətdə bulunduğunu bilməmək... İştə tayib olunacaq hallar..."

Biz çox uzun bir müddət milli tarixin simalarına və hadisələrinə (Cavad xana və M.Ə.Rəsulzadəyə, Çələbi xana və Hüseynqulu xana, elə Əli bəy

Hüseynzadənin özünə və Ə.Ağaoğluna...) milli məntiqin və mənafeyin yox, qeyri-milli tarixlərin ölçüləri baxımından qiymət vermişik. Türkün tarixinə türk olmayanın nəzərilə baxıb təhlil vermişik. Sən demə bu mərəzin də tarixi qədim imiş və Əli bəy hələ o vaxt yazdığı bu sözləri elə bil bizi nəzərdə tutaraq yazıbmış "...böyük cahangirlərə öz qövm və milləti nəzəriylə deyil, başqa millətlərin nəzərilə baxırlar... Səd İbn Vəqqasın mədəniyyətə xidmətlərini iranilərdən sormayın, ərəblərdən sorun... Bismark fransızların qənimi, almanların iftixarı; Teymurun da türk mədəniyyətinə etdiyi xidmətlərini İrandan və Çindən yox, ...Orta Asiyadan soruşun".

M.F.Axundovdan sonra Azərbaycan (türk) mədəniyyəti tarixində "Qərb-Şərq sintezi"nin böyük nümayəndəsi Əli bəy Hüseynzadə olub. Bu sintezdə türklük "Qərbdən və Şərqdən nə alıb?" sualı ilə yanaşı, "dünyaya nə verib?" sualı da öz əyani ifadəsini tapmışdır. Ədəbi-mədəni sintezin daha ali və kamil Əli bəy nümunəsini biz nəinki ondan əvvəlki Axundov mərhələsinin, hətta... ondan sonrakı "sosialist realizmi" və "Anadolu avropaçılığı" mərhələsinin də ifratlarından təmizlənmiş halda görürük. Əli bəyə görə, əgər bir türk milli, ədəbi, mədəni "mən"ini itirib fransızlaşırsa, bu türk kültürünün yox, fransız mədəniyyətinin tərəqqisi deməkdir. Biz "Avropa sivilizasiyası" deyilən qazanda və mədədə qaynamaq və həzm olunmaq üçün yox, onlardan da bəhrələnib, milli baxımdan gerçəkləşmək, özümüzü təsdiq etmək üçün Qərbə açıq oluruq. Bu baxımdan Əli bəyin rus ədəbiyyatına və onun ayrı-ayrı nümayəndələrinə ikili, dialektik münasibəti çox ibrətli və səciyyəvidir.

O, bir tərəfdən, ən adi milli-insani haqq və hüquqların təminatı, demokratiya və sosial tərəqqi baxımından "Avropa jandarmı"nın çağdaş sivilizasiyadan nə qədər uzaq olduğunu görüb belə yazırdı: Rusiyanın bu günlərdəki halı hürriyyət səadəti degildir, bəlkə bir anarxiyadır" ("Həyat", 30 noyabr 1905). Digər tərəfdən isə deyirdi ki, "...əsri-hazır bəşəriyyətin bir üzvü-mühümmi olan rus millətinin dövri-kamalıdır". Bunu deyərkən Əli bəy, şübhəsiz, birinci növbədə XIX-XX əsrlərin mütərəqqi rus ədəbiyyatını (Tolstoy, Dostoyevski, Çexov, Bunin...) nəzərdə tuturdu və onu da əlavə edirdi ki, ona məhz bu baxımdan hətta "Avropa və Amerika qibtə edə bilər". "Peyğəmbər olmayan", fəqət "sahibi-kitab" olan Tolstoyu o, daha tez-tez xatırlayır və ona ayrıca məqalə həsr edirdi. Əgər çar naziri Puruşkeviçi biz Əli bəyin əsərlərində Şeyx Fəzlullah, Seyidəli Yəzdi, Mir Haşım kimi ən qatı Şərq (İran) irticaçılarının əhatəsində görürüksə, Tolstoyu Əli bəy həmişə Firdovsi ilə, Sənai ilə, Sədi ilə bir kontekstdə təhlil və təqdim edir. Özü də maraqlıdır ki, nəhəng Tolstoyu biz həmin kontekstdə həm həssaslıq və ehtiramın, həm də obyektiv tənqidi münasibətin hədəfi şəklində görürük: "Tolstoy bəlkə dərin bir mütəfəkkir deyildir. Lakin hər halda vase bir bəhri-bədayedir".

"Ömrü boyu yol gedən və keçdiyi bütün yol boyu da heç vaxt mənzilbaşına çatmayan səyyah! Əbədi yarı yolda qalan, zamanın, ömrün karvan yolunda



əbədi köçəri didərgin olan, sarvan və müsafir... Sənət fəlsəfə adlı ən möhtəşəm qalaya, qəsrə daxil olan, fəqət qapının və yaxud qapıya açarın harda olduğunu bilməyən ixtiyar ədib! – rəssam Əli bəyin fırça ilə kətanda yox, qələmlə vərəqdə çəkdiyi Tolstoy obrazı və portreti belədir...

Əli bəy Hüseynzadənin şah əsəri "Siyasəti-fürusət"dirsə, tarixə irs qoyub getdiyi ən böyük kitabının adı "Füyuzat"dır.

"Füyuzat" sözünün əsil mənası səadət və ələlxüsus səadəti-mənəviyyədir, həqiqi zövq və səfalərdən ibarət bir səadəti-mənəviyyədir, həyat isə mənayibatinisilə daimi bir meyli-səadət, bir meyli-füyuzatdır..." Müəllif xüsusi qeyd edir ki, mən "həyat – səadətdir" demirəm, "həyat – meyli-səadətdir" deyirəm. Bununla o, idealdan ən uzaq gerçəklikdə də idealla yaşamağın labüdlüyünə işarə etmək istəyir.

Bəs idealla nisbətdə onun yaşadığı ictimai gerçəkliyin real iqtisadi və siyasi məkandakı İslamın həqiqi vəziyyəti necədir? Əli bəy bu suala da cavab verir. Onun "Məcnun və Leylayi-İslam" ("Füyuzat", 1907, №17, 18, 20) adlı bədii-fəlsəfi düşüncələr silsiləsində həkim müayinə etdiyi xəstəyə – islama belə diaqnoz qoyur: "...beyniniz, dimağımız müzmin və mənid bir sədai-istibdad və əsarətə mübtəladır". Bəs "nicat nədədir?" **"Nicat – məhəbbətdədir!"** İdeala və gözəlliyə əbədi meyildədir!.. Bu, Əli bəyin qəti qənaətidir, həm təbiətdə, həm də cəmiyyətdə zorakı qəsdi inkar edən müasir humanitar təlimlərlə də onu birləşdirir. Həyatı idealsız absurd, mənəvi, əxlaqi dəyər və sərvətdən məhrum xaos, yerüstü iblis səltənəti sayan bəzi qaranlıq, işıqsız modern Qərb fəlsəfələrindən Əli bəyi aparıb Şərqlə, klassik Şərq ontoloji dəyərləri ilə birləşdirən körpü də bu nöqtədə idi!..

Hələ böyük Füzulidən və Mövlanədən sonra Dostoyevski elan etmişdi ki, dünyanı gözəllik xilas edəcək. Cavid bu hökmü olduğu kimi qəbul edir, Əli bəy isə elan eləyir ki, "Nicat məhəbbətdədir..." ("Füyuzat", 1906, №6). Əli bəy bu sözləri o zaman söyləyir ki, "qırmızı qaranlıqlar", "terror alovları" hər tərəfi bürüyüb, hər gün, hər yerdə "bombalar vəhşiyanə rəqs edir", "kəlisa önündə insanlar bir-birlərini öldürür, məktəb içində insanlar bir-birini vurur". Məhz görünməmiş zor, irtica şair-filosofun simasında şərri-İblisi yox, xeyir və məhəbbət mələyini dilə gətirir. O, nicat sorağında tarixi ələk-vələk edir, böyük peyğəmbər və filosofların irsində zamanın böyük sualına cavab axtarır:

"İsa və Məhəmmədin arzu və tələb etdikləri bu məhəbbəti nə ilə və nə vasitə ilə təmin etmək olur?.. O vasitəni bəşəriyyət kəşf edə bilmişmidir? Şübhəsiz, etmişdir. O nədir?.. Hürriyyət və ədaləti-kamilə!..

Ədl olursa, hürriyyət də olur. Hürriyyət olursa, məhəbbət və müvəddət olur. Həzrət İsanın da, həzrət Məhəmmədin də şər və qanunları bu həqiqətə müncərdir".

Təbiət və tarix Əli bəyin nə qədər haqlı olduğunu sübut etdi. Terror doğuran "texnogen sivilizasiya" özünü tamamilə tükətdi. Əsrin sonu məhz o həqi-

qətə təsdiq və yekun oldu ki, həm təbiətə, həm də cəmiyyətə zorakı qəsd özünü heç vaxt doğrultmur. Təbiət də, cəmiyyət də belə qəsd üçün insandan intiqam alır. Yüzdən çox inqilab və əksinqilab, iki dünya müharibəsi, total rejimlər, ölüm peçləri və konslagerlər – bütün bunlar Əli bəyin hələ yeni başlayan əsrin qanla qızaran dan yerində gördüyü və əvvəldən xəbər verdiyi "qırmızı qaranlıqlar"dan doğdu. Əql, məhəbbət, şəfqət, hamısı batan, yox olan "yaşıl işıqlarda" və yaşılı əvəz edən al qaranlıqda – "qırmızı eşafotda" sönüb, əriyib itdi. Planeti bürüyən kütləvi ölüm və zor epidemiyası Şərqin (Əli bəyin, Qandinin, Tolstoyun...) **"Məhəbbət və nicat"** fəlsəfəsindən yox, ...Avropanın (Hegel, Marks, Nitsşe...) vulqar və nihilist "elmindən" – "təzad və mübarizə", "sinif və tərəqqi" təlimindən doğdu.

Ədib – inqilabı "qırmızı qaranlıq", maarif, zəka, ağıl çırağından yayılan nuru isə "yaşıl işıqlar" adlandırır ("Qırmızı qaranlıqlar içində yaşıl işıqlar", "Füyuzat", 1906, №5). "İnqilab ilə irtica görüşür, mübarizə edir, bu mübarizə nəticəsində ortalıq al-qanlara boyanır. O qanlardan süud edən buxarati-kəsif bir səhabə halını alıb bütün ətrafı zülmətə qərq edir. İştə qırmızı qaranlıq!"

Bütün Turanı Əli bəy məhz yaşıl perspektivdə (maarif qəndilinin nurunda!) görmək istəyir. Bunun üçün coğrafi, yaxud siyasi bir anlam kimi heç bir "pantürkizm", "panislamizm" uydurmaq lazım deyil, məhz mədəniyyət, elm və sənət mənasında vahid bədii, estetik, mənəvi məkana nail olmaq lazımdır: "İslam, türk hər tərəfdə tərəqqi etsə, qüvvət bulsa, məmaliki-Osmaniyyə də o aləmin içində bir daha degil, bir behişt-öndər-behişt olur. Binaənəleyh məsələ, ittihad, yaxud tövhid məsələsi degil, məsələ yekdigərimizi tanımaq, sevmək, təriqi-təməddünə yekdigərimizə müavinət etmək məsələsidir".

Nəhayət, Əli bəyi oxuyanda və eyni vaxtda müasirliyin tarixi kitabını vərəqləyəndə Azərbaycanda təkrar olan eyni tarixlərin bir qanunauyğunluğuna da heyrət edirsən: sən demə, tarix təcrübə dərslərini həmişə Şərqdə keçir, böyük eksperiment üçün sosial və siyasi poliqon axtararkən bir qayda olaraq Azərbaycanın üstündə durur... Bəlkə ona görə ki, qlobal geopolitik mənafelər həmişə burada qovuşur və kəsişir? Hər halda belə təcrübələr üçün "xammal"a, qurbana və çıxdaşa hamıdan əvvəl, həmişə bizim xalq çevrilir.

Görün hələ o vaxt taleyin və qəzanın Qafqaz müsibətinə Əli bəy necə təsvir verir: "Bu gün bütün cahanı sarsıtmaqda olan və yekdigərilə təsadüm edərək, ortalığı hərc-mərc eyləyən üç mühüm cərəyanın, yəni imperializm, nasionalizm və sosializm cərəyanlarının ən fəci saheyi-fəaliyyəti Kavkaziya və bilxassə Azərbaycan oldu. Orası bir cəhənnəmə döndü. Oradakı türk qardaşlarımız bütün bu müxtəlif yaxıcı, yıxıcı, əzici cərəyanların altında sərsəmlədi, nə yapacağını şaşırdı, mühakiməsini qeyb etdi. Osmanlı türkü imdadına yetişməsə idi, məhv olub gedəcəkdi. Fəqət onun məhv olması ilə Anadolu da təhlükəyə düşəcəkdi. Azərbaycanı qurtaran Anadolu kəndi-kəndini də qurtarıyor, buna şübhə etməyiniz. Derlər ki, dağ dağa qovuşmaz, insan insana qovuşur. Xeyr, tarixin elə anları vardır ki, dağ dağa qovuşur, bugün Erciyəz dağı Qaf dağına qovuşuyor və qovuşduqca yüksəliyor".

"Türkçülüyün babası" rolunda Əli bəyin ən böyük xidməti, bu istiqamətdə yazdığı ən qiymətli yazı isə Hüseynzadə yaradıcılığının Bakı dövrünün şah əsəri ("Şahnaməsi") – "Siyasəti-fürusət"dir.

* * *

..."Siyasəti-fürusət" – "At minmək siyasəti" – bu ad, nə üçünsə, "Kutadqu bilik" ("Xoşbəxtlik və siyasət biliyi") kitabının adını mənim yadıma salır: hələ XI əsrdən Şərqdə ədəbiyyat "Xoşbəxtlik və siyasət" biliyini xalqa öyrətməyə başlamışdır və "Siyasəti-fürusət" bu tarixdə son böyük səhifələrdən birini təşkil edir.

Hər iki kitab başqa bir baxımdan da səsləşir: "Kutadqu bilik" türk xalqlarının tarixində hələ "atlı (köçəri) həyat" tərzi dövrünün abidəsi idi. "Siyasəti-fürusət"də də məcazi – şərti mövzu və əsas metafora – "at" və "atlı" obrazıdır. Dünyada son böyük köçəri xalq türklərdir və onların çoxəsrlik "atlı" (azad, sərbəst, qanadlı) həyat tərzinə və ənənəsinə qarşı çevrilmiş ən müasir, çağdaş "quyruq və at siyasəti"nə Əli bəy biganə qala bilməzdi.

Kitabı tarixi, milli ənənəyə bilavasitə bağlayan bir cəhəti də vurğulamaq istəyirəm. Burada hadisələrin axarı miqyaslı, çeşidli tarixi və coğrafi məkanları əhatə edir, lakin onların hamısı Cənubi Azərbaycanda kəsişir və qovuşur. O zaman Cənubda baş verən hadisələr xalis milli hərəkat və milli inqilab idi, xalis "Şərq hadisələri" idi. Burada "marksizmin üç mənbəyi, üç tərkib hissəsi" hələ yox idi və Əli bəy Hüseynzadə "rus şapkalı", "çinovnik epoletli", müsəlman təxəllüslü vulqar bolşevikə yox, Səttar xana inanırdı.

O da mənalı və ibrətamizdir ki, ədib Qafqazda tarixən qonşu xalqlar arasında münasibətlərdən danışarkən qədim fars mədəniyyətini İranın şahpərəst, şovinist hakim ideologiyasından, rus demokratik ədəbi-ictimai fikrini isə hərbi-bürokratik rus çar üsul-idarəsindən və müstəmləkəçi rus-çar şüurundan fərqləndirirdi.

Nəhayət, milli ənənəyə bağlılıq özünü xalis sənət və sənətkarlıq sahəsində, "Siyasəti-fürusət"lə ondan əvvəlki böyük bədii-publisist təcrübə arasında olan varis-irs əlaqələrində göstərirdi. Kəmalüddövlənin, İbrahim bəyin məşhur səyahətnamələrindən sonra "Siyasəti-fürusət" əsrin əvvəlinin növbəti böyük bədii-fəlsəfi traktatı və növbəti böyük "Ölülər"i idi.

Əlbəttə, əsər, ənənəni yada salır: "Maaday Kara" dastanında Maadayın ölülər dünyasına səyahətini, Dantenin "cəhənnəm"ini, Qoqolun "Ölü canlar"ını, qədim Misrin "ölülər kitabı"nı"... Dünyanın özü kimi qədim tarixini. Lakin povest, birinci növbədə, ənənəyə sadiqliyi ilə yox... novatorluğu ilə diqqəti cəlb edir.

Ənənəvi süjetqurma prinsiplərini saxlasa da, Əli bəyin əsəri modernist nəsrin ilk maraqlı nümunələrindən biri kimi təsir buraxır. Bir neçə süjet xəttinin kontrapunkt axarı əsərin məhz modernist arxitektonikasını yaradır. Simvolların polifoniya sistemi assosiativ planı gücləndirir. Ümumiyyətlə, modernist simvolika əsərdəki alogizm (şərtliyi) hazırlayır və şərtləndirir.

Qərb mifik ənənəsində "at quyruğunu kəsmək" – o dünyaya düşmək deməkdir. Qədim hindlilər o dünyaya köç edən ölüləri at belində təsəvvür edirdilər. Obraza və ideyaya belə miqyaslı nəzər XX əsrin türk müəllifi üçün zəruri idi.

Tendensiya, fəlsəfi mövqe burada dildə də özünü göstərir, pafosda ifadəsini tapır. Ümumiyyətlə, diqqətlə nəzər yetirsək görərik ki, Ə.Hüseynzadə yalnız obrazlara yox, həm də üslubla "düşünür". İdeya təzadları, fəlsəfi kontrastlar bu üslubu "kəskinləşdirir".

Əli bəyin təsvir etdiyi "axirət"də on doqquz (!) əsrin ölüləri və ...əməlləri iştirak edirdi. Miqyas birinci növbədə tarixə salınan nəzərin ölçülərində dəyişirdi: Əli bəyi hər şeyin zatı, əsli, hətta ölülərin də soy şəcərəsi, soy adı, soy kökü maraqlandırırdı!.. Və bütün bunlar böyük mütəfəkkirə müasirliyi, gələcəyi, bu günü görmək üçün lazım olurdu. Təsadüfi deyil ki, əsrin əvvəlində yazılan bu əsər indi əsrin sonunda da öz böyük ədəbi-bədii və siyasi-tarixi əhəmiyyətini qoruyub-saxlayır.

Əli bəyin Şərqə, tarixə, keçmişə saldığı nəzərin bu əsərdə içinə aldığı əhatə və miqyas digər bir baxımdan da dəyişirdi: "Ölülər"də (C.Məmmədquluzadə) hələ avropalı və rus "mərhum" yox idi, burada isə Puruşkeviç – baş kabus, "zülmət səltənətində hakim İblis" rolunda çıxış edirdi. Yerli, "milli", müsəlman kölgələr və ruhlar bu "əcnəbi kabusdan" nicat və imdad dərsi alırdılar: "Qurbanınız olaq, bizə də at oynatmaq siyasətindən nicat veriniz və "fürusət" sözündən xəbərdar ediniz".

Söhbət Azərbaycana və onun taleyi məqamına gəlib çatanda, hətta "Şirixurşid" də (şahlığın və istibdadın rəmzi!) Puruşkeviçin simasında bayquşla tərəfi-müqabil, həmtay və həmkar olmağa razılıq verir!..

Əsər boyu Əli bəy də elə tarixən çarlıq və şahlıq rejimi arasında Azərbaycana qarşı çevrilmiş bu razılığın tarixini qələmə alır. Və qərara gəlir ki, hər iki dünyada İslam aləminin başı üstündən "domokl qılıncı" yox... "at quyruğu" (kazak atının quyruğu) sallanıb. Quyruqlu ulduzlardan və quyruqlu atlardan gələn bəla daha qorxuludur. Ayıq olun: başınızın üstündəki səlib xaçı poladdan, yaxud palıddan düzəlməyib, əyilən və qıvrılan quyruqdan düzəlib. Xatırlayın ki, ta qədimdən türk qövmi həmişə qılıncla açıq döyüşdə yox, quyruqla şübhəli cəngi-cidalda məğlub olub!..

Bir var Zevsdən, Yupiterdən, Marsdan gələn qəza, bir də var şeytandan, İblisdən, bayquşdan yayılan bəla. Bir var başla hədə və hücum edəsən, bir də var... quyruqla. İkinci ilə mübarizə qat-qat çətindir.



Tarix əməldə, işdə göstərdi ki, Əli bəy nə qədər haqlı imiş: imperiyalar hələ də öz "quyruğunu" Qafqazdan çəkmir ki, çəkmir və bu gün onun quyruğu rolunda birbaşa və açıq şəkildə vulqar erməni şovinizmi çıxış edir.

Beləliklə, Əli bəy XX əsrin bədii-fəlsəfi və publisist fikrində məlum "dəlilər", "artıqlar", "xırdalar" və "ölülər" təsnifini "quyruqlar" çeşidi ilə də zənginləşdirir və tipologiya daha böyük kamillik, tamlıq və bütövlük ("alt qat" da görünməyə başlayır) kəsb edir. "Quyruqlarsız" – Dövrün obrazı onun həm "Füyuzat"dan, həm də "Molla Nəsrəddin"dən görünən mənzərəsi natamam olardı.

Ta on yeddinci ilə qədər Puruşkeviçin atının quyruğu hələ rus bolşevizminin də başının üstündə idi. Amma o vaxt ki, bolşevizm özü bu atın üstünə qalxır, Şərqə və türkə qarşı eyni "quyruq siyasəti" yenə davam edir. Bir fərqlə ki, at "siyasəti" artıq "Duma"da yox, "Ali Sovet"də , "Plenum"da, "Politbüro"da davam edir. At dəyişir, quyruq dəyişir, yaxud atlı dəyişir, at özü dəyişmir.

Və Əli bəy də həyəcan təbili çalır, haray qaldırır ki, "Atı quyruğu ilə birlikdə" dəyişmək lazımdır.

Povestdə at, araba, kocavə, gəmi obrazları var. Lakin müəllifin diqqət hədəfinə çəkdiyi – "Qafqaz müsəlmanlarıdır", "çəkə-çəkə gətirdikləri türk atının iki cinahında (!) onların səf bağlamaları"dır. "Müsəlmanların son zamanlar öyrətmək istədikləri və intixab üsulu ilə aradıqları... qaşına hilal, köksünə Şiri-Xurşid əlaməti taxılan bir türk atını əyirləmələri"dir. "Hilalın", "Şiri-xurşid"in, "türk atı"nın və qafqazlıların (bir kontekstdə xatırlanan bu əlamətlər sisteminin!) vurğulanması heç də təsadüfi deyildi, bəlkə "vəhdət" rəmzinin tərkib hissələrinin xatırlanması demək idi. Hələ lap bu yaxınlara qədər biz nəinki bütöv Azərbaycanı, adətən, hətta Şimali Azərbaycanın özünü də iki əks "milli (sinfi!) qütbə" bölüb ayrılıqda təhlil eləyirdik. "Siyasəti-fürusət" müəllifi isə onları cəm halda alır! XX əsrin milli vəhdət idealını Şəhriyardan əvvəl Əli bəy ifadə və təsdiq edir...

Romantik maksimalizmə Əli bəy tarix və tale probleminin təkcə qoyuluşunda yox, həlli üsulunda da yol verir və nail olur: "Vətənin şu Feniks kimi bir kərrə yanıb kül olması, illər uzunu aləmi bizar edərək bari-istibdad altında əzilib inləməkdən min qat övladır".

"İstibdad" adlanan Şərq gerçəkliyinin tənqidində Əli bəyin Sabirdən və Mirzə Cəlildən fərqi nə idi? Axundovdan və Talıbovdan o, nədə irəli gedirdi?

Hər şeydən əvvəl, problemə fəlsəfi-nəzəri baxışın vüsət və dərinliyində! Miqyas özünüdərkin ölçüsündə də dəyişirdi, islam birliyi, türk bütövlüyü miqyasında məsuliyyət və cavabdehlik şüuru, tarixi-milli mentalitet hərtərəfli dərk olunmuş elmi, nəzəri, fəlsəfi hüdudlara qalxırdı, bugünkü milli tale və tarixi müsibətlər üçün babaların günahı, əcdadların səhvi və eyni bir ittihamın təhlil və cəza hədəfinə çevrilir, islamı dünya miqyasında bazara, hərraca çıxaran Nəsrullahlar, Xəzəri şor su kimi rusa satan Fətəli şahlar məhşər ayağına

çəkilirdi, heç kəs kənarda qalmırdı: ən qədim, əsatiri Pişdadyan sülaləsindən, onun ilk hökmdarı Kəyumərsdən XX əsrə, Qacar sülaləsinə qədər...

Şərqdə sosial böhranlar və müsibətlər silsiləsinin rus-çar ünvanları və onun qaynaqları da bu ittihamdan kənarda qalmır. Məlumdur ki, At şıllaq atır, quyruq bulayır, soncuqlayır. ...Ədib quyruğu atdan ayırır və onu olduğu yerdə, daha doğrusu, olmalı olduğu yerdə yox, ...III Dumada (!) təsvir edir. Quyruğun bədəndəki və Dumadakı "yerləri" arasında estetik baxımdan da, sən demə, elə fərq yox imiş. Hər iki mənada və ünvanda quyruq çubuq və qırmanc olub, şapalaq olub Qafqaza dəyir. Doğrudur, bu çox qorxuludur: axı qafqazlılar "at yeyirlər!" Amma nəyi yeyirlər: atın zərbəsini, ya özünü?!

Əli bəy bu əsərdə ayrı heç yerdə olmadığı qədər yazıçı-ideoloq kimi çıxış edir və bu gün də Qafqazda "quyruq üstə" tamam olan əsrin əsas bəlasını hələ o vaxtdan göstərərək gur səslə elan edir ki, "İnqilabı qırmaq, kəsmək, şikəst edib, topal qoymaq üçün quyruqların hücumu" mütləq olacaq və ona hazır olmaq lazımdır.

O da maraqlıdır ki, əvvəlki səyahətnamələrdən fərqli olaraq, burada səyahət, əsasən, coğrafi məkanda yox, ...tarixi ərazidə davam edir. Tarixin dolaylarında, azadlığa aparan hər yoxuşda Puruşkeviç Azərbaycanla, Şərqlə, İranla qarşılaşır. Hər dəfə də coğrafi ünvanın (kəndin, şəhərin) yox, tarixi şəxsiyyətin simasında.

Kefli İskəndər, Kəmalüddövlə, İbrahim bəy... rolunda isə burada müəllif özü iştirak edir. Puruşkeviçlə, Şeyx Fəzlullahla, Seyid Yəzdi, Mir Haşım və Kəyumərslə... dialoqda (alt qatda) həmişə hiss olunur.

Əli bəy özü isə tarixə və keçmişə səyahətdən gördüklərini və götürdüklərini bütün dünyaya və bütün zamanlara göstərir. Mənəvi-əxlaqi təcrübəmizin dərsləri kimi bu görüntülər bu gün üçün də mənalıdır və ibrətlidir. Hamısı birlikdə ən modern, mükəmməl, klassik bir filmin bədii-fəlsəfi lentinə çəkilmək üçün hazır süjetə bənzəyir. Belə bir lenti – Şərqin eyni vaxtda həm romantik, həm də satirik "Şahnamə"sini, güman edirəm ki, gec-tez böyük ekranda biz mütləq görəcəyik...

"Siyasəti-fürusət" – özünə qədərki böyük sosial və tarixi "səyahətnamə"-lərin sənətkarlıq təcrübəsini və ədəbi məziyyətlərini də özündə birləşdirir. O, tək klassik siyasi parodiya, fəlsəfi kinayə və həcv, publisist pamflet deyildir, həm də obrazlı təxəyyül, sənədli bədii düşüncə məhsulu olan nəsr əsəridir, fəlsəfi, publisist povest – traktatdır. Bu povesti Turanın və İranın, Yaxın və Uzaq islam Şərqinin bütün nəsilləri bir dərslik kitabı, etiraf, tövbə və yaddaş qamusu, qeyri-rəsmi ana yasa kimi oxumalıdırlar. Müasir milli-mənəvi tərəqqiyə, yaxın humanitar gələcəyə Şərqdə yol bu povestin səhifələrindən və sətirlərindən keçir...

Tarixi, Qarabağı itirməmişdən əvvəl tarixi yaddaşı (!) itirmişik. Əcnəbi drakonlar və daxili manqurtlar, islam və türklük düşmənləri Şərqdə, o cümlədən Azərbaycanda yaddaşın məhvi ilə müntəzəm, ardıcıl, planlı şəkildə məşğul olmuşlar. Türkün qalxanı tarix boyu yalnız bir şeyə – yaddaşa enən qılınca qarşı bu qədər zəif və biganə olmuşdur.



Əlbəttə, bizim xalqda "məhkumluq maniyası" yoxdur. İstər obyektiv-geopolitik, istərsə də tarixi-coğrafi mövqe baxımından o, həmişə etibarlı, sabit, açıq milli, dini və mənəvi məkanda yaşamışdır. Onun nə kənardan gözlənilən daimi qəsd xofu və maniyası ilə yoluxması üçün, nə də qövmi, milli "özünə qəsd" və intihar şizofreniyasına tutulması üçün heç bir obyektiv və ya subyektiv əsas olmayıb. Elə ona görə də millətin taleyini işığa, ağıla, ziyalıya yox... qəzəbə, nifrətə, məzhəb və irq instinktinə istinad edərək ayağa qalxan qüvvətə o, heç zaman tapşırmayıb.

Bütün klassik mənəvi-bədii irsimiz bu həqiqətin ədəbi sənədləridir. Xalqın psixologiyası ən çox məhz onun sözündə, sənətində əksini tapır. Əli bəy fenomeni də bir daha təsdiq edir ki, bədii sözün timsalında xalq əvvəlcə içindəki drakona qarşı çıxır və özünə qalib gələndən sonra daha ətrafda da düşmən axtarmır. Ətrafdan qorxan və həmişə ətrafla vuruşan xəstə milli şüurda və psixologiyada isə gizli, daxili drakon əbədi yaşayır və həmin xalqı, milləti içindən didməkdə davam edir.

Bu baxımdan artıq qamuslara düşmüş məşhur "erməni fenomeni" və "məsələsi" Əli bəy Hüseynzadəni ömrü boyu düşündürüb, narahat edib. Və öz yazılarında o, bu milli-xroniki-tarixi anomaliyaya klassik təhlillər verib. Görünə bilərdi ki, belə təhlillərdən sonra həmin fenomenə və bəlaya Əli bəyin xalqı daha həmişəlik hazır olacaq. Lakin belə olmadı. Özünə və Əli bəyə qarşı çevrilmiş inkarçı canfəşanlıqda bəzən hətta ən qatı erməni şovinistini belə arxada qoyan yerli, milli "ziyalının" vətəni və mənəviyyatı eyni bəlaya yenidən tutuldu, tarixdə bəlkə də hələ görünməmiş növbəti erməni qəsdinin və təcavüzünün qurbanı oldu. Son yetmiş ildə Azərbaycan ədəbiyyatşünaslığında və siyasi-ictimai fikrində Əli bəy Hüseynzadəyə və "Füyuzat" ədəbi məktəbinə qarşı yağdırılmış iftira və böhtan fəvvarəsi ilə müqayisədə hətta üzdəniraq "erməni mənbələri" və "əlyazmaları" da "toya getməli" görünür. Görünür bu da öz növbəsində davamlı sindroma və mənfi işarəli immunitetə çevrilən "müsəlman" və "türk fenomeni"dir və tarix boyu "erməni amili" belə "türk fenomeni"ndən planlı və məharətli şəkildə istifadə etmiş, yalnız onunla eyni məkanda mövcud ola və fəaliyyət göstərə bilmişdir.

Əli bəy Hüseynzadənin siyasi-fəlsəfi publisistikasında erməni-türk qarşılıqlı münasibətlərində erməni şovinizminin rəhbər tutduğu və israrla, inadla həyata keçirdiyi konkret-tarixi və milli-siyasi proqramın qlobal motivləri və strateji havadarları, ideya kökləri, dini, irqi, sosial və qövmi əsasları, həm fiziki, həm də mənəvi terroru açıq, fəal cəbbəxana elan edən ikiüzlü, saxta məkrli üsul və vasitələri öz yüksək ixtisaslı, predmetli, təfsilatlı elmi şərhini və təhlilini tapır. Əsrin əvvəlinin "erməni hadisələri"ni dərindən incələyən bu təhlil-

lər əsrin sonunun "erməni işğalları"nı da anlamaq və açıqlamaq üçün ən yaxşı açardır. Tək bir fərq var, o da odur ki, 1905-1918-ci illərdə türk əleyhinə çevrilən milli qırğın və genosid aktlarının təhlilində Əli bəyin irsi yarandı. 1937, 1948-1952, 1988-1995-ci il hadisələrinə qarşı isə siyasi-ideoloji reaksiya kimi bu sanbalda və siqlətdə elmi-fəlsəfi irs yaranmadı. Odur ki, Qafqazda və Azərbaycanda real gerçəklikdə və ideologiyada erməni genosidinin mahiyyətinə və ənənəsinə qarşı çevrilmiş Əli bəy irsini öyrənmək Vətənimizdə gedən müasir müharibənin də psixologiyasını, ideya qaynaqlarını və tarixi köklərini öyrənmək deməkdir. Bu irsdən – həm siyasətdə, məkrdə və riyakarlıqda düşmənin gücü, həm də ona qarşı müqavimətdə bizim milli-siyasi ənənənin gücsüzlüyü (eyni vaxtda!) görünür. Əli bəy bizi heç olmasa bu dəfə tarixdən dərs almağa, keçmişdən ibrət götürməyə çağırır...

Tarixi paralellər, hər şeydən əvvəl, əsrin əvvəlinin və sonunun Azərbaycan və erməni mətbuatındakı tipoloji uyğunluqda və bu uyğunluğun xristian-rus kontekstlərində özünü göstərir və heyrətə gətirir:

"...Erməni üdəbasından bəzisi ittihadi-islam qorxusu saiqəsilə rast gələn qəzetələrə kizb və böhtandan ibarət məqalələr yazdıqları bir zamanda biz:

"Dövri-islahatdır, sülhü səlah əyyamıdır,
Arkadaşlar, sülh edin, sülh etmənin həngamıdır" –

beytini mənzuməmizə nəqərat ittixaz edib... vətəndaşlarımıza xitabən təkrarlamaqda idik... Qəzetəmizin ilk nüsxəsində nəşr edilən bu növ xeyirxahanə sözlər təsirsiz qalmadı. Buna dəlil, təbi-şairanələri müsəlləm olan sair din qardaşlarımızın qəlbləri bizimlə həmahəng zərbət olub (döyünüb), yenə sülh və vifaqə dair şövqavər mənzumələr vücudə gətirmələridir. Üç-dörd gün müqəddəm qəzetəmizin sütunlarında deyilmi idi ki, növrəsidəkan şüəramızdan Əli Əkbər Sabir, bu büğz və ədavətin və bu nifaqın və bunlardan iləri gələn qətl və qitalın bir cəhl və qəflət, bir zəlalət nəticəsi olduğunu xəlqə bildirmək üçün fəryad edib duruyordu. Erməni qəzetələri və qəzetə mühərrirləri buna diqqət etdilərmi? Erməni süxəndanları Əli Əkbər Sabirin mənzuməsində nəqərat olub təkrar edən: "Ey süxəndanan, bu günlər bir hidayət vəqtidir; Ülfəti-ünsiyyətə dair xitabən vəqtidir!" – beyti-mənidarından ibrət alıb o yolda qələm oynatdılarmı? Bir şeir və ya bir məqalə yazdılarmı? Yazdılarsa, bildirsinlər. Biz onları tərcümə edib, sülh və vifaq meylinin ikitərəfli olduğunu camaətimizə böyük bir məmnuniyyət və məsərrətlə bildirməyə hazırız... Yoxsa bugünədək erməni lisanında çıxan və yaxud erməni mürəvvici-əfkarını bulunan qəzetələrə dörd gözlə diqqət etdiyimiz halda, sədrə şəfa verəcək bir sözə rast gəlmədik".

Maraqlıdır ki, hətta mənəvi ittiham, "ölüm-dirim" məqamında bizim milli mətbuat Əli bəyin simasında ənənəvi-milli ziyalılığını itirmir: "Şübhəsiz, ermənilər də hər millət kibi bir millətdirlər, onların da özlərinə məxsus qüsurları olduğu kibi, məzayaları da vardır. İçlərində hər millətdə olduğu kibi fəna adamlar varsa da, yaxşıları daha çoxdur, biz erməni millətini heyəti-məcmuəsilə bəzi narəva işlərdən naşı əsla ittiham edəməyiz, onların dəxi ümumiyyət etibarilə nifaq və şiqaq əleyhinə olub, sülh və vifaqə şiddətlə meyal bulunduqlarına əminiz! Ancaq ermənilərin əhli-maarifi, mühərrirləri, ədibləri öhdələrinə tərtib edən vəzifeyi, iki millət arasında təlifi-beyn etmək xüsusundakı müqəddəs vəzifeyi əsla ifa edəmmədilər, bu xüsusda hətta bəzilərinə bir həmaqət belə ariz oldu..."

Saxtakarlıq və yalan, qurbanı və cəlladı ayırd etməkdə dünyanı çaş-baş salmaq, türklük və azərilik əleyhinə riya, iftira və böhtan kompaniyasının az qala bütünlükdə xristianlıq və planet toru və miqyası (həqiqətin səsini isə blokadaya alınması), mətbuatda və işdə, əməldə terrorun bir-birinin necə hazırlaması və əvəz etməsi... – sən demə bütün bunlar hələ o vaxtdan məlum model və taktika imiş: "Bunlar cahilanə bir nifaq hər iki tərəfi müsavat üzrə zərərdidə edib eyni müsibət və fəlakətlərə düçar etdiyi halda, hər iki tərəfdən ölənlərin ədədi təxminən bir olduğu, halda, təəssüb, cəhalət, vəhşət, hər iki tərəfdən eyni dərəceyi-şiddətlə izhar edildiyi halda, erməniləri haqlı, insaniyyətli, bigünah və əlhasil məsum bir quzu kibi göstərməyə, bizi isə bütün bunun əksiövsaf ilə tövsif etməyə qeyrət ediyorlar, qəzetələrlə, teleqraflarla, ajanslarla Avropanın bir ucundan o biri ucuna, bəlkə ta Amerikadan Avstraliyaya qədər o yolda fəryadlar ediyorlar; daha doğrusu, bizim kibi aciz qalmayıb elə biliyorlar idi. **Pişik öz pisliyini topraqa sitr etdiyi kibi, bunlar da öz qüsurlarını, öz qəbahətlərini, öz vəhşətlərini söz tufanı içində gizlədib, bizim isə ən kiçik qəbahətimizi birəni dəvə edərcəsinə mübaliğələndiyorlar idi.** Bu qədərlə də iktifa etməyib adətən qəsdi iftiralarda bulundular" (ayırma bizimdir – *Y.Q.*).

Bu iftiralardan ən qlobalı hansıdır? Sən demə onun da artıq yüz yaşı varmış: bütün xristianlıq, sivilizasiya (!) üçün qorxu, fəlakət – islam, yeganə xilas, nicat, ümid yeri isə ermənilər imiş: "Guya ümummüsəlmanlar, yəni üç yüz milyondan ibarət müsəlmanlar ittifaq və ittihad edib bu günlərdə çəyirtkə kibi qanadlanıb uçacaq və Rusiya ilə Avropanın üstünə töküləcək və Qərb mədəniyyətini və bəlkə də bütün xristian aləmini bağı ilə, bağçası ilə, əkiniylə, əhalisiylə yeyib yetəcəklərmiş. Buna da guya indiyə qədər ermənilər mane olduğundan, ittihadi-məzkurun mərkəzi olan bir nöqtədən, İstanbuldan, Kabildən, ya Bombeydən ermənilərin qətli-amminə dair bir barmaq işarəti çəkilmiş imiş!.."

**"Panislamizm"** bir mif, **"panxristianizm"** isə həqiqətdir, **"pantürkizm"** – məhz türklük əleyhinə genosidə haqq qazandırmaq, xristianlığı müsəlman xofu ilə erməninin əlində oynatmaq üçün düşünülən uydurmadır – bütün bunları da Əli bəy hələ o vaxt, öz ideya rəqibinin düz gözünün içinə deyir:

"...Səni ittifaq və ittihadmı qorxuduyor?.. Biz isə nifaq və şiqaqdan qorxuyoruz!.. Nifaq və şiqaq deyilmidir ki, sizlərlə bizlər arasında bu qədər qan

tökülməyə səbəb oldu?! Bizim Qafqazda bu nifaq, bu ədavət və qital yetmiyormuş kibi bir də ümum aləmi-islamın içinə dəxi nifaq düşüb ittihadi-müslimin xatiriniz üçün müxtəlmi olsun, müslimin yekdigərinin qanınımı töksün? Siz bunumu istiyorsunuz? Xeyr, sizi qorxudan ittihad və ittifaq degildir. Bu, zatən min üç yüz sənədən bəri mövcuddur. Qəribədir aranızdakı qitalın səbəbi cəhalət, qəflət və zəlalət olduğu mühəqqəq ikən, ermənilərin əksəriyyətincə dəxi mühəqqəq ikən, siz hər nədənsə aləmi-islamın ittihadından degil, xabi-qəflətdən oyanıb, təriqi-təməddün və maarifə sülukindan qorxursunuz! Sizi təlaşa salan, zənn edirəm, bu cəhətdir".

Bu sözlərin müəllifi doğrudan da **həkimdir**: xəstəliyə diaqnoz çox dəqiq qoyulub! Doğrudan da **peyğəmbərdir**. İndi də səsi müqəddəs haqdan və haqqın dərgahından gəlir! Doğrudan da **filosofdur**: təbiəti iblisdən və insan qəsdindən, ekologiyanı radiasiyadan qoruyur: "Sizin qorxu və təlaşınızla qanuni-təbiətə səddmi çəkiləcək, zənn ediyorsunuz? Və ya siz bütün Avropayı təlaşa düşürməklə bizi təhdid etdiyiniz üçün, biz: – Xeyr, əstəğfürullah, qələt etdik. Biz nə aləmi-islamın sülh və insaniyyət dairəsində ittihadını arzu edər və nə də bu aləmin xabi-qəflətdən oyanıb ənvari-mədəniyyətdə münəvvər olmasını istəriz", – deyənlərdənmiyiz, zənn ediyorsunuz? Və bütün Şərq dəxi oyandığı halda, sizin qorxunuzdan: "Qorxma, qorxma, hənuz oyanmadıq"mı deyəcək? Xeyr, xeyr, sizin və bizim və ümumi-insaniyyətin nicat və səlaməti-bidaridə, haqqı bilməkdə, nuri-maarifdə, tərəqqi, təməddün və təkamüli-daimidədir. Etiqadımızca, ancaq bu vəsaitlə insanlar, millətlər, din və məzhəblər arasından nifaq və şiqaq, cəng və cidal fəsx oluna biləcəkdir...

Qeyrət, vətəndaşlar, qeyrət!"

Qəribədir və ibrətlidir: o, təkcə yerli millətçinin "başına ağıl qoymur", erməni şovinistinə erməni ziyalısının deməli olduğu sözü də ona – erməni yox... Əli bəy deyir: "Çalışalım ki, Bakı və İrəvan hadisələri kibi çirkin şeylər yaddan çıxsın, hətta səhayifi-tarixiyyəmizdəndən belə silinsin! Maarifə, təməddünə, təkamül və təaliyə çalışalım, vəqtimizi qaib etmiyəlim, çünki yol uzundur, yoxuşdur, arizəlidir!" ("Həyat", 5 iyul 1905).

Dialoq-mükalimə şəklində yazılmış başqa bir məqaləsində Əli bəy Hüseynzadə *erməniyə xas ənənəvi dini və irqi ambisiyanın o vaxtkı konkret-tarixi* səbəblərini izah etməyə çalışır və bu izahlar da bizim günlərin hadisələri kontekstində nə qədər aktual səslənir: "...Bu qovğa üç növ siyasətin təhti-təsirində hasil oldu: birincisi, bəzi ermənilərin azğınlığı və zəlaləti idi ki, ermənilər bir az kəsbi-maarif və sərvət etdiklərindən naşı **kəbirləndilər**, qürur peyda etdilər. Bu hallarına bir də təsirati-kəlisa qarışdı. Sair millətlər, məsələn, fransızlar kəlisanın əlindən xilas olmağa çalışırlarkən, ermənilər aləmi-islamın ortasında bulunduqları halda, dini-islamdan qətiyyən bixəbər qalmağa və təəssübi-kəlisalarını son dərəcələrdə vardırmağa cəhd və qeyrət ediyorlar idi!

Səyasətin ikincisi müsəlmanların qəflətləri, avamlıqları idi...



Fəqət bu iki amil özlüyündə nifaq və şəqaqə bais olmaz idi! Baisi-həqiqi köhnə üsuli-idarə idi, daha doğrusu, o üsulun bəzi qərəfkirani idi ki, bu kibi əhvalda bir zəmini-müsaid (əlverişli zəmin) bulub toxmi-nifaqı əkdilər!.."

Nəhayət, Əli bəy Hüseynzadə irsində sənədləşən tarixi faktlar bir də onu sübut edir ki, məhz şovinizm dalğasında qabaran rus-erməni həmrəyliyi heç də təzə hadisə deyilmiş:

"...Naxçıvan və Şərurda vaqiə gələn dəhşətli fəlakətlər paytaxt qəzetlərinə əks edib, təsirata səbəb vermədi. İnsanı lərzələrə, dəhşətlərə düçar etmək üçün əcəba əskik olan nədir?.. Bütün bu işlər üçün indiyə qədər bir neçə məqalə və məktubdan başqa rus mətbuatı hərf belə yazmamışdır. Mətbuatın bu cür sükutuna bais, əcəba, nədir? Əcəba, bu sükut qəsdənmi ixtiyar olunuyor? Bu *məsələyi şimdilik buraxalım*".

"Buraxalım" desə də, ədib bu dərəcədə müdhiş insani, bəşəri müsibətə rus ziyalısının göstərdiyi laqeydliyə laqeyd qala bilmir və göstərir ki, sükut və laqeydlik pozulanda da, Badkubədən və Naxçıvandan yazanda da rusun mətbuatı ermənidən fərqlənmir, belə ki, "erməni mətbuatının müsəlmanlar barəsində kizb və böhtanları" haman rus mətbuatına sirayət edib də, axırda xəcalət və peşmançılığa səbəb oldu". Çünki heç bir riya və məkr sona qədər çuvalda gizli qalmır. Axır ki, həqiqət və vicdan duyğusu öz işini görüb, "çox təcrübələrdən sonra həmməzhəblik və xristianlıq" yuxuşundan oyanan rusa yəqin olub ki, bəzi adını İsavi qoyanlarda heç İsa sifəti olmayıb, ancaq **isaviliyi də bir mal kimi bazarlarda satırlar**" ("Həyat", 17 iyun 1905).

Əli bəy Hüseynzadənin erməni problemi və mövzusu ilə bağlı məqalələrində ifadəsini tapan "millət" və "millilik" anlayışında bir cəhət diqqəti xüsusilə *cəlb edir: milliliyi o, bəşərilikdən və insanilik problemindən heç zaman ayırmır*. Hətta yazılarından biri də belə adlanır: **"Milliyyət və insaniyyət"**. Əksinə, ermənisayaq "millilik" proqramını o, məhz humanizm məzmunundan məhrumluqda, erməniçiliyi" hər cür humanizm və insanpərvərlik çərçivəsindən kənarda mütləqləşən ifratlar və anomaliyalar səviyyəsinə enməkdə ittiham edir. Müsəlmansayağı, türksayağı hər şey eybəcərdir, necə olursa olsun, nə olursa olsun, – onun maraqlı bir yazısını bu fikir aşılayır: "Panislamizmə bir məqsəddir ki, nəticəsi cəmi əqvam və məmaliki-islamiyyəyi bir-birinə rəbt edib qayət vasе və həddən ziyadə böyük bir məmləkət, bir hökumət təşkil etməkdir..."

Müsəlmanlar (osmanlı, iranlı, qafqazlı, hətta hindistanlılar) panislamizmə məqsədinin ətrafına cəm olmağa hərəkət ediyorlar və dəryada qərq olub boğulanlar kibi onun vasitəsilə nicat tapmağa səy və qeyrət ediyorlar... Məgər panislamizm məqsədinin gələcəkdə qüvvədən fеlə çıxması mümkündürmü? *Biz diyoruz ki, xeyr!..*

Bu üç cümlədən nə anlaşılıyor? Üç-dörd yüz milyon nüfusdan ibarət bir camaat dəryada qərq olub boğulmaqda ikən, guya yeganə çarə, nicat zənn

olunan panislamizm də bir Nuh gəmisi kibi təcəssüm edib meydana çıxıyormuş!.. Deməkki, boğulacaqları mühəqqəqdir".

Görülüyör ki, ya erməni rəssamlarından dəryayi, əmvaci-bəhri təsvirdə məharətilə şöhrət qazanmış olan Ayvazovskinin "Tufan" adlı məşhur lövhəsi doxi bu qədər fəci və əzəmətli bir mənzərə iraye edəməz!..

Afərin erməni mühərririnin bu qədər rəssamanə qələminə!..

Qüvvəyi-vahimə insanları nə qərib, nə gülünc hallara ilqa edərmiş!.. Nə qədər doğru sözdür. Deyirlər ki, yalançı bir yalanı deyə-deyə axırda özü də o yalana inanmağa başlar!.."

Absurd və səfsəfə halı olan "ermənisayaq" doktrina aşağıdakı incələmədə xüsusilə qabarıq, şəksiz karikatura halına düşür: "Lakin məqalədə bir cümlə daha vardır ki, mühərririn vicdan və qəlbindəki, niyyətindəki xülusi - səfvətin dərəcəsini, daha doğrusu, dərrakəsini göstərmək üçün yeganə o cümlə kafidir.

O da budur: "Müsəlmanlar (müxtəlif siniflərdən bəhs olunuyor) tərəqqi edəmmədilər və edənləri də bimənə oldu, onların da əksəri Qafqazdadır..."

Bu sözə diqqət ediniz: Tərəqqi, etməsək, şikayət olunuyor, tərəqqi etsək, yenə şikayət olunuyor. **Bu hal sadə bir erməni mühərririnə məxsus degil, bütün avropalılar cüzi bir istisna ilə aləmi-islama qarşı bu məsləkdədirlər** (ayırma bizimdir – *Y.Q.*)

Əgər biz tərəqqi yolunu tutsaq, sürətlə tərəqqi etsək, tərəqqimiz, sürəti-tərəqqimiz bunların təlaş və əndişələrinə, dad və fəryadlarına bais olur. "Makixan"ından ziyadə teleqrafların, dəmir yolların çəkilməsinə, darülfünunların açılmasına, cəmi cəmiyyətlərin, cəmiyyəti-xeyriyyələrin təşkilinə mümaniət edərlər, mümaniət etmək üçün ənva-hiylələr, dəsisələr icad edərlər. Yox biləks, əgər bətalət və ətalətə meyl edib, tədəniyyə, geridə qalmağa qeyrət etsək, geri qalmamızdan, vəhşiliyimizdən, cəhalətimizdən əlaman deyib bütün aləmi də vəlvələyə salırlar, vaveylalar qoparırlar!..

İttihad və ittifaq etsək də şikayət edərlər, nifaq və şəqaqə düçar olsaq da şikayət edirlər; ittifaqımız bunlar üçün bir təhlükə, nifaqımız yenə təhlükə: ittifaq etsək "panislamizmə" adı qoyarlar, mitinqlərdə, məclislərdə, qəzetə sütunlarında xatirü xəyala gəlməyən iftiralar, kizbü böhtan söyləməkdən çəkinməzlər, xəyaldan ibarət bulunan, əsla vücudi olmayan bir qüvvətin əleyhinə mühib və həqiqi kuvalisiyalar təşkil edirlər...

Öz aramıza təfriqə düşüb öz xanəmizin içində iki qardaş bir-birimizlə dəva etsək, yenə narahat və bezar olurlar. Fasda, Marokda olduğu kibi müttəfəqənməmləkətə girib bütün ölkəyi təqsimə qalxışıyorlar!.."

Əli bəyin xəyalı, romantikası ifrat satira boyaları alanda məqalədəki mahiyyət daha sərt rəngləri ilə, əlavə qabarıqlığı ilə üzə çıxır:

"Və əlhasil tərəqqi və təali edib göylərə çıxsaq, deyəcəklər ki: Ay haray, qoymayın!.. Müsəlmanlar göyə çıxıyorlar, olmaya ki başımıza asimandan



şərarbar olalar, ildırımlar, şəhablar, atəşlər yağdırarlar!.. Yox, tədənni və tənəzzül edib yerin dibinə keçəcək dərəkələrə gəlsək, bağıracaqlar ki, ay haray!..

Qoymayın ki, nari-cəhənnəmi iqaz edən bunlardır. Vezuvi yanar dağının ətrafa saçdığı odları, külləri, kükürdləri, lavaları püskürən bunlardır!.. Yerdən də, göydən də əl çəksək, dəryalara, dənizlərə iltica etsək, yenə susmayacaqlar, fəryad edəcəklər ki, ay haray! Əqvami-islamiyyənin qüvayi-əksəriyyəyi bəhriyyəsi artıyor!.. Sahillərimizə barıtlar, güllələr, bombalar yağdıracaqlar!..

Bu adamları nə ilə məmnun etməli?.. Bunların xoşuna getmək üçün nə etməlidir? Nə etməli? Ya boynumuza bir zənciri-əsarət salmalı, yaxud məhv və nabud olmalı vəssalam!..

Üç-dörd yüz milyon xalq ya əsarətdə, ya məhviyyətdə!.. Başqa heç nə!.. Bu mümkünmü?.. Əzizim erməni mühərriri, **biz nə boğulub qərq oluruz və nə də panislamizməyi vase və böyük bir dövlət təşkil etməyi özümüzə bir vasitəyi-nicat bilirüz. Səhvin var, xətan var!.. Biz bir sövq-təbii ilə, naqabilitəğyir bir hökmi-qədərlə, bütün əlyanın, əqvas və millinin getdiyi yollarla gediyoruz!.. O yolun ibtidası qaranlıq və tikanlıq isə də, iləris işıq və çəmənlikdir!.. Millətlərin** bir qismi yolun ortasında getdikləri və ya nəhayətinə yetişdikləri halda, digərləri o yolu başlarlar!.. Bu bir qanuni-təbiyyətdir ki, adına "evolyusiya", təkamül qanunu deyərlər. Biz də bu yol ilə gediyoruz, məqsədimiz, amalımız ittihad, ittifaq, ictimai, maarif, kəsbü-kar, sənaye, ticarət və sairə qüvvətləri ilə kürreyi-ərz üzərində insanlara qismət olan səadətə nail olmaqdır. Menşikov, Mağda, Neman, Çirevanski, "Mşaq", "Arşalyus" və sairə nam divlər, ifritələr arxadan, sağdan, soldan istədikləri qədər çığırbağır etsinlər, biz qorxub geri baxanlardan degiliz!.."

Sonralar real siyasi təhlükəyə çevrilən ifrat meyl-azadlıq və istiqlal ideologiyalarına da vulqar nasionalist məzmun vermək bu yazıda o vaxtdan bəri xəbər verilir.

Bizim ədəbi-bədii fəlsəfi fikirdə Faust kitabı, Hamlet monoloqu, Tanrıya, Təbiətə, bəşəriyyətə ünvanlanan alqış, qarğış, fəryad nidası çox-çoxdur. Nə qədər desən ("Müsəlman əhlinə", "Qafqaz müsəlmanlarına", Allaha, Peyğəmbərə...). Amma Əli bəyin qonşulara, erməniyə xitabla söylədiyi tragik monoloq onların hamısından fərqlənən nadir, unikal monoloqdur. Burada bir xalqın və etiqadın oğlu başqa bir xalqın və etiqad sahibinin özünə müraciət edir. Onu bu gün də ucadan, Tanrı səsi, peyğəmbər səsi kimi Kosmosdan elan etmək, yeni yüz ilin, yeni min ilin hamıya xəbərdarlıq sənədi kimi dünyaya car çəkmək olar: "Yüksəlin, qonşular, yüksəlin! Dar bir milliyyət, bir nasionalizmə dairəsindən dişarı çıxınız! Əfradi-millətinizi zəlalətə düçar etməyiniz... Şekspirlərin, Getelərin, Jan-Jak Russoların, Lassalların, Marksların, Tolstoyların məziyyətləri, qədr və qiymətləri yüksəlib milliyyət xaricinə çıxdıqları üçün, bilafərqi-qövm və millət, ümumbəşəriyyətin, insaniyyətin vali-nemətləri olduqları üçündür... Bir işıq yüksəldikcə, yuxarılara çıxdıqca o nisbətdə, uzaqlara tənvir edər, odur

ki, bütün aləmə işıq və hərarət verən şəmsi-taban ən uca, ən bülənd bir nöqtədədir. Bu gün bu qədər elm və maariflərlə, sərvət və samanınızla bərabər degil ümum insaniyyəti, hətta bir-iki qonşularımızı dəxi müstəfid edəcək içinizdən bir fərd yetişmədi!.. İçimizdən nə bir Əbu Əli Sina, nə bir Mollayi Rumi, nə bir Uluq bəy göstərəmməzsiniz. İki min illik tarixinizi qarışdırsanız, yenə göstərəmməzsiniz! Əflatunlar, Ərəstular, Homerlər yetişdirən yunanlara, Musalar, Spinozalar, Heynelər, Lassallar yetişdirən yəhudilərə heç bir vəchlə müşabihətiniz yoxdur!.. Yüksəlmədikcə, əxlaqınızı təthir etmədikcə, milliyyət xəyaləti-vahiyyəsini beyninizdən çıxarıb atmadıqca, ümumi bəşəriyyətə, insaniyyətə İsalar, Məhəmmədlər, Buddalar kibi bir nəzərlə baxmadıqca müşabihdə olammazsınız, bir virteyi-həlakə düşüb gedərsiniz!.." ("Həyat", 9 aprel 1906, №77).

Əli bəyin ibrətli və müdrik irsi bizə yalnız tarixi erməni ekspansiyasının mahiyyətini açmaqda və ona həmişə hazır olmaqda kömək etmir. O, həm də bu ekspansiyaya qarşı özümüzün mübarizə təcrübəmizi saf-çürük etməkdə, çağdaş istiqlal hərəkatımızın, Azərbaycanda çağdaş türkçülüyün və millətçiliyin qüvvətli və zəif cəhətlərini meydana çıxarmaqda bugünkü ədəbi-ictimai fikir üçün ayna və açar rolunu oynaya bilər. Öz müdrik təlimi, klassik Şərq və dünya fəlsəfəsi ənənəsi üzərində yüksələn ədəbi-ideoloji irsi ilə o, bir daha sübut etdi: Azərbaycan Demokratik Cümhuriyyəti ona görə qalib gəldi ki, o, belə təməl üzərində milli dövlətin bünövrəsini ideyaca hazırlayan kamil proqram zəminində bayraq qaldırdı. Yaxın on ilin milli azadlıq hərəkatı isə Əli bəy və Əhməd bəy miqyaslı ideoloq və mütəfəkkiri yarada bilmədi və həmin səviyyədə mənəvi, əxlaqi, nəzəri ideoloji işin nəticəsi, ona adekvat bir təşkilati-əməli fəaliyyətin barı, bəhrəsi şəklində yaranmadı. Kültürdə, əxlaqda, qeyrətdə milli-mənəvi intibahın siyasətdəki, əməldəki təzahürü və ifadəsi kimi gerçəkləşmədi. Son on ildəki siyasət və mücadilə təcrübəmizin bu miqyasda elm, mədəniyyət, torpaq, insan itkilərilə nəticələnən nöqsan və səhvləri bəlkə də elə buradan irəli gəlir.

"Maarif, ittihad, hürriyyət. Nə qədər gözəl nemətdir. Bunları unutmayalım. Çünki əsil nicat bu üç qüvvədədir" ("Müzəffərəddin", "Füyuzat", 1907, №7). Həmin "üç qüvvətdən" bircəciyinin bu vəhdətdən kənarda qalması naqislik, böhran olardı və necə ki, bizim yaxın təcrübəmizdə oldu da. Bugünkü böhrandan və milli faciədən xilas olmağın da yaxşı üsulu yenə budur – bu üç qüvvət arasında vəhdətdədir: "Nicat məhəbbətdədir" – Əli bəy bunu deyərkən ən ali milli ideal, qeyrət və şərəf məqamında ümummilli həmrəyliyi və ittihadı nəzərdə tutur. Erməni ekspanizminin və ideoloji erməni blokadasının dünya masştablarına biz yalnız bu yolla qarşı dura bilərik.

Heç də təsadüfi deyil ki, Əli bəy "panislamizmdən" və "erməni məsələsi"ndən həmişə eyni yerdə danışır və hətta onun bu problemə həsr etdiyi məxsusi məqalənin başlığı da belə adlanır: "Panislamizm məsələsi və ermənilər" ("Təzə həyat", 1907, №20-22). Ermənilər və onlara havadar xristian



qüvvələr islama və türklüyə qarşı eyni siyasətdən bugün də eynilə istifadə edirlər. Əgər aşağıdakı mətndə "panislamizm" sözünü "İslam fundamentalizmi" ifadəsilə dəyişsəydik, inanmaq olardı ki, həmin yazı 1907-ci ildə yox, bugün yazılıb, məhz islama tapınan "qaynar nöqtələrdə" "açıq genosidə, savaşa çevrilən fitnə və fəsad toxumuna onda "panislamizm"ə indi "fundamentalizm"ə qarşı mübarizə adı altında bərəət verilirdi: "...biz də özümüzə naməlum, özgələrə aşkar, özümüzdən məstur, özgələrə əyan bir qüvvə var ki, hamı ona mənə verib, hamı ondan qorxur. Bu qüvvət də haman "panislamizm" deyilən qüvvətdir. İslamların tutduğu sükunət etdiyi yerlərin şəklin, xəritəsin dürüst gətirib nəzərdən keçirəndə bunun üstünə bir az da qeyrət, namus, dirilik, fəaliyyət fikri gətirəndə, doğrudan da, elə bir qüvvət əmələ gəlir ki, ondan nəinki xristian aləmi, bəlkə cəmi dünya təşvişə düşsə haqlıdır. İslam torpaqları bir kəmər kimi cəmi Avropanın belində sıxılıb əlləşməyə məcbur olan əjdaha nisbətində başın ozib beynin çıxartmağa hazır islam tayfasını görür. Lakin hamısın yatmış, hamısın bir şirin yuxuya uyumuş görür".

Bəs "uyqudan oyanmağın" vaxtı haçan çatacaq? Axı nə vaxta qədər şerimiz deyəcək: "Ayıltmadı qələmim bu türk ilə əcəmi!" Vulqar xaçpərəst irtica da elə bunu istəyir. Fil hələ yatmış ikən hələ "oyanma" baş verənə qədər "yatmış fili" yuxuda məhv etmək, didib-parçalamaq siyasəti yeridir.

Ona görədir ki, böyük ideoloq türklüyü hələ o vaxtdan qarşıdakı tarixi sınaqlara hazırlayır: "Füyuzat" tutduğu yol türklük, müsəlmanlıq və avropalılıqdır" ("İntiqad ediyoruz, intiqad olunuyoruz"). Türk milli-tarixi şüuru tarixən bu yöndə yaranıb və indi də bu məqsədə xidmət edəndə qüvvətli, sivil və gələcəkli görünə bilir.

***

Yadındamı, doğduğun zamanlar
Sən ağlar idin, gülərdi aləm.
Bir öylə ömür keçir ki, olsun
Mövtin sənə xəndə, xalqa matəm.

Əli bəyin ən səmimi, kövrək yazılarından biri yuxarıdakı poetik bəndlə başlayır. Həmin sətirləri böyük ədibin və mütəfəkkirin özünə aid eləmək, müdrik Şərqin bizim əsrdəki son peyğəmbərinin öz ömür yoluna epiqraf seçmək olar. Bütünlükdə islamın yaddaşına türklüyün tarixinə çevrilən şəxsi tərcümeyi-halı ilə Əli bəy doğrudan da elə bir ömür yaşadı ki, bu ömür bitəndə o özü "xəndə" (məmnun), bütün dünya, bütün aləm isə məğmun və pərişan oldu...

***Yaşar Qarayev***
***1995***

## REDAKTORDAN

Əli bəy Hüseynzadə (Əli Turan) 24 fevral 1864-cü ildə Salyan şəhərində dünyaya gəlib.[1]

Tiflis Müsəlman Məktəbinin müəllimlərindən Molla Hüseyn Hüseynzadənin oğludur. Anası Xədicə xanım Qafqaz Şeyxülislamı Axund Əhməd Hüseynzadənin qızıdır.

Valideynlərini erkən yaşında itirən Əli bəy babasının himayəsində böyümüşdü. 32 il (1852-1884) Qafqazın Şeyxülislamı olmuş Axund Əhməd Səlyani dini fəaliyyətilə yanaşı maraqlıdır ki, milli məfkurə istiqamətində də ciddi işlər görürdü. Şeyx "Tarixi-ədəbiyyati-türki" adlı bir əsər yazmışdı, türk millətinin böyükləri, əski türklərin yazısı, cığatay ədəbiyyatının qızıl dövrü, uyğur dili, Əlişir Nəvai haqqında yazılı söz deməyi özünə vicdan borcu bilirdi. "Qafqaz məmləkətinin xalqları", eləcə də qələmə aldığı digər əsərləri Şeyxülislamın zəngin erudisiyasından xəbər verir. Uzun illər dostluq etdiyi Mirzə Fətəli Axundov, eləcə də Həsən bəy Zərdabi və Seyid Əzim Şirvani Şeyxin üstün məziyyətləri barədə qiymətli fikirlər söyləmişdilər. Şahzadə Mirzə Yusif xanın 1862-ci ildə Mirzə Fətəli Axundova yazdığı məktubda Axund Əhməd Səlyani ilə bağlı belə bir maraqlı məqam var: "Mən o cənabı, mollalar silkindən hesab etmirəm. Mən onu ruhani alimlərdən bilirəm".

...Əli bəy Hüseynzadə ibtidai təhsilini Tiflis müsəlman məktəbində, orta təhsilini isə Tiflis birinci klassik Gimnaziyasında (1875-1885) alıb, Peterburq Universitetinin fizika-riyaziyyat (1885-1889), İstanbul Darülfünununun Əsgəri-Tibbiyyə fakültələrini (1889-1895) bitirib.

Peterburq Universitetində Mendeleyev, Nikolay Menşutkin, Yeqor Vaqner və Nikolay Beketov kimi böyük kimyaçı alimlərdən dərs alan Əli bəy, universitetin şərqşünaslıq fakültəsində Jukovskinin mühazirələrini də dinləmiş, Rəssamlıq Akademiyasının məşğələlərində iştirak etmişdi.

Əli bəy Hüseynzadənin İstanbul Universitetində təhsil aldığı illəri səciyyələndirən Yusif Akçura yazırdı: "Qafqazlı Əli Hüseyn Əfəndinin İstanbul Əsgəri-Tibbiyyəsinə girməsi... rayihədar bir Avropa həvayi-mədənisinin əsməsi kimi oldu. Tələbəsinin çoxu Anadolu və Rumelinin uzaq və qaranlıq vilayətlərindən toplanmış bu məktəbdə Əli bəy bir fəcri-şimali kimi parladı. Yunan və latın ədəbiyyatına aşina olmaqdan əlavə, alman, rus, ingilis ədiblərini xeyli mütaliə etmiş və Şərq ədəbiyyatına şərqşünaslar nöqteyi-nəzərindən vaqif olmuşdu. Üstəlik rəssam idi və kaman çalırdı. Arkadaşlarının hamısı əski dövr ədiblərinin ad və rəsmlərini ancaq "Kiçik Larousse"dən bilirdilər. Rus fikir və ədəbiyyatına tamamən yabançı idilər. Çoxunun Batı fikir və ədəbiyyatına bələdliyi ancaq fransız qramer və lektorlarında hecalanan parçalara dayanırdı. Əli bəy, İstanbul Tibbiyyə məktəbinə Batı fikirlərini, Batı ədəbiyyatını, Batı irfan və mədəniyyətini, qısası Batını tanıtmaqda professorlardan çox xidmət etdi".

İstanbul Darülfünununun tələbəsi Əli bəy Hüseynzadənin adı bu illərdə Türkiyə tarixinə "İttihad və Tərəqqi" cəmiyyətinin qurucularından biri kimi daxil olur.

* * *

Hüseynzadə 1895-1897-ci illərdə Heydərpaşa əsgəri xəstəxanasında dəri mütəxəssisi, Türkiyə-Yunanıstan müharibəsi zamanı – Tesaliya savaşında (1897-1900) hərbi həkim olaraq çalışdı. Müharibədən sonra, 1900-cü ildə müsabiqə yolu ilə İstanbul Darülfünununda dosent seçildi.

* * *

1903-cü ildə Qafqaza – Bakıya qayıdan Əli bəy Hüseynzadə 1905-1906-cı illərdə "Həyat" qəzetinin (əvvəlcə Əhməd bəy Ağaoğlu ilə birlikdə), 1906-1907-ci illərdə "Füyuzat" dərgisinin baş redaktoru vəzifəsində çalışıb. 1907-ci ildə Birinci Dövlət Dumasının dağıdılmasına etiraz sənədini – "Vıborq bəyannaməsi"ni imzaladığı üçün mədəni haqlardan məhrum edilən Ə.M.Topçubaşinin yerinə bir müddət "Kaspi" qəzetinin də baş redaktoru Hüseynzadə olmuşdu.

1905-ci ildə Qafqaz müsəlmanları tərəfindən Peterburqa göndərilən heyətin tərkibində Ağaoğlu Əhməd, Adil Xan Ziyadxan, Əli Mərdan bəy Topçubaşi, Fərrux Vəzirov və b. ilə birlikdə Əli bəy Hüseynzadə də vardı. Nümayəndə heyəti Rusiyanın baş naziri Vitte ilə görüşmüş və özünün bir çox siyasi tələblərini baş nazirə qəbul etdirmişdi.

* * *

Yusuf Akçura, Ziya Gökalp, Məhəmməd Əmin Rəsulzadə, Bay Məhməd Tevfiq, Hilmi Ziya Ülken, Françios Georgion, Y.Landau və b. bildirdiyi kimi, bu illərdə Əli bəyin ən böyük tarixi xidməti türk millətinin qurtuluşu üçün yeni məfkurə sistemini – ***türkləşmək, islamlaşmaq, avropalaşmaq*** triadasını irəli sürməsi oldu.

* * *

1910-cu ildə ittihadçı dostlarının dəvəti ilə İstanbula köçən Əli bəy Hüseynzadə Bakıdan ayrılarkən şəxsi əmlakını 1908-1910-cu illərdə müdiri və türk dili müəllimi olduğu "Səadət" məktəbinə hədiyyə etmişdi.

[1] Yazıda Ə.Hüseynzadənin 1935-ci ildə qələmə aldığı "Bioqrafik müxtəsər məlumat"ı əsas götürülmüşdür (*red.*).

İstanbulda Tibb fakültəsində əvvəlcə dəri xəstəlikləri üzrə dosent, sonra professor seçilən Əli Turan 1933-cü ilə qədər Darülfünundakı vəzifəsini davam etdirdi.

1911-ci ildə İstanbulda süvari zabiti Şəmsəddin bəyin qızı Ədhiyyə xanımla evlənən Əli bəy Hüseynzadənin üç övladı var: Saida Santur, türk rəssamlığında *yeni* adlandırılan hərəkatın qurucularından biri Səlim Turan və Feyzavər Alpsar.

* * *

"İttihad və Tərəqqi"nin ilk qurucularından olan Əli bəy Hüseynzadə 1911-ci ildə Eyyub Səbri, Midhəd Şükrü, Ziya Gökalp, Ömər Naci, Tələt Paşa və başqaları ilə birlikdə partiyanın rəyasət heyətinin üzvü seçilir.

...1911-ci il sentyabrın 1-də yaradılmış "Türk Yurdu" cəmiyyətinin qurucuları sırasında Türkiyənin milli şairi Məhməd Əmin Yurdaqul, Əhməd Hikmət bəy, Ağaoğlu Əhməd bəy, Akil Muxtar bəy, Akçuraoğlu Yusuflə yanaşı Əli bəy Hüseynzadə də vardı.

1913-cü ildə Əli bəy Hüseynzadə akademiya tipində olan və Cəlal Sahirin rəhbərlik etdiyi Türk Bilgi Dərnəyinin Türkiyyat komissiyasının, yenə həmin ildə "Kafqasyalılar Nəşri-Maarif Cəmiyyəti"nin (Qafqaz Türkləri Maarif Cəmiyyəti) üzvü seçilmişdi.

Dünya Müharibəsi əsnasında Hüseynzadə Rusiya müsəlman türk-tatar xalqlarının haqlarını qoruma komitəsinin "Turan heyəti" adlandırılan qrupunun tərkibində türklük lehinə təbliğat aparmaq, türklərin siyasi haqlarını müdafiə etmək məqsədilə Avropa ölkələrində səfərlərdə olmuşdu. "...Əvvəlcə Cəmiyyət adından yaradılmış bir komissiyanın, öncə müttəfiq və dost dövlətlər olan Almaniya, Avstriya-Macarıstan və Bolqarıstana getməsi və sonra da 1916-cı ilin haziranında İsveçrədə toplanacaq olan "Millətlər konfransı"na qatılmaları uyğun görülmüşdür... Komissiyanın Avropaya hərəkətindən öncə, ilgililərə təqdim edilmək üçün 1915-ci ilin yayında almanca "Rusiyadakı Müsəlman türk-tatarların bugünkü durumu və fəaliyyətləri", "Rusiyadakı müsəlman türk-tatar xalqlarının haqlarını qoruma komitəsinin bəyanatı" sərlövhəsi ilə iki mətn hazırlanmışdı. İkinci mətn, Budapeştdə nəşr olunmuşdur... Bu bəyanat almanca və fransızca olaraq İsveçrədə də yayınlanmışdır. Bəyanatı hazırlayan və təqdim edən kimsələr olaraq bu adları görürük: Yusuf Akçura, Əli bəy Hüseynzadə, Məhəmməd Əsəd Çələbizadə, Mukiməddin Beycan"[1].

Əli bəy Hüseynzadə, Yusuf Akçura, Çələbizadə və Beycan dekabrın 8-də Vyanada Avstriyanın baş naziri Storqk və xarici işlər naziri Forqaç, dekabrın 12-də Budapeştdə baş nazir Tisza, parlament üzvü Andrasi, 1916-cı il yanvarın

[1] Temir Ahmet. "Yusuf Akçura", Ankara, 1987, səh.49-50.



12-də Berlində xarici işlər naziri Paqu və onun müavini Zimmermann, 1916-cı ilin fevralında isə Sofyada Bolqarıstanın baş naziri Rodoslov və Məclis üzvləri ilə görüşlər keçirdilər.

1916-cı ilin mayında Əli bəy Hüseynzadənin də təmsil olunduğu Yusuf Akçura, Abdurrəşid İbrahim, Mukiməddin Beycan, Safa Əhmədoğlu, Əhməd Saib Kaplanov, Seyid Tahir Əfəndi, Əziz Makər və Əhməd Ağaoğludan ibarət nümayəndə heyəti Lozanda keçirilən "Milliyyətlər Birliyinin Üçüncü Konqresi"ndə iştirak etmək üçün İsveçrəyə getmişdi.

Françous Georgeonun yazdığına görə, 1916-cı ilin qışında "Hüseynzadə Əli Almaniyada, alman orduları tərəfindən dustaq alınmış Rusiya kökənli türklərdən taburlar təşkil etməyə çalışırdı".

Bu ərəfədə Əli bəy Hüseynzadə, Yusuf Akçura, Abdurrəşid İbrahim və Əhməd Ağaoğlu tərəfindən Amerika Birləşmiş Ştatlarının prezidenti Vilsona teleqram göndərildi. Teleqramda onlar Amerika Prezidentindən Rusiya müsəlmanlarının hüquqlarını müdafiə etmək üçün öz şəxsi nüfuzundan istifadə etməsini xahiş edirdilər.

Xatırladaq ki, "Turan heyəti"nin Avropaya bu gözlənilməz və uğurlu səfərləri Rusiya Dövlət Dumasında ciddi müzakirələrə səbəb olmuşdu.

* * *

1917-ci il avqustun 14-də Stokholmda keçirilən Beynəlmiləl Sosialist Konfransında Türkiyəni Ə.Hüseynzadə təmsil edirdi. Konfrans zamanı bir sıra bəyanatlarla çıxış edən Əli bəy Stokholmda ermənilərin türk milləti əleyhinə apardıqları təbliğat kompaniyasına qarşı güclü antitəbliğat işlərini də həyata keçirirdi. Stokholma gedərkən, yolüstü Berlində dayanan Hüseynzadə burada alman sosialistlərinin liderlərindən biri, müharibədən sonra isə Almaniyanın ilk prezidenti olan Evertlə görüşüb, Rusiya türklərinin vəziyyətini müzakirə etmişdi.

Əli bəy Hüseynzadənin Millətlərarası Sosialist Konfransındakı çıxışının məndəricəsi barədə təsəvvür yaradan əsas məqamlar bunlardır: "Osmanlı dövlətində milliyyətlər məsələsi dünya millətlərinin bağımsızlıqlarını qazanmalarına bağlıdır... Kapitalist imperializminin savaşda meydana çıxardığı problemlər arasında türk məsələsi diqqətlə ələ alınmağa dəyər. Sosialistlərin bir qismi kapitalist dünyanın, islam aləminə qarşı aldığı tövrü mənimsəməkdədir. İngiltərədəki Labour Party, Türkiyənin gələcəkdə Millətlər Cəmiyyətindən çıxarılmasını istəməkdədir. Yəni sosialistlik iddiasına rəğmən kapitalist zehniyyət içində qalmışdır. Halbuki onların bu kimi hökmlərdən qurtulmaları lazımdır. Müsəlman düşmənliyi, türk düşmənliyi belə hökmlərin başında gəlir. Alman və fransız sosial-demokrat partiyalarının çoxunda bu kimi hökmlər davam etməkdədir. 1908-ci il Türk inqilabı bu şikəst dünyagörüşünü ortadan

qaldırmaq qayəsini güdməkdə idi... Fəqət imperialist dünya Türkiyəyə bir dəqiqə nəfəs aldırmadı: İtaliya səbəbsiz Trablisə hücum etdi. Avropa hazırlanmağa vaxt qoymamaq üçün Balkan savaşını icad etdi. Sosialistlər arasında yalnız böyük Laures, Osmanlı dövlətinin parçalanmasının sosialist idealına ayqırı olduğunu gördü. Əgər Laures tragik bir surətdə ölməmiş, Stokholm Konqresində bulunmuş olsaydı, bu çox yayğın olan türk düşmənliyi (turcophobie) ilə mücadilə edərdi. Çünki o, Türkiyənin mühafizəsinin və bağımsızlığının Doğuda barışı davam etdirmək üçün yeganə təminat olduğuna qane idi. Türklərin dünya savaşına girmələri də imperialist saldırmaların doğurduğu bir hadisə olmuşdur. Çanaqqala zəfəri imperialist dünyanın irəriləməsi üçün bir baraj olmuş və bu böyük hadisə Doğu millətlərinin oyanmasına imkan hazırlamışdır".

***

...1916-1917-ci illərdə Hüseynzadə Türkiyə Maarif Vəkaləti "Asari-İlmiyyə və Milliyyə Tədqiq Cəmiyyəti"nin, eləcə də Məclisi Ali Səhiyyə Cəmiyyətlərinin üzvü olaraq təhsil və səhiyyə sahələrinin inkişafında xidmətlər göstərmiş, 1916-cı ildə yaradılan Milli Təlim və Tərbiyə Cəmiyyətinin qurucuları sırasında olmuş, yenə həmin ildə "Türk-Macar Dostluq Cəmiyyəti" idarə heyətinin üzvü seçilmişdi.

***

1918-ci ildə Əhməd Ağaoğlu ilə birlikdə Azərbaycana gələn Əli bəy Hüseynzadə Azərbaycan Cümhuriyyətinin təsis edilməsində iştirak edir.

Şəxsi qeydlərində Əli bəy Azərbaycana səfərini belə şərh edirdi: "Digər mühüm bir səfər də, "Qafqaz Cümhuriyyətləri Federasionu" ilə bir sülh müahidəsi əqd etmək üzrə, xariciyyə naziri Xəlil bəyin Batumda bulunduğu sıralarda Ağaoğlu Əhmədlə bərabər, xüsusi bir vəzifə ilə, əvvəla Batuma (Xəlil bəyin nəzdinə), sonra oradan da, Federasiyondan ayrılıb ayrı bir hökumət halında təşəkkül etməkdə olan Azərbaycan Cümhuriyyətinin ilk paytaxtı Gəncəyə (Nuru Paşanın yanına) qədər getməmizdən ibarətdir...

Burada türk ordusu sayəsində yenidən istiqlalını qazanmaqda olan **Azərbaycanın münəvvərlərilə birlikdə, bu ölkənin bir Cümhuriyyət halında təəssüs və təşəkkül etməsi işlərində çalışdıq**".

Əli bəy Hüseynzadə Gəncəni iyunun 24-də tərk edib. Qafqaz məsələsini müzakirə etmək üçün Məhəmməd Əmin Rəsulzadə ilə birgə İstanbula qayıdıb.

Bu illərdə Əli bəy Hüseynzadənin Qafqazın, o cümlədən Azərbaycanın siyasi aqibətilə bağlı xüsusi, ayrıca fikirləri vardı. Əvvəla, necə adlandırılmağından asılı olmayaraq, Əli bəy bu məmləkəti türklərin ölkəsi hesab edirdi.



Əli bəyə görə "bu bölgə üçün üç seçənəkdən söz etmək mümkün idi: bir Qafqaz Federasyonu, ayrı-ayrı müsəlman və gürcü dövlətləri və ya bölgədə türklərin yaşadığı kəsimlərin hıdıvıyyət şəklində Osmanlı dövlətinə bağlanması"[1].

Əli bəy Hüseynzadə 1918-ci il oktyabrın sonu və noyabrın əvvəllərində Fuad Köprülü, Nurəddin bəy Xudayarxanov, türküstanlı Sədrəddin Xan, sibirli Abdurrəşid İbrahim, Osman Tokumbet və kazanlı Bahəddin və Həlim Sabitlə bir yerdə Rusiyadakı əsir türklərin problemlərini müzakirə etmək üçün İsveçrəyə getmişdi. Yolüstü Kiyevdə Almaniya səfiri Baron Mumla görüşmüşdülər.

1919-1921-ci illərdə Əli bəy Türkiyədə Damad Fərid Paşanın sədr-əzəm olduğu dönəmdə, yəni "İttihad və Tərəqqi" mənsublarının təqib olunduğu vaxtlarda bir neçə dəfə həbs edilir. Həbslərlə müşayiət olunan bu illərdə də elmi-ictimai fəaliyyətinə fasilə verməyən Ə.Hüseynzadə 1919-cu ildə Azərbaycan Cümhuriyyətinin İstanbuldakı elçisi Yusif Vəzir Çəmənzəminlinin Azərbaycan türk ədəbiyyatı tarixini yazmasına və əsərin yayınlanmasına yardım etmişdi.

***

Hüseynzadənin Bakıya sonuncu gəlişi 1926-cı ilin fevral ayına təsadüf edir. Həmin günlərdə keçirilən Birinci Türkoloji Qurultayın fəxri rəyasət heyətinə seçilmiş Əli bəyin çıxışı, təəssüf ki, türkoloji qurultayın stenoqramına daxil edilməyib. Lakin Hüseynzadənin bu qurultayla əlaqədar yazdığı birdəftərlik qeydlərini türkiyəli alim Hilmi Ziya Ülken "Türk sosializminin və türkçülüyün atası Əli Turan" əsərinə daxil edib. Tədqiqatçıların bir qismi isə bu qənaətdədir ki, həmin il Bakıda nəşr olunan "Qərbin iki dastanında türk" əsəri Əli bəyin qurultaya təqdim etdiyi məruzənin mətnidir.

Türkoloji qurultay günlərində Azərbaycan Yazıçılar Cəmiyyətinin fəxri üzvü seçilən Hüseynzadə Bakını 1926-cı ilin 25 martında tərk edib. Bu, Əli bəyin Bakıdan son gediş tarixidir: **25 mart 1926-cı il.**

Əli bəy Hüseynzadə Bakıdan qayıtdıqdan sonra – 1926-cı il may ayının 4-də İstanbul Universitetinin professoru seçilir.

...1928-ci ildə Hüseynzadə dahi şotland filosofu Adam Smitin 1776-cı ildə yazdığı və Parisdə 1881-ci ildə nəşr olunmuş "Sərvəti-miləl" – "*Təbiətin tədqiqi və millətlərin zənginliyinin səbəbləri" – red.*) əsərini fransızcadan tərcümə etdi. Bu kitab Ə.Hüseynzadənin həm böyük bir siyasi iqtisad alimi və həm də mükəmməl bir fransızca mütəxəssisi olduğu qənaətini doğururdu.

Yenə də 1928-ci ildə Kamal Cənabla birlikdə Əli bəy Hüseynzadə elmi mündəricəsi etibarilə bu gün də çox əhəmiyyətli olan "Ensiklopedik tibb

[1] Tadeusz Svietachovskı. "Rus Azerbaycanı 1905-1920", Ankara, 1968, səh.163.

lüğəti"ni yazmışdı. Ensiklopediyanın təkcə "A" hərfi ilə başlayan qismi 600-ə yaxın tibbi termini ehtiva edirdi.

1933-cü ilin iyul ayında Əli bəy Hüseynzadə Türkiyənin maarif naziridir. Rəşid Qalibin əmrilə yeni iş yeri tapana qədər bir il müddətində aylıq maaşı saxlanılmaqla təqaüdə çıxarıldı. Təqaüdə çıxarılması ilə əlaqədar ona göndərilmiş məktubda maarif naziri "uzun illərdən bəri həyatını məmləkətə münəvvər yetişdirməyə vəqf etmiş və çox zaman zorlu şərait içində böyük hizmətlər görmüş olan zati-alilərinin" – Əli bəyin xidmətlərini etiraf etməyi də unutmamışdı.

Türkiyədə soyadı haqqında qanun qəbul edilərkən 1934-cü ildə Əli bəy Hüseynzadə Turan soyadını götürdü. "Turani adından nisbət "i"sini qaldırıb bunu kəndimə soyadı olaraq seçdim. "Turani" imzasını 1904-cü yılında "Türk" qəzetəsindəki türklük, türkçülük üzərinə yazdığım bitülərdə (məqalələrdə), düzgülərdə kullanmışdım". Akçuranın dediyi kimi, ilk Turani olan Hüseynzadə həm də 1934-cü ildə Türkiyə hüdudlarında Turan adına rəsmi status verərək onu soyadına çevirdi.

1930-cu illərdə qələmə aldığı yazılar Əli bəy Hüseynzadənin dilinin sürətli şəkildə turançı düşüncə sistemini ehtiva etməsi kimi də maraq doğurur. Artıq Əli bəy yazılarında hətta Tanrı əvəzinə bu adın əski türkcədəki daha qədim versiyalarından olan ***Oğan***, peyğəmbər əvəzinə ***Yalavac***, metod əvəzinə ***oran***, şair əvəzinə ***ozan***, saz əvəzinə ***çoğur–çökür***, hökumət əvəzinə ***törü*** və s. bu kimi sözlərdən istifadə etməyə başlayır.

1934-cü ildə Ə.Hüseynzadəyə Ankarada "Təlif və Tərcümə əncüməni" başqanlığı vəzifəsi təklif edilsə də o, bu vəzifəni qəbul etməyib.

Hüseynzadə 1936-cı ildə Üçüncü Türk Dil Qurultayının, 1940-cı ildə isə Dəri və Zöhrəvi Xəstəlikləri Cəmiyyətinin təsis yığıncağında iştirak edib.

Parlaq istedadını yaradıcılığın müxtəlif istiqamətlərində büruzə verən Əli bəy Hüseynzadənin ilk mətbu yazısı "Ömər Xəyyam" darülfünun tələbəsiykən A.H.-zadə imzasıyla A.Cövdətin çıxardığı "Ramazan bağçası"nda, ilk mənzum əsərləri Səlyani imzasıyla "Məlumat" və "İrtika" qəzetlərində dərc olunmuşdu. Miltonun "İtirilmiş cənnət", Getenin "Faust", Esxilin "Zəncirlənmiş Prometey", Homerin "İliada", Şillerin "Kəfalət, yaxud vəfakar dostlar", Firdovsinin "Şahnamə"… əsərlərinin bəzi parçalarını ingilis, alman, yunan, fars dillərindən tərcümə edən Hüseynzadə, eyni zamanda, ərəb, rus, çin dillərindən də tərcümələrin müəllifidir.

Qeyd etdiyimiz kimi, tibb sahəsində də əhəmiyyətli çalışmaları olan Əli bəy "Ensiklopedik tibb lüğəti"ndən başqa "Vəba və mikrobu", "Siflis" əsərlərini də qələmə almışdı.

O, həm də rəssam idi. 1880-ci illərdə çəkdiyi "Şeyxülislamın portreti" başda olmaqla digər əsərləri Hüseynzadəni müasir Azərbaycan boyakarlığının banisi adlandırmağa əsas verir. Səlyani imzası ilə akvarellə çəkilmiş "Tesaliyada türk əsgərləri" əsəri müəllif tərəfindən Sultan Həmidə, Plevnə qəhrəmanı Osman Paşanın yağlı boya ilə yaradılmış portreti isə Müzəffərəddin şaha hədiyyə edilmişdi. Üzeyir Hacıbəyovun "Leyli və Məcnun" operasının ilk tərtibatçı rəssamı da Əli bəy Hüseynzadədir.



***

İstanbulda Üsküdarın Ehsaniyyə məhəlləsində yaşayan "bəyaz saqqallı, pəmbə üzlü, gözəl gözlü, şair, rəssam, musiqişünas, filosof, qəzetəçi, professor, doktor, mütərcim... bütün bir dövrün həqiqətən gizli həyat qaynaqlarından biri" *(S.Ağaoğlu)*, türk dünyasının fəxri, türkləşmək, islamlaşmaq, avropalaşmaq triadasının müəllifi və "Azərbaycan bayrağını mənalandıran üç ümdə amilin ideoloqu" *(M.B.Məmmədzadə)*, hələ sağlığında böyük müasirləri tərəfindən rəsuli-həqq *(A.Cövdət, Z.Gökalp)*, dahi *(M.Hadi)* adlandırılan Əli bəy Hüseynzadə 1940-cı il martın 17-də bazar günü İstanbulda dünyasını dəyişib. Qaracaəhməd məzarlığındakı başdaşında "Tibb fakültəsi dəri professoru Hüseynzadə Əli Turan" yazılmışdır...

***Azər Turan***

## MƏKTUBİ-MƏXSUS[1]

Möhtərəm qəzetənizin bilmiyorum hanki nüsxələrinin bir-iki bəndində türklüyün nədən ibarət olduğuna tamamilə vüquf göstərilməmiş və tatarlara, ələlxüsus türklüyün mədari-iftixarı bulunan Çingizlər, Teymurlar kibi hərb dahilərinə həqarətamiz bəzi sözlər dərc edilmişdir. Bu da Osmanlı türklərini müdafiə niyyətindən iləri gələrək qaş yapayım dcrkən göz çıxarmaq qəbilindən bir şey olmuş oluyordu.

Bu gün üləmayi-ətrakşünasın, hətta rus müstəşriqlərinin çoxu Çinin bəri cəhətlərində tatar namıyla bir qövm tanımıyorlar: türk var, moğol var, fəqət tatar yoxdur. Krımlılar, kazanlılar, orenburqlar və sairə həp türk oğlu türkdürlər. Kəndilərinə nə qövmdən olduqları türkcə sual olunmasa türküz – deyə cavab vcrirlər. Bunlara əqvami-sairə tərəfindən bir yanlışlıq olaraq tatar denilmişdir.

Surəti-məxsusada şu üç məsləkdən (üç tərzi siyasətdən) heç birini tərvic edəmiyəcəyinizi, yeganə məqsədinizin Osmanlı türklərini iqaz və şəhrahi-tərəqqi və təməddünə sövq etmək olduğunu bildiriyorsunuz ki, umum türklər için tariqi-səlamət budur... Müslümanlar və bilxassə türklər, hər nerədə olursa olsun, istər Osmanlıda, istər Türküstanda, istər Baykal Gölünün ətrafında ya Qaraqum civarında olsun, yekdigərlərini tanıyacaq, sevəcək, sünnilik, şiəlik və daha bilməm nəlik anlamlarıyla təəssübi-məzhəbiyi azaldıb Qurani-Kərimi anlatmağa qeyrət edəcək olurlarsa əlverməzmi?.. Çünki gərək dincə, əsasən gərək qövmiyyətcə birdirlər, müttəhiddirlər. Süni olaraq ayrıca pantürkizm, panislamizm namlarıyla məslək icadına nə lüzum vardır? Əsil məsələ nə surətlə çalışmaq, nəyə çalışmaq və öyrənməkdir. Bir millət için hər şeydən əqdəm arzu ediləcək şey qüvvətdir. Zamanımızda millətlərin səlamətlərinə, səadətinə yeganə vasitə budur. Bir millətin kəsbi-qüvvət etməsi nüfusun kəsrətinə, əfradın sihhət və afiyyətinə və ənasiri-mütəcanisəsi arasında irtibati-mənəvinin təzayüdünə vabəstədir. Təkəssüri-nüfuz səhhəti-cismaniyə

[1] "Məktu-məxsus" yazısı Ə.Bayatın "Hüseynzade Ali Turan ve Türkiyede yayınladığı eserleri" (İstanbul, 1992) kitabından götürülüb.



və ruhaniyə, irtibati-mənəvi sərvətsiz, məhəbbətsiz, hüsni-əxlaqsız olamaz. Binaənəleyh əvvəl əmirdə cahil olmamağa çarə aramalıdır. Sərvət qazanmanın yollarını öyrənməlidir. Fəsadi-əxlaqın önü alınmalıdır. Və ələlxüsus məhəbbəti-mütəqabilənin təzayüdünə çalışılmalıdır.

Ancaq şunu gözəlcə anlamalıdır ki, bu millətin və ümmətin tərəqqiyi-maddi və mənəvisi mütəqabildir; yəni təavvün əsasına müstəniddir. Ətrakın bir qismində vüqua gələn tərəqqi o biri qisminə əks edər, təsir edər. Məsələ, lisani-Osmaninin təkamülü krımlıların, kazanlıların, ya şirvanlıların dəxi dilini islaha hizmət edər; Türküstan Çini bir Fransa qədər laəqəl bir Fləmənk, bir Belçika qədər mütərəqqi bir məmləkət olsa idi, bunun Osmanlı türklərinə dəxi bir faidəsi olmayacaqmıydı?.. Aləmi-İslam, ya məmaliki-ətrak qeyri-münbit bir çöl, bir biyaban halını aldığı təqdirdə əmin olunuz ki, Osmanlı mədəniyyəti dahi nə qədər çalışsa yenə bu biyabanın ortasında bir vahədən başqa bir şey olamaz! Bir məmləkətin bağlarına filoksara ariz olmuş ikən orta yerdə bir-iki bağın şu illətdən tamamiylə məsun qala bilməsi çox müşküldür. İslam, türk hər tərəfdə tərəqqi etsə, qüvvət bulsa məmaliki-Osmaniyyə də o aləmin içində bir vahə deyil, bir behişt, əndər-behişt olur. Binaənəleyh məsələ, ittihad, yaxud tövhid məsələsi deyil, məsələ yekdigərimizi tanımaq, sevmək təriqi-təməddündə yekdigərimizə müavinət etmək məsələsidir.

Qafqaz türklərinin Molyeri bulunan məzhəkənəvisi-şəhir Mirzə Fətəli Axundova adının başında mirzə var, yaxud axırında "ov" var deyə əcəm, əcəmləşmiş, yaxud ruslaşmış nəzəriylə baxıb tanımamaq, təqrir etməmək, türk olduğunu, türkcə yazdığını, türklərə hizmətdə bulunduğunu bilməmək... Müəllim Feyzi kibi fazil və kamil bir türkü, bu Azərbaycan türkünü İranda təvəllüd etmiş olduğu üçün, ya iraniləri sevdigi üçün əcəm təlqib etmək... Digər tərəfdən də İranın kaanilərinə varıncaya qədər məktəb şagirdanına şeirlərini əzbərlətmək; fəqət Mirzə Əlişir Nəvaidən iki sətir olsun düz oxuya bilməmək... iştə təyib olunacaq hallar...

* * *

"Alimi-müşarünileyhin [1] məktubunu oxurkən yadıma vaxtiylə türklüyə dair yazmış olduğum qitələr gəldi. Bunları məktubuma əlavə edib zati-alinizə göndəriyorum. İstanbulda təb və nəşri müm-

kün olmamışdı. Qüsurlarına baxmayıb qozetənizə dərcini layiq görürsəniz, bəndənizi minnətdar edərsiniz.

Sizlərsiniz ey qövmi-macar bizlərə ihvan,
Əcdadımızın müştərəkən mənşəi Turan.
Bir dindəyiz biz, həpimiz haqpərəstan
Mümkünmü ayırsın bizi İncil ilə Quran?
Çingizləri titrətdi şu afaqı sərasər
Timurları hökm etdi şəhinşahlara yeksər.
Fatihlərinə keçdi bütün kişvəri-qeysər...[2]

*A. Turani*
*"Türk" qəzeti, sayı 56*
*24 təşrini-sani 1904*

## QƏZETƏMİZİN MƏSLƏKİ

Qəzetənin əhəmiyyəti bir cəmiyyət, ya millət üçün artıq o qədər aşkardır ki, bundan bəhs etməyə lüzum yoxdur. Qərbdə məcmui 4-5 milyon əhalidən ibarət kiçik məmləkətlərdə üç-dörd yüzə qədər müxtəlif qəzetələrin yüz minlərcə nüsxələrlə intişarına baxılırsa, əqvami-mütəməddinə üçün qəzetənin dəxi nani-əziz kimi ehtiyacati-bəşəriyyənin ən zəririlərindənədd olunduğu anlaşılır. Bu kimi məmləkətlərdə insanlar qəzetə qiraətini etiyad edə-edə (təbir cayizsə) bir növ qəzetə tiryəkisi oluyorlar. Hər sabah və axşam qəzet oxumamışsa çay, qəhvə içməyən adamlar kimi rahatsız oluyorlar... Qəzetə insan üçün adətən munis bir yoldaş, xeyirxah bir müəllim, nafe bir məktəb, hətta fərəhəfza xoş bir tamaşaxana kibidir. Zəlalətdə qalanlara doğru yolu, hidayət yolunu göstərir. Lakin qəzetə sözünü hənuz yeni eşidən və qəzetin nə olduğunu layiqilə bilməyən bizim xəlqdə qərib bir fikir vardır. Bunlar və ələlxüsus içlərində bir az məktəb görüb, yazmaq, oxumaq bilənlər öylə zənn edirlər ki, hər qəzetə faydalıdır və balada tedad olunan övsaficamedir. Xeyr! Qəzetə dəxi tutduğu məsləkə görə bir qism xalqın mübtəla olduğu əfyun və bəng kimi müzürr ola bilir. Fikrin sönməsinə, xəsaili-məmduheyi-milliyyə və insaniyyənin məhv olmasına, cavanların qəbləl-vəqt fikrən qocalmasına xidmət edən qəzetələr də vardır. Avropa mətbuatının içində nə qədər qərəzkaranə məqalələr nəşr edən qəzetlər mövcuddur!.. Binaənəleyh qarcin bir qəzetədən layiqi-vəchlə fayda görmək üçün əvvəl əmrdə o qəzetin nə məsləkdə olduğunu, yəni nə yol tutduğunu bilməsi lazımdır. Çünki qəzetin əhali üçün nafeya müzürr olmağı o qəzetin ibtidadan tutduğu yola, məsləkə bağlıdır. Məsləksiz, ya məsləkini gizlədən bir qəzet dinsiz, ya din və məzhəbini gizləyən adamlar kibidir. Məslək demək – yol deməkdir. Yol düz və asan ya arizəli və müşkül ola bilir. Bunda bir bəs yoxdur.

Dər biyaban gər ze şövqe Kəbe xahi zəd qədəm
Sərzənişha gər dəhəd xare-moğilan qəm məxor[1].

Lakin rəhbər hər halda yolun nə halda olduğunu və nərəyə vasil olacağını, məqsudun, hədəfi-amalın nədən ibarət bulunduğunu və yolda nə sürətlə gediləcəyini həm özü bilməli, həm xəlqə əvvəlcədən anlatmalıdır. Çünki ola bilir ki, xəlq içində heç o yolu getməmək istəyənlər vardır. Yoxsa yolu təyin etmədən bir cəmi-ğəfirin önünə keçib camaəti gah iləri, gah geri, gah sağa, gah sola çəkərək aldatmaq cayiz olamaz. Yolu təyin etmədən zülmət içində yol getmək və bu surətlə xəlqi kor-koranə bir girdabi-xətərnakə doğru aparmaq böyük bir cinayət olur. Biz qəzetəmizin məsləkini ibtidadan bildirmək istəyiriz. Bəyənənlər oxumağa rəğbət edərlər. Bəyənməyənlərin də bilaxirə tən etməyə həqqi olmaz. Məsləkimiz qəzetəmizin adından da istidlal oluna biləcəyi vəchlə həyatın mənayi-həqiqisinə xidmətdir. Həyat isə mənən, fikrən və maddətən daimi bir hərəkətdən, bir fəaliyyətdən, cismani və ruhani bir nəşvü nümadan, bizi bir dövri-kəmalə yaxınlaşdıran mütəmadi bir nəşvü nümadan ibarətdir. Bir fərd üçün belə olduğu kibi bir cəmiyyət, bir millət, hətta bütün bəşəriyyət üçün də böylədir. Bizlərə gəlincə şübhə yoxdur ki, bir hikməti-xəfiyyeyi-ilahiyə məbna hidayəti-rəbbaniyyə ilə müşərrəf bilislam olaraq kürcyi-ərzin bir qismi-əzimində təvəttün edən millətimiz qəvi, zində, bilcümlə xafi həyat ilə müttəsif bir millətdir. Həm də tazə cavan bir millətdir, hənuz həyatın dövri-kəmalə doğru gedən yolunun mənzili-əvvəlindədir. Sinni-kəmal deniləm bir dövrə vasil olmamışdır ki, qocalığa, zavala üz tutsun. Bunu bilməmiz lazımdır.

[1] Tərcüməsi: Əgər Kəbənin həvəsilə biyabanda istəsən qədəm vurasan,
Dəvə tikanı əgər səni dalasa da qəm yemə.
Bu və sonrakı farsca şeir və nəsr parçalarının tərcüməçisi Çingiz Sasanidir (*tərt.*).

İnşaallah gələcəkdə bunu ayrı məqalələrlə göstərməyə səy edəcəyiz. Burada ancaq bunu demək istəriz ki, zatən zihəyat olan millətimizə qəzetimiz həyat vermək iddiasında deyil! Qəzetəmiz ancaq bu həyatı bir ayinədə olduğu kibi əks etdirib göstərmək istər. Fəqət bununla bərabər qəzetəmiz həyatın mənayi-həqiqiyyəsinə, övsaf və şəraitinə agah bulunduğundan həyati-ictimaiyyəyi-milliyyəmizin nigahbanı olub daxildən və ya xaricdən, hər bir cür tərəqqi və təkamülə qarşı zühur edən maniə və müşkülata müqabilə etmək istər. Digər tərəfdən məlumdur ki, dünya və həyat bir meydani-cəngdir. Bütün zihəyat daima yek, digərləri ilə rəqabət və mühiti-təbiyyələrilə mübarizədə bulunuyor. İştə qəzetəmizin əsil vəzifəsi bu cəhətdədir. Borcu millətimizi qələmlə müdafiə və bu yolda mücahidədir. Lakin sayir əqvam ilə rəqabət edərək varlığımızı təqviyə etmək üçün əvvəlbəəvvəl geriləiyimizin səbəblərini mütaliə eyləmək lazımdır. Filhəqiqə səbəb nədir ki, bütün ətrak, bütün aləmi-islam bu gün sair əqvami-mütəməddinəyə nisbətən bu qədər geri qalmışdır. Bu məsələ barəsində gələcəkdə bitərəfanə və biqərəzanə bilaxof sözü aşkar söyləməyi özümüzə borc biləcəyiz. Ancaq doğru irayeyi-təriq xüsusunda əsla etidali-lisan və etidali-əfkardan ayrılmayacağız. Məsləkimiz nizamat və qəvanini-mövcudə dairəsində müntəzəmən və tədricən irəliləmək sürətilə tərəqqiyə xidməti iqtiza etdirir. Burada şübhəsiz bəzi müşkülat baş göstərəcəkdir. Çünki mötədil tərəqqipərvəranidən bulunacağımız cəhətlə sağımızda və solumuzda duran iki böyük firqə ilə mübarizəyə məcbur olacağız. Sağımızda duranlar firqeyi-mühafizəkarandır ki, hər növ tazə və cədid şeylərdən və işlərdən həzər edib insanları ələtdəvam bir nöqtədə saxlamaq xəyalındadırlar. Bunlar daima xalqın irəliləməsinə sədd çəkirlər. Solumuzda duranlar isə rəqiblərimizi kor-koranəyə təqlid edərək birdən-birə sıçramaq, özlərini qorxulu girdablara, uçurumlara atmaq istəyirlər! Hər iki tərəfdən əlhəzər! Birincilər dini-mübini-islamın ruhuna vaqif olmayaraq öz zövq və həvəslərinə müvafiq bir halətdə qaldığını xəyal edirlər. İkincilər isə zənn edirlər ki, islamda mədəniyyətə, tərəqqi və təkamülə xidmət edəcək bir şey yoxdur. Avropa cəhətindən əsən bütün yellər, hətta zəhərli yellər belə şəfabəxşdir. Bunlar bütün şu maddiyunluğun, dəhriyunluğun, iştirakiyunluğun mahiyyətlərinə özləri belə agah olmadan bu təriqəti-fəlsəfiyyələri nəşrə çalışıyorlar!.. Nə böyük yanlışlıq!.. Biz isə türk, müsəlman və rus rəiyyəti bulunduğumuz üçün türklük və islam dairəsində və rus



dövlətinin şəraiti-iqtisadiyyə və siyasiyyəsi daxilində tərəqqi etmək istəriz. Biz arzu edəriz ki, bizim tərəqqimizə baxıldıqda, rus rəiyyəti bulunan türk və müsəlmanlar nə gözəl tərəqqi ediyorlar deyilsin. Yoxsa türklər, müsəlmanlar irtidad ediyor, firəngləşiyorlar deyilməsin! Türkün irtidad edib firəngləşməsi, firənglərin ya mürtədlərin tərəqqisi deməkdir, yoxsa türk ya müsəlman tərəqqisi demək deyildir!.. "Təfavüt əz koca ta bekoca"[1].

Müsəlmanız, onun üçün dünyanın hər nərəsində xeyrxahı bulunduğumuz din qardaşlarımız tərəqqi etsə biz o tərəqqiyi əz canü dil alqışlarız! Türküz, binaənəleyh türküz. Türkün hər yerdə tərəqqi və təkamül ilə məsud olmasını arzu eyləriz. Rus təbəəsiyiz, binaənəleyh bütün rus vətəndaşlarımıza məsudiyyət və rifahiyyət diləriz. Və əlhasil sifati-səlasə ilə müttəsif olmamız bizi bütün islamın, ətrakın və rus camaətinin xeyrxahı olmaya sövq edir. Sədəd və mətləbimizdən uzaqlaşmayalım. Yuxarıda dedik ki, məsləkimiz həyatın mənayi-həqiqiyyəsinə xidmətdir. Əcəba, məsləkimiz, niyyətimiz dini-islama müvafiq gəlirmi? Əcəba, islam həyata nə nəzərlə baxıyor? Əcəba, onu bir lüzumlu hesab ediyor. Xeyr! "Əddünya məzrəətül-axirəmənkanə fihəzəhə"[2]. Ey qare, rükni-əzimi-islam olan Qurani-kərimi anlaya-anlaya oxudunsa, bilirsən ki, həyat cənabi-həyyi-layəmutun ən böyük nemətlərindən məduddur. O nemətə əhəmiyyət verməmək küfrani-nemət deməkdir. Bir kərrə rəbbina-atina fiddünya həsənətən və filaxirət həsənətən duasını xatırla. Burada zikr olunan həsənə və dünyadan murad həsənati-maddiyyə və mənəviyyədir.

Bu həsənati-maddiyyə və mənəviyyə həm fərdə, həm cəmiyyət və millətə aiddir. Fərdə və heyəti ictimaiyyətimizə aid olan həsənati-maddiyyə və mənəviyyəyə isə ancaq vəzaifi-həyatiyyəmizi mükəmmələn etdiyimiz halda nail ola bilərik. "Leysə lil insan illa masəa"[3]. Səy və qeyrət daima əgər fikrən və cismən hərəkət və fəaliyyəti-daimidən ibarət isə həyatın başlıca şərtlərindən biridir ki, nəticəsi getmək, tərəqqi etmək, nəşvü nüma və təkamüldür. Bunların əlaimi-zahirəsi nədir? Əvvəla, heyəti-ictimaiyyəmiz əfradının mümkün mərtəbə əksəriyyəti arasında maarifi-ümumiyyənin intişar və təzaidi. Lakin hansı maarif? (Mən ərəfə nəfsəhu, fəqəd ərəfə rəbbəhu)[4]

[1] Fərq hardan hara kimidir.
[2] Dünyasız axirət, axirətsiz dünya olamaz.
[3] İnsana yalnız çalışmaq gərəkdir.
[4] Özünü tanıyan Allahını tanımış olur.

hədisi-şərifinin müstəfadınca ancaq o taifə, o millət təriqi-fəlah və nicatda olur ki, özünü tanıya. Yəni hər qövm və millət öz qövmiyyətinə, lisanına, dininə, tarixinə, adət və əxlaqına və əlhasil özünün bütün əhvali-maziyyə və hazirəsinə, hətta əhvali-atiyəsinə kəsbi-vüquf eyləməlidir. Binaənəleyh "Həyat" milelül-islamiyyəyə və ələlxüsus türk qövmünə dair məlumat və onların nə olmuş olduqlarına və nə olacaqlarına bacardıqca diqqət edib bu yolda türklərin əhvali-siyasiyyə və tarixiyyə və ədəbiyyələrinə dair nəşriyyata qeyrət edəcəkdir. Kəsbü karidən səmərə hasil olmaq üçün əvvəl əmrdə bilgi və vüquf lazımdır. Bilgi və vüquf isə elm və lisan ilə olur. Bir əcnəbi lisanında dəxi elm təhsil oluna bilər. Fəqət bu surətlə təhsil olunan elm əfradi-məhdudə beynində qalıyor. Millətin əksəriyyəti arasında intişar edəmiyor. Ülum və maarif əksəriyyət beynində intişar etmək üçün lazımdır ki, millətin öz ana dili məlum və maarif təhsilinə alət olsun. Təbiri-axərlə lazımdır ki, millət öz dilinin qədrini bilsin və onun tərəqqi və təkamülünə çalışsın. Bir vaxtlar Şərqdə milləti-islam beynində ərəb və fars dilləri ülum və maarifə alət bulunmuş olduğundan ərəb və fars qövmləri xeyli tərəqqiyyati-iqtisadiyyəyə və ictimaiyyəyə malik oldular. Bu gün isə ülum və ədəbiyyat türk dilində olmaq üzrə tərəqqiyə başlamış olduğundan ümum Şərqdə maarifin ən gözəl vasiteyi-intişarı türk lisanı olmuşdur. Türk lisanı bu xüsusda mütəhəddid şəraiti mətlubeyi-camedir. Miləli islamın ruhu olan dini-mübini-Məhəmmədinin əsasən nədən ibarət bulunmaqda olduğuna dair mütaliat və müzakiratda bulunacağız. Lakin bir qövm tayfanın həyatı məhz ruhaniyyatdan ibarət olmayıb, həyati-maddiyyə və cismaniyyəni dəxi möhtəvidir. Binaənəleyh tərəqqi və nəşvü nümadan ibarət bulunan həyatın bir əlaməti zahirəsi də sərvət, yəni dövləti-milliyyənin çoxalmasıdır. Və bu surətlə rifah və səadətin artmasıdır. Bunun üçün "Həyat" daima sərvəti-milliyyənin təzayüdi-vəsaitini göstərməyə çalışacaq. Ticarət, ziraət və sənayeyə dair müzakirata girişəcəkdir. Bunlardan başqa həyati-milliyyəmizin ən birinci şərti əxlaq və adabın qəvaidi-həsənə və məmduhə üzrə olmasıdır. Əxlaq pozuqluğu, sirqət və qətl cinayətləri, kizb və böhtan, büğz və nifaq, həsəd və ilaxir məzmum sifətlərlə məttəsif olan taifə əsla fəlah bulunmaz. Bunun üçün "Həyat"ın vəzifələrindən biri də təhzibi-əxlaqi-millətə səy edib Qurani-məcid və şəriəti-qərrayi-Məhəmmədi iqtizasınca insan nə cür olub və özündən qeyrilərlə nə tövr müaşirət və müamilə etməsi nöqtələrinə



diqqət edəcəkdir. İndi yuxarıda məslək haqqında yazdığımızı xülasə edəcək oluruqsaq, deyəriz ki, tərəqqi edib, behəqq "zihəyat" bir millət olmaq istərsək, bizə hər şeydən əqdəm islam bulunmaq, islam qalmaq əlzəm və bilcəllə məsaiyi-həyatpərəstanə və tərəqqipərvəranəmiz əhkami-islamiyyəyə tofiqən icra olunmalıdır. Bizim üçün islam xaricində nicat yoxdur. Bunu mazidə bütpərəst, ya atəşpərəst olan əcdadımız idrak etdikləri üçün dini-islamı qəbul və nəşrilə müşərrəf olmuşlar idi. Ancaq hikməti-islamiyyəyə vaqif olmalıyız və bu hikmətdən feyzyab olmamıza, nuri ilə tənəvvül etməyimizə hail olan maneələri ortadan rəf etməyə qeyrət etməliyiz, digər tərəfdən də aləmi-islamın hər nə səbəbdənsə bir neçə əsrdən bəri haləti-təvəqqüfdə qaldığı, hətta gerilədiyi bir müddəti-mədidə zərfində Qərb aləminin durmayıb, təriqi-mədəniyyətdə nə cür tərəqqiyyata nail olduğunu nəzəri-etibar və ibrətə almamız lazımdır. Fəqət bu cəhətdən dəxi zəvahirə aldanmayıb bu mədəniyyətin din və qövmiyyətlərə deyil, bəlkə ümumi-bəşəriyyətə aid əsaslarını mütaliə ilə əsbabi-tərəqqi və rifahiyyətlərini dini-islama tovfiqən millətimizin tərəqqiyyatına tətbiq etməliyiz. Avropa ülumuna, maarifinə, ədəbiyyatına, sənaət və sonayeinə kəsbi-vüquf etməyə və millətimiz beynində nəşrə çalışmalıyız. Biz belə yapmağa qeyrət edəcəyiz. Məsləkimiz bunu iqtiza etdirir. Çünki bu surətlə qüvvətimiz, həyata istehqaqımız, sair millətlərlə rəqabətə qabiliyyət və istedadımız və əlhasil mühitimizlə, yəni bizi əhatə edən canlı və cansız bütün mövcudat ilə mübarizəyə iqtidarımız təzayüd edə bilir. Ancaq qəzetəmizin heyəti-mühərrirəsində çalışmaya, yazıb-pozmaya bir həvəs, bir şövq olmaq üçün lazımdır ki, cəmaətimizin hüsni-təvəccöhünə, müavinəti-maddiyyə və mənəviyyələrinə məzhər olsunlar. Bizim saf və səmimi niyyətlərimiz budur.

Ümid ediriz ki, xudavəndi-aləm bizə öz tovfiqini əta buyurub milləti-nəcibədə öz müavinəti-ruhanisini müzaiqə etməsin.

*Ə.H.*

*"Həyat", 1905, №1*

# QƏZETƏMİZİN DİLİ HAQQINDA BİR NEÇƏ SÖZ

Bizəmi qəzetəmizin dilini sadələşdirmək, yoxsa, cəmaətimizəmi öz ana dili olan türkcəyi öyrənmək lazımdır. Budur məsələ!.. Rəyimizə görə yazdığımızdan daha sadə Qafqazda söylənən şivələrə daha müvafiq bir surətdə yazmaq mümkün deyildir. Vaqiən, qəzetəmizdə yazılan məqalə və bəndlərin şivəsi, üslubu müxtəlifdir. Lakin bunu da yaddan çıxarmamalıdır ki, yazanlarımız da Qafqazın və Rusiyanın müxtəlif şivə ilə mütəkəllim guşələrindən gəlmişlərdir. Birimiz Qarabağdan, birimiz Gəncədən, ya Şirvandan gəliriz. Birimizin vətəni lap Rusiyanın ortasındadır. O birimizin vətəni isə ya Osmanlı, ya İran sərhədinə yaxındır. Qəzetəmizi qiraət edənlər də böylədirlər. Amma həqiqət aranılırsa, bu şivələrin heç birinə, hətta qəzetəmizin ən ziyadə nəşr olunduğu Bakı şivəsinə belə rüchaniyyət verməmək icab edər. Cümləsini tovhidə çalışmaq lazımdır. Orta yerdə, vəsətdə durmağa qeyrət etməliyiz. Çünki, hər hansı şivəyi ayrı-ayrı ələ alsaq, hər birində bir nöqsan görürüz. Bəzi şivələrdə əfkari-aliyyə və hikəmiyyəyi-ifadəyə, məsaili-siyasiyyə, ya ictimaiyyəyi, mətalibi-iqtisadiyyəyi bəyana artıq söz qalmamışdır. O biriləri türkcə sərfi və nəhvi bilkülliyyə yaddan çıxardıb, artıq bir neçə türkcə sözü fars ya rus nəhvinə tətbiqən yan-yana düzərək ifadeyi-məram etmək istəyirlər. Şübhəsiz, böylə olamaz! Bakı şivəsi iləmi yazaq? Yazarsaq qorxuram ki, qeyri türklər içində, türkcəyi yaxşı bilən türklər içində rüsvay oluruz!.. Ey qare, şübhəsiz "Həyat"ın altıncı nömrəsindəki "Dərviş" imzalı "Balaca mütəfərriqə"yi oxudunuz. Orada qəzetəmizin dilini bəyənməyib tən və rişxənd edən zatın sözlərinə diqqət etdinizmi? Rus lisanına vaqif deyilsiniz, əlbəttə, o sözlərdən bir məna çıxarammadınız. Nümunə üçün bir daha burada dərc edib idrak edə bilməniz üçün tərcümə dəxi edəcəgəm: "Yahu... "Həyat" qəzetəsinin rəsmi-güşadına... təşrif gətirdinizmi? – sualına bir zat bu surətlə cavab veriyor:

– Bana "priqlaşeni" göndərməmişdilər və bir də vallah "zanyatiyam" o qədər çoxdur ki, sən öləsən[1], obed də yadıma düşməyir... Danış görək nə var idi, yaxşımı keçdi? "Reç" zad deyən oldumu! Və ilx.

[1] Yalan deyirsəm "mən öləyim deyəcək" – yerdə müxatəbin arzu olunmayan mövtə yəmin olub Qafqazın bəzi tərəflərinə məxsus qərib bir təbirdir.



Bu zatın yarım rusca və yarım türkcə olan bu sözlərini türkcədən başqa bir dil bilməyənlər üçün tərcüməyə məcburuz.

Ağa demək istəyirdi ki: – Bana dəvətnamə göndərməmişdilər. Bir də billah məşğuliyyətim o qədər çoxdur ki, "sən öləsən" günorta taamı da yadıma düşməyir... Danış görək nə var idi, yaxşımı keçdi? Nitq-filan irad edən oldumu?..

Hər zaman qəzetəmizin dili bu tərcümədə göstərildiyi kibi olacağından şübhəsiz bəzi zəvat bunu bəyənməyəcəklər. "Dəvətnamə", "məşğuliyyət", "taam", "nitq" və sair kimi sözlərə mügləq və öz təbirlərincə "qəliz"dir, ərəbcədir, anlaşılmıyor deyəcəklər. Nə qayıraq? Öz ana dilini bilməyən bir neçə zatın xətiri üçün türkcə hüruf ilə yazılmış rusca bir qəzetəmi çıxaraq? Qəzetimizin dilinə etiraz edənlərin bir qismi bu cür xəlqdəndir! Bunlar dəvət olunmaq, iş görüb məşğul olmaq, xörək yemək kimi ən sadə mətləbləri öz ana dillərində ifadədən aciz qalırlarsa, bunlara əhvali-aləmi, ülum və fünundakı tərəqqiyyatı, məsaili-siyasiyyə, iqtisadiyyə və ictimaiiyyəyi, ehtiyacati-zəruriyyəyi-milliyyəmizi, hikəmiyyəti-islamiyyəyi hansı dildə anladaq? Türkiyi-cədid artıq türkiyi-qədim deyildir. Türkiyi-qədim üzrə yazmağa qalxışsaq, heç kimsə sözümüzü anlamaz. Məsələn, Mir Əlişir Nəvai kimi desəm ki, "uçmaq" içrə həyat tapğaylar tamuğdan nəcat tapğaylar. "Uçmağ"ın behişt, cənnət və "tamuğ"un cəhənnəm, duzəx olduğunu içimizdə anlayan olacaqmı?.. Şübhəsiz xeyr! Nə üçün? Çünki bugünkü dilimiz türkiyi-cədiddir. Türkiyi-cədid isə bir tərəfdən dini-islamın, bir tərəfdən də vüquati-tarixiyyənin təsirilə ərəb və farsdan çox kəlmələr alıb müruri-zamanda bu iki dil ilə o qədər ülfət eləmişdir ki, artıq onların xəzaini-lüğəviyyəsini özünə mal eləmişdir. Hər nədənsə türklərin təbiət və məzaci-milliləri ancaq dini-islam ilə mütədəyyin olmağı iqtiza etdirmiş ikən, lisanları dəxi ancaq farsi və ərəbi kəlmələr əxz və qəbulə meyil göstərib, sair lisanların kəlimatını bəyənməz, rədd edər!.. Bunun üçündür ki, rus, firəng, ingilis kibi Avropa əlsənəyi-cədidəsi tərəqqi və təkamül və təvsi eyləmək üçün yunan və latın lisanları kibi əlsənəyi-mürdədən istifazə etdikləri kibi türkiyi-cədid dəxi bu gün bir cəhətlə mürdə və bir cəhətlə zində olan ərəbin və farsın xəzaini-lüğəviyyəsini özünə bir məxəz ittixaz elədi. Bu surətlədir ki, türk şivələrindən biri olan osmanlı lisanı o dərəcə təvsi və təkamül etdi ki, ən ali, ən dərin fikirləri, ən nazik, ən rəqiq hissləri ifadəyə bugünkü ərəbi və farsi dillərindən belə müstəid və müqtədir olub bilapərva hər hansı Avropa

dili ilə rəqabət edə bilir. Ancaq türkiyi-cədid ərəb və farsın lüğətinə ehtiyac göstərir. Yoxsa sərf və nəhvi qəvaidi-lisaniyyəsini qəbul etməz. Çünki, öz qəvaidi-lisaniyyəsi bu dillərin qəvaidi-lisaniyyəsindən fitrətən daha bəsit, daha asan və binaənələyh daha mükəmməldir. Lüğət xüsusunda dəxi türkcəmiz ərəb və farsın hər kəlməsinə meyl göstərməz. Öz təbinə müvafiq olan kəlimatı alır. Bunun üçündür ki, yəzdan, giyti, kuhi, dirəxt və ilx. kimi kəlimat dilimizə daxil olmayıb bunlara xuda, allah, ağıl, cahan, dünya, cəbəl, şəcər və ilx. kimi sözlər tərcih edilmişdir. Ülum və fünun tərəqqi etdikcə, ixtiraat və kəşfiyyat çoxaldıqca ətrafımızda, mühitimizdə yeni-yeni şeylər, fikrimizdə yeni-yeni mətləblər, mənalar peyda olacağından, əlbəttə, bu şeylərə, bu mətləb və mənalara yeni adlar vermək lazımdır. Avropa lisanları bu adları, bu yeni kəlmələri latın və yunan dillərindən alıb yaradıyorlar. Zənn edilməsin ki, yunan və latın dilləri cədid Avropa lisanlarından vasc və mükəmməldir və mürdə olan məzkur lisanda hər yeni ixtira və kəşfə məxsus ad hazır və mövcuddur da, onun üçün böylə edilir! Xeyr! Bu lisanlar olmuş olduqlarından onların sadə və müəyyən bir məna ilə olan kəlmələri alınıb bəsit, ya mürəkkəb bir halda başqa məna ilə istemal edilir. Məsələn, sinini-əxirə zərfində icad olunan fotoqraf, teleqraf, fonoqraf, telefon və ilx. alətlərini ələ alalım. Bunları yunani-qədim bilmədiyindən lisanlarında bu alətlərin adı da olamayacağı aşikardır. Amma "işıq", "səda", "yazı" bugünkü kimi yunanilər zamanında dəxi mövcud olduğundan, bu kəlmələrin müqabili, əlbəttə, onlarda da var idi. Bu halda avropalılar üçün "işıq", "səda" və yazıya məxsus öz kəlmələrini yenə bu mənalara həsr edib, yunanın kəlmələrini isə yeni icad etdikləri alat və ədəvata ad vermək və bu surətlə dillərini zənginləşdirib tovsc etmək üçün istemal eləmələrinə nə mane var? Biz nə üçün avropalılar kimi hərəkət etməyəlim? Nə üçün biz də türkcəmiz üçün latın və yunan dilləri məqamında olan fars və ərəb dillərinə müraciət etməyəlim? Lazımdır ki, biz də "işıq", "səs", "yazı" sözlərini öz mənalarında mühafizə edib farsın, ya ərəbin bunlara müqabil olan "pərtov", "səda", "nəviştən" kimi kəlimatını yeni ixtira olunan alat və ədəvata tətbiq etməklə fotoqrafa – pərtovnəvis, fonoqrafa – sədanəvis, telefona – durşeno və ilx. deyəlim! Və bu surətlə dilimizi tovse edəlim. Böylə etsək, şübhəsiz, çox keçmədən dilimiz farsiyə mürəccəh ola biləcəkdir. Çünki fars özü "pərtovnəvis", ya "durşeno" kibi kəlmələri icaddan aciz qalıb fotoqraf, ya telefon



deməyi tərcih edəcəyi halda türki-farsi kəlmələrindən mürəkkəb məzkur ibarələrlə təzyin etmiş olacaqdır.

İndi sual olunur ki, dilimizi əcnəbi lüğətlərlə doldurmaqmı lazım, yoxsa dilimizdəki nöqsanları ikmal üçün bu dilə münasibəti-diniyyə, tarixiyyə və ədəbiyyəsi olan ərəb və farsi dillərinə müraciət eləməkmi müvafiq məsləhətdir. Əlbəttə, içimizdə öz lisani-millisinin qədrini bilən hər fərd ikinci şiqqəyi tərcih edər. Ərəbi və farsi kəlimata müğləq, qəlizdir, deyənlərdən sual edirəm ki, kapitalist, ekonomiya, pressa, direktor kibi sözlərmi, yoxsa sərmayədar, iqtisad, mətbuat, müdirmi müğləq və "qəliz"dir? Bir əsəri Avropa dillərindən tərcümə əsnasında sözü mənayi-həqiqi və müəyyəniləmi tərcümə etməli, yoxsa xalqımızın asan anlaması üçün mənayi-əsliyi təhrifmi etməli?

Keçənlərdə bir məqalədə rusca "Mir zaklyuçit" sözünü "sülh əqd etmək" surətilə tərcümə eyləmək istəyirdim. Rüfəqamdan birisi buna etiraz edib dedi ki, böylə tərcümə etsən kimsə anlamaz. "Sülh etmək" yazmalıdır. Lakin "sülh etməklə" "əqdi-sülh etmək" birmidir? "Sülh etmək" sadəcə barışmaq deməkdir. "Əqdi-sülh" isə qanun və nizam dairəsində, şahidlər hüzurunda əldə kağızlar, əhdnamələr tərəfeyn tərəfindən imzalanmış şərtnamələr olduğu halda barışmaq deməkdir. Əgər dilimizdə "sülh bağlamaq" demək mümkün olsaydı, əlbəttə, böylə tərcümə edərdim. Fəqət "sülh bağlamaq" təbiri çox qərib görüldüyündən də sözü haqqı ilə tərcümə üçün naçar "əqdi-sülh" ibarəsindən ayrılmadım. Biz mənayı pozamayız. Lazımdır ki, xalq öz dilini öyrənməyə rəğbət eləsin. Bu xüsusda gələcək nüsxələrdə daha danışarız.

*Ə.H.*

*"Həyat", 1905, №7*

## TÜRKLƏR KİMDİR VƏ KİMLƏRDƏN İBARƏTDİR?

Qəzetəmizin türkcə bir cəridəyi-islamiyyə olduğu hər nüsxənin başında zikr olunuyor: "Türkcə" və "islamiyyə" ibarələri hər nə qədər surəti-zahirdə qayət aydın və aşikar sözlərə bənzəyirlərsə də, həqiqət halda öylə deyildir. Bu kəlmələr asan, sadə, munis görünürlər və hər kəs öylə zənn edir ki, bunlar izahata, şərh və təfsirə möhtac deyil-

dir. Böylə zənn edənlər, əlbəttə, səhv edirlər. Çünki, qəzetəmiz illərcə intişara davam etdikcə məzkur iki kəlmənin mənalarını bəyan etməklə məşğul olacaqdır. Bu xüsusda çoxdan bəri mövcud batil, zənniyyatı, fərziyyatı, səhv və xətaları ortadan rəf eləməyə səy edəcəkdir. Lisanımızı, qövmiyyətimizi, tariximizi, tariximizə zinət verən böyüklərimizi, qəhrəmanlarımızı, dinimizi məzmum sifətlərlə ləkədar etmək istəyən qərəzkaranə nəşriyyata, rəqiblərimizə, çox kərrə də biz özümüz aldanıb inanırız. Bunların nə niyyət və məqsədlə yazılmış və yazılmaqda olduğunu bilməyiriz. Hətta məəttəəssüf keçənlərdə türk qəzetələrindən birində belə tatarlara, türk və tatarların mədari-iftixarı bulunan Çingizlərə və Teymurlara dair narəva sözlərə rast gəlmiş idik. Türklüklə iftixar etdikləri halda türkün kim və kimlərdən ibarət bulunduğunu bilməyən nə qədər türk mühərrirlərimiz vardır!.. Şübhəsiz, öz qövmünü ehya edən, öz məmləkətini abad edən, öz millətini təriqi-tərəqqiyə sövq ilə anı mədəniyyətin bala mərtəbələrinə çıxardıb şərəf qazandıran böyük cahangirlərə öz qövm və milləti nəzərilə deyil, başqa və rəqib millətlərin nəzərilə baxarsaq böylə cahangirlər haqqında əlbəttə yaxşı söz deyəməyiz. Səd ibn Vəqqasın mədəniyyətə xidmətini iranilərdən sormayın, ərəblərdən sorun? İranilərin, zərdüştilərin mədəniyyəti-qədimələrini kökündən məhv etdiyi halda, islam və ərəb mədəniyyətinin xadimi bulunurdu... Dövri-cədiddə Moltke və Bismark fransızların səbəbifəlakətləri olduqları halda almanların vəliyyül-nemətləri bulunurlar. Şübhəsiz, birincilər bunlara vəhşi, xunxar deyərək məzəmmət edir, ikincilər isə bunların mədh və sitayişindən aciz qalıb namlarına heykəllər tikərlər. Lord Keçnerdən burlar şikayətçi, ingilislər isə fövqəladə razıdırlar. İştə Teymurun da türk mədəniyyətinə etdiyi xidmətləri Dəşti-Qıpçaq, İran-Osmanlı, Çin əhalisindən deyil, Asiyayi-Vüsta türklərindən, Səmərqəndi təzyin edən asari-memariyyədən, öz nəsli bulunan Uluğbəylərin, Babur Mirzələrin təlifatından, cığatay ədəbiyyatına şərəf verən şüəra və üdəbanın yazdığı kitablardan sormalıdır. Bu xüsuslarda batil fikirlərimizi təshih etməliyiz! Ancaq tariximiz və keçmişdəki əkabiri-milliyyəmiz haqqında həqiqəti meydana çıxarmaq üçün əvvəl əmrdə özümüzü tanımalıyız. Yəni, türklərin kim olduqlarını və kimlərdən ibarət bulunduqlarını, nərədən nəşət etdiklərini, neçə şöbəyə ayrıldıqlarını, bu gün nərədə sakin olduqlarını və nə namlar təhtində yaşadıqlarını göstərməliyik. İçimizdə özbəklərin,



qırğızların, başqırdların türk olduqlarını bilməyənlər də vardır!.. Binaənəleyh məsələ qayət mühümmüdür. Surəti-zahirdə nə qədər sönük görünsə də, həqiqət halda böyük və daimi bir əhəmiyyətə haizdir. Bu məsələ ilə bu gün deyil, bir neçə əsr əvvəldən bəri iştiğal etmək lazım idi. Mazidə ehmal olunmuş bu məsələyi gələcəyə, uzaq gələcəyə tərk etməyib heç olmazsa indi ələ almalıdır. Ancaq böylə bir məsələni həqqilə tənvir edə bilmək, bir, ya iki fərdin işi deyildir. Bəlkə onu mütaliə üçün beynəlislam xüsusi darülfünunlar, məclislər, cəmiyyətlər mövcud olmalı.

Finlandiya Helsenkfors şəhərində "Fin və uğor (yəni uyğur) ismilə bu kimi məsail ilə məşğul bir cəmiyyəti-fənniyyəyi-məxsusə vardır. Peterburq darülfünununda əqvami-Türkiyə əhvalına vüquf üçün ayrıca şöbə olduğu kimi, akademiya (Əncüməni-daneş) əzası arasına dəxi "ətrakşünaslıqda" şöhrət qazanmış Vasili Radlov kimi böyük alimlər vardır.

Macarıstanda elmi-əhvali-ətrakın nə dərəcələrdə tərəqqiyata məzhər bulunduğunu göstərmək üçün Vamberinin, Uyfalvunun namlarını zikr etmək kafidir. Ümum Avropada isə bu yolda çalışan müstəşirqinin və bu cür üləma tərəfindən yazılan asari-mühümmənin adlarını saymaq üçün qəzetə sütunları yetməz. Hətta Daniya (Danimarkalara) varıncaya qədər kiçik məmləkətlər belə bu elmdə mühüm kəşfiyyatlar ilə tarixi-ətraka, aləmi-ətraka xidmətlərdə bulunmuş (gərçi bu xidmətlər bizcə məchul qalmış), Vilhelm Tomsen kimi böyük alimlərlə fəxr edirlər. Məsələnin əhəmiyyətindən naşi Avropanın bəzi yerlərində[1] mövcud olaraq övraq və rəsaili-məxsusə dəxi nəşr olunur. Qəribədir ki, məsələ ən ziyadə türklərə mütəəlliq ikən aramızda bu yolda sahibi-tətəbbö bir alim yetişmək nədir, hətta Avropa üləmasının əhvali-ətraka dair asari-tətəbbüati-fənniyyələrinə aşina olanlarımız belə pək nadirdir!

Vaqiən, axır zamanlarda Osmanlı türkləri arasında mərhum Şəmsəddin Sami bəy, Nəcib Asim və sair bəzi zəvati-möhtərəmə bu vadidə bir cığır açmaq, yeni bir yol göstərmək təşəbbüsündə bulundular! Ancaq bunlar təşəbbüsdən iləri gedəmədilər!.. Nə üçün? Çünki məsələyə elm və irfan sahiblərinin qüvayi-müttəhidəsilə çalışmaq, məclislər, cəmiyyətlər, darülfünunda şöbələr güşad etmək, türk asari ətiqəsini aramaq üçün uzaq məmləkətlərə fənni-heyətlər göndərmək lazımdır!.. Lakin heyhat, heyhat!

[1] Müntəzəm "vəqt və fasilələrlə çıxan" deməkdir.

* * *

Bu kimi məsələlərlə behəqq iştiğal etmək üçün əvvəla “Elmi-əhvali-əqvam”, “Elmi-bəşər”, “Elmi-lisan” və sairə kimi bir neçə elmdə tətəbbö və ixtisas sahibi olmaq lazımdır. Biz isə belə bir ixtisas sahibi olmadığımıza etirafla bərabər deyə bilərik ki, hər həqiqəti millətimizə sadə və bir rəngdə göstərmək istəyən “Həyat” sütunlarında bir surəti-ümumiyyə və bəsitədə bəhs edəcək qədər məlumati-lazımədən də məhrum deyiliz. Zənn edərəm türk lisanında çıxan bir qəzetənin nüsxələrinə göz gəzdirərkən atidəki ibarələrə rast gəldik:

“Biz tatarları türkdən xaric buraxmadıq, şu qədər ki, tatar namilə bir cins, bir lisan, bir çöhrə, bir cəhətin bu gün mövcud olduğu pək məlumdur”. Lakin volov türk irqinin, bir fərini təşkil etsin. Tatar namında bir qövm əlbəttə vardır. Bunlar böyük hökumətlər təşkil etmişlər, cahangir olmuşlar və ilx. Mühərrir məqalənin bu qədər sözləri içində fəna, səhih bir cümlə varsa, o da “tatar namında bir qövm əlbəttə vardır” – sözüdür. Şübhəsiz, vardır! Ancaq bir qövm, bir əşirət, ya qəbilə halında bunlar Çin daxilindən xaricə çıxmamışlardır. Çıxanlar isə ancaq ayrı-ayrı zəvatdan, qoşun böyüklərindən və sairədən ibarət qalmış, yoxsa öz qövmlərini özlərilə birlikdə bəri cəhətlərə çəkib gətirməmişlərdir.

Bunlar isə moğol cinsinə mənsub olduqlarından bütün moğollar kimi türk irqinin bir fərini təşkil edəməyib, moğol irqinin bir fərini təşkil edirlər. Binaənələyh türkdən xaric tutulmaları əlzəmdir. Əgər cahangir olmaq qövmiyyətə, millətə, millətin heyəti-məcmuəyi-ictimaiyyəsinə aid isə moğolların bu qismi bəri cəhətlərdə nə böyük hökumətlər təşkil etmiş və nə də cahangir olmuşlardır. Ancaq müxtəlif dövrlərdə əsakiri-əziməyə müvəffəqiyyətlə sərkərdəlik etdikləri inkar olunmaz! Bunların moğol irqinə mənsubiyyətlərindən naşi, təbiidir ki, cinsiyyət, lisan və çöhrələri dəxi az-çox moğollara məxsus cinsiyyət, lisan və çöhrədir.

Tatar deyilən, səhvən tatar deyilən türklərə, daha doğrusu türklərin səhvən tatar deyilən qisminə gəlincə, bunların lisan və tarix cəhətilə moğollara müşabihət və münasibətləri çox azdır. Yox kimidir. Lisanları, irəlidə isbat edəcəyim vəchlə nisbətən qaba olmaq ilə bərabər Azərbaycan türkü, osmanlı, hətta cığatay şivələrindən ziyadə türkcədir. Yəni türkiyi-qədimə, farsın, ərəbin təsirindən azada qalmış türkiyi-əsliyə daha qəribdir və tatar türkcəsində görünən bu hal



Qərbdən Şərqə doğru getdikcə Volqa nəhrindən Baykal gölünə, ya Altay dağlarına təqərrüb etdikcə daha vazeh və aşikar oluyor.

“Cins” və “çöhrə” məsələsinə gələlim: Burada ancaq antropologiya (elmi-bəşər) qaydasınca miqyasi-cümcümə (qafa tasını ölçmək) və sair üsullar ilə tutulmuş bir statistika hökm oluna bilər. İçimizdə az-çox moğollara bənzəyənlərə “tatar çöhrəli” diyoruz, deyilmi? Burada iki mülahizə var və xatir ola bilər: Bir mülahizəyə görə ola bilər ki, burada bir irsiyyət məsələsi vardır. Yəni bu şəkildə olanlarımız, ya əbaən, cəddi külliyyən türkləşmiş bulunan moğollardır, yaxud damarlarındakı qana xeyli moğol qanı qarışmış olan türklərdir... “Üləmayi-bəşər” tərəfindən Qazan türkləri (tatarları) haqqında icra edilən tətəbbüat nəticəsində bunlardan təqribən bir nisfinin az-çox Avropa (yəni ariya) çöhrəsinə və bir nisfinin də az-çox moğol çöhrəsinə malik olduqları təbəyyün etmişdir. Ancaq bu hal qazanlıların moğol olduqlarını isbat edəməz! Çünki qismən moğol çöhrəli, qismən də Qafqaz çöhrəli olmaq halından türklərin hansı şöbəsi azad ədd oluna bilər? Əcəba, Azərbaycanda, Anadoluda, habelə bizzat Türküstanda bu yolda təhərriyyati-fəniyyə bizim öz tərəfimizdən dəxi icra edilsə, eyni nəticə hasil olmazmı? Anadolu içlərində öylə vilayətlər vardır ki, türklərinin çoxu “tatar”, yəni moğol çöhrəsinə malikdirlər... Bu isə əvvəllərdə səyahət edənlərə məlum bir keyfiyyətdir. Yuxarıda dedik ki, burada ikinci bir mülahizə daha vardır. Madam ki, hər tərəfdə, haman nisfi nisfinə hər iki çöhrə mövcuddur, o halda elmi-qəvam və elmi-bəşər nöqteyi-nəzərindən hansı çöhrəni ən ziyadə türk çöhrəsi ədd etməliyiz? Moğollaramı, yoxsa hind və avropalılara müşabeh olanlaramı; məsələ qayət müşküldür. Çünki əvvəla iki-üç min il əqdəm bir millət halını alaraq Baykal civarında Orxon və Yenisey nəhrləri səvahilində və Altay dağları ətəklərində yaşamış və türklərin ən qədimi və ən xalisi bulunmuş olan Tu-ku-ye qövmünün çöhrə və cümcüməsinə (qafa tasına) vüqufi-tamımız olmaq lazım idi. Mümkün isə həfriyyat icra edib üzami-qədiməyi müayinə və mütaliə etməli idik. Ola bilər ki, ən qədim zamanlarda dəxi hər iki çöhrə mövcud idi... Lakin çöhrə məsələsinin mücərrəd, özbaşına o qədər əhəmiyyəti yoxdur.

Türklər səhnəyi-tarixiyyəyə miladi-İsadan 2000 il əqdəm çıxıb, o vaxtdan bəri cinsən və lisanən müxtəlif və mütəəddid təsirata məruz olmuşlardır: Asiya qitəsinin şərqində mancu, moğol və çinlilərlə, qərbində isə irqi-qafqazidən olan əqvam ariya və samiyə ilə, yəni hindi, irani, islav, çərkəs, kürd, ərəb və sairə nəsillərilə qarışmış

olduqlarından bu gün hər tərəfdə şəklən, cinsən və lisanən qayət müxtəlif bir qövmdür.

Bir tərəfdən tarixin göstərdiyi vəchlə müqəddəmən türk ikən bilaxirə türkcəyi tamamilə unudub, başqa lisanlarla mütəkəllim qövmlər mövcud olduğu kimi, digər tərəfdən də öz qədim dillərini tərk edib türkcə təkəllümə başlayan və bu surətlə içimizə qarışıb bizlərdən mədud olan başqa qövmlər də vardır.

Xəzərləri, bu gün islavca söyləyən bulqarları, macarlara qarışmış hunları, hind əqvamına qarışmış catları, üləmayi-ətrakşünasan birinci zümrəyə nümunə ədd ediyorlar. Müqəddimən guya Fin və uyğur tayfasından olan başqurlar, Əfqan və Türküstan tərəflərində təvəttün edib iraniyüləsl olan sartlar isə bu gün tamamilə türklərə qarışıb türkcə söyləməkdə olduqlarından ikinci firqəyə misaldırlar. Bundan başqa bizzat türk əqvamından bir qismi digər qismi tərəfindən təməssülə uğradılıb, bu diqqət bir maddədir. Bütün bu söylədiklərimdən anlaşılıyor ki, ayrı-ayrı nə cins, nə çöhrə, nə lisan, nə adət və əxlaq və nə də din və məzhəb türk əqvamını fənnən tərif və təsnif üçün əsas tutulamaz. Bəlkə şəraiti-tarixiyyəyi-coğrafiyyəyə və sairə ilə bərabər bütün bu tedad olunan şəraitin heyəti-məcmuəsi nəzəri-etibara alınıb bu surətlə əqvami-türkiyyədən mətlubə ən ziyadə müvafiq olan bir ünmuzəc ittixaz olunmalı, digərlərinin isə cədvəli-təsnifdəki mövqeləri məzkur ünmuzəcə dərəcəyi-qürbiyyət etibarilə təyin edilməlidir.

Bunlardan hansının və nə dərəcədə türk namını daşımağa müstəhəq bulunduqları ancaq bu surətlə təbyin edə bilər.

* * *

Əsil mətləbimizə başlamazdan əqdəm "moğol", "tatar", "türk" və "turok" kimi istilahati-fənniyyəyə dair bir fikir edəlim. Bu gün "moğol" ləfzi etnoqrafiya əhvali-əqvam elmincə müəyyən bir qövmə məxsus istilahdır. Atidə bir cədvəldə göstəriləcəyi vəchlə bu qövm türkün qeyri olmaqla bərabər türk əqvamının dəxi mənsub bulunduqları Altay, yaxud Turan əqvamından böyük bir şöbədir. Türklərə bu surətlə bir münasibətləri olmaqla bərabər türklərdən başqadırlar. Halbuki türklərin tarixi-mədəniyyətdə böyük bir rol oynamış bir qisminə səhvən bu nam verilmişdir. Teymurləngin həfidi (nəvəsi) Babur Mirzənin Hindistanda təsis etdiyi böyük və mətin bir hökumətə



"böyük moğollar hökuməti" deyilmişdir ki, qətiyyən yanlış bir istilahdır. Teymur Burlas nam türk əşairindən birinə mənsub olub, türkcədən başqa bildiyi bir dil var idisə, o da sonradan öyrənmiş olduğu lisani-farsi idi. Moğolca bilməz idi. Babur Mirzəyə gəlincə, bu zatın tənzimi-dövlət və ümuri-idarədəki məharəti dərəcəsində qüvveyi-qələmiyyəsi də var idi. Əmuzadəsi Uluğbəy kimi həp türkcə yazmış olduğu asari-tarixiyyə və ədəbiyyə alan ortada mövcuddur. Qiymətdar olan bu əsərlər miyanında "Vəqaye", yaxud "Baburnamə" namilə bir də Babur Mirzənin özü tərəfindən qələmə alınmış bir tərcümeyi-halı vardır. Bu əsərin[1] bir çox yerlərində müşarileyh moğolca bilmədiyini etirafla bərabər əcdadı kimi özünün dəxi türk olduğunu və hətta türklüklə iftixar etdiyini bəyan eyliyor. Hindistandakı sülaləsinə "böyük moğollar" ləqəbi bir yanlışlıq əsəri olub bu yanlışlıq avropalılara bəzi İran müvərrixlərindən sirayət etmiş idi. Bu gün Avropa müstəşirqinin haman kaffəsi xətalarını anlayıb təshihi-maddə etmiş olduqları halda, biz nədən əski zəhabımızda səbat edib qalırız?

İndi Hindistanda böyük hökumətlər təsis etmiş olan bəzi türklərin üzərindən bu moğol[2] namını rəf edib yalnız aid olduğu əqvama təxsis etdikdən sonra gələlim "türk" və "tatar" istilahlarına.

"Tatar" istilahı mübhəm, qeyri-müəyyən, qeyri-fənni olduğuna və ancaq avampəsəndanə və cahilanə bir surətdə istemal edilməkdə bulunduğuna binaən türkoloqlar (üləmayi-əhvalşünasani-ətrak) fiyövmən bu istilahın ortadan götürülməsi tərəfdarıdırlar. Çünki tatar ləfzi mənayi-həqiqi əslisindən başqa üç-dörd məna ilə daha istemal olunur ki, kaffəsi yanlışdır. İbtida bu yanlış olanları mütaliə edəlim. Bəzi əski müvərrixin və müstəşirqin hər iki istilahı (türk və tatar ləfzlərini) həmməna və yekdigərinin tamamilə müradifi kimi tələqqi etmişlərdir ki, bunun külliyyən yalnış olduğu aşkardır. Digərləri ələlxüsus əski fransız müəllifinin bir qismi öylə zənn etmişlərdir ki, guya moğol, tunğuz mancu, tibetli, türk və sairə həp fürutdan olub ümuminə "tatar" deyilir, yəni tatar istilahı guya qayət şümullu olub türk, moğol və sairəyi mühit və şamildir. İştə bu növ yanlışlıq nəticəsidir ki, Değin (Deguignes) nam müvərrix əsərinə şöylə bir ünvan vermişdir: "Historic generale des huns des Turcs, des Magoles et des autres Tatares".

[1] "Pavede Kurtil" nam fransız alimi tərəfindən fransızcaya tərcümə edilmişdir.

[2] Türkmən və Azərbaycan türklərindən bir qisminə osmanlı ilə ərəblər tərəfindən səhvən "əcəm" deyilir ki, kəza təshihi əlzəmdir.

Yəni "Hun, türk, moğol və sair tatarların tarixi-ümumisi" təbiri-axərlə Değin zikr olunan bu əqvamın cümləsini tatar fərz etmişdir. Bir üçüncü firqə üləma isə bunun tamamilə əksi bir xətaya düçar olaraq türk ləfzini ümumi və şumulli ədd etdiklərindən tatarları türk irqinin bir fəri, bir şöbəsi kimi qəbul etmişlərdir. Bunlar haqqında deyə biləriz ki, əgər tatardan muradları başqaları tərəfindən səhvən tatar namı verilən türklər isə, o halda etiraz ediləcək nöqtə ancaq bizzat ləfz tatar olur. Yox əgər məqsədləri ən əsil moğol olan tatarlar isə o halda bittəb bu da böyük bir yanlışlıq ədd edilmək iqtiza edər. Çünki əvvəlcə ərz etdiyim vəchlə tarix göstərir ki, nə tatar deyilən moğollar Tyan-şan dağlarından bəri tərəfə hicrət etmişlər və nə də Rusiya və Sibirya səhralarındaki türklər tatardır. Biləks bunlar türklərin ən ziyad türk olanlarıdır. Mərhum Şəmsoddin Samibəyin "Qamusi-türki"sində dəxi tatar maddəsində bu yolda bir yanlışlıq vardır. Samibəy öylə zənn etmişdir ki, tatar ən əsil türk əqvamından kiçik bir qövm olub, bunların namına nisbətən ümum moğollara "tatar" deyilmişdir. Bəzi fərziyələrə görə tatar ləfzinin mənşəi mancuriyalıların lisanında tirəndaz, oxatan mənasına gələn "ta-ta" kəlməsidir. Digər tərəfdən də doqquzuncu əsri-miladidə yazılmış Çin kütubi-tarixiyyəsində iki işarə vardır ki, "ta-ta" və "ta-zə" kimi oxunur. Ərəblərin irq və cins tanımayaraq, ərəb olmayan bilcümlə əqvam və üməmə əcəm itlaq etdikləri kimi, çinlilər də Amur nəhri kənarlarında sakin və türklərə heç bir müşabihət və münasibəti olmayan, fəqət çinlilərin qeyri bulunan bir çox əqvama "ta-ta", yaxud "ta-zə" namı verirlərdi. Bundan başqa, yenə ərəbin əcəm ləfzini ayrıca İranın Fürs qövminə təxsis etməsi qəbilindən çinlilər də nəhri-Əsfər sahilində yaşayan bir moğol qövmünə dəxi bilxassə "ta-ta" deyirlərdi. Bəzi çinli şivələrində hecaların axırına bir də "r" hərfi ilhaq olunduğundan bu kəlmə "tar-tar" və "ta-tar" surətində dəxi tələffüz olunurdu. İştə nəhri-Əsfər səvahilinin tatar deyilən bu moğolları çinlilərlə bir müharibənin nəticəsi olaraq Qobi səhrasından keçib Tyan-şan dağlarının ətəklərinə qədər gəlmişlər, fəqət oradan daha iləri heç bir zaman keçəməmişlərdir.

Çingizin validəsi bu moğollardan idi. Çingiz fütuhatından sonra türk əqvam və məmalikinin bir qismi bu cahangirin ordularında bulunan tatar (moğol) komandaları səhvən tatar namilə yad olunmağa başladı. Bu səhvə başlıca islavlar səbəb oldu. Çünki bunlar Çingiz qoşununun bir əksəriyyəti – əzimə etibarilə türk olduğunu anlamayıb ancaq



əsgərin sərkərdələrini nəzəri-etibara almış idilər. Halbuki fəth olunan ərazinin əhaliyi-turaniyyəsini zatən minəlqədim türk, bu əraziyi fəth edən əsgərlər türk, bunları təqib edən mühacirlər türk, Çingizin özü türk, türkün bir qisminə, bir şivəsinə, bir dövr tarixinə namını verən oğlu Cığatay, yaxud özbək türklərinə nam verən digər oğlu Cuci kimi həp türk oğlu türk idilər. Çingiz ümuri-dövləti üçün moğolların deyil, uyğurların, yəni qədim türklərin xətt və lisanlarını qəbul etmiş olduğu da cümləcə məlum bir keyfiyyətdir.

Çox keçmədən bir neçə komandan və sərkərdədən ibarət bulunan moğol ünsürü türklük ümmanı içində tamamilə qayib olub, bir əsər buraxmadığı halda, tatar nami əqvami-əcnəbiyyə dillərində mühafizə olunub qaldı. Fəqət elmi-əhvali-əqvam ilə elmi-lisanda bu yanlışlıq ancaq bu axır zamanlara qədər davam edə bilib, bu gün ortadan götürülmək üzrədir. Çünki fiyövmən məzkur elmlər birdənbirə yeni bir dövrə-tərəqqiyə vasil olmaqla "tatar" deyilən türklərin ən xalis türklərdən bulunduqları anlaşıldığından ülumi-məzkurə müntəsibini "tatar" istilahının ancaq baladə zikri keçən moğollarla tunquzlara həsr və təxsis edilməsinə haman müttəfiqən qərar verməkdədirlər. Səhvən tatar denilər türklər bərvəchi zir üç böyük şöbədən ibarətdir:

1) Sibiryanın vase səhralarında yüzlərcə müxtəlif namlar təhtində yaşayan qəbail və əşair ki, başlıca vaxtidə Qızıl Orda hökumətini təşkil edən qıpçaq türklərinin nəslindən münşəəbdirlər.

2) Rusiyayi-Avropayı türkləri. Bunlar ya qazanlılar kibi qıpçaq nəslindən elmi-bəşər nöqteyi-nəzərindən "braxisəfal" olub qismi-əzəmin çöhrəsi avropalılara məxsus çöhrədir, ya krımlılar kimi noğay və sair qədim türklərin əhfadıdırlar.

3) Qafqaziyanın əqvami-mücavirə tərəfindən səhvən tatar təsmiyə olunan türkləri də bunlardır. Qafqaz silsiləyi-cibalının cəhəti-cənubiyyəsində sakin Azərbaycan türkləri ki, şirvanlı, bakılı, qarabağlı, gəncəli, irəvanlı və sairədən ibarətdir (İranın şimali-qərbi səkənəsi də bunlardandır) və məzkur silsiləyi-cibalın cəhəti-şimaliyyəsində sakin noğay, bulqar, bir qismən ləzgilərə qarışan kumuk və zahirən xeyli çərkəslərə bənzəyən və adətən çərkəsləşmiş bulunan "kabarda" və ilaxir.

**Gələlim "turok" ləfzinə.** Əhvali-qövmiyyeyi-ətrakə aşina olan üləmanın ən mötəbərləri bir qələti-tarixi nəticəsi olan "tatar" təbirini

rədd edib bu nam təhtində zikr olunan türklərin şək və şübhə qalmayacaq surətdə türklüklərini isbat eləmiş bulunduqlarından bəzi Germaniya (alman) ətrakşünasını daha ziyadə ərəb, fars və Avropa təsirati-irqiyyə və lisaniyyəsinə məruz bulunmuş və guya bu surətlə türklükdən bir dərəcə təbaüd etmiş bulunan qərb, yəni osmanlı türklərini bərikilərdən təfriq üçün fəndə başqa bir istilah icadına qalxışdılar. Məlumdur ki, Türkiyədə beynülam ruslara Moskov deyildiyi kibi, rus əhalisi beynində də osmanlılara türk ləfzindən qələt olaraq "turok", ya "türk" deyilir. İştə, bəzi alman üləması türk namını baladə tedad edilən ətrakla Asiyayi-vüstadəkilərə təxsis edib osmanlı türklərinə isə "türk", yaxud "turok" isim verilməsini təklif elədilər. Fəqət böylə bir təklif bizzat osmanlı türkləri tərəfindən gülünc olacağı kibi üləmanın ümum beynində dəxi əsla şayani-qəbul görünmiyor. Hətta Rusiyanın ən ciddi əhvali-əqvami-aləm və müvərrixləri fənni-həqiqi namına bu fikrə şiddətlə etiraz etdilər. Zatən, alman alimlərinin böylə iki istilah icadı lüzumuna göstərdikləri səbəb də çox zəif, hətta qeyri-məquldur. Çünki bu gün türk əqvamının cümləsi osmanlılar kimi ərəb, fars və sairənin təsirati-irqiyyə və lisaniyyəsinə məruz olmuş bulunuyorlar. Məruz olmayanlar isə yox kimidir, olsa da, yakutlar kibi bütpərəstlikdə qalan, ya xristiyanlıq qəbul edən kiçik şöbələrdən ibarətdir. Deməк ki, zikr olunan fərq, təsirati-xariciyyənin azlığında, çoxluğunda olub, yoxsa keyfiyyətdə deyil. Bu isə ancaq təməddün və tərəqqi etibarilə türk əqvamının bulunduqları dərəcati-müxtəlifədən iləri gəliyor...

***

Türk lisanının əssəneyi-aləm beynində mövqeini təyin edəlim. zira mütaliə etdiyimiz bəhsə böyük dəxli vardır.

"Lisaniyon" bir sinfi-əssənənin əsvat, hürufat, lüğat, iştiqaqi-sərf və nəhvində bəzi mühüm övsafi-ümumiyyəyi-müştərəkə kəşf edib bu surətlə aralarında mövcud olan müşabihətə məbna bir zümrəyi-əssənəyi "Altay", ya "Ural və Altay dilləri", yaxud "Əssənəyi-turaniyyə" namı vermişlərdir. Əssənəyi-məzkurənin künhi, cəddi-əlası qayət qədim və vahid bir lisani-əsliyi-turani olmaq möhtəmil isə də ancaq bu lisani-əslinin mahiyyəti hənuz layiqilə anlaşılmamışdır.

Üləmayi-lisanın qövlünə görə əssənəyi-turaniyyə aralarındakı fərqlərə binaən bərvəchi-ati altı şöbəyə münqəsimdir:



1) "Fin və uqor" dilləri ki, Finlandiyanın müxtəlif ləhcələrilə Macar (Venqriya unğar) lisanı bu şöbəyə daxildirlər.

2) Sibiriyada və Bəhri-Müncəmidi-Şimali səvahilində söylənən müxtəlif "samoyed" ləhcələri, fin və uğor lisanları ilə bu ləhcələr beynində mövcud olan xüsusi bir müşabihətdən naşi cümləsini (yəni hər iki şöbəyi) bir şöbəədd edənlər də vardır.

3) Türk ləhcələri, bunlar aşağıda ayrıca tedad ediləcəkdir.

4) Moğol ləhcələri ki Çinin şimali-şərqisində və kəza Sibiriya və Rusiyanın bəzi cənub cəhətlərində söylənməkdədir. Məvərayi-Baykal moğolları, buryat, kalmık və sairə bu zümrəyə daxildirlər. Çingiz ordusunda bulunmuş tatar komandalarının ləhcəsi dəxi bu ləhcələrdən biridir.

5) Mancuriyalıların lisanı ki, tunğuz deyilən qəbail də bu lisanla mütəkəllimdir. "Fin və uqor" lisanları ilə samoyed lisanı beynində bir irtibati-nəsli, nəsəbi mövcud olduğu kibi türk, moğol və mancuriya lisanlarının da ayrıca bir əsildən, bir kökdən mütəfərrə bulunduqları zahirdir.

6) Yapon lisanı dəxi Eyveld, Şot, Venqler və sair mötəbər linsanyonu-turaniyyənin rəy və qövlünə görə Ural və Altay lisanlarındandır.

Hələ qəvaidi-nəhviyyəsinin tamamilə turani olmasında üləmanın cümləsi müttəfiqül-rəydirlər. Əsasən yapon lisanının turaniliyini müsirranə iddia edən zat ən ziyadə Venqlerdir. Əssənə və əqvami-turaniyyəyə dair mütəəddid asari-nafiəsilə kəsbi-iştihar etmiş bulunan alim müşarileyh bu xüsusda Budapeşt şəhərində intişar edən "Revus Oient le pour us etudes Oural-alo altai gues" nam risaləyi-mövqutənin 1900 sənəyi-miladiyyəsində çıxan məcmuələrində "Die Ural altaischen Sprachen" sərlövhəsi təhtində məqalati-mühimmə dəxi nəşr etmişdi.

Bəzi alimlərə görə əssənəyi-turaniyyə zümrəsinə tedad edilənlərdən başqa bir də xətti-mixi (xətti-mismari) ilə yazılmış akkadi, yaxud şumeri deyilən qədim bir lisanı dəxi daxil etmək lazım gəlir.

Əssənəyi-turaniyyəni yekdigərindən təfriq edən övsafi-xüsusiyyədən sərfi-nəzərlə (bu təfsilat sədədimizdən xaricdir) yalnız türkcənin ümum əssənəyi-turaniyyə ilə müştərək bulunan övsaf və məzayasını müxtəsərən zikr edərsək faydadan xali olmaz.

Əssənəyi-aləmin bir qismini Turani ya Ural və Altay namilə bir yerə cəm və tövhid edən övsaf və əlamət bunlardır:

a) Kəlmənin müəyyən mənaya, məfhuma dəlalət edən hecai-əslisi erab və təsrif əsnasında əslən təbəddülata uğramaz.

Məsələn, ərəbin "qövl" kəlməsi təsrif əsnasında qeyl, qal və ilx. şəkillərə girdiyi, yəni bir mənayi-müəyyənə dəlalət edən heca və məsdərinin "vav"ı gah "əlif"ə, gah yayi-münqəlib olaraq hərəkələr dəxi dəyişdiyi, yaxud ara yerə başqa bir hərf daxil olduğu halda türkcənin "dəmək" felindəki "de" hecayi-əslisi təsrif əsnasında heç bir vəchlə təhəvvül edəmədiyindən (da), yaxud (du) və ilx. kibi şəkillərə qətiyyən girəməz. Bu isə bir lisanın asanlığı, sadəliyi, müsbətliyi nöqteyi-nəzərindən əlbəttə böyük bir məziyyətdir.

b) Kəlmələrin təbəddülati-sərfiyyə və iştiqaqiyyəsi təlasüqi-ədəvat (agglutination) və daha doğrusu, təlahüqi-ədəvat qaydasına tabedir. Ədəvat hecayi-əslini daima təqib edər, ona təqəddüm etməz.

Məsələn, ərəbcə (məqal) kəlməsində (m) hərfi hecai-məsdərə təqəddüm etdiyi halda türkcə (deyilmiş) ibarəsində (yilmiş) ədəvatı (de) hecai-əslisini təqib edər. Hecai-əsliyə təqəddüm edən ədəvata əssənəyi-turaniyyədə ancaq macar dilində təsadüf olunur ki, o da müstəsna qəbilindən olaraq əndər nadiratdandır.

c) Kəlmələri tərkib edən hecalar və bunlara təbəddülati-sərfiyyə əsnasında ilhaq olunan ədəvat daima "qanuni-ahəng" deyilən və ancaq əssənəyi-turaniyyəyə (macar, fin, türk, moğol və yapon, sair turan dillərinə) məxsus bulunan bir qayidəyi-mühimməyə təbəiyyət edər ki, bu da bir kəlmədə bulunan hürufi-sövtiyyənin yekdigərə təvafüqündən ibarətdir. Yəni hərəkələrin xəfifi xəfif ilə və səqili səqil ilə imtizac edə bilər. Yoxsa hərəkəyi-xəfifə hərəkəyi-səqillə bir araya gələməz. Misal: "gəlmək", "getmək", "gələcək", "gedəcək" ibarələri əslən və qətən: "gəlmaq", "getmaq", "gələcaq", "gedəcaq" kimi tələffüz olunamayacaqlarından "gəlmək", "getmək" şəklində yazılmaları da caiz olamaz.

Kəza qalməq (qalmaq), qaləcəq (qalacaq) ibarələri də "qalmək", "qaləcək" surətində nə yazıla bilir və nə də tələffüz oluna bilir.

ç) Ədəvati-zəmiriyyə və ya zəmiriyyəyi-izafiyyə vasitəsilə əfalda süvəri-intəhaiyyəyi-təsrifiyyənin hüsula gəlməsi keyfiyyəti dəxi bir çox turan lisanlarının övsafi-müştərəkəsindən məduddur.

d) Fəqət ən ziyadə əssənəyi-turaniyyəyi bir zümrəyi-vahidə şəklində birləşdirən cəhət qəvaidi-nəhviyyədir ki, haman kaffəsində bir siyaq üzrədir. Fel və xəbərin daima cümlənin axırında bulunması məfulların, zərfi-zaman və məkanların felə tabe bulunduqları felə,



sifətlərin mövsufə təqəddüm etmələri və ilx. əssənəyi-turaniyyədə ümumi bir keyfiyyətdir.

Nəhvi-turanidə kəlmələrin bir təaqübi-müəyyən ilə irtibat və ittihad etməsindən naşi, cümlə (Venqlerin təbiri vəchilə bir "cümləyi-şibhi-kəlmə)dir. Yəni cümlə içində təaqübi-kələmat, kəlmə içindəki təlahüqi-ədəvata təşbih oluna bilir!..

Bütün bu zikr olunan məvaddi-mövzu bəhsimiz nöqteyi-nəzərindən qayət mühümmdür. İndi türk ləhcə və şivələrindən hansının ziyadə türkcə olduğunu anlamaq üçün əvvəla hər birinin məzkur övsafi-əsasiyyəyi-turaniyyə ilə nə dərəcə və nə nisbətdə müttəsif, yəni qəvaidi-əsliyyəyi-turaniyyəyi nə nisbətdə mühafizə etmiş və özlərilə qeyri-mütəcanis bulunan əssənəyi-samiyyə və ariyyənin təsiratına nə qədər məruz bulunmuş olduğunu təyin etməli, saniyən vəsaiti-fənniyyəyi-lisaniyyə və tarixiyyəyi-coğrafiyyə və sairə ilə ən qədim və ən xalis türklər kimlər olduğunu kəşf ilə bunların lüğatını, qəvaidi-sərfiyyə və iştiqaqiyyəsini gözəlcə zəbt etdikdən sonra türkün şimdiki ləhcələrindən hər birinin bu qədim və xalis türkcədən təbaüd edib-etmədiyini və etdi isə nə dərəcə etdiyini mütaliə etməlidir. Bundan başqa türkcə ləhcələr üzərinə həmcins və həmcivar bulunan sair Turan lisanlarının da təsiratını unutmamalıdır. Heç şübhə yoxdur ki, lisani-əsliyi-türk müxtəlif səbəblər təhtində təhəvvülata uğramaqdan və başqa dillərin təsiratına məruz bulunmaqdan bir an xali qalmamışdır.

Bu səbəblərin başlıcalarından olmaq üzrə mühitin şəraiti-iqlimiyyə və təbiyyəsini vəziyyəti-coğrafiyyədən naşi münasibəti-milliyyəyi-həmcivarini: ədvari-müxtəlifədə türklər tərəfindən qəbul olunan növ-növ məzahib və ədyanı və bunlarla bərabər gətirilən xətt və lisani-diniyi vəlhasil miləl və əqvamı yekdigərinə qarışdıran müxtəlif vüquati-tarixiyyəyi zikr edəriz. Əsbabi-məzkurəyə dair təfsilatdan sərfi-nəzərlə türklərin müxtəlif ədvari-tarixiyyədə qəbul etdikləri məzahibə dair bir məlumat edənəlim.

* * *

Orxon[1] səvahili qürbündə əxirən kəşf edilən asari-ətiqədən müstəban olduğu vəchlə, türklərin ən qədim din və məzhəbləri bir növ şaman etiqadatından ibarət bulunmuşdur. Şaman məzhəbinə bu gün

[1] Orxon bir çaydır ki, Baykal gölünə mənsəb olan Selenma nəhrinə tökülür.

dəxi bəzi Çin və moğol əqvamı və Sibiriya cəhətlərində bir neçə türk əşair və qəbaili tabedir. Zamani-qədimdə binnisbə mənidar olub əsasən təbiətə, əsrari-təbiətə pərəstişdən ibarət bulunan bu məzhəb əlyövm qaba bir bütpərəstlik dərəkəsinə enib şaman kahinlərinin şarlatanlığı sayəsində davam etməkdədir. Türklərdən ən əvvəl təməddün edən qədim tu-ku-yc təbiri-axərlə oğuz türklərilə bunlardan sonra səhnəyi-tarixə çıxan uğyurların qismi-küllisi məzkur bütpərəstlikdə çox müddət səbat etməyib mürurі-zamanla fövc-fövc müxtəlif dinlərlə mütədəyyin olmağa başladılar. Şaman bütpərəstliyini ilk sədəmata uğradan din miladi-İsadan əqdəm Hindistanda zühur edib türk və moğollar içində, miladi İsadan, hətta hicrəti-nəboviyyədən belə sonra intişara başlamış olan Budda[1], yaxud Şakyamuni nam bir zati-möhtərəmin dini olmuş idi. Bir qismi-əzimi-bəşəriyyətin, haman ümum irqi-əsfərin mütədəyyin bulunmaqda olduğu dini-məzkur, bu gün Çin moğolları ilə Rusiyadakı kalmık və buryatların və koza moğollaşmış bir qisim türklərin arasında dəxi lama məzhəbi şəklini əxz edərək sair ədyan ilə rəqabət etməkdədir. "Dini-əsfər", yaxud "sarı məzhəb" təbir olunan lamalığın banisi Zonqova nam rahibdir. Hər halda lama məzhəbi budda dininin bir şöbəsindən başqa bir şey deyildir. Bu məzhəbdə olan moğollarla, moğollaşmış bəxi türklərin mərkəz ruhaniləri Tibet qitəsindəki Lahasa şəhərindən sonra Şimali Moğulustanda qaim Orğa bələdəsidir. Əsası panteizmə, yəni vəhdəti-mütləqə, yaxud vəhdəti-vücud ilə metampsixoz, yəni ruhun cismdən-cismə intiqalı demək olan tənasüx etiqadlarından ibarət bulunan məzkur məzhəblərin tövsif və tərifi mövzu bəhsimizə təəllüq etmədiyi cəhətlə bu xüsusda təfsilatdan sərfi-nəzər edəriz. Məqsədimiz ancaq bir zamanlar türklərin bu dinlərdə dəxi bulunmuş olduqlarını, binaənəleyh lisan, adət və əxlaqımızda o dövrlərdən dəxi bir əsər qalma möhtəmil bulunduğunu göstərməkdir. Budda məzhəbini mütəaqib, ya onunla eyni zamanda ortaya siryani xristianları çıxıb türklər və moğollar içində nəstur məzhəbini nəşrə başlamışlar idi. Nəstur məzhəbi xristian dinindən bir şöbədir.

Məlum olduğu üzrə, bugünkü etiqadi-İsəviyyəyə görə səlib əlaməti-nicat və şəfaət olub, xristianlarca-əqanimi-səlasə, yaxud

[1] Budda ilə büt kəlmələri arasında tələffüzcə bir müşabihətə məbna çox adam bu iki kəlməyi bir-birinə qarışdırıb buddapərəstliyi bütpərəstlik zənn eləyir. Halbuki budda məzhəbi əsasən əslən bütpərəstlik deyildir.



üluhiyyəti-müsəlləsəyi-vahidənin bir rüknüədd olunan həzrət İsa səlib üzərində iztirabatı bəşəriyyətin naili-əfv və qüfran olması uğrunda qəbul eləmişdir ki, bizim etiqadımıza müxalifdir. Çünki Qurani-Kərimdə "Vəla yəsləbuhuva ləkin şəbbiha ləhu..." buyurulur. Yəni Allahın peyğəmbəri olan Həzrət Məsih səlb olunmayıb yerinə zahirən şəbihi bulunan biri səlb olunmuşdur.

İştə türkcə bəzi əşari-qədimədə hətta bu gün dəxi türkün bəzi ləhcələrində cənab həqqə "çələb", ya "çalap" namı verilməsi məzkur dövrün asarındandır... Zira çələbi farsi çəlipadan, yaxud ərəbi səlibdən qələt olub xaç deməkdir. Osmanlı türkcəsində "əfəndi", "ağa" mənasına gələn və hətta birinci Sultan Məhəmmədə ləqəb və Konya şəhərindəki mövlana həzrətlərinin pustnişininə Çələbi Əfəndiyə əlyövm belə ünvan olan çələbi təbiri dəxi çələbdən müştəqqdir.

Siryanilər islamın şəşyei-zühurundan naşi türklər arasında böyük bir iş görəmədilər. Bu gün xristian bulunan türklər varsa da Anadoluda, Qazan[1] tərəflərində və Sibiryanın bəzi cəhətlərində qəlilüləded olduqlarından sair əqvami-nəsraniyyəyə qarışıb məzhəb üzündən millətlərini qayib etmək üzrədirlər. Balada zikr olunan məzahibdən başqa bir aralıq bəzi türklərə Zərdüşt və Mani məzhəbləri dəxi sirayət etmişdi. Əlyövm Hindistanın bəzi cəhətlərində davam edən Zərdüşt məzhəbinin əsası sənəviyyətdir. Bu məzhəbə görə bütün kainat iki yekdigərə zidd qüvvətin təhtihökmündə bulunur ki, biri zülmət və şərin mənbəi olan Əhrimən və digəri isə nur və xeyrin xaliqi bulunan Hörmüz, yaxud İyzəddir. Nur İyzədin əlaməti-zahirəsidir. Nura pərəstiş guya İyzədə pərəstiş demək olduğundan Zərdüşt məzhəbi tabeini tərəfindən bilaxirə qaba bir atəşpərəstliyə qəlb edildi. Atəşpərəstlik isə zatən yuxarıda zikr olunan şaman məzhəbində də var idi. Bir çox adətimiz bu dövrlərdən qalmadır. Məsələn, axır çərşənbələrdə atəş yandırıb üzərindən atılmamız və sairə.

Bu gün türklərin qismi-küllisi əlhəmdülillah xeyli zamandan bəri artıq dini-islam ilə müşərrəf bulunurlar.

Türklər arasında müxtəlif din və məzhəblər yekdigərini təqib etdikcə bunlarla bərabər təhrirati-diniyyə və rəsmiyyədə müstəməl xətlərin, əlifbaların əşkalı dəxi təbəddül ediliyordu.

[1] Anadoluda bəzi kəlisalarda türkcə icrayi ayin ediliyor. Böylə kəlisa Qazan şəhərində də vardır.

Bu gün anlaşıldığına görə türklərin ən qədim xətt və əlifbaları run denilən bir növ xətdir ki, bizzat türklərin özləri tərəfindən ixtira olunduğu məznundur.

Bu xətdən iləridə ayrıca bəhs olunacaqdır. Beş-on sənə əvvəlinə gəlincəyə qədər ən qədim türk yazısı etibar olunmuş olan uyğur xətti ancaq run xəttindən sonra ortaya çıxıb, onun yerinə qaim olmuşdur. Uyğur xəttinin isə siryanidən mübəddəl olduğu və türklər içinə nəsturilər tərəfindən gətirildiyi zənn olunur. Dini-islamın türklər arasında intişarından sonra artıq uyğur və moğol xətləri yerinə hər tərəfdə əlifbai-ərəbi, fars tərəfindən bir dərəcə islah edilmiş əlifbai-ərəbi qəbul olunmuşdur.

Burada qayət şayani-diqqət bir nöqtə var idi – xatir oluyor: Dini-islam ilə xətt və lisani-ərəbi türklərin lisani-ədəbiyyat, əxlaq və adətlərində xeyli əzim bir təbəddül vücuda gətirmiş olduğu halda, türklər, yenə milliyyət və qövmiyyətlərini, lisan və ədəbiyyatlarını ancaq dini-islam dairəsində mühafizə edə bilmişlərdir.

Türklərin külliyyat etibarilə sair dinlərə meyil və istedad göstərməmələri və nadirən göstərənlərin isə milliyyət və qövmiyyətlərini qayib edərək gah çinli, moğol və hindulara, gah əqvami-nəsarayə qarışıb qayib olmaları və biləks türklərin ancaq müsəlmanlığa meyyal və müştaq bulunmaları və islamı qəbul etdikdən sonra bir tərəfdən aləmi-islamın mühüm bir rükn və istinadgahi sırasına keçmələri, digər tərəfdən də ancaq bu dini-mübin sayəsində öz qövmiyyət və milliyyətlərini mühafizə edib təmini-bəqa edə bilmiş olmaları fövqəladə şayani-diqqət və mütaliə bir maddədir ki, əsasən zikr olunduğu vəchlə iki mühüm məsələdən ibarətdir. Məsələlərdən biri türklərin ümumiyyət etibarilə ancaq dini-islamı qəbula meyil və istedad göstərmələri və digəri də dini-islam ilə mütədəyyin, ərəb elmilə mütəəllim, ərəb mədəniyyətilə mütəməddin olduqları halda türklərin əsla ərəbləşməyib, yenə türk oğlu türk qalmalarıdır. Aya, bu hallara səbəb nədir?

Səbəb bir deyil, qayət mütəəddiddir. Əhvali-məzkurənin əsbabını zənn edirəm. Bir yandan dini-islamın öz mühəssənat və məzayasında, həqayiqinin bədahət dərəcəsində sadə və əyan olmasında, isbat və dəlildən müstəğni bulunmasında, o biri yandan da türklərin fitrət və təbiətlərində, məzaclarında, fəzaili-əxlaq və xəsaili-mənəviyyələrində aramalıdır!..

Abu hava, əhvali-iqlimə, şəraiti-təbiyyeyi-coğrafiyyə və sairə cəhətilə vase dəşt və biyabanlara, qum səhralarına malik bulunan Türküstanla Ərəbistan beynində bir dərəcəyə qədər müşabihət bulunduğu kibi dəvəni, atı, süvariliyi, mərdanəliyi, igitliyi, seyri-səfəri, köçbəliyi, füshətabad vətəni, hürriyyət və muxtariyyəti sevən türk ilə ərəb arasında dəxi bir münasibət, bir qərabət mövcud olduğu inkar olunamaz. Bundan başqa hər iki qövmün qəbləlislam olan etiqadatibatilə və əhvali-tarixiyyələri arasında dəxi bir təvafüq var: Türklərin run xətti dövründəki şaman bütpərəstlikləri ərəblərin zəmanicahiliyyətdəki etiqadati-sənəmpərəstanə və müşrikanələrinə xeyli bənzəyir.

İştə bu tedad olunan və sair əsbabdan naşi türklər ərəb mədəniyyətinə bir meyli-əzim göstərib onu öz malları kibi sühulətlə qəbul etdilər. Yenə eyni səbəblərə məbnadır ki, ariya əqvamı dini-islamı qəbuldan sonra bir an rahat durmayıb daima o dində cüzi, ya külli təbdilat vücuda gətirmək həvəsinə düşmüşlərkən türklər öylə fikirlərdə bulunmadılar. Biləks islamı olduğu kibi qəbul və olduğu kibi də mühafizəyə qeyrət etməkdədirlər.

Bununla bərabər türklər əsla ərəbləşmədilər. Ərəblər bütün Şimali Afrika, Suriya və Mesopotamiya (Əlcəzirə) əqvamını və kəza bizim Dağıstan əqvamından bəzisini, məsələn, ləzgiləri və sairəyi tərib etdikləri halda, türkləri təmsilə müvəffəq olamadılar!

Əcəba, səbəbi nədir?

Bu xüsusda türklərin bir kiçik qövm olmayıb ərəblər kibi müstəqillən bir milləti-müəzzimə olmaları və mərkəzi-ətrâk bulunan Asiyayi-Vüsta və Türküstanın Ərəbistandan bödi-məsafə etibarilə uzaq bulunması səbəb göstərilə bilərsə də, lakin bunlardan daha mühüm bir cəhət vardır ki, o da türkcənin əssənəyi-Turaniyyədən olmasına binaən əssənəyi-Samiyyədən bulunan ərəbiyə külliyyən müğayir olması keyfiyyətidir. Ərəb, dini-islam vasitəsilə deyil, bəlkə lisani-ərəbi vasitəsilə əqvamı ərəbləşdirməyə müvəffəq olmuş idi. Əqvami-mütəərribə ya kiçik və Ərəbistana həmcivar bulunanlar, yaxud Afrikayi-şimali millətləri kibi zatən əqvami-samiyyədən olmaqla parlaq bir mədəniyyətin təsirilə ərəbləşməyə istedad göstərənlərdir.

Əgər dini-islam ərəblər içində degil, moğollar içində zühur edəydi, o vaxt moğollar türkləri bəlkə moğollaşdırmağa müvəffəq olurlardı. Çünki əssənəyi-Turaniyyədən bulunan bu iki lisan beynində yekdigərini təmsil edəcək dərəcədə qərabət vardı. Məlumdur ki, hər lisan lüğət və qəvaiddən ibarət bulunduğu halda, türk lisanı başlıca qəvaiddən ibarətdir (zənn edirəm, bu fikri ilk əvvəl ifadə edən Osmanlı üdəbayi-məşhurəsindən Əhməd Midhət əfəndi olmuş

idi), yəni türk dili lüğətə əhəmiyyət verməz, hər lisandan bəyəndiyi kəlməyi alıb öz malı kimi asanlıqla öz qəvaidi-sərfiyyə və nəhviyyəsinə tətbiqən təsrif edər. Məsələn, (lər) ya (lar) türkcədən ədaticəmdir. Türki yunancadan filosof, istoriya, ya latıncadan doktor, professor kəlmələrini alıb asanlıqla filsoflar, professorlar və ilx. deyə bildiyi halda ərəb filosofu fəlasifə, ya istoriya əsturə, ya əsturəni əsatir şəklinə cəbrən qəlb edə bilirsə də, mütəəddid əşkali-cəmi olduğu halda yenə doktor, ya professorun cəmində aciz qalır dəkatir professurə deyəcək deyil a.

Türk qəvaidi o qədər sadə, o qədər gözəl və məntiqə müvafiqdir ki, onunla ülfət edən türk heç bir vaxt anı tərk eləyib, ərəbin qəvaidini qəbul edəmiyəcəyi aşkar idi. İştə bu növ səbəblərdəndir ki, türklər dini-mübini-islamı öz ruh və mənəviyyatlarından nəban etmiş kibi bir şövqi-əzim ilə dərağuş edib onun qəvi bir nigahbanı olmuş olduqları halda əsla ərəbləşmədilər və qövmiyyəti-nəcibəyi-əsliyyələrini mühafizə edə bilib, ancaq o yolda tərəqqiyyata məzhər olmağa başladılar.

Bundan sonra türklərin əhvali-tarixiyyəsinə nəzər edib beş-on sənədən bəri bu xüsusda əldə edilmiş kəşfiyyat və həqayiqi-cədidəyi mütaliə edəlim.

* * *

Ən qədim türklərin əhvali-tarixiyyəsi xurafati-şairanə ilə qarışmışdır. Sultan Mazmud Qəznəvi kibi bədayepərvər bir türk dühasının təşviq və himayəsilə yetişən Firdovsinin, İran və bəlkə cahan şairi-əzəmi olan Firdovsi Tusinin vücuda gətirdiyi "Şahnamə" başdan-başa diqqətlə oxunursa görünür ki, bu əsəri-binəzir əsasən yegdigərilə daimi bir mübarizədə bulunan iki bahadırın biri-birinə rəqib, iki dilavərin, iki böyük qəhrəmanın vəsf və tərifindən ibarətdir ki, birinin adı İran, digərinin adı Turandır. Avropanın haman nisfi cəsamətində olan Turan, yaxud Türküstan Ceyhun, Amurdərya və Qüsus namlarilə məşhur nəhri-əzimin mavərasında[1] bulunan vase bir ölkədir. Firdovsiyə nəzərən bu ölkənin əhalisi guya minəlqədim haman xilqəti-aləmdən bəri türklərdən ibarət bulunurdu. Keykavus ilə həməsr olan bunların ən qədim padşahlarından biri Əfrasiyab idi[2].

[1] Bu məmləkətin bir qisminə Mavəraünnəhr və Transoksaniya dəxi deyilir.

[2] Bu nam ilə Türküstanda bu gün bir şəhəri-əzim xərabəsi kəşf olunmaqdadır.



"Şahnamə"nin ən şairanə və eyni zamanda ən facianə bir fəslini Səyavuş hayiləsi təşkil edir. Səyavuş türklərlə bir müharibədən sonra pədəri Keykavusa küsərək, onun rəqibi bulunan Əfrasiyabın nəzdinə iltica etdiyi bir tərzi-dilnişin ilə hekayə olunur. Əfrasiyab öz qızı Firəngizi Səyavuşa təzvic edib onu məmləkətin bir qisminə əmir təyin etdi. Şairin hekayəsinə nəzərən burada öylə bir asari-umran və təməddün vücuda gəldi ki, hətta Əfrasiyabın öz sarayında belə hissi-həsədin oyanmasına bais oldu: İştə ən qədim zamanda hətta xurafat dövrü bulunan bir zamanda Türküstan tərəflərində Firdovsi tərəfindən fərz və qəbul olunan bu "umran" və "təməddün" keyfiyyəti qayət mühüm bir məsələdir. Bu gün bəzi asar və dəlail ilə şairin sözləri sırf xəyalatdan ibarət olmadığı anlaşılmaqdadır. Heç şübhə yoxdur ki, Firdovsi mövzuati-şairanəsi üçün özündən çox qədim, fəqət əksəri bu gün zaye edilən farsi, pəhləvi, zənd, ərəb, türk və sair dillərdə yazılmış məxəzlərə müraciət etmiş idi. Ancaq Firdovsi məxəzi-məzkurəyə bir müvərrixi-mütəfənnin nəzərilə degil, bəlkə bir şairi-büləndamal və bilxassə həmiyyəti-vətəniyyəyi-fürsPərəstanə ilə müttəssif bir şairi-ateşməzaci-İrani nəzərilə baxmış, onları o cəhətdən nəzəri-etibara almışdır. Bununla bərabər fünuna aşina, müqtədir bir türk tarixnovisi, bəzi ülum və kəşfiyyati-cədidə sayəsində teyfbini-intiqad və tədqiq ilə şairin müraati-təxəyyülatında nüquşi-şairanənin əlvani-gunagununə bürünən həqayiqi-tarixiyyəyi təmyizə müvəffəq ola bilir. Bu isə xüsusi bir tətəbböyə möhtacdır[1]. Bundan başqa qədim türklər və mədəniyyətləri haqqında qayət qiymətdar həqayiqə Çin kütübi-tarixiyyəsində; ələlxüsus bu kitabların dördüncü əsri-miladiyyəyə aid olanlarında dəstrəs ola bilərik ki, bu da ayrıca bir mütaliə ilə bilxassə Çin dillərinə kəsbi-vüquf etməklə olur.

Qərb, əz cümlə Yunan[2] müvərrixini türkləri ancaq altıncı əsri-miladında tanımışlardır. Bu üləmayə görə sənəyi-miladiyyəsində ən əsil Altay cəhətlərindən gələn Türküstan türklərinin xaqanı Sincibo (yunanca Silzibol) Xosrov Nuşirəvan ilə bir müahidə əqd edərək, Ceyhun səvahilini yədi-istelasına keçirmişdir. Bu tarixdən etibarən

[1] Hindi-qədim şahnaməsi olub başlıca Qoravalar ilə Poravaların müharibələrindən bahis "Mahabharata" nam kitabının dəxi bu nöqteyi-nəzərdən mütaliəsi faydadan xali qalmayacaq, zənn edirəm. Lakin qəbləlmütaliə bir hökm verilməz.

[2] Yunan xurafatında ehtimal türklərə dair bəzi işarələr vardır: yarı insan, yarı at şəklində təsəvvür olunan məxluq mövhum kentavrın türk süvarilərinə dəlalət etdiyini bəzi osmanlı mühərrirləri iddia ediyorlar.

türklər artıq Monqolustan və Türküstan daxilinə münhəsir qalmayıb biladi-müxtəlifəyi istelaya başlamış və Volqa nəhri səvahililə bugünkü Rusiyanın şərqi-cənubisinə də o zamanlar gəlmişlərdir. Müruri-zaman ilə istela və mühacirətlər yekdigərini vəli eyləyirdi. Bunların ən mühümləri XI əsri-miladidə başlamış olduğundan türklərin bu əsrdən sonrakı əhvali-tarixiyyələri xeyli məzbut olub ondan əvvəlki tarixləri isə ehmal edilmiş idi. Fəqət VI əsr ilə XI əsr ilə XI əsr beynindəki zamana təvafüq edən bir dövri-tarixiyyəyə aid olmaq üzrə bu son sənələrdə fövqəladə mühüm kəşfiyyat icra edilmiş olduğundan, bu xüsusda bir nəbzə məlumat edinməmiz əlzəmdir.

Orxon nəhri cəhətlərində yeni Qaraqurum şəhəri xərabələrindən başqa əxirən yenə Qaraqurum namında daha əski digər bir şəhricəsimin xərabələri kəşf edildi ki, uyğur türklərilə bunlardan da qədim çincə Tu-ku-ye denilən Oğuz türkləri tərəfindən bina edilmişdir. İştə ümumtürklər içində tarixi-mədəniyyətdə ən əvvəl isimlərini qeyd etdirənlər qırğızlarla bərabər məzkur iki qövmdir.

Tu-ku-ye, yaxud turk oğuz, uyğur. Qırğız – iştə türk qövmiyyətinin sepayi-əsası!.. Ən qədim və Ən xalis türklər əsil bunlardır. Bunlardan başqalarının, məsələn, başqurdların[1] tarixi – mədəniyyətləri bu qədər qədim deyildir. Uyğurlar tu-ku-yelərin tarixən varisləri olduqları halda qırğızlar bunların rəqibləri olmuşlardır. Qırğızlardan ayrıca bəhs olacaqdır... Uyğurların əhvali-tarixiyyələri oğuz türklərindən, yəni tu-ku-yelərdən daha əvvəl məlum olmuş idi. Çünki uyğurların lisanı uyğur xətti denilən və bir növ qədim Suriya yazısının təbəddülündən hasil olma bir xətt və əlifbai-məxsus ilə məzbutdur ki, qədimdən bəri qabili-qiraət idi. Macar üləmasından məşhur Vamberi tərəfindən kəşf olunan "Kutadqu bilik" ünvanlı kitab da işbu lisan və xətt ilə yazılmış olub, şu son on-on beş sənə içində icra olunan kəşfiyyati-cədidəyə qədər uyğur və ələlitlaq türk asari-ədəbiyyəsinin ən qədimi etibar olunmaqda idi[2]. Uyğurlardan daha qədim olan tu-ku-yelərin əhvali-tarixiyyələri ancaq şu son on beş,-igirmi il zərfində məlum olmağa başladı. Çingiz vüquati-əziməsindən sonra səlatini-Osmaniyyənin cəddi-əlası bulunan Ərtoğrul qazinin

[1] Bir nəzəriyyəyə görə (başqurd) təbiri (başqa yurt)dan qələtdir. Çünki vətəni-əslilləri Altay olmayıb Ural dağlarıdır. İləridə bəhs olunacaqdır.

[2] Beşinci əsri-hicridə Kaşkarda yazılmış olan şu kitab nəzmən hökmdar vəziri-komandan və sairənin ümuri-dövləti nə surətlə idarə etmələrin lazım gəldiyinə, insanların din və dövlət və ailəcə vəzifələri nədən ibarət olduğuna dair məlumat verilir. Çox yerlərində fəlsəfəyə belə girişilir.



pədəri Süleyman xan komandası təhtində Xorasandan qərbə doğru hərəkət etmiş bulunan oğuz türklərinin namı ilə şu çinlilərin Tu-ku-ye deyə zikr etdikləri qayət əski oğuz türklərinin adı beynindəki müşabihət şayani-diqqət bir maddə olmaqla bərabər bunlara dair bu axır zamanlara qədər əsla məlumatımız yox idi. Bu gün kəşfiyyati-mühümməyi-cədidədən sonra daxi qədim oğuz türkləri ilə Süleyman xan oğuzları arasında tarixən bir neçə yüz sənəlik bir açıq, bir nöqsan qalıyor idi!

Baxalım oğuzlara dair kəşfiyyati-cədidəyi-tarixiyyə nədən ibarətdir? İki yüz sənədən bəri Yenisey nəhri cəhətlərinə run denilən qeyri-qabili-qiraət bir xətt ilə bir çox məhkukat bulunmuş, hətta bunlardan məcmuələr təşkil olunub, bəzi muzeylərdə vəz və təşhir edilmiş olduğu məlumdur. Lakin bu run yazılarının on-on iki sənə əqdəminə gəlincəyə qədər kimsə oxuyub anlamağa müvəffəq olmamış idi. Əxirən bu növ asari-ətiqə təhərrisinə həvəs artdı. Həvəs edənlər çoxaldı.

1889 sənəyi-miladiyyəsində "Şərqi Sibiriya coğrafiya cəmiyyəti", 1890 sənəsində Helsenkfors "Fin və uyğur" cəmiyyəti və 1891-də Peterburq ülum akademiyası tərəfindən Baykal gölünə mənsub Selenqa nəhri şöbələrindən Orxon nəhri vadisində kain hər iki qədim və yeni Qaraqurum xərabələrinə bir ay təhərriyyati-müxtəlif heyəti-fənniyyə ezam olundu. Məzkur heyətlərdən birincisinə rus ədib və mühərriri Yadrintsev (Ядринцев), ikincisinə müəllim Hegel və üçüncüsünə akademiya əzasından alimi-şəhir Radlov riyasət etməkdə idi. Zəvat və heyəti-müşarileyhin kəşf etdikləri şəhri-ənqazi, əzim saray xərabələri somaki mərmər növü daşlardan, sənayei-nüqriyyənin fövqəladə tərəqqisinə dəlalət edən qayət nəfis heykəllər, əjdəha, arslan və sair heyvanat şəkilləri üzərində run xəttilə qiymətdar məhkukat bulunan gözəl dikili daşlar və sair bu misilli asari-ətiqə burada böyük parlaq bir mədəniyyəti-qədimənin mövcudiyyətinə dəlalət edirdi. Ancaq məzkur Run yazıları[1] oxunmadığından bu şəşəəli mədəniyyətin hansı qövmə aid olduğu anlaşılmıyordu. Bu xüsusda məsələnin həllinə Yadrintsev və Hegel tərəfindən başlıca Ərdənizo nam lama manastırı qürbündə kəşf olunan uyğurca, çincə

[1] Qədim german (alman) dilində gizli sirr mənasındadır. German və Skandinaviya və run xəttinin latın əlifbasında mühərrəf bulunduğu zənn olunur. Fəqət Orxon (run)-larının bunlarla bir münasibəti olmayıb, bəlkə olsa-olsa arami denilən əlifbaya müşabihətləri vardır.

və rumca olaraq üç lisan üzrə, bəzilərində bir də moğolca məhkukat iraə edən bir neçə dikili daşların (obelisklərin) böyük yardımı oldu. Hegel adlı müəllim tərəfindən kəşf olunan və üzərində üç lisan üzrə məhkukat bulunan daş, dördguşəli bir sütun olub arslan heykəlindən ibarət əzim bir qaya üzərində paydar idi. İştə əsil bu üç lisanlı daşlardakı Çin və uyğur yazılarının dəlalətilə kopenhaqlı müəllimi-fazil Vilhelm Tomsen 1893 sənəyi-miladiyyəsində şampolyonlara məxsus bir məharəti-kamilə ilə qədim türklərin əlifbalarını kəşf ilə run xətlərini həll edib qiraətə və məzmunları nə olduğunu anlamağa müvəffəq ola bilmişdir.

Bu tarixdən etibarən türk mədəniyyəti-qədiməsi üzərindən pərdə rəf olub gündən-günə mühüm kəşfiyyat ilə elmi-əhvali-ətrak yeni bir tərəqqiyə mozhər olmaqda və üləmaya şən və şöhrət qazandıracaq vase bir meydan açılmaqdadır.

Türklərə etdiyi xədəmati-əziməyi-nafiədən naşi mədyuni-şükrani bulunduğumuz Tomsen kəndilərindən əqdəm əsrlərcə anlaşılmaz bir müəmma halında qalmış olan türki run yazılarını həll üçün uyğur və Çin xəttilə olan məhkukatın dəlalətindən başqa bir neçə keyfiyyətdən dəxi istifadə etmişdir. Məsələyə girişməzdən əqdəm Danyalı alim müşarileyh run mühərriratının türkcə olduğuna yəqinən hökm etmiş olduğundan run əlifbasının hürufi-sövtiyyəsini ümumi Turan dillərinə məxsus olan "ahəngi-sövti" qaydasına istinadən və hürufi-qeyri sövtiyyəsini (TRK)dən ibarət olan "Türk" ləfzi ilə adına heykəl dikilən xanın adını nəzəri-etibara alaraq təyin eyləyə bilmiş idi. Vilhelm Tomsen bu xüsusa dair qələmə almış olduğu əsəri-giranmayəsini "Dechiffrement des inscriptons de Orkhont et de l'Jenissei" "Orxon və Yenisey məhkuatının həlli" ünvanilə 1894 tarixində Danya (Danimarka) paytaxtı olan Kopenhagendə nəşr etmişdir. Bundan sonra türk-oğuz Tu-ku-ye qövminin sair məhkukati-tarixiyyəsi artıq müntəzəmən tərcümə edilərək Avropa və rus mətbuatı vasitəsilə nəşr olunmağa başlandı. Tomsenin öz tərcümələrindən bəzisi "Memoires de la societe Finno – ougrienne" nam Finlandda risaləyi-mövqutəsinin müxtəlif nüsxələrində mündəricdir. Tomsenin kəşfindən sonra bu vadidə ən çox çalışan Peterburq əncüməni-danəş əzasından Radlov həzrətləridir... Məzkur akademiya tərəfindən Orxon sovahilinə heyəti-fənniyyənin məhsuli-məsaisi də bir çox xəritə və rəsmləri havi olaraq müsəvvər və mükəmməl bir məcmuə şəklində nəşr edilmişdir ki, başlıca dörd qismdən ibarətdir:



1) Orxon cəhələlərindəki asari-qəblət-tarix.
2) Tu-ku-ye sülaləsinin oğuz türkləri dövri-asarı.
3) Uyğur sülaləsinin dövri-asarı.
4) Moğol dövrünə aid asar.

Bütün şu təhərriyyatın nəticəsində Vamberinin kəşf etdiyi "Kutadqu-bilik"dən laəğəl üç yüz sənə daha əvvələ aid olmaq üzrə uyğur lisanının hər iki xətt ilə, yəni uyğur və run xətlərilə yazılmış asarı və bunlardan da qədim oğuz türklərinin tu-ku-yelərin yalnız run xəttilə olan yazıları əldə edilmişdir. Run yazılarının bulunmaqda olduğu məhəl Yenisey nəhrindən Orxona qədər mümtədd olub min kilometrdən ziyadə bir məsafə təşkil edər. Kəşfiyyatın ən mühümmü Qoşo-zaydam nam mövqedə və sənəyi-miladiyyəsində türk-oğuz hökmdarlarından Kültəkin və Bilgə xanların namlarına rəkz olmuş daşlardakı run yazılarıdır. Bu növ yazılarla türk qövmünün vəqayei-tarixiyyəsi xanların fütuhatı və sairə dövri-dastanı Lejandr denilən ən qədim zamanlardan bida ilə Bilgə xanın vəfatına qədər qayət milli və şairanə bir surətdə hekayə edilir. Bu yazılar miyanında bir də Bilgə xanın öz millətinə, yəni türklərə xitabən bəzi vəsaya və ixtaratını havi bir növ vəsiyyətnaməsi vardır ki, şayani-diqqətdir.

* * *

Keçən məqaləmizdə rus və fin üləmasının Orxon və Yenisey cəhətlərində və bilxassə Qaraqurum şəhəri xərabələrində bulduqları asari-mühümməyi-tarixiyyədən və bu sayədə danyalı Vilhelm Tomsenin qədim tu-ku-yelərin run denilən yazılarını həll edib türk tarixini mütaliəyə yeni yollar açmış olmasından bəhs etmiş idik. Run uyğur yazılarında və sair Orxon asari-ətiqəsində oğuz və uyğur türklərinin vəqayei-tarixiyyələrindən başqa etiqadi-diniyyəyi-qədimlərinə, sənayelərinə, sənayei-memariyyə və nəfisələrinə, ziraət və ticarətlərinə, adət və əxlaqlarına, əlbisə və qiyafətlərinə, tu-ku-ye mərmər heykəlləri və sair əhvallarına dair pək çox məmulati-nafiəyə dəstrəs oluna bilir. Qədim türklərin dəmir və sair mədən emalatında məharəti-kamilə sahibi bulunduqları aşikardır. Bu məharətləri zatən minəlqədim çin vəqəənəvisani tərəfindən dəxi mədh və səna edilməkdə idi. Bu gün belə bir çox türk əqvamının əsləhə emalı xüsusunda göstərdikləri hünər və ustalıq əcdadi-qədimələrindən irsən

intiqal etmiş bir keyfiyyətdir. Əlan Sibiriyada Yenisey səvahili türkləri "dəmirçi" ləqəbilə müləqqəbdirlər. Orxon run yazılarında "Əkin", "Əkinlik" kibi təbiratla ziraətə dair verilən məlumat, ovalardakı süni isqa cədvəlləri isə su yolu kəmərlərinin şayani-diqqət bəqayası və sair bu növ asari-mühümmə türklərin bilxassə köçəbə və bədəvi olmayıb minəlqədim ziraət və hirasətlə məşğul mədəni bir qövm bulunduqlarını isbat eyləyir.

Tu-ku-yelərin etiqadati-diniyyələri keçənki məqalələrimizdə zikr olunduğu vəchlə şaman bütpərəstliyindən ibarətdir. Lakin bu bütpərəstlik məzkur dövrlərdə o qədər qaba olmayıb Misir, ya Yunan məzahibi-qədiməsi qədər xurafati-kəsirəyə boğulmamışdır. Run məhkukatında zikr olunan məbudların ədədi məhduddur. Başlıcaları "onqon" "Oğan?"[1] nam məbud "yer" (ərz) nami-allah, "Humay" nam ilahə və sairədir. Fəqət şu təəddüd ilahə ilə bərabər türk oğuzlarda vəhdaniyyəti-rəbbaniyyə fikrinə bir meyil bulunduğuna sahibüssəma mənasına gələn və ilahülilahə olması möhtəmil olan "tanrı" gög tanrı və yaxud sadə "gög" denilən allah dəlalət ediyor. Qədim türklərin ruha etiqadları var idi. Orxon məhkukatına görə ruh bir quş şəklində təsəvvür olunuyordı. Movtayı dəfn etmək adəti dəxi talibi-diqqətdir.

Run xətti ilə yazılmış asar və məhkukat başlıca iki müxtəlif nəvahidə kəşf olunduğundan əlifbasına "Yenisey və Orxon" əlifbası namı dəxi verilir. Bunlar haqqında əxirən mütaliati-məxsusədə bulunmuş müvərrixeyn və lisaniyondan bəzi zəvatın qövllərinə görə Yeniseyrun lisanı indiki Qara qırğız türklərinin əcdadı dili və Orxon runlarının lisanı isə bugünkü türkcə ləhcələrin cəddi-əlası etibar edilmək lazım gəlir.

Çinlilərin Tu-ku-ye namilə zikr etdikləri oğuz türklərindən sonra ən qədim türklər, qırğızlarla uyğurlardır. Hər nə qədər qırğızların tarixi-mədəniyyətləri qədimlik cəhətilə ötəkilərdən, yəni həm oğuz, həm də uyğurlardan geri qalmazsa da, lakin tu-ku-yelərin bilavasitə əsil varisi-hökumət və mədəniyyətləri uyğur qövmünün bulunması, bizi əvvəl əmrdə uyğurların əhvali-tarixiyyəsindən bəhs etməyə

[1] Mərhum Şəmsəddin Sami bəyin "Qamusi-Türki"də əlyövm cığataycada müstəməl: "Oğon" əski türk müşriklərinin ən böyük məbudi olub fəzavü kainatdan kinayə idi, diyor və yunan məbudi ovğun "mühiti-kül" ilə müşabehəti-ləfziyyə və mənəviyyəsinə təəccüb eliyor.



məcbur eyləyir. Uyğurların ləhcələrindən iki növ asar qalmışdır ki, birisi marrüzzikr run xəttilə və digəri isə qədim Suriya və nəsturi hürufatından mühərrəf zənn olunan və bilxassə "uyğur" denilən xəttilə yazılmış bulunur. Məlum olduğu üzrə uyğurların paytaxtı Orxon nəvahisindəki qədim Karakorum olub, bu şəhər bilaxərə 13-cü əsri-miladidə cingizlər dövründə bina olunan yeni Karakorumdan daha vase, daha əzəmətli və daha gözəl idi. İştə uyğur qövmünün hər iki xətt ilə olan yazılarının tarixcə ən mühümləri Orxon civarında qədim Karakorum xərabələrində kəşf olunmuşdur. Bunlar miyanında "Kutadqu biliğ"ə nisbətən daha qədim məhkukatdan başqa bir çox əl yazısı ilə asar belə bulunuyor![1]

Məəmafih uyğurların daha qədim voqayei-tarixiyyələrinə vaqif olmaq üçün Çinin dördüncü əsri-miladidə yazılmış kütübi-tarixiyyəsinə müraciət etmək lazım gəlir. Çin tarixlərində uyğurların iki mühüm şöbəsindən şimaldakılara hay-qoy, yaxud hoy-he namları verilir, Fin və macarlara verilən hunqar ya Venqer, yaxud Enqrus[2] namı dəxi "uyğur" ləfzindən mühərrəf bulunduğu iddia olunuyor. Zira uyğur türkləri qərbə doğru irəlilədikdə bəzi fin əqvamı ilə qarışıb guya bunlara öz namlarını vermişlərdir. Tu-ku-yelərdən sonra hayqoyların hökuməti ancaq bir əsr qədər davam etdi. Çünki 840 sənəyi-miladiyyəsində bunlar yuxarı Yenisey cəhətlərindən gələn qırğız türklərinə məğlub olaraq Türküstani-şərqiyə hicrətə məcbur oldular. Bu tarixdən sonra uyğurların əhvalı Çingiz dövrünə qədər məchul kibidir. Uyğurların "Edikut" ünvanlı haiz bulunan Türküstani-şərqidəki xanları Çingizə öz arzu və rizalərilə ərzi-inqiyad etdikləri və bədə Çingiz dövri-mədəniyyətində uyğurların yenidən böyük bir rol oynamağa başladıqları vəqəənəvisan zamanı mütaliə edənlərin məlumudur. "Edikutlar"ın təhti-hökmündə bulunan son uyğur şəhəri Qara Xoca bələdəsi idi ki, əlan Turfan civarında xərabələri məşhud olmaqdadır. Türküstani-Şərqidə Qara Xocadan başqa dəxi bir neçə şəhər xərabələri vardır ki, uyğur asarıdır. Beşbalıq və sairə Çingizdən sonra uyğurlar tədricən budda və nəstur məzhəblərini və "uyğur" xəttini tərk edib haman cümləsi dini-islamı və əlifbayi-ərəbiyi qəbul və həttə qonşuları arasında nəşr etdilər. Bir dərəcədə ki, uyğurlar

[1] Uyğurlar bir zaman budda məzhəb olduqlarından ortada uyğur xəttilə yazılmış sanskrit asari dəxi vardır.

[2] Bir az rumcalaşmış bir istilahdır.

xəttindən hasil olan moğol və mançu xətləri bu gün türklərin öz aralarında əsla müstəməl degildir. Əlyövm "uyğur" namilə bir çox türk qəbaili mövcud isə də böyüyəcək cəmaət halında olaraq ancaq iki qövm bu namı mühafizə etmişdir ki, bunlar da Tibet hüdudunda sakin qara uyğurlarla sarı uyğurlardan ibarət bulunur. Qara uyğurlar bu gün türkcəyi unudub moğolca söyləyirlərmiş. Fəqət sarı uyğurların lisanı xalis türkcəligi mühafizə etdigindən şayani-mütaliədir. Şübhə yoxdur ki, Çin hökuməti heyəti-fənniyyələrə və ələlümum elmi-lisan və elmi-əhvali-əqvam maraqlılarına şu sarı uyğurların içinə səyahətə, Türküstan və Moğolustan cəhətlərində həfriyyat icrasına və təhqiqati-sairəyə müsaidəyi driğ etmədikcə uyğurlara dair ittilaatımız artar və bu surətlə elmi əhvali-ətrak daha ziyadə tərəqqiyyata məzhər olur.

* * *

Bu gün oğuz Tu-ku-yelərlə uyğurların nami-qədimini mühafizə edən türklər bir qaç kiçik qəbilə və əşirətlərdən ibarət olduğu halda türkün Altay dağları ilə Yenisey nəhri tərəflərində mədəniyyəti-qədimələrinin asari-mütəəddidəsi müşahidə olunan bir üçüncü böyük şöbəyi-tarixiyyəsi daha vardır ki, kəsrəti-nüfus və hissiyyati-milliyyə etibarilə əlan belə əhəmiyyəti-əziməyi haiz olub nami-qədimlərini əsla tərk etməmişdir. Bu şöbə qırğızlarla, qırğız qazaqlarından ibarətdir. Hətta denə bilir ki, ümum ətrak aləm içində bu gün türklüklərini lisanən, əxlaqən, fitrətən ən ziyadə mühafizə etmiş bir qövm varsa, o da qırğızlardır.

Qırğızları etnoqrafiya üləması iki şöbəyə ayrıyorlar. Birinə "Qırğız qazaqları", yaxud sadəcə "qazaq", digərinə də "qara qırğız", yaxud "qırğız" deyirlər. Əsil xalis qırğız da bu qara qırğızlardır. Qara ləqəbi ancaq ötəkilərdən təfriq üçün sonradan verilmişdir. Əsil qırğızlar, yəni qara qırğızlar İşıq göl ətrafında, Türküstani-Rusidə cərəyan edən Çu və Talas çaylarından Türküstani-Çini daxilindəki Tarım nəhrilə, Tyan-şan və Altay dağlarına və Hind hüdudunda kain Pamir cibali-mürtəfiəsinə qədər olan əraziyi-vasiənin müxtəlif cəhətlərində təvəttün edən və milyonlarca nüfuza malik bulunan əşair və qəbaildən ibarət bulunurlar. Çinlilər bunlara Ki-li-Ki-zi təsmiyə ediyorlar. Bu türklər çinlilərə ən qədim dövrlərdən bəri məlumdurlar. Bir neçə əsr miladi-İsadan əqdəm yazılmış Çin tarixnamələrində bunların Gen-



Qon namilə müstəqillən böyük bir hökumət təşkil etmiş olduqları müqəyyəddir. Gen-Qonlılar sair əqvam ilə qarışıb bir vəqt Xaqas[1] namını almışdı. Çinin əski müvərrixini şu xaqasları qayət mütəməddin bir qövm deyə tərif ediyorlar. Hökmdarlarına Ajo namı verilməkdə idi. Xaqasların məzhəbi şaman məzhəbinə və xətti-rəsmiləri uyğurların xəttinə müşabeh idi. Xaqas dövlətinin məmaliki altıncı əsr miladiyə doğru ziyadə təvəssö edib, Baykal gölündən Tibetə qədər imtidad etmiş və Asiya qitəsinin şimal şərqisində vüsətcə ikinciligi qazanmış idi. Roma imperatoru İkinci Yusten tərəfindən 569-cu sənəyi-miladiyyəsində Tu-ku-ye hökmdarı bulunan Dizabolun nəzdinə göndərilən Zemarx nam elçinin səyahətinə dair hekayətdə qırğız adı zikr edilib. Hətta Zemarxa türk padşahı tərəfindən "Xerğiz" əsilli bir kölə əhda edilmiş olduğu belə nəql olunmaqdadır. Məzkur dövrlərdə qırğızlardan Çinə səkkiz dəfə elçi getmişdir. 758 sənəyi-miladisində Xaqas dövləti inqiraz bulub məmləkətlərini uyğurlar zəbt və istela etdilər. Artıq bu tarixdən sonra bunların əhvalı məchul kibidir. Ancaq məlum olan bir şey varsa, o da budur ki, Xaqaslar bir müddət Ərəbistanda münasibəti-tüccariyyədə bulunmuşlardır. Bu isə qırğızların bilaxərə islamiyyətə bir meyil göstərmiş olmalarından naşi şayani-diqqət bir keyfiyyətdir. IX əsrdə hökumət bir aralıq təkrar Ajoların əlinə keçmişsə də, sonra yenə uyğurlara keçib axirüləmr cümləsi, yəni həm qırğızlar, həm də uyğurlar Çingizə ərzi-təbəiyyət etməyə məcbur olmuşlar[2]. İştə görüyoruz ki, turklügün ərkani-əsasiyyəyi-tarixiyyəsi başlıca Tukuye (oğuz), uyğur və qırğız namlarilə üç şöbədən ibarət olub, digər adlarla müsəmmi türklərin səhnəyi-tarixdə sonradan zühur etdikləri və hətta müsəmmi bulunduqları adların

[1] Qırğız ləfzinə müşabihəti aşikardır. Əxirən əl yazısı ilə asarı Misirdə kəşf olunub IX əsri-miladi səyyahlarından bulunan Əbülqasım ibn Xurdadbeh xaqasları qırğız namilə zikr etməsinə məbna "xaqas" ləfzinin çinli lisanında "qırğız"dan mühərrəf bulunduğu anlaşılır. Ş.Sami bəy "Qamusu"nda bu ismi "qırğız" şəklində yazıyor. Daha doğrusu, "qırkız" yazmaq icab edərdi. Çünki qırkız səhranəvərd, yəni qırlarda gəzən deməkdir. Sair türk əqvamı hökmdarlarına, əmirlərinə nisbətlə nam aldıqları halda qırğız isminin bu surətlə təşəkkül etməsi şayani-diqqətdir.

[2] Baladəki məlumat Pozdneyevin məqaləsindən iqtibas edilmişdir. Avropa lisanlarında qırğızlara dair xeyli asar və tətəbböati-fənniyyə və ədəbiyyə vardır. Əz cümlə, Klaproth "La langue des kirghises" (Mem: ree a J'Asie). Dingelstedt "le regime patriarcal et le droit coutumier des kirgliz" 1891. Dal nam ədibin "Boki və Mayana" ünvanlı qırğızları təsvir edən romanı dəxi şayani-tizkardır.

əksəriyyən bilaxarə bir zata mənsubiyyətdən naşi verildigi anlaşılıyor. Bu qəbildən olaraq "qırğız qazaqlar" da sonradan təşəkkül etmiş bir qövm isələr də, lakin əsil qırğızlara qərabət və müşabihəti-külliyyələrindən naşi haqlarında bir nəbzə burada bəhs etməmiz münasibdir, zənn edirəm. Qırğız qazaqları özlərinə sadəcə qazaq deyirlər.

Bu nam əvvəla Asiyayi-Vüsta ətrakının heyəti-müttəhidəsindən ayrılan köçəbə qəbilələrə verilirdi. Bilaxirə müxtəlif tərəflərdən ayrılıb bir yerə toplananlar yeni bir heyəti-müttəhidə hüsulə gətirərək "qazaq", yaxud "qırğız qazaq" namını mühafizə etdilər. Bu yeni heyət ancaq Çingiz dövründən sonra zühur edib bu cahangirin hökuməti ənqazından və bilxassə Əbilxeyr xanın hökuməti-inqirazından sonra sərbəst qalan özbəklərdən təşəkkül etmişdir. Bunlar üç milyondan ziyadə olaraq, böyük bir əksəriyyətlə (əhalinin yüzdə səksəndən ziyadəsi) başlıca İşıq göl ilə Ural nəhri beynindəki ərazidə təəyyüş edirlər.

Ağmolla şəhəri işbu diyarın biladi-məşhurəsindəndir. Qazaqlar Qasımxan və sonra Aqnəzər xan dövrlərində 300.000 nəfərlik orduya malik bulunan böyük bir hökumət təşkil edə bilmişlərdir. Mərkəz hökumətləri bir zaman Taşkənd olmuşdur. Bilaxirə Qazaq hökuməti xanlarının yekdigərlə qovqaları və qabiliyyətsizlikləri yüzündən inqiraza yüz tutub BÖYÜK, ORTA və KİÇİK ordu namlarilə üç qismə ayrıldı... Bu gün qazaqların bir qismi Çin torpağında yaşayırsa da qismi-külliləri Rusiya imperatorunun təbəəsidirlər. Antropolociya elmi nöqteyi-nəzərindən bu türklər dəxi sairələr kibi həm moğol, həm Qafqaz çöhrəli bulunuyorlar.

Biniçilik, silahşurlıq, igitlik, mərdlik, cəngavərlik, bunlarla bərabər istiqamət, doğruluq, müsafirpərvərlik, ciddiyyət, şeir və ədəbiyyata meyil və həvəs bilxassə bu qövmün övsafi-guzidəsindəndir. Həmiyyəti-milliyyələri nəhayət dərəcədədir. Qövmiyyət və cinsiyyətlərinə fövqəladə məzurdurlar. Qırğızlıqları ilə fəxr edirlər. Bu hal qara qırğızlarda daha ziyadə nümayan oluyor. Bunların cümlə əşayiri yekdigərlərinə bir ailəyi-vahidə əfradı kibi bir ittihadi-mənəvi ilə bir məhəbbəti-qövmiyyəyi-müqəddəsə ilə bağlıdırlar. Bu məhəbbət ruhlarının, qəlblərinin ən dərin nöqtəsindən nəban edir, öylə yaşarlar. Hər əşirətin ayrıca bir əmiri vardır ki, Mənap deyilir. Lakin bunların cümləsi Ağa Mənap namında daha böyük bir əmirə itaət etdiklərindən bu vasitə ilə yekdigərlərinə mərbut bulunurlar. Cəngavərlikləri xariqüladə bəsalət və şücaətləri, isimlərindən də anlaşıldığı vəchlə



hərəkətə, gəzməgə, təbdili-məkanə nəhayət mərtəbə meyil və həvəsləri sayəsində Asiyanın mərkəzində bulunan bu qövm tarixi-aləmdə inqilabati-əzimiyi-cahanda Vamberinin dedigi kibi, böyük rollar oynamışdır. Çingiz və Teymur kibi cahangirlər ən ziyadə bunlar vasitəsilə məramlarına nail olmuşlardı... ...Asiyayi-Vüsta "insan sellərinin nöqteyi-təsadüm və təlahüqidir... O nöqtədə təlatümlər, girdablar hüsulə gətirən qövm də qara qırğızlar olmuşlardır..."

Fridrix Rodzel, "Əhvali-əqvami-aləm" ünvanlı kitabi-mötəbərində Pamirin, yəni bu "Bami-cəhanın" cəhəti-şimalisində sakin qırğızları tərif edərkən haqlarında deyir ki, "Miləl və əqvamın həqiqi mayəsi *vrai ferment des peuples* bunlardır!.."

Bu qövmün zəkai-təbiisinə, istedad və qabiliyyəti-fitriyyəsinə heyran olamaq qabil deyildir. Hər hansı sənəti, elm və fənni təhsil etsələr, onda dərəqəb hünərlərini göstərərlər.

Heç şübhə yoxdur ki, bunlar rusun və Avropanın dairəyi-mədəniyyətinə idxal edilib, maarifi-cədidədən, ülumi-müsbətədən bəhrədar və müstəfid olur, tənviri-əfkar edərlərsə, Rusiya imperatorluğunun ən xeyirli ərkanından biri sırasına keçərlər. İçlərindən Rusiya məkatibi-aliyəsində kəmali-müvəffəqiyyətlə təhsil edib yetişən ərbabi-elm və hünərləri sözümüzə birər bürhani-mücəssəmdirlər... İstər İrtış, istər Volqa nəhri kənarı əhlindən olsun, qırğızların cümləsi türk şivəsi ilə qonuşurlar. Qara qırğızlarla qazaqların ləhcələrindəki fərq həmən ancaq bəzi hürufi-türkiyyənin əsvati-tələffüziyyəsindədir. Lisanlarındakı fəsahəti-təbiiyyə məşhurdur. Əsla məktəb görmüyənlərin belə bəlağətə, gözəl söyləməgə meyl və həvəsləri nəhayət dərəcədədir. Şeir nəzərlərində sənayei-nəfisənin ən məqbuli, ən mötəbəridir. Asari-şairanələri əşari-süniyyədən ziyadə əşari-təbiyyəyi-milliyyədir. Bu növ təbii əşar bunlarda pək tərəqqi etmişdir. Lisanlarında ağızdan-ağıza söylənən şeirlərdə, dastanlarda öylə xariqələr, bədiələr vardır ki, bunları mütaliə edən üləmayi- "ətrakşünasani" böht və heyrət içində buraxmışdır. Hər iki qırğız qövmünün təbi-şairanələrində dəxi fərq vardır. Qazaq qırğızlar "lirik" deyilən əşari-hissiyyəyə, qəzəliyyata rəğbət və inhimak göstərdikləri[1] halda, daha parlaq, daha şəşəəli bir maziyi-tarixiyə,

[1] Novruz bəy, Bəymurad və sairə qazaqların bu zəmində şöhrət qazanmış şairlərindəndir. Radlovun "Şimali türk ədəbiyyatı müntəxəbatı" ünvanlı təlifatı şayani-mütaliədir. Radlovdan başqa qırğız əşarinə dair xeyli əsər yazanlar olmuşdur.

tarixi-qəhrəmananəyə malik bulunan qaraqırğızlar "epik" denilən əşari-təsviriyyəyi-hakiyədən, Firdovsiyanə dastanlardan zövq alır, öylə şeirlər vücuda gətirməgə meyil göstərirlər!.. Akademiya əzasından alimi-möhtərəm Radlov deyir ki: "Yunan şairi-əzəmi Homer zamanındakı sünuhati-milliyyənin dövri-dastanisini bu gün ancaq qırğız qövmündə müşahidə etmək mümkündür..." Qırğızların bu növ əşarı başlıca sarı noğay qəbiləsindən olan "Ərmanas" nam qəhrəmanın hünərlərini təsvir ediyor...

*Ə.H.*

*"Həyat", 1905, № 4, 9, 16, 22, 35, 52, 81, 82*

## ERMƏNİ VƏTƏNDAŞLARIMIZA TÖVSİYƏ VƏ İXTARATIMIZ

Əhli-nur əhli-nar amixte,
Dər miyaneşan kuhi-Qaf ənkixte[1]

Zirdə qəzetəmizə, cümlə millət vəkillərindən mütəşəkkil, "Bakı sülh və vifaq komitəsi" tərəfindən irsal edilən bir vərəqəyi məəl-məmnuniyyə təb" və nəşr ediyoruz. Bu vərəqədə ümum qəzetələr, daha doğrusu, qəzetə mühərrirləri sülh və müsalimət dairəsində çalışıb müsəlmanlarla ermənilər beynində təlifi-beyn xüsusunda qeyrət etməyə dəvət olunuyorlar...

Biz zənn ediyoruz ki, bu dəvət "Həyat" qəzetəsinin özünə xitabən degildir, çünki "Həyat"ın məsləki əsasən sülhcuyanə və asayişpərvəranə olduğu aşkar olmaqla böylə bir dəvətnaməyə əsla ehtiyacı yoxdur. Biz məsləkimizin sülhpərvəranə olduğunu daha "Həyat"ın intişarə başladığı ilk gün bəyan etmiş idik. Qəzetəmizin ilk nüsxəsi sülhpərəstanə əfkar, həttа o yolda sünuhat və ilhamat ilə başladı[3]. Erməni üdəbasından bəzisi ittihadi-islam qorxusu saiqəsilə rast gələn qəzetələrə kizb və böhtandan ibarət məqalələr yazdıqları bir zamanda biz:

Dövri-islahatdır, sülhü səlah əyyamıdır,
Arkadaşlar, sülh edin, sülh etməgin həngamıdır –

[1] Tərcüməsi: Nur əhli cəhənnəm əhli qarışdı,
Aralarından Qaf dağı ucaldı.



beytini mənzuməmizə nəqərat ittixaz edib bila təfriqi-din və məzhəbi-ümum vətəndaşlarımıza xitabən təkrarlamaqda idik... Qəzetəmizin ilk nüsxəsində nəşr edilən bu növ xeyrxahanə sözlər təsirsiz qalmadı. Buna dəlil, təbi-şairanələri müsəllə olan sail din qardaşlarımızın qəlbləri bizim ilə həmahəng zərban olub yenə sülh və vifaqə dair şövqavər mənzumələr vücudə gətirmələridir. Üç-dörd gün müqəddəm qəzetəmizin sütunlarında deyilmi idi ki, növrəsidəkan şüəramızdan Əli Əkbər Sabir, bu büğz və ədavətin və bu nifaqın və bunlardan iləri gələn nəhb və qarətin, qətl və qitalın bir cəhl və qəflət, bir zəlalət nəticəsi olduğunu xalqa bildirmək üçün fəryad edib duruyordu[4]. Erməni qəzetələri və qəzetə mühərrirləri buna diqqət etdilərmi? Erməni süxəndanları Əli Əkbər Sabirin mənzuməsində nəqərat olub təkrar edən:

Ey süxəndanan, bu günlər, bir hidayət vəqtidir,
Ülfəti-ünsiyyətə dair xitabət vəqtidir, –

beyti-mənidarından ibrət alıb o yolda qələm oynatdılarmı? Bir şeir və ya bir məqalə yazdılarmı? Yazdılarsa bildirsinlər. Biz onları tərcümə edib sülh və vifaq meylinin ikitərəfli olduğunu cəmaətimizə böyük bir məmnuniyyət və məsərrətlə bildirməyə hazırız... Yoxsa bu günədək erməni lisanında çıxan və yaxud erməni mürəvviciəfkarı bulunan qəzetələrə dördgözlə diqqət etdiyimiz halda sədrə şəfa verəcək bir sözə rast gəlmədik. Şübhəsiz, ermənilər də hər millət kibi bir millətdirlər, onların da özlərinə məxsus qüsurları olduğu kibi məzayaları vardır. İçlərində hər millətdə olduğu kibi, fəna adamlar varsa da, yaxşıları daha çoxdur, biz erməni millətini heyəti-məcmuəsilə bəzi narəva işlərdən naşı əsla ittiham edəməyiz, onların dəxi ümumiyyət etibarilə nifaq və şiqaq əleyhində olub sülh və vifaqə şiddətlə meyyal buluqduqlarına əminiz!.. Ancaq ermənilərin əhli-maarifi, mühərrirləri, ədibləri öhdələrinə tərtib edən vəzifəyi, iki millət arasında təlifi-beyn etmək xüsusundakı müqəddəs vəzifəyi əsla ifa edəmmədilər, bu xüsusda həttа bəzilərinə bir həmaqət belə ariz oldu.

Bunlar cahilanə bir nifaq, hər iki tərəfi müsavat üzrə zərərdidə edib, eyni müsibət və fəlakətlərə düçar etdiyi halda, hər iki tərəfdən ölənlərin ədədi təxminən bir olduğu, təəssüb, cəhalət, vəhşət, hər iki tərəfdən eyni dərəceyi-şiddətlə izhar edildiyi halda, erməniləri

haqlı, insaniyyətli, bigünah və əlhasil məsum bir quzu kibi göstərməyə, bizi isə bütün bunun əksi-övsaf ilə tövsif etməyə qeyrət ediyorlar, qəzetələrlə, teleqraflarla, ajanslarla Avropanın bir ucundan o biri ucuna, bəlkə ta Amerika və Avstraliyaya qədər o yolda fəryadlar ediyorlar. Daha doğrusu, bizim kibi aciz qalmayıb edə biliyorlar idi. Pişik öz pisligini torpaqla sitr etdiyi kibi, bunlar da öz qüsurlarını, öz qəbahətlərini, öz vəhşətlərini söz tufanı içində gizləyib, bizim isə ən kiçik qəbahətimizi birəni dəvə edərcəsinə mübaliğələndiriyorlar idi. Bu qədərlə də iktifa etməyib adətən qəsdi-iftiralarda bulundular. Əvvəla, Həsən bəy və Fərrux bəy kibi hər növ şaibədən bərra bulunan vücudi-pakları ləkədar etmək istədilər, müvəffəq olunmayınca Əhməd bəyə müsəllət oldular. Zavallı Əhməd bəy, bir zəlaləti-ümumiyyə nəticəsi olan Bakı müqatiləsi əsnasında öz həyatını təhlükəyə qoyaraq, öz vücudunu bərbad edərcəsinə tərəfeyni barışdırmaq üçün ciddü cəhd etdiyi, gecəyi-gündüzünə qatıb o halda nitqlər iradı, məqalələr təhriri ilə məşğul bulunmuş olduğu halda, keçənlərdə guya fəsad çıxarmaq üçün Qarabağa getdiyini yazan qəzetə, erməni qəzetəsi degilmi idi?..

Əvvəla, Əhməd bəyin bir an Bakıdan bir tərəfə ayrılmadığına erməni və müsəlman bütün Bakı camaəti şahiddir. Saniyən, Əhməd bəy öz vətəni bulunan Qarabağa getmiş olsa dəxi, "Mşaq" qəzetəsinin iftira degil, hətta ən cüzi bir sui-zənndə belə, bulunmağa nə həqqi ola bilir?! Əhməd kibilərin bulunduqları, daha doğrusu, hökm və nüfuzları cari olan yerlərdə sədayi-nifaq degil, ahəngi-sülh, vifaqi-təninəndaz olacağı gün kibi aşikar və mühəqqəqdir. Hər nə hal isə biz böylə şəxsə aid iftiralara zatən əhəmiyyət verənlərdən degiliz. Əsil məsələ ümumimizə, ümumtürk və müsəlmanlara aid iftiralardır ki, bəzi erməni mühərrirləri bu növ iftira və böhtandan dəxi çəkinmədilər. Guya ümum müsəlmanlar, yəni üç yüz milyondan ibarət müsəlmanlar ittifaq və ittihad edib bu günlərdə çəgirtgə kibi qanadlanıb uçacaq və Rusiya ilə Avropanın üstünə töküləcək və Qərb mədəniyyətini bəlkə də bütün xristian aləmini bağı ilə, bağçası ilə, əkiniylə, əhalisiylə yeyib yetəcəklərmiş. Buna da guya indiyə qədər ermənilər manc olduğundan, ittihadi-məzkurun mərkəzi olan bir nöqtədən, İstanbuldan, Kabildən, ya Bombeydən ermənilərin qətli-amminə dair bir barmaq işarəti çəkilmiş imiş!..

Bu sözlər iftira olsa dəxi qayət safi-dərunanə, sadədilanə, adətən tiflanə bir iftira olduğu aşkardır. Ay mühərrir, ay Nikoksof panislamizmə ləfzini icad edənlər şərqlilər degil, qərblilərdir, çünki, zatən müttəhid və müttəfiq bulunan, hər gün qütbi-şimalidən qütbi-cənubiyə qədər, Amerikadan Avstraliyaya qədər dua və niyazlarını dərgahi-əhədiyyətə isal üçün gündə beş kərrə səlat əsnasında üzlərini eyni nöqtəyə çevirən, hər il hər tərəfdən axın-axın gedib bir əlaməti-ittihad olan həcəri-əsvədin, yəni Kəbədəki o binai-müqəddəs ittihadın ətrafında təvaf edən, orada və hər yerdə bir-birilərini eyni kəlmə ilə salamlayıb əleykümə ssəlam ilə ənamül-möminun üxüvvəti-dini, aləmi-islam o qədər müttəhid, o qədər müttəfiqdir ki, "panislamizm" kibi bir əcnəbi kəlməsi icad edib yenidən ittihad və ittifaq etməyə əsla ehtiyacları yoxdur!..

Səni ittifaq və ittihadmı qorxuduyor?.. Biz isə nifaq və şiqaqdan qorxuyoruz! Nifaq və şiqaq deyilmidir ki, sizlərlə bizlər arasında bu qədər qan tökülməyə səbəb oldu?! Bizim Qafqazda bu nifaq, bu ədavət və qital yetmiyormuş kibi bir də ümum aləmi-islamın içinə dəxi nifaq düşüb ittihadi-müslimin xatiriniz üçün müxtəlmi olsun, müslimin yekdigərinin qanınımı töksün? Siz bunumu istiyorsunuz?.. Xeyr, sizi qorxudan ittihad və ittifaq degildir!.. Bu zatən min üç yüz sənədən bəri mövcuddur. Qəribədir aranızdakı qitalın səbəbi cəhalət, qəflət və zəlalət olduğu mühəqqəq ikən, ermənilərin əksəriyyətincə dəxi mühəqqəq ikən, siz hər nədənsə aləmi-islamın ittihadından degil, xabi-qəflətdən oyanıb, təriqi-təməddün və maarifə sülukindən qorxursunuz! Sizi təlaşa salan zənn ediyoram bu cəhətdir. Sizə Tehranın "inci saçan fəvvarənin yanında xabidə", daha doğrusu xabi-qəflətdə qalmasımı lazımdır! Əgər siz, Nikoksov, o qədər balalara pərvaz edə bildiniz, o qədər büləndi-amalə nail oldunuzsa, əlbəttə, yalnız ermənilərin degil, xristianların degil, bütün aləmi-insaniyyətin xeyirxahı, bütün cahani-bəşəriyyətin tələbkari-səadəti olmanız icab edərdi. O halda iki-üç yüz milyon əhaliyi-islamiyyənin xabi-qəflətdən bidar olub təriqi-elm və mərifətdə teyi-mənazil etməsi nə üçün sizi qorxuduyor və bu halı bir təhlükə, bir xətər şəklində tərif və tövsif etməyə sizi və sizin kibilərin nə haqq və səlahiyyətiniz var?.. Sizin qorxu və təlaşınızla qanuni-təbiətə sədmi çəkiləcək zənn ediyorsunuz? Və ya siz bütün Avropayi təlaşa düşürməklə bizi təhdid etdiyiniz üçün, biz: – Xeyr, əstəğfürullah, qələt etdik. Biz nə aləmi-islamın sülh və insaniyyət dairəsində ittihadını arzu edər və nə də bu aləmin xabi-qəflətdən oyanıb ənvari-mədəniyyətlə münəvvər olmasını istəriz, – deyənlərdənmiyiz, zənn ediyorsunuz? Və bütün Şərq dəxi oyandığı

halda, sizin qorxunuzdan: "Qorxma, qorxma hənuz oyanmadıq"mı deyəcək?.. Xeyr, xeyr, sizin və bizim və ümumi-insaniyyətin nicat və səlaməti-bidaridə həqqi bilməkdə, nuri-maarifdə, tərəqqi, təməddün və təkamüli-daimidədir. Etiqadımızca, ancaq bu vəsaitlə insanlar, millətlər, din və məzhəblər arasından nifaq və şiqaq, cəng və cidal fəsx oluna biləcəkdir!.. Bundan sonra yekdigərimizin zəmm və mədhində bulunacağımıza, hər tərəfin söz bilənləri, söz anlayanları, əli qələm tutanları öz millətinin dəfi-cəhlinə, kəsbi-maarif etməsinə, tərəqqisinə çalışsın. Yoxsa bihudə bir ağız, ya qələm qovğası ilə vəqt keçirmiyəlim, nafilə yerə yekdigərimizin qeybətini etməyəlim. İştə sözlərimizə dəlil olmaq üzrə bugünkü nüsxəmizdə dəxi şüəramızdan müəllim Mirzə Həsib Qüdsinin xalqımızı sülh və vifaqə dəvət edən bəliğ bir şerini nərş ediyoruz. Qeyrət, vətəndaşlar, qeyrət!.. Çalışalım ki, Bakı və İrəvan hadisələri kibi çirkin şeylər yaddan çıxsın, hətta səhayifi-tarixiyyəmizdən belə silinsin!..

Maarifə, təməddünə, təkamül və təaliyə çalışalım, vəqtimizi qaib etmiyəlim, çünki yol uzundur, yoxuşdur, arizəlidir!..

*Ə.H.*

*"Həyat", 1905, №21*

## XƏYALİ-XAM

İspaniyadan "Russkiye-vedomosti" qəzetəsinə yazılan sərsəriyanə bir məktubla Qafqaz hadisati-müəssifəsi arasında bir münasibət, bir əlaqə var imiş!..

"Russkiye-vedomosti" qəzetəsinə (23 avqust tarixli 232 nömrə) İspaniyanın Seqovaya nam şəhərindən guya bir osmanlı müsəlmanı tərəfindən rus lisanilə axmaqca və imza yanlışları ilə dolu imzasız bir məktub göndərilmişdir. Məktubun başına bu fransızca ibarə vəz edilmişdir:

"Məğlub olub xar və zəlil düşən Rusiyanın Portsmutda müxəlli şərəf bir sülh müahidəsini imzaladığı zaman ona xitabən Türkiyənin dediyi sözlərdir". İmza yerinə də böylə yazılmışdır: "İntiqam alan müsəlman Türkiyənin sədası". Məktub Rusiyaya qarşı kin və ədavətin və müharibədəki ədəmi-müvəffəqiyyətlərdən naşi bimənа bir sevincək təsirilə yazılmışdır.



Baladəki sərsəriyanə sözlərdən məzmunu nədən ibarət bulunduğu anlaşılan bu uzun məktubun bir-iki fəqərəsini dərci-sütun etdikdən sonra "Russkiye vedomosti" qəzetəsi diyor ki: "Əgər bu məktubda ifadə və bəyan olunan hissiyyat həqiqətən osmanlı türklərinin hissiyyatına tərcüman isə, o halda bu günlərdə Qafqaz ölkəsində müsəlmanlar arasında nümayan olan hərəkatı hissiyyati-məzkurə ilə bir dərəcə izah etmək qabil olur. Bu hərəkat ermənilərі qırmaqdan başlayıb indi ümum xristianları təhdidə keçir".

Məzkur qəzetin baş mühərriri bulunan cənab Sobolevski bu sözlərin məntiqə müvafiq olmadığını özü də anlamış olmalıdır ki, qəti iddiada bulunmayıb fikrini "isə", "əgər", "bəlkə", "bir dərəcə" kimi əlfaz ilə ifadə etmişdir. Lakin bir şübhə yeri buraxıyor, bir sui-zənndə bulunuyor. Fəzlə olaraq öylə etiqad ediyor ki, qitalı başlayan müsəlmanlar olub; bunlar ələlümum xristian aləmini dəxi təhdid etmək üzrədirlər. Nə qədər batil, xam fikirlər!.. Biz "Russkiye vedomosti" qəzetəsinin yerinə olaydıq, böylə bir məktubu yırtar, lüzumsuz kağızlar səbətinə atar, onu qəzetimizin sütunlarında zikrə belə layiq görməz idik, nərədə qaldı ki, onunla Qafqaz vüquatı arasında bir də bir irtibat aramağa qalxışmaq!.. Çünki İspaniyanın "Ucraber" şəhərindən rus lisanilə imzasız bir məktubun türk bir müsəlman tərəfindən yazılmış olması qayət şübhəlidir. Məktub müsəlman tərəfindən yazılmış olsa dəxi imzasızlığı həsəbilə nəzəri-etibara alınmağa şayəstə degildir. Çünki bir məktubun nə dərəcələrdə vase bir məmləkətin, qoca bir millətin əfkar və hissiyyatına tərcüman olmaq iddiasında haqlı bulunduğu ancaq imza ilə anlaşıla bilər. Hər rast gələn sərsəri bir millət vəkili, tərcümanı, həyatı sayılmaz! Deyə bilərəm ki, elə bir məktuba adi bir adam deyil, hətta Əhməd Midhət, Əbu Ziya Tovfiq, Üşşaqizadə Xalid Ziya, Əli Kamal kimi mötəbər türk mühərrirləri, yaxud Əbdülhəq Hamid, Əkrəm bəylər kimi böyük şairlər dəxi vəziimza etmiş olsa idilər, mən yenə onları ümum osmanlıların tərcümani-əfkarıədd etməkdən ictinab edərdim. Çünki bunlardan hər biri olsa-olsa osmanlılardan kiçik bir firqənin hissiyyatını ifadə edə bilirlər. Əgər "Russkiye vedomosti" qəzetəsi bu firqələrin əfkarı nə mərkəzdə olduğunu bilməyə həvəs edirsə imzasız bir kağızda deyil, heç olmazsa meydanda osmanlı mətbuati-yövmiyyəsinə müraciət etməli idi... Bir mətbuat ki, iki böyük firqəyə ayrılmışdır: Bunlardan birisi Türkiyə daxilində çıxaraq Osmanlı hökumətinin və bilxassə Sultan həzrətlərinin mürəvvici-əfkarı olan "İqdam", "Tərcümani-həqiqət",

"Sabah", "Qeyrət", "Sərvət" və "Məlumat" kimi mühafizəkar və qeyri sərbəst qəzetələrdən və digəri isə hüdud xaricində məmaliki-əcnəbiyyədə intişar edən "Türk", "İctihad", "Şurayi-ümmət" və sairə kimi "Yeni türklər" denilən hürrəndiş tərəqqipərvəran zümrəsinin sərbəst qəzetələrindən ibarətdir. Birinci firqəyə mənsub qəzetələr rus və yapon müharibəsinin ibtidasından bəri əqsayi-Şərqdə vaqe rus hökumətinin ədəmi-müvəffəqiyyətlərindən naşi əsla bir əsəri-məmnuniyyət izhar etməyib məzkur müharibəyə dair Avropa mətbuatında görünən həvadisi ancaq qayət bitərəfanə surətdə tərcümə ilə iltifa elədilər. Özlərindən bu xüsusda müstəqillən kiçicik bir məqalə, bir bənd belə yazmadılar.

Rusiyanın daxilində baş göstərən şuriş və ixtilal haqqında isə bir sükuti-əmiq ixtiyar etdilər... Bir dərəcədə ki, bu qəzetələri oxuyan öylə zənn edər ki, müharibənin ibtidasından bəri Rusiyada asayiş və intizam əsla xələldar olmayıb, guya bu məmləkət bir xabi-əmiqə, bir növmi-müstəğrəqə giriftar olub bir sükunəti-tammə içində dəmgüzar oluyor. Bu qəzetələrə etimad edənlərin fikir və xəyalında ancaq Qoqolun Malorusiyaya, məsələn, "Mir qorod"da aid hekayətindəki bəzi xab və sükunət lövhələrindən başqa bir şey peyda olamaz!..

Xaricdə çıxan və osmanlı qövmünün amal və əfkarına binnisbə daha ziyadə tərcümanlıq iddiasına haqqı ola bilən cəraidə gəlincə bunlarda qayət müxtəlif surətlərdə yazılmış məqalati-müstəqilləyə rast gəldiksə də, lakin ümumiyyət etibarilə bunlar rusun bəzi öz liberal qəzetələri kimi bütün ədəmi-müvəffəqiyyətləri bürokratiyaya isnad edib rus milləti-nəcibəsinin islah və təcəddüdü uğrunda olan məsai və qeyrətinə təhsinxan olurdular.

İspaniyadan gələn məhud məktubdakı kin və qərəzdən bunlarda bir əsər görünmədi. Əz cümlə İsveçrənin Cenevrə (Jeneva) şəhərində çıxmaqda ikən bu axır zamanda idarə və mətbəəsini Misirə köçürməkdə olan "İctihad" qəzetəsinin bir çox məqalatı ancaq bürokratiya əleyhində olub. Yoxsa rus milliyyətinə qarşı tərəqqi, təcəddüd, sərbəstliyə meyil göstərən rus millətinə qarşı böyük bir "simpatiya" ilə mülhəmdir. Qəzetin sahibi və naşiri türkcə və fransızca əşari-güzidə və asari-fənniyyeyi-mütəəddidəsi ilə müştəhir Abdulla Cövdətdir. Baxınız, "İctihad"ın axırıncı nüsxəsində nə yazıyor:

"Ötədən bəri Rusiya əhvalına dair yazdığımız hər bir məqalədə təkrar etdiyimiz vəchlə bu müharibədən bürokrati məğlubən, ruslar müzəffərən çıxacaqlar", "...Ruslar xilasi-ümumi bayramının ərəfəsində bulunuyorlar, müstəhəqqdirlər..." Məqul və adil bir hökumətə layiq insanlar olduqlarını cahan mədəniyyəti önündə isbat etdilər... Bu gün əlahəzrət imperatorun lütfü ilə, hüsni-tədbirilə Rusiyada təəssüs etməkdə olan dövlət duması şairin bu sözlərini təsdiq etmiyormu?

Binaənəleyh İspaniyadan gələn məktubun bir müsəlman tərəfindən yazılmış olmasına biz əsla ehtimal vermədik. Böylə bir məktubun həm rus, həm də müsəlman düşməni olan bir şəxs tərəfindən yazılmış olması kağızın əlaimi-zahirəsindən aşkar olduğu kimi, məzmunu da osmanlı əhli-qələminin baladə şərh edildiyi vəchlə xaricdə və daxildə yazdıqlarına təmamilə ziddir. Ələlxüsus, bu axır zamanlarda osmanlı əhli-irfani tərəfindən bəzi nafe məqalələrlə isbat edildiyi vəchlə Türkiyəyi və bütün məmaliki-osmaniyyəyi xəfi və aşkar surətdə bu gün təhdid edən bir dövlət, bir millət varsa, o da alman və Avstriya dövlətlərilə ümumi cerman ünsürüdür. Bu mühəqqəqdir. Rusiyanın zəif düşməsinə müsəlmanlar əsla sevinəmiyəcəkləri kimi, böylə bir halın özləri üçün qayət müzürr nəticələr verəcəklərini də çox yaxşı bilirlər. Hal və keyfiyyətin bu mərkəzdə olduğunu ümumi düvəli-islamiyyə dərk etdikləri üçündür ki, cümləsi rus və yapon müharibəsi zamanında bitərəfliklərini təmamilə mühafizə edib hətta şəhamətli şahi-İran həzrətləri əxirən Rusiyanın müsafirləri sırasında belə bulundu.

Bir də İspaniyadan gələn məhud məktubun sahibi bihudə və əbəs yerə seviniyor, çünki Rusiya yaponlarla müharibədən sonra nə xarü zəlil düşdü və nə də Portsmutda imzaladığı sülh müahidənaməsi müxəlli şərəfdir. Rus dövlətindən başqa heç bir Avropa dövlətinin, nə Germaniya, nə Fransa və nə də İngiltərənin bu qədər uzaqlarda on, on iki verst uzaqlarda, müharibə etmək həddi deyil idi. Bu isə bir milyondan ibarət burlar kimi balaca bir qövm ilə üç il düşə-qalxa müharibə edən Anqliyaya acı-acı təcrübələrlə sabitdir.

Vitte həzrətlərinin hikmət və tədbirilə Amerikanın Portsmut nam bələdəsində imzalanan sülh müahidəsinin əsla müxəlli şərəf olmadığına isə bu gün Yaponiyanın paytaxtında və sair böyük şəhərlərində baş göstərən şuriş və ixtilallar böyük bir dəlildir!.. Lakin bunların cümləsindən sərfi-nəzər, Rusiyanın öz daxilində müharibənin təsirilə vücuda gətirdiyi təcəddüd və islahat öylə nafe gələcəkdə nətayici-həsənəyi-məsudəsi mühəqqəq, öylə əzim bir hadisədir ki, müharibə meydanlarında qazanılan min zəfərlərə bədəldir, müadildir. O zəfərlərlə deyil, bu təcəddüd və islah sayəsindədir ki, Rusiya çox keçmə-

dən ümum cahanın düvəli-mütəməddinəsi arasında ən bala mərtəbələrə süud edəcəkdir. "Peterburqskiye vedomosti" və "Rassvet" nam paytaxt qəzetələrində axirən "Sursum corda" ünvanilə bir məqalə nəşr edən, ingilis məşahiri-mühərrirlərindən Vilyam Sted cənabları dəxi bu fikirdə bulunub sözlərinə dəlil məqamında İngiltərənin tarixi-cədidini dərxatir etdirir. Diyor ki, XV əsri-miladda Jan d'Ark nam bir fransız qızının homiyyəti-vətənpərvəranəsi sayəsində ingilislər məğlub edilib, Avropa yerindən bilxassə Fransa torpağından tərd olundular. Lakin bu gün ingilislər o fransız qızının namını böyük bir hörmət və şükran ilə yad edirlər. Çünki o məğlubiyyət səbəbinədir ki, bilaxirə ingilislər dənizlərə, bəhri-mühitlərə hökmfərma oldular.

XVIII əsrdə ingilislər yenə böyük məğlubiyyətə düçar olub Corc Vaşinqtonun himmətilə Amerika bərri-cədidindəki müstəmləkələrini qayib etdilər. Fəqət ondan sonradır ki, ədalət və hürriyyətin qəvanini-əsasiyyəsi İngiltərə ölkəsində mətin bir surətdə yerləşib ingilis millətini bugünkü heyrətbəxşi-üqul olan tərəqqiyyati-əziməlرinə məzhər etdi. Vilyam Sted məqaləsinə böylə xatimə çəkir: "Bir neçə ildən sonra rus millətinə yəqin olacaqdır ki, bir dövlət duması üçün bir Mancuriya deyil, igirmi Mancuriya fəda etmək mümkün idi və tərəfi-imperatoridən rus millətinə bəxş və ehsan olunan böylə bir dövlət müəssisəsi padşah və imperator Nikolay Aleksandroviçin dövri-səltənəsinə zəvali-napəzir, müəbbəd bir şani-şərəf verəcəkdir. Öylə bir şani-şərəf ki, onu heç bir əqsayi-Şərq ədəmi-müvəffəqiyyəti xələldar edəmməz!"

*Ə.H.*
*"Həyat", 1905, №58*

## TÜRK DİLİNİ ÖYRƏNMƏYİN FƏVAİDİ

İslamın hikmətinə, qəvamizi-hikmətinə kəsbi-vüquf ilə hidayəti-rəbbaniyə məzhər olduqdan sonra bu qədərlə iktifa etməyib bir də o dini-mübinin ingilis məmalikində, vase müstəmləkələrdə və cəzayiri-kəbirədən ibarət nəfsi-İngiltərədə intişar və tərəqqisinə cəhdü qeyrət edən İngiltərə Şeyxülislamı Şeyx Abdulla Qovilyam bəy əfəndi həzrətlərinin təhti-idarə və nəzarətlərində ötədən bəri Liverpul bələdiyyeyi-əziməsində ingilis lisanı üzrə maarifi-islamiyyəyi nəşr məqsədi-xudapəsəndanəsilə "Zi qresent" – "Dhe Gresent",



yaxud "Əlhilal" namında bir cərideyi-əsbuiye çıxmaqda olduğu məlumdur. İştə, məzkur qəzetənin 30 avqust tarixli, axırıncı nömrəsi qarşımda!.. Mutaliəsindən özümüz müstəfid olduğumuz kibi qareini-giramımızı dəxi hissəmənd etmək istiyoruz. Məzkur nüsxənin mündəricatı miyanında məqalati-atiyəyə rast gəldik: "Türk lisanını öyrənmənin mənafei" ki, Uelss nam mühərririn əsəridir.

"Əhadisi-şərifeyi-nəbəviyyə" ki, şeyx Abdulla Qovilyam həzrətlərinin özü tərəfindən qələmə alınmışdır və əxirən "Liverpula gələn əfğan mollaları" ki, Mustafa Leon tərəfindən yazılmışdır. Əvvəla, baxalım, "türk lisanını öyrənmənin" fəvaidi haqqında Uelss cənabları nə kibi mütaliatda bulunuyor, şübhəsiz, bu fəvaidə ingilis müsəlmanlarının və ələlümum ingilislərin nöqteyi-nəzərindən baxılıyor, çünki əgər türklərin mənafeyi nəzəri-etibara alına idi, ayrı bir məzmunda məqalə yazılıb sərlövhəsi də böylə olmaq icab edərdi: "Türklər öz dillərini gözəl öyrənməkdən başqa ingilis dilini təhsildən, daha doğrusu, rus, ingilis, firəng və german dillərini təhsildən nə gunə mənafeyi-əziməyə dəstrəs ola bilirlər?.."

Hər halda məzkur məqalənin bəzi fəqərələri bizcə dəxi şayani-diqqət olmaqla tərcümə edib buraya dərc ediyoruz:

"Türk məmaliki təxminən dörd kərrə Fransa ölkəsindən cəsimdir. Fəqət türk dili yalnız məmaliki-məzkurəyə münhəsir qalmayıb İranda və Misirdə hökmdar saraylarında söylənməkdən başqa dərəcati-müxtəlifədə ta Dunay (Tunay) nəhrindən Nili-mübarəkə qədər və İstanbuldan Çini-Maçin hüdudunadək müntəşir bir lisandır. Türk lisanı ümum aləmin sövqülceyş nöqteyi-nəzərindən bəzi ən mühüm məvaqeinə hakim bulunan milyonlarca müsəlmanların söylədikləri bir dildir..."

"Bizim Türkiyədəki mənafeyi-siyasiyyə və tüccariyyəmiz "Levantin" (Şərqli firəng) denilən tərcümanların lütf və insafına buraxılmışdır. Ümid ediləməz ki, bunların qəlblərində türklərin, ya ingilislərin xeyri üçün böyük bir meyil olsun, çünki, doğrusu aranılırsa, bunlar nə ingilis və nə də türkdürlər və çox kərrə məlumatları ancaq naqis və səthi bir surətdə türkcə mükalimə edə bilməkdən ibarətdir..."

Bu axır zamanlara qədər türkcəyə aşina bulunan ingilislərin ədədi fövqəladə qəlil idi və ələlümum avropalılar arasında bu fikir və etiqad ziyadə müntəşir idi ki, guya türk dili o qədər təhsilə şayəstə olmayıb, türklər bir ədəbiyyata, yaxud mütaliə və qiraətə şayan bir ədəbiyyata malik degildirlər...

"Lisani-türkiyi təhsilə maneyi-əzimə təşkil edən məvaddən birisi də bu anadək Avropada və bilxassə Angliyada talibənin qovaidi-lisani öyrəndikdən sonra qiraət üçün bir şey bulmaqda rast gəldikləri müşkülatdır. Ehtimal türklərdə guya ədəbiyyat yoxdur, fikrinin Avropada bu qədər müntəşir olmasına bu hal az səbəbiyyat verməmişdir. Xeyr, türklər bir ədəbiyyata, hətta mütənəvve" və şayani-diqqət, müfid bir ədəbiyyata malikdirlər.

Lakin bu ədəbiyyata dair asarın başlıca nümunələri nadir və bahalıdır, çox kərrə ancaq əl yazısı halında olaraq bulunur və bu növ kitablardan bir məcmuə, bir kitabxana təşkili böyük bir pul məbləğinin sərfinə möhtacdır. Binaənəleyh türkcəyi öyrənmək üçün bilxassə əlzəm bir şey varsa, o da məcmueyi-müntəxəbat (xrestomatiya)dır, fəqət bütün Avropada bir dənəsinə rast gələməzsiniz[1]. Avropa talibəsinə məxsus olmaq üzrə yeganə bir qiraət kitabı var idi ki, o da "Qırx vəzirlərin hekayələri" namında bir məcmueyi-hekayət olub bu məcmuə "Əssənəyi-zindeyi-Şərq məktəbi" talibəsi üçün Fransa hökuməti tərəfindən Parisdə təb və nəşr etdirilmiş idi.

Məcmueyi-məzkurə bəzi türkcə hekayələrdən ibarətdir ki, nə tərcüməsi var, nə də bir şərh və təfsiri. Mətn özü öylə qədim, əskimiş, qüsurlu bir imla ilə mətbudur ki, oxunması qayət müşküldür və talibə ondan pək yanlış bir imla öyrənir. Fəzlə olaraq bu kitabda, üslub və şivəcə heç bir tənəvvö, cürbəcürlük yoxdur, çünki hekayənin kaffəsi bir müəllifin əsəridir. Bu qədər nəvaqis olan bir qiraət kitabı dəxi nə xatirlə, nə də pul ilə əldə edilə bilir, zira kitab, Şərq dillərini öyrənmənin əhəmiyyətini tamamilə dərk etmiş bulunan Birinci Napoleonun dövri-hökumətində, haman yüz il qədər bundan əqdəm bir zamanda nəşr edilmiş idi. Bu kitabın nüsxələri bu gün fövqəladə nadirdir. Binaənəleyh əminəm ki, türk müəlliflərinin bədaye asarından intixab olunan qitələrdən mürəkkəb bir məcmuə türkcə təhsil edən tələbəni məmnun edəcəyi kibi böylə bir cild ələlümum əhalimizin dəxi xeyli calibi-diqqəti olur. Zira camaatimiz görüb anlayacaqdır ki, türklərdə gözəl müvərrixlər, şairlər, hekayənəvislər, dram yazanlar (faciənəvislər), qəzet mühərrirləri vardır ki, əsərlərində tarix, ədəbiyyat və siyasət həvəskaranı üçün surəti-qətiyyədə bir cazibə vardır...

[1] "Həyat": Türkiyə talibəsinin özlərinə məxsus Ziya Paşa, Əbu Ziya Tofiq, Əkrəm bəy və sairə tərəfindən olduqca gözəl müntəxəbat kitabları vücudə gətirilmişdir.



Mühərrir bütün məqaləsində ingilisləri türk dilini öyrənməyə tərğib və təşviq edərək bunları əssəneyi-şərqiyyəyi tədris üçün Şərq Akademiyası təsis edən və türkcəyi böyük bir şövq ilə təhsil edən almanlardan ibrət alıb "Mütaliati-cədideyi-şərqiyyə məktəbi"ni daha ziyadə ikmal və islaha dəvət ediyor və kral VII Eduardın bu xüsusa dair olan nitqindəki tövsiyələri ingilislərin bir daha xatirinə gətiriyor.

*Ə.H.*
*"Həyat", 1905-ci il, №67*

## GÖZÜAÇIQ TACİRLƏRİMİZƏ XİTAB

Məmləkətimizdə hürriyyəti-mədəniyyə elan olundu, hürriyyəti-mədəniyyənin şəraiti-xəmsəsindən biri də hürriyyəti-mətbuatdır. Mətbuat isə yalnız qəzetələrlə nəşriyyati-movqufədən ibarət degildir. Risalə, kitab, qamus və sairə şəklində olan asar dəxi buraya daxildir. Türk dilində və ələlümum müsəlman dillərində kitablara əşədd ehtiyacımız məlum olmaqla bərabər bu ehtiyac bundan böylə gündən-günə daha ziyadə artacaqdır. Buna heç şübhə yoxdur. Çünki, milli məktəblərimizdə türk dilinə və türk dilində ülumi-müxtəlifəyi-cədidə təhsilinə böyük bir meydan açıldı. Binaənəleyh əli qələm tutanlarımız bu məktəblər üçün türk, ərəb və fars dillərinin qəvaidinə, sərf və nəhvinə, elmi-əqaidə, tarixə, coğrafiyaya, hesaba, elmi cəbrə, həndəsəyə, nəbatat, heyvanat, mədəniyyət kimi ülumi-təbiəyə *və sairəyə dair kitablar vücuda gətirməyə çalışacaqlardır. Bu kitab*ları əvvəl əmrdə öz fikir və xəyallarından çıxarmıyacaqlar a!.. Onları ya rus və firəng dillərindən tərcümə ilə, yaxud İranda, Osmanlıda, Misirdə, Hinddə basılmış kitabları cüzi, külli bir təbdil ilə məmləkətimizin şivəsinə, əfkarına, hürriyyətinə tətbiqən vücuda gətirəcəklərdir... Hal və keyfiyyət böylə ikən altmış, yetmiş min müsəlman süknası olan şəhərimizdə ciddi bir kitabfüruş dükanı yoxdur. Bəradərani Orucovlar, Ağa Dadaş Əlizadə, Abbasqulu Kazımzadələr kimi kağız, qələm, dəftər və sairə məktəb və şagirdlərə lazım şeylər satanlar zühur etdi... Lakin heç kitab satanlarımız yoxdur... vaqiən, ötədə-bəridə, məsələn, Bazarnaya küçədə bir-iki səhhaf dükanlar var... Fəqət bunların satdıqları əksəriyyən daş basması olan İran məhsulu köhnə kitablardır. Aləmi-islamın tərəqqiyyati-mədəniyyəyi-

cədidəsinə dəlalət edən kitablardan əsər yoxdur. Ərəb, fars lisanlarının türkcə yazılmış qəvaidini, ya Şəmsəddin Sami bəyin Qamusi-türkisini, Qamusi-elamını, Qamusi-fransəvi-türkisini, ya sair asarını bir adam edənmək istəsə mütləqa İstanbula, İstanbul kitabçılarına müraciət etməsi lazım gəliyor və çox adam kimə və nə surətlə müraciət edilməsini və nə vəchlə pul göndərilməsini bilmədiyindən bu növ müfid və nafe kitablardan məhrum qalır... Əhməd Midhətlərin, Əbdülhəq Hamidlərin, Kamal bəylərin, Əbu Ziya Tovfiqlərin adları belə bizim səhhaflara məchuldur! Halbuki şəhərimizin bir kitabfüruş taciri "İqdam" qəzetəsinə, yaxud İstanbulun Babi-ali caddəsindəki bir kitab mağazasına müraciət edib, məsələn, yüz dənə "Qamusi-türki" gətirtsə, əminəm ki, bir-iki ayın zərfində bunların yüzünü də yaxşı bir qazancla satmağa müvəffəq olacaqdır... və kitabçılara pul qazandıracaqdır. Osmanlıda, Misirdə və sair məmaliki-islamiyyədə nə qədər kitablar vardır ki, səhhaflarımızın onlardan xəbərləri yoxdur. Bu gün hər şey tərəqqi ediyor. İgirmi-otuz il əvvəl üç-dörd balıq, ya bir-iki boçka neft ilə Bakıdan Tiflisə bir aya gedən bir atlı, iki təkərlikli arabamız bu gün bir maşına münqəlib oldu ki, dalına minlərcə adam dolu yüz vaqonluq bir qatar bağlayıb o qədər məsafeyi bir gündə teyy eyləyir. Bir neçə il əqdəm bir adam qövm və əqrəbasına bir-iki mənzillik yoldan bir məktub, bir kağız göndərməkdən aciz ikən bu gün telefon vasitəsilə Bakı Mərdəkan kəndilə, Peterburq, Moskva şəhərilə, Paris, Rim ilə söhbət eyləyir. Ata-babalarımız qulaqlarının dibindəki qonşuda vaqe olan əhvaldan bixəbər ikən, bu gün dünyanın ta o biri başındakı vüquati insan bir dəqiqənin içində teleqrafla xəbər alıyor. Gecə alınan bir xəbərə sabah yüz min kişi qəzetələr vasitəsilə agah oluyor... daha nələr, nələr. Lakin səhhaflarımız nədən köhnə tasdan, köhnə hamamdan ayrılmıyorlar, ayrılmaq istəmiyorlar?.. Gücləri, qüvvətləri yetmiyorsa, bir şirkət təşkil etsinlər, işə ictima ilə çalışsınlar... hürriyyət şənlikləri əsnasında qırmızı bayraqların çoxunda: "Yaşasın ictimaiyyət" – sözləri yazılmışdı. Əlbəttə, ictimaiyyətdə bəzi yaxşı cəhətlər vardır ki, bu adamlar "yaşasın ictimaiyyət" – deyə fəryad ediyorlar! Bu gün ictimaiyyətə belə hürriyyət verildi... Lakin şirkətlə, ittifaqla, ictima ilə iş görmək üçün mütləq sosialist ictimaiyyun olmaq lazım gəlməz, ya hər nə surətlə olursa olsun şəhərimizdə təzə moda üzərinə bir-iki mədəni müsəlman kitab dükanlarının vücudu əlzəmdir. Kitabçılar erməni və rus kitabfüruşlarından ibrət alıb Peterburq, Berlin, Leypsiq, Lahə (Hollandda), Paris, İstanbul, Tehran, İsgəndəriyyə, Misrül-Qahirə, Bombey, Kəlküttə və sair kitabçılıq, kitabfüruşluq mərkəzlərinin kitab tacirlərilə münasibəti-tüccariyyəyə girişsinlər, oralardan Bakı və ümum Qafqaz müsəlmanlarının ehtiyacati-cədidəyi-maariflərinə müvafiq kitablar gətirsinlər... Mağazalarını şəhərimizin Nikolayevski küçə kimi nisbətən mədəni bir məhəllinə nəql etsinlər... guşədə, bucaqda itməsinlər! Yoxsa bu işi ehmal etsələr qorxuram ki, bu ticarət dəxi biganələr, əcnəbilər əlinə keçər.

İstanbulun "Babi-ali caddəsi" nam küçəsində, müsəlman, xristian, yəhudi bir çox kitabfüruşlar vardır ki, ancaq müsəlman kitabları ilə ticarət ediyorlar. Bunlar İstanbulda və ələlümum məmaliki-osmaniyyədə mətbuatın ədəmi-hürriyyətindən, daha doğrusu əsarətindən, oralardakı senzorun, yəni kitab və mətbuat müfəttişinin birəhmligindən dadü fəqan ediyorlar... Bu kitab tacirləri məmləkətimizin sərbəstiyi-mətbuat kimi böyük bir nemətə nail olduğunu xəbər alsalar, buralara can atıb şəhərimizdə münasib bir müsəlman kitabçı dükanı açmaları möhtəmildir. Gözüaçıq yerli tacirlərimizə lazımdır ki, ticarətin bu şöbəsini onlara qapdırmayıb vəqt və zaman ilə özləri gözəl bir kitab mağazası vücuda gətirsinlər!..

*Ə.H.*
*"Həyat", 1905, №93*

## HÜRRİYYƏT

Çərx bərhəm zənəm əz qeyr mürадəm gərdəd
"Mən nə anəm ke zəbunİ kəşəm əz çərxə fələk"[1].

***Hafiz Şirazi***

Hürriyyət!.. O nə qüvvədir ki, yalnız zikri belə inşirahi-dərunə, səfayi-qəlbə badi oluyor. Zehinləri, fikirləri, xəyalları, bəşərin bütün ruh və mənəviyyatını ülviyyata sövq eliyor!.. Yalnız zikrin eşidən insanların qanadlanıb uçacaqları, balalara pərvaz edəcəkləri gəliyor!.. O nə qüvvədir ki, onun yolunda neçə-neçə fikirlər, zəkalar, dühalar, dühayi-müəzzəmlər, Dostoyevskilər, Çernışevskilər məhbəslərdə,

[1] Tərcüməsi: Çərxi bir-birinə vuraram, istəyim başqasından hasil olar, "Mən çərxi-fələyə əsir olanlardan degiləm".

qürbətlərdə, mənfalərdə, Sibiriya çöllərində hər növ iztirabatı, hər növ əza və cəfayi qəbul etdilər. O nə qüvvədir ki, onun zühuru, bəşəriyyətin ona nailiyyəti bu həngamələrə, bu qiyamətlərə, bu zəlzələlərə, mənəvi-zəlzələlərə bais oldu. Məmləkəti sərasər bir mübarizə meydanına çevirdi. Bütün əhaliyi, bütün millətləri firqə-firqə edib, yekdigərlərilə o meydanda müsariəyə, mücadiləyə, məcnunanə bir mücadiləyə məcbur elədi?

Ey pəriyi-ilhamat! Anlat mənə o nə bəladır, o nə afəti-candır, o nə canandır?

Namiq Kamal, o sənə aşiq və dildadə olan ədibi-əzəm səni, ey hürriyyət, ey afəti-dövran, gözəl, hüsna, mələkmisal fəqət zəncirbənd bir qız şəklində təsəvvür etmiş idi... Zavallı ədib o qollar ki, ayaqlar ki, vurulan zəncirlərin qırılıb düşdüyünü ancaq aləmiröyasında görə bilmiş idi!.. Biz nə məsuduz, nə bəxtiyarız ki, halətibidaridə olduğumuz halda o zəncirlərin həqiqətən qırıldığını, parça-parça olub töküldüyünü görməyə nail olduq!..

Xeyr! Bu xab və röya dcgildir! Billah bu məhz həqiqətdir! Ey illərdən, əsrlərdən bəri üzünə, hüsni-didarına müştaq olduğumuz, həsrət çəkdiyimiz hürriyyət! Bu gün sənin camalını, hüsn və anını bütün şəşəsilə, dəbdəbə və darayətlə, bütün şuriş və qiyamətlərilə seyr və tamaşaya başladıq!

Ey pəriyyi-şurəngiz!
Benomay ruy ke, xəlqi valeh şəvəndü heyran,
Bəqoşay ləb ke, fəryad əz mərdu zən bər ayəd![1]

Ey dilbəri-cahan aşub! Ruy və didarını şu xalqa göstərməkdən, şirin göftarını hər kəsə eşitdirməkdən çəkinmə!

Bu vəlvələlərdən, bu rədü bərqdən qorxma!
Bəhr zəxxar deyil, əbr şərərbar degil[2],
Həp yanar dağlar ilə dolsa civarın qorxma!

Daima sənin məhəlli-zühurun, mətləin bir "Fəcri-mühibbi-rədvarin" al-qırmızı xunin ənvar ilə tənvir edilmişdir! Bu müqəddəs

[1] Tərcüməsi: Ey iğtisaşçı pəri! Üzünü cöstər ki, xalq valeh və heyran olsun! Dodağını aç ki, kişidən və qadından fəryad qopsun.
[2] Tərcüməsi: Dəniz coşqun degil, bulud qığılcım saçan dcgil.



ramazan günlərində belə məni məst etdi. Sürxabın, şərabi-gülfamın ey hürriyyət! Bu sözlərim mənim bilirəm hüşiyar sözünə bənzəmiyor!.. Bu xalqa sənin birər-birər nemətlərini tedad edəcəyinə, qədrü qiymətini, əhəmiyyətini bildirib layiqi-vəchilə təfsir edəcəginə bu nə laf və gəzafdır, bu nə hərzə və hədyandır ki, mən ediyoram? Nə deyəyim, mən ey canan!.. Dərdlərə dərman sənsən, sən! Yaralara mərhəm sənsən, sən. Atəşi, nari, ürəkdəki azəri söndürən, həm əfsürdələri, dilmürdələri dirildən sənsən, sən! Həq və həqiqətin təcəllasına, məhkəməyi-müsavatda ədalətin behəqq hökmranlığına yol göstərən sənsən, sən! Hər növ ümuri-xeyr uğrunda çalışmaq üçün fikrü xəyala etiqad və vicdana, hər lisan ilə mütəkəllim xətiblərin, mühərrirlərin, ərbabi-qələmin nitq və kəlamına vasc" bir meydan açan sənsən, sən! Bəşəriyyətin ən böyük ehtiyacı, mədəniyyətin tərəqqi və təkamülünün ən qəvi mühərriki olan ictimalara, cəmiyyətlərə, şirkətlərə, ittifaqlara, ittihadlara sərbəstiyi-tam verən sənsən, sən! Vəlhasil insanlara bilafərq lisan və şivə, bilafərq din və məzhəb, bilafərq qövm və millət, əfkar və amalın həvayi-nəsimində sərbəst nəfəs almağa müsaidə edən sənsən, sən! Yaşa hürriyyət, yaşa! ("Zaisser moi chier!")[1]. Buraxınız, mən avazım çıxdığı qədər bağırayım: "Yaşa hürriyyət, yaşa!"

*Ə.H.*

*"Həyat", 1905, №94*

## RƏMAZANÜL-MÜBARƏK VƏ HÜRRİYYƏT

Bu gün eydi-səidi-fitrdir, ramazan bayramıdır!.. Hər kəs yekdigərinin oruc namazı, sövmü səlatı cənab həqqin qəbuluna məzhər olmasını təmənna ilə biri-birini təbrik edəcəkdir. Biz də ramazanda tutulan maddi və mənəvi oruc, əda edilən səlat, məscidlərdə, camelərdə qulaq asılan vəz və nəsihət vasitəsilə qəlblərin, qülubi-müsliminin çirkdən, pasdan, büğz və ədavət, kin və qərəz, hissi-intiqam pasından, nəfsaniyyət kirindən təmizlənib pak və tahir qılındığını təbrik edər və ümid edəriz ki, qəlblərin bu paklığı, sifatı bundan sonra əsrlərcə davam edib bir daha ləkədar olmaz!.. Filhəqiqə denilə bilər ki, bu il sinini-sabiqəyə nisbətlə ramazana olan ehtiyacımız daha

[1] "Məni rahat burax, dostum!" (*frans.*) Abdulla Cövdətin bir mənzuməsinin adıdır.

ziyadə idi... Bu sənə zərfində baş göstərən mütəəddid vəqayei-müəssifə könüllərdə kəsif bir pas, bir torti, kimya istilahilə bir rüsub buraxmış idi. Bunların cümləsini rəmazanül-mübarək sildi, təmizlədi... Bu işdə bir hüsni-təsadüf olaraq hürriyyət denilən nemətiəzimeyi-siyasiyyə dəxi ramazani-şərifə kömək eylədi... "Xeyrat" ilə üxüvvət və insaniyyət bayramı ilə xitam bulan rəmazan, hürriyyət və müsavat bayramı ilə başlandı... Builki rəmazan iləlebəd unudulmayacaqdır!.. Çünki, builki ramazan bəşəriyyətin bir qismi-əzimi üçün, Asiya və Avropanın nisfini təşkil edən Rusiya məmaliki üçün, o məmalikdə sakin bilcümlə miləl və əqvam üçün hürriyyət ədvarının birinci ayı oldu: 1323 ramazanı, hürriyyətin birinci ramazanı unutmayalım. Hürriyyət və ramazan!.. Nə qədər gözəl şeylər! Binaənəleyh ümid ediyoruz ki, bu sənəki ramazan yalnız müsəlmanların degil, bəlkə miləli-sairənin, musəvi və isəvilərin, yəni ümum qonşularımızın dəxi qəlblərini, fikirlərini hürriyyət sayəsində təmizləməgə, tənvir etməgə müvəffəq oldu... zənn edərəm, hürriyyət bayramı günlərində bilafərq qövm və millət, bilafərq din və məzhəb ümum vətəndaşlarımız miyanında görünən sülh və vifaq və hüsnimünasibət sözlərimizə dəlildir!.. Keçən il, yəni bu rəəmazanın *ibtidasına qədər olan müddət zərfində vüqua gələn hadisat*, bəlayi-nifaqə giriftar olan hər iki tərəfin günahlarının nəticəsi idi. Lakin o gunə günahlar ancaq "köhnə" üsuli-idarədə törəyə bilərdi... İnşaallah hürriyyət sayəsində həq və ədalətin təcolla edəcəgi idarəyi-məşrutəyi-cədidə daxilində keçmiş hadisata heç bir vəchlə məhəl qalmayacaqdır! Bundan sonra meydan ancaq maarifin, tərəqqi və təkamülün, maddi və mənəvi bir təkamülündür!..

Yaşasın *vifaq*! Yerə batsın *nifaq* və *şiqaq*!..

*Ə.H.*

*"Həyat", 1905, №102*

## AVROPALILAR VƏ MAKEDONİYA

Bir-iki ildir ki, üzümüzü şərqə, şəmsin, yapon şəmsinin tülu etdiyi cəhətə çevirib və üfüqi-bəiddə tarixin qərib-qərib cilvələrinə tamaşa elədik!.. İmdi də nəzərimizi qərbə, hilalın, "hilali-islamın" tülu etdigi səmtə təvəccöh edəlim, bakalım bizə mücavir və yaxın olan bir məmləkətdə nə kibi hadisat baş göstərmək üzrədir. Lakin heyhat,



bu əsnada pişi-ənzarımıza hər tərəfdən kəsif bir pərdə çəkilmiş oldu. Öylə bir pərdə, nə şimal və cənubi və nə də Şərq və Qərbi görmək olmuyor!.. Rus inqilabcuyan firqəsinə iltihaq edən poçta və teleqraf məmurini-heyətinin ittifaq və qərarı ilə bütün Rusiyanın poçta və teleqrafları tətil etdi... Binaənəleyh nə şimaldan və nə də Qərbdən bir xəbər gəlmiyor!.. DeməK oluyor ki:

> Əşya görünür niqabi-matəm,
> Məstur durur liqayi-aləm,
> Həp cilvəsi aləmin xəfadə!..[1]

Əcəba bu niqabın, bu pərdənin mavərasına fikir gözü ilə olsun ətfi-nəzər etmək mümkün olmazmı?

Avropalılar və avropalılarla bərabər bəzi qonşularımız "panislamizm" deyə-deyə bizi, biz müsəlmanları bizar etmişdilər!.. Fəqət bu gün pərdənin arxasında cərəyan edən vüquat bizə əyan bir surətdə göstəriyor ki, "Panislamizmə"nin, yəni ittihadi-islamın ən cüzi bir əsəri belə görünməyib, bəlkə mükəmməl bir Avropa panxristianizməsi mövcud imiş!.. Bir neçə gün əqdəm teleqrafın verdigi xəbərə görə bir tək Türkiyə dövlətinin əleyhinə beş-altı Avropa düvəli-müəzziməsi birləşib hərb gəmilərini müttəhidən osmanlı sularına göndərdilər və osmanlı mülkü olan Midilli cəzirəsini işğal etdilər... Bu "panxristianizmə" degil imiş!...

Bu ancaq bir kualisiya imiş!..

İran dərin bir uyqu içində durur bilahərəkət... Əfqanıstan əzim yüksək bir divar ilə əhatə edib, nə xaricdən içəriyi, nə içəridən xarici görmək oluyor. Fas isə nifaq və şiqaqə giriftar olaraq o qədər zəif düşmüşdür ki, xaricdən də gələn düşmənlər onu bilapərva təqsimə qalxışmışlar... Ərəblər ingilisin iğfal və iğvasilə böylə bir zamanda mərkəzi-xilafətə qarşı üsyan ediyorlar...

Cəzair, Tunis, Misir, Hindistan, Cava və ilx. tabe bulunduqları Avropa dövlətlərinə kəmali-inqiyad ilə itaət edib yerlərində sakit və samit duruyorlar... Bu kibi əhval həp "panislamizmə" əlamətləri imiş!.. Nə isə gələlim sədədə:

Avropa dövlətlərinin müttəhidən osmanlı əleyhinə hərəkət etmələrinin səbəbi Makedoniyada vaqe şuriş və ixtilaldır. Bu şuriş və ixti-

[1] T ə r c ü m ə s i: Şeylər matəm örtüsü kibi görünür,
Aləmin üzü örtülüdür. Aləmin bütün cilvəsi gizlindədir.

lal bəhanəsilə məzkur dövlətlər keçən sənədən bəri Makedoniya işlərinə müdaxiləyə qalxışdılar. Osmanlı hökuməti də, bu müdaxiləyə bir dərəcəyə qədər və bir zamani-müvəqqət üçün müsaidə etdi. Lakin bu müdaxilənin bu gün lüzumundan həddən ziyadə olduğunu görüncə mane olmağa başladı...

"Makedoniya" nədir? Osmanlının öz türkcə dilində böylə bir məmləkət adı yoxdur. Osmanlı hökuməti bu adla bir məmləkət tanımıyor. Osmanlıların bildikləri Mərmərə və Ağ dənizin Avropa sahili olan Rum elinin cəhəti-qərbiyyəsində Səlanik, Skopye Manastr, Yaniya namilə ancaq bir neçə osmanlı vilayətləri, yəni quberniyaları vardır.

İştə, bu bir neçə osmanlı vilayətlərinin bir qisminə avropalılar "Makedoniya" diyorlar. Çünki, iki min il əqdəm İsgəndəri-Kəbirin xüruc etdiyi məmləkətin ismi-qədimi böylə idi... Bu gün zorla Makedoniya denilən bu məmləkətin əhvali-xüsusiyyəsindən biri də şudur ki, bu məmləkətin özünə məxsus bir milləti yoxdur, yəni tarixən bir Makedoniya varsa da, lakin həqiqət halda "Makedoniyalı" adlı bir millət yoxdur. Ruminiyada rumın, Serbiyada serb, Bolqarıstanda bolqar, Yunanıstanda yunan vardır. Lakin Makedoniyada "makedoniyalı" yoxdur. Yəni burayı özlərinə xüsusi bir vətən bilib istiqlal qazanmağa həqq göstərəcək bir qövm yoxdur.

Olsa-olsa böylə bir dəvada avropalıların alban dedikləri arnavudlar buluna bilərlər. Lakin arnavudların qismi-əzəmi müsəlmandır. Makedoniyanın əhalisi, əsasən müxtəlifülcins və müxtəlifülməzhəb olub türk, arnavud, qrek, bolqar, serb, rumın (ovlax) və yəhudilərdən ibarətdir. Yəhudilər başlıca şəhərlərdə, ələlxüsus, Səlanik şəhərində sakin bulunuyorlar. Məzkur şəhərin xəlqi yarı-yarıya yəhudidir – desəm caiz: Bu yəhudilər osmanlının ən sadiq təbəəsindəndir. Bunlar hər sənə ispaniyalıların zülmündən azad olub Qanuni Sultan Süleyman zəmanından Türkiyəyə – Səlanikə qəbul olduqları günü böyük bayram edirlər... Osmane-yunan müharibəyi-əxirəsində bunlar özlərindən mütəəddid könüllü əsgər dəstələri təşkil edib qanları ilə, canları ilə, malları ilə osmanlılara kömək elədilər!.. İçlərindən müharibədə bir çox yaralanan və ölənlər oldu... Aralarında məhəmmədi olanlar da çoxdur...

Anlamıyoram ki, Avropa dövlətlərinin birləşmiş olan hərb donanması Səlanik şəhəri pişgahında, yəni bu yəhudilərin ənzarı önündə nə üzlə nümayişi-bəhri icra edəcəklərdir... Fəqət çi faidə, avropalılarda utanacaq, qızaracaq üz yoxdur ki, ... Onlar yenə bildiklərini edəcəklər. Nə isə buralarını sükut ilə keçəlim, çünki qorxuram söz zülfi-yarə toxunar!..

Əvət, avropalılar bildiklərini edəcəklər, bəlkə də niyyətlərində, sui-qəsdlərində müvəffəq olacaqlar! Lakin günah kimdədir?! İştə burası nazik bir məsələdir. Bu xüsusda mütaliatımızı ayrıca gələcək nömrədə bəyan edəriz.

Günah kimdədir?! Şübhəsiz o adamlardadır ki, otuz ildən bəri Midhət paşa kibi bir dahiyənin məhsuli-zəkası olan osmanlı qanuniəsasını ortadan götürüb yerinə bürokratiya, daha doğrusu, oliqarxiya idarəyi-keyfiyyəsini qaim edib bir neçə cahil əşxasın keyfini, həvəs və arzusunu, rəyi-xudsəranəsini, qanun və şəriətin, hüquqimüqəddəsinin mafövqünü vəz etdilər... Öylə bir surətdə ki, qoca bir məmləkətdə həqq və ədalətdən əsər qalmadı!.. Zavallı Turani iki il əqdəm İstunbulu tərk etdiyi zaman demiş idi ki:

Həqq və ədalətdən əsər yoxsa da,
Harisi-qanun bir ər yoxsa da,
Zülm edənə qarşı sipər yoxsa da,
Qəm yemə, səbr et, bu da yahu keçər!

Heyhat! Türklər, osmanlılar səbr etmədə qüsur etmədilər, hətta general Kuropatkini belə keçdilər, lakin bidad və istibdad üsulu hənuz keçmədi!..

Keçməmək şöylə dursun, bir də Türkiyə ölkəsinin başına bir qarğa, ya bayquş kibi yeni-yeni bəla və müsibətlər cəlb etməkdən geri durmuyor!..

İştə şu Makedoniya məsələsi, şu bəla və müsibətlərin biridir!..

Bizə bu gün kibi aşikar oldu ki, Rusiyanın Yaponiyaya məğlubiyyəti və bu məğlubiyyəti təqib edən ixtilalati-daxiliyyə, bürokratiya namı verilmiş və 17 oktyabr manifesti ilə mövtinə hökm edilmiş olan köhnə üsuli-idarənin nəticəyi-təbiyyəsindən başqa bir şey degil idi! Lakin osmanlıda hənuz davam edən üsuli-idarə Rusiyanın mütəvəffi köhnə üsuli-idarəsindən beş-on kərrə daha fənadır!.. Binaənəleyh nətayici-məşuməsinin də o nisbətdə ziyadə olması təbiidir. Zatən osmanlı üsuli-idarəsinin nətayici-məşuməsi meydandadır: Rəşid paşaların, Fuad paşaların, ələlxüsus, Midhət paşanın cəhd və qeyrətlərilə osmanlı mülki emar və ehya edilib ümran və mədəniyyətə üz

tutmuş ikən Midhəd paşanın facianə bir surətdə vəfatı ilə firqəsinin, tərəfgiran əfkarının dərbədər və pərişan olmasından sonra məmləkət parça-parça qopub əldən getməgə başladı: Rum elinin böyük bir qismi getdi. Bosna, Hersoq getdi, Tunis getdi, Kıprıs getdi, Misir getdi, Ərəbistanın bir çox yerləri getdi. Yunan müharibəsində biçarə əsakiri-osmaniyyə mükəmmələn qalib gəldikləri halda yenə Krid cəzirəyi-kəbirəsi getdi...

Bu gün növbət "Makedoniyaya" gəldi!..

Üsuli-idarəyi-mütləqə, istibdad davam etdikcə növbət Makedoniyadan sonra Anadolu vilayətlərinə də gəlməyə başlar... və yavaş-yavaş qoca bir səltənət, vase bir məmləkət Xivə, ya Buxara dərəcəsinə endirilib axirüləmr istiqlalını da zaye edər və ortada tarixdən, tarixin hekayətindən başqa bir şey qalmaz!.. Qəribə şurasıdar ki, osmanlı məmalikindən parçalar qoparıldıqca osmanlının özündə mütləqiyyət üsuli-idarəyi-məşuməsi ibqa ediliyor, fəqət hər qoparılan parçaya məşrutiyyət və qanuni-əsasi verilib, o parça məclisi-məbusan vasitəsilə, yəni millət və cəmaət vəkillərinin ümuri-idarəyə müdaxiləsi və idareyi-hökuməti təhti-müraqəbəyə alması surətilə canlanıyor, qüvvətləniyor. Bu surətlə ana məmləkət tədənniyə, zəvala və ondan yeni bir parça qoparılmağa müstəid bir halda davam etdiyi halda, qoparılan parça tərəqqiyə, nəşvü nümayə, böyüməyə qabil olur. Rumıniya dövləti bir, ikinci Prusiya kəsilir, nizam və intizamına, rifah və səadətinə aləmi heyran edər, Qresiya "xəlifəyi-ruyizəminə" meydan oxur, ortaya mükəmməl bir flot çıxardır, xəlifə isə Həsən paşa sayəsində özünün qədim bir vilayəti olan Qresiya ilə bəhrən müharibə etmək üçün iki cüt, bir tək gəmi tapmaz!..

Dünənki Sofiya, ya Felbə quberniyaları bu gün Bolqarıstan namilə mükəmmələn silahlanıb elani-hərb etməklə cürətyab olur!.. Bir deyən olmazmı ki, bütün Avropa və Amerikayı, Asiyanın Yaponiyasını, Balkan şibh cəzirəsinin şu balaca-balaca hökumətlərini mədəniyyətin bu dərəcələrinə vasil edən qüvvət üsuli-idarəyi-məşrutədir və osmanlıyı və Asiya və Afrikadakı bütün islam hökumətlərini gündən-günə geri salan üsuli-idarəyi-mütləqə, üsuli-istibdaddır!.. Bu həqiqəti osmanlı hökumətinə deyənlər, anladanlar oldu, lakin bunlar, ya qürbətlərdə, mənfalarda, məhbəslərdə sürünürlər, ya Mərmərə dənizinin dibində balıqlara yem olurlar!

Bu gün məmləkətin nə qədər elm və zəka, istedad və hünər sahibi adamları varsa, həm xaricə fərar etmişdir, İstanbulda isə adam



qəhətligi var. Makedoniya işi üçün altı Avropa dövlətinin siyasiyonuna söz söylüyəcək, həqiqini bildirəcək nə lisan, nə də qələm sahibi bir adam yoxdur. Şübhəsiz sahibi-seyflər var, lakin bir mülahizə etməli ki, altı qəviyüşşəkimə dövlətin qarşısında qılınc fayidə edərmi? Yunan müharibəsində fayidə etdimi? Ədhəm paşalar, Seyfulla paşalar, Rza paşalar, Nəşət paşalar və Anadolunun kəndli soldatları müzəffər oldular, şən və şöhrət qazandılar. Lakin Krid yenə getdi. Qılınc degil, siyasət lazım, lisan lazım, əhli-maarif lazım, qələm lazım, ədalət lazım, adilanə və müdəbbiranə üsuli-idarə lazım! Bu gün bir kiçik saat pozulduqda bir saatsaz ustanın yanına qoşuyoruz, bir qoca məmləkətin makinəsi nasıl oluyor da cahillər əlinə təslim olunuyor! Şübhə etməyirəm ki, Sultan Həmid həzrətləri Makedoniya işində yenə bir komediya oynayır. Əsasən İstanbulda payidar olan bir idareyi-müstəbidənin əks təsiri olaraq gah məmləkətin bu başında, gah o başında bir fəsad, bir şuriş baş göstəriyor... əhalinin isə zülm və bidadə təhəmmül nöqteyi-nəzərindən istedadları bir degildir. Müsəlmanların səbr və təhəmmülləri daha ziyadədir. Ələlxüsus, türklər, müsəlmanlar Fasa, İrana, Əfqanıstana baxdıqca özlərinə bir təsəlli buluyorlar.

Lakin osmanlının xristian təəbəsi, ələlxüsus, Rumeli və Makedoniya xristianları öylə deyildirlər... Bunların xristian olmaq hesabilə Avropa ilə əlaqələri ziyadədir... Bunlar Avropadakı və bilxassə Balkan şibh cəzirəsindəki qonşularının hallarını, səadət hallarını külli-yövm müşahidə ediyorlar. Binaənəleyh zülmə türklər qədər təhəmmül edəmiyorlər. Osmanlı siyasiyonu, liberal olan Midhət paşa tərəfdarları dərdə çarə göstərdilər. Bunlar dedilər ki: "Balıq başdan qoxumuşdur..."

"Mahi əz sər gənde gərdəd, ney zedəm!.."[1]

Ayrı-ayrı vilayətlərə xüsusi islahat verməkdən bir şey çıxmaz, bəlkə o vilayətlərin ayrılmasına, əldən getməsinə xidmət edər! İslahat mərkəzi və ümumi olmalıdır. İslahat yalnız Makedoniyaya degil, bütün məmaliki-osmaniyyəyə lazımdır!.." Lakin Sultan Həmid hökuməti bu fəryadlara qulaq asmayıb Makedoniyanın ayrıca islahatına razı olduğu halda məmalikinin sair əqsamında köhnə və çürük üsuli-idarəyi ibqayə çalışıyordı və bu surətlə öz əlilə məmləkətdən yenidən bir parçanın qopmasına kömək etmiş oluyordu! Müşarileyhin

[1] Tərcüməsi: "Balıq başdan iylənər, quyruqdan yox".

vükəlası məmləkətdə bürokratiya və istibdad üsulunu mühafizə etmək üçün Makedoniyanı verməgə çoxdan razı! Lakin görünür ki, artıq səbr təhəmmülü qalmayan millət və cəmaət hər çe badabad buna mane olmaq istiyor. Baxınız, sultan dövlətlərə nə surətlə cavab veriyor. Diyəmiyor ki: "Makedoniyanın ümuruna avropalıların müdaxiləsi, o vilayətlərin ümuri-maliyyəsinə Avropa məmurlarının nəzarət və müraqəbəsi bənim hüquqi-hökmranimə və osmanlı mülkinin təmamiyyətinə bir təcavüz olduğundan buna nə mən, nə hökumətim və nə də millətim razı olamayız!"

Sultan həzrətlərinin cavabından biləks bu məna çıxıyor ki, guya sultan həzrətlərinin başına toplanan vüzəra və vükəla razı ola bilirmiş də, ancaq millət mane olurmuş! Təbiri-axirlə bürokratiyanın sui-idarəsinin bir əsəri olan Makedoniya şuriş və iğtişaşında bütün məsuliyyətləri millətin üzərinə atmaq istiyorlar... Sultanın burada nə fikir bəslədigi və əlaltından nə kibi komediya oynadığı aşikardır... Yəni! "Bən biliyoram ki, siz cəbrən olsun Makedoniyaya daxil olacaqsınız! Lakin daxil olduqdan sonra cəzayi bürokratiyaya degil, osmanlı millətinə edərək bənim İstanbuldakı üsuli-idarəmə əl sürməyib üsuli-istibdad bəlasını millətim üçün kəmakan mühafizə ediniz!" Fəqət biz əminiz ki, cahanın hər tərəfində cəmaət vəkaləti surətilə olan üsuli-idarə osmanlı məmləkətində dəxi qalib gəlib milləti-osmaniyyəyi erkəc tərəqqi və təkəmmül və səadət yollarına sövq edəcəkdir!..

*Ə.H.-zadə*
*"Həyat", 1905, №105-106*

## YENƏ DİL MÜŞKÜLATI

"Həyat" sütunlarında "Dil müşkülatı" haqqında yazılan bir neçə söz, bu xüsusa dair iki daha gözəl məqaləyə səbəb oldu. Bunlardan birisi "Dil məsələsi" ünvanilə və Kəngərli Əsədulla imzası ilə "Həyat"ın 97-ci, digəri də S.M.Qənizadənin əsəri-xaməsi olub "Hansı dil ilə yazmalı" bir sərnamə təhtində "Həyat"ın 99-cu nömrəsində mündəric idi. Bunlardan başqa "Həyat"ın müxtəlif nüsxələrində bəndə və sair zəvat, əz cümlə "Sur" tərəfindən dəxi bu növi-bəhslərə girişilmiş idi. "Türklər kimdir və kimlərdən ibarətdir" ünvanlı məqalələrdə də məsələyi-məzkurəyə dair ara-sıra məlumat veriliyor.

Gərək, Kəngərli Əsədulla bəy, gərək S.M.Qənizadə cənabları, hər ikisi də dil məsələsini ayrı-ayrı cəhətlərdən tənvir edib məsələnin həll olunmasına kömək etmiş oluyorlar. Əsədulla bəy, mütaliatının çoxunda, bəlkə əksərində haqlıdır. Ələlxüsus bir "lisanın avam anlayacaq vəchlə" yazıla bilməsindəki müşkülata dair əfkarı pək müsib və doğrudur. Kəza xalis türkcə kəlmələrin cəmi-ərəbi qaidəsilə cəmləndirilməsini Əsədulla bəylə bərabər biz də heç bir surətlə təcviz edəməyiz.

Şübhəsiz, ərəblər türkcədən, ya yunan və firəngcədən aldıqları kəlmələri ərəb qaidəsilə cəmləndirə bilirlərsə də, lakin buna türklərin qətiyyən haqları olamaz. Binaənəleyh "ciftlikati-humayun mabeyni-əqval", yaxud farsi qaidəsilə "didəkan" kibi İstanbulda işlənən təbirlər qələti-fahişdirlər. Fəqət "fars" kəlməsi kibi "ətrak" kəlməsini dəxi qəbul edəriz. Çünki türk ləfzi türkcənin malı olduğu kibi, ərəb lisanının da malı olduğundan cəmi-ərəbisi caizdir. Bir də "ciftlikat" ləfzi kibi yeni çıxma bir şey olmayıb "filosof" kəlmeyi-yunanisinin cəmi olan fəlasifə kibi həm ədəbiyyatı-ərəbdə qədimdən bəri istemal olunur, həm türkcəyə çoxdan keçmişdir. Və türkcəyə də boşuna keçməmişdir: "Ətrak" bir istilahi-fənnidir ki, ifadə etdigi məna "türklər" cəminin qeyridir. Mütəfərriqə şəklində nəşr etməkdə olduğum məqalata mən "Türklər kimdir və kimlərdən ibarətdir" ünvanını verdim, fəqət bu qədər uzun bir ibarə yerinə sadə "Ətrak" deyə idim, bu mənayı ifadə etmiş olurdum. "Türklər" denildikdə xatirimə beş-on nəfər türk gəliyor, lakin "ətrak" denildikdə zehnimə türk qövmlərinin, yəni heyəti-qövmiyyələrinin cəmi xütur ediyor.

Gələlim, farsi və ərəbi kəlmələrinin türkcədə istemal olunan cəmi-ərəbi və farsilərinə. Əsədulla bəy yazıyor ki:

"Sərmayədar ləfzi türk dilində belə bir söz olmadığı üçün farsidən götürməyə ixtiyarımız var. Lakin "sərmayədarlar" yerinə "sərmayədaran" qollanmağa heç ixtiyarımız yoxdur, habelə "mülahizələr" yerinə "mülahizat"... Bir az sonra:

"Biz kəndi dilimizi bəgənmədigimz kibi ərəb və farsi kibi yazıb-danışırız. Məsələn, yer ya məhəl şurası yerinə şurayi-məhəlliyyə deyiriz. Bu sözlərimə irad tutub deyərlər ki, osmanlı dilinin şivəsi dəxi böylədir. Cavabında deyərəm ki, osmanlılar da böyük xəta edi-

yorlar. Beş nəfər ədib yüz milyon taifənin[1] dilin dəyişə bilməz. Müasir ədiblərimiz və şairlərimiz bu işə islah verməlidirlər".

Bundan başqa Əsədulla bəy alçaqlatmaq, əskiltmək kəlmələri dururkən "dun" kəlməsi istemalını caiz görmüyor.

Biz bu sözlərə birər-birər cavab verməkdən isə bu xüsusda surəti-ümumiyyədə bəhs etməyi tərcih edərək deyiriz ki:

– Əzizim, beş nəfər ədibdən muradınız kimlərdir? Əgər Şinasi, Naci, Kamal, Əbdülhəq Hamid, Əhməd Midhət, Şəmsəddin Sami və ilx. isə o halda biz ancaq təəccüb və təəssüf edəriz ki, nədən o dahilərdə, Osmanlı türklərinin mədari-iftixarları olan o sahibi-zəkalarda "yüz milyon taifənin" dilini nəzəri-etibara almaq üçün Kəngərli Əsədulla bəy qədər olsun bir əql və fərasət olmadı?.. İzafət qaidəsini və ərəbin və farsın cəmlərini türkcəyə qəbulda nə məcburiyyətləri var idi? Dostum, türki-cədid haqqında mütaliatınız yanlışdır. Bu gün nə türkcə, nə ərəbcə və nə də farsi, ya hindi bir dil vardır! Onların yerlərinə türk müsəlmanca, ərəb müsəlmanca, farsi müsəlmanca, hindistani, yaxud urdu müsəlmanca dillər qaim olmuşdur. Bu lisanların hər biri qəvaid xüsusunda bir qövmün, bir millətiislamiyyənin qəvaidi-əsliyyəyi-qədiməsini bəzi istisnaat ilə mühafizə edərsə də, lakin lüğət xüsusunda yekdigərlərindən hətta əqvamiəfrinciyədən dəxi kəlmələr istiarə edərlər.

Firdovsi Tusinin qeyrətinə rəğmən bu gün İranda nümunə ittixaz olunan dil farsi olmayıb bəlkə Sədi Şirazinin farsi müsəlmanca olan dilidir.

İştə yeni türkcə də böylədir: Bu dil lüğət etibarilə türkiyi-qədim, farsi və ərəbidən mürəkkəbdir. Bu dillərdən hər bəgəndiyi kəlməyi, ələlxüsus məsdər olan kəlmələri almağa səlahiyyətdardır; bəzi Avropa dillərindən də, məsələ, yunancadan, latıncadan kəlimat aldığı da var, lakin ruscadan və ümum slavcalardan alamaz, çünki türkcə kəlmələr də farsi, ərəbi, yunani və italiyan dillərində olduğu kibi, hər sədasız hərfin yanında bir də sədalı hərf olur, təbiri-axirlə slav dillərində olduğu kibi hürufi-qeyri-sövtiyyə bir yerə tərakim etməz. Misal: "Dil müşkülatı" ünvanlı məqalədə zikr olunan və nəzəriyyə-mülahizə mənasına gələn rusca "vzqlyad" ləfzində v, z, q, l, y kibi beş qeyri-sövti hərf bir arayə gəldiyindən əsla türkcəyə qəbul olunamaz.

[1] Əsədula bəy "yüz milyon nüfusdan ibarət olan bir millətin" demək istəyir, zənn edirim.



Ruscadan türkcəyə kəlmələr keçər, lakin o kəlmələr keçər ki, onlar zatən rus lisanına da, yunancadan və ya latıncadan keçmişdir. Bu da yenə o kəlmələrdən rusca intihaların tərk edilməsi şərtilə olur: Məsələ, mikroskop, yəni xürdəbin, teleqraf, yəni durnəvis, konsul, yəni şəhbəndər, konsilus türkcəyə istiarə və qəbul olunursa da fəqət heç bir vəchlə "teleqrafiçeski", ya "konsulstvo" təbirlərini alamayız: bunların yerinə "konsulluq" və "teleqrafi" deməlidir... Ruscadan "drama", "qəpik", "samovar" kibi ümuməlsənəyə keçən kəlmələr bizim dilimizə dəxi keçmişsə də, bu növ kəlmələr nadiratdandır...

*Ə.H.-zadə*

*"Həyat", 1905-ci il, №112*

## RUSİYA İNQİLABININ ƏHƏMİYYƏTİ-ALƏMİYYƏSİ

Ta pərişan nəşəvəd kar be saman nərəsəd[1].

Qaranlığa, ya uzaqlara baxan gözlərin, ələlxüsus göz qapaqları ilə hədəqə denilən göz bəbəklərinin əxz etdigi şəkil başqa dürlü olub fəaliyyəti-röyyəti-mötadından ziyadə olunur, təzayüd edər. Bunu hər kəs bilir!.. Hətta insan uzaqlara baxarkən gözlərinə əli ilə də kömək edər. Əlini alnının hizasına götürüb bu surətlə gözlərini yaxından gələn işıqların təsirindən mühafizə edər ki, nəzər bütün qüvvətini uzağa həsr edə bilsin! İştə biz də nəzərimizi, nəzəri-mənəvimizi mazidən atiyə, keçmişdən gələcəgə çevirmək üçün fikir gözünə də xüsusi, xilafi-mötad bir hal kəsb etdirib fəaliyyətini təzyid edəlim!.. Mazinin, hətta hal-hazırın təsirati-mühitiyyəsindən onu təcrid eliyəlim! Ələlxüsus, bu günlərdə zülmət, qaranlıq, vüqufsuzluq ətrafı bürüdü. Nə yaxından, nə uzaqdan bir işıq, bir şüa gəlmiyor.

"Pişimdə duran, bütün dumandır
Deycuri leyli-bikərandır.
Bir şölə degil dəlili-rahim,
Məsduddurur vüqufə birdir!.."[2]

[1] Tərcüməsi: Dağıtmayınca, iş sahmana düşməz.
[2] Tərcüməsi: "Yol bağlıdır dayanacaq birdir".

Binaənəleyh uzaqlara, qaranlıqlara nəzərimiz nüfuz edəmiyorsa, heç olmazsa gələcəgə, istiqbala bir ətfi-nəzər etməgə qeyrət edəlim!

"Sizlər, olunuz bana pədidar,
Ey tən gözünə görünməz əsrar!
Əsrari-istiqbal!.."

Fəqət heyhat! Bu bizim üçün öylə asan bir şeyə bənzəmiyor! Biz maziyə, əsari-salifəyə, vüquati-güzəştəyə doğru o qədər ifrat ilə ircai-nəzər etdik, gözlərimizi daima keçmişə doğru çevirə-çevirə bütün ümidlərimizi oraya bağlaya-bağlaya, o qədər buna etiyad və ülfət etdik ki, bu gün degil, gələcəgə, hətta ətrafımıza, hal-hazırda gözümüzün qarşısında cərəyan edən vüquata, vüquati-müəzziməyə baxmağa belə qadir degiliz!.. Hətta nə surətlə baxmaq, fikir gözünə şəkil kəsb etdirmək lazım gəldiyini belə bilməyiriz!.. Dörd-beş yüz ildən bəri avropalı qonşularımızın gözləri müstəqbələ, gələcəgə mətuf ikən, mətuf olmaqla, məluf ikən, biz gözümüzü hənuz mazidən ayramadıq. Biz hətta xatırımızdan çıxardıq ki, maziyi görmək, bilmək, ancaq istiqbalı, təriqeyi-atiyi təyin üçün bizə lazımdır!.. Bu surətlə, biz bir növ bütpərəstliyə giriftar olduq ki, onun adına mazipərəstlik deyirlər! Mazipərəstligin ənvai-əşkalı var: şəkli-mötədilinə mühafizəkarlıq (köhnəpərvərlik), şəkli-ifratinə də ricətpəsəndlik deyirlər!..

Bu mazipərəstlik, bu ricətpəsəndlik üzündən bizlər, biz şərqlilər, biz müsəlmanlar şu son dörd-beş yüz il zərfində cərəyan edən vüquati-əziməyi-cahandan bixəbər, binəsib qaldıq. Binəsib və bixəbər qaldığımız üçün külliyyətli zərər və ziyanlara düçar olduq. Öylə şiddətlə düçar olduq ki, bütün aləmi-islam, bütün məmaliki-vasieyi-islamiyan Fasdan Cavayə qədər, Kazandan Zəngibarə qədər fələcə uğramış kibi əzim bir cismi-atilə oxşayır!..

Bu son dörd-beş yüz sənə zərfində aləmdə fövqəladə böyük hadisat, hadisati-inqilabiyyə vüqua gəldi...

Hər nə qədər bu hadisata hükəma və üləmayi-tarix tərəfindən əhəmiyyəti-külliyyəyəyi-aləmiyə isnad olunursa da, fəqət bunların heç biri cüzi olsun üzərimizdə bir təsir hasil etmədi!.. Hətta biz bu hadisatdan bixəbər qaldıq. Bəşəriyyətin bir qismi-əzimərsində bu hadisatın bəxş etdigi mənafei-əzimədən binəsib qaldıq.



Kolumb nam italiyalı mahir bir məllah İspaniyadan qalxıb Bəhri-Mühiti-Ətlasiyi keçib Yeni dünya, Amerika denilən bir nisfi-cahan, bir nisfi-küreyi-ərz kəşf etdi!..

Nə mühüm, nə əzim vəqəə!.. Oraya avropalılar axın-axın gedib dövlətlər, məmləkətlər, bu gün qibtəbəxşi-aləm olan məsud-məsud cümhuriyyətlər vücudə gətirdilər. Eyni İspaniyadan İspaniyanın bir qismi olan Əndəlisdən nifaq üzündən qovulmaqla mütənəbbeh olmayan müsəlmanlar eyni Mühiti-Ətlasinin sahilində Fasda, Məqribi-əqsada dəxi xilafət və səltənət qovğaları ilə məşğul olub nə Kolumbdan, nə Kolumbun gəmilərindən, nə də kəşf olunan yekə bir aləmdən xəbərdar olmadılar. Olmadıqları üçün cəhanın bu qismi müsəlmanlara bu gün külliyyən biganədir...

Yengi dünyayı müsəlmanlara qayib etdirən o faslılar, o ərəblər bu gün dəxi hənuz xilafət və səltənət qovğasını bitirməmişlərdir!..

Bir neçə əsr sonra Avropanın göbəgi, qəlbi sayılan Fransada bir tufan qopdı. Bu bir tufani-hürriyyət idi? Avazeyi-hürriyyət mühib bir göy gurultusu kibi bütün avropalıların başı üzərində təninəndaz oluyordı. Hökmün cəmaətdən, əfradi-cəmaətdən sadir olduğu, hüquqi-bəşərin müqəddəs bulunduğu elan olunuyordu. Cəmiyyəti-bəşəriyyənin ruhundan nəbən edən bu sədalar bütün Avropayı alt-üst etdi. Fransa inqilabından əlli-altmış sənə sonra Avropa dövlətlərinin cümləsi inqilabata düçar olub hüquqi-bəşəriyyələrinə nail oldular! Lakin Avropanın yanı başında duran aləmi-islam yenə mütəəssir olmadı... bu hürriyyət sədasını eşitmədi, bütün inqilablardan bixəbər qaldı... Bixəbər qaldığı üçün gündən-günə tənəzzüldə, tədənnidə davam edib durdu!..

İmdi bu iki vüquati-aləmdən, yəni həm Amerika kəşfindən, həm Fransa inqilabi-kəbirindən daha mühüm, daha əzəmətli olaraq gözümüzün qabağında bir üçüncü vəqəəyi-əzimə cərəyan etməkdədir... Əgər bu vəəqədən də bixəbər qalıb hissəmənd olmazsaq, məhv və müzməhil olacağımız şübhəsizdir. İştə bu dəfə artıq gələcəgə, istiqbala bir əmani-nəzər edib Rusiya hərəkati-inqilabiyyəsinin nəyə müncər olacağını kəşfə çalışalım: heç şübhə yoxdur ki, bu inqilab öz hədəfi-məqsudinə nail olacaq, hürriyyəti-mütləqəyi-kamiləyi cəmaətə bəxş etdirəcəkdir. Binaənəleyh bu hərəkata qarşı laqeyd durmayalım! Cərəyani-ümumiyyəyə qapılmamız, iştirak etməmiz lazımdır...

Çünki bu iştirakdan gələcəkdə bizim üçün fayidədən, mənfəətdən başqa bir nəticə yoxdur. Gələcəkdə zərər deyil, fayideyi-səadət görünür. Hürriyyət, inqilab bir pəhləvandır ki, hər yerdə ki, cuş və xüruşə gəlib ciddən öz amalı uğrunda çalışdı, orada:

"Qələyi viran gərdə əz kafir sitəd,
Bəd əz an bərsaxtəəş səd borc o sədd"[1].

Ə.H.
*"Həyat", 1905, №120*

## KRİSTOFOR KOLUMBMU, YOXSA TÜRKLƏRMİ?!

Məlumdur ki, Amerikanın kəşfi şərəfi Kristofor Kolumba aiddir. Bir neçə millət vardır ki, bu şərəfə iştirak iddiasında bulunuyorlar. İtaliyalılar, bilxassə Ceneva şəhəri xəlqi diyorlar ki, Kolumb bizlərdən olduğu üçün, bizim şəhərimizdə təvəllüd etdigi üçün şərəf bizimdir. İspaniyalılar diyorlar ki, xeyr. Kolumba gəmiləri verən biz olduğumuz üçün o şərəfə kimsənin haqqı olamaz. Osmanlı türkləri də diyorlar ki, biz İstanbulu fəth etməsə idik, avropalılar Hindistana ayrı yollar arayıb Amerika kəşfinə müvəffəq olmaz idilər. Skandinaviya xalqı isə diyor ki, Kolumbdan çox əvvəllər biz İslandiya cəzirəsindən Amerikanın şimal cəhətlərinə getmiş idik. Ancaq bu hadisə bilaxirə yaddan çıxdı. Lakin əxirən fransızca "Fiqaro" qəzetəsinin verdigi xəbərə baxılarsa, türklərin Kolumbdan çox əvvəl Amerikaya getmiş olduqları anlaşıyor.

Bu qəzetədə oxunduğuna görə: "Amerikayi cümhuriyyətlərindən olan Meksikanın üləmayi-lisaniyuni Meksikanın vəsətlərindən bəzi qəbilə və əşirətlərin türkcə danışıb söylədiklərini kəşf edib fövqəladə düçari-heyrət olmuşlardır. Bunun üzərinə üləmayi-mümaunileyhim, ticarət qəsdilə Meksika şəhərində iqamət etməkdə olan istanbullu bir ruma müraciət edib məsələyi həll etmək üçün özləri ilə bərabər türkcə danışan qəbilələrin nəzdinə getməsini təklif etmişlər. Rum taciri dəxi təklifi qəbul edib oraları üləmanın rəfaqətində

[1] Bir qalanı viran etdi, kafirdən aldı,
Ondan sonra yüz bürc və sədd tikdi.
*Ə.Həyati*



ixtiyari-səfər etmiş və qəbilə əfradı tərəfindən söylənən sözlərin tamamilə türkcəyə müşabeh olduğunu müşahidə eyləmiş və bir az qəbilənin şivəsilə kəsbi-ülfət etdikdən sonra Meksikanın bədəvi ilə türkcə təkəllümə başlayıb kəmali-sühulətlə təatiyi-əfkar eyləmişdir.

Bu hadisəyə meksikalılar nəhayət, mərtəbə heyrət ediyorlar!.."

"Türklər kimdir və kimlərdən ibarətdir" ünvanlı məqalatımızda zikr olunduğu vəchlə, Baykal civarında Orxan nəhri kənarlarında tukuyu, yaxud türk-oğuz türklərinə dair fövqəladə kəşfiyyati-mühümmədə bulunan Peterburq və Helsinqfors türkoloqlarının heyəti-elmiyyələrinin Meksikaya dəxi bərayi-təhərriyyati-ciddiyyə adamlar göndərəcəklərini ümid ediyoruz.

İstanbulda hənuz böylə şeylərin qədrini biləcək dərəcədə hazırlıq yoxdur...

Ə.H.
*"Həyat", 1905, №129*

## ABDULLA CÖVDƏT "İCTİHAD"I İLƏ MİSİRDƏ İCTİHADA BAŞLIYOR

Heç şübhə yoxdur ki, bu gün ümum aləmi-islamda ən ziyadə məzhəri-tərəqqi olan mətbuat türk və ələlxüsus osmanlı mətbuatıdır. Fəqət bu mətbuatın üzünü ağardan əsasən yeni türk övraqı olub, bunlar miyanında da mətanət, vüsət və ciddiyyəti-əfkar, nəzakət, lətafət və mükəmməliyyəti-lisani nöqteyi-nəzərindən birincilik ünvanına şayəstə bir cəridə varsa, o da şübhəsiz, "İctihad" məcmuəsidir ki, ayda bir dəfə Abdulla Cövdət bəyin təhti-idarə və nəzarətində nəşr olunur. Bu məcmuənin əvvəlcə səkkiz nüsxəsi Avropada İsveçrə cümhuriyyəti şəhərlərindən Cenevrədə çıxmaqda ikən bu dəfə mühərrirlər əsbabi-müxtəlifədən naşi Misrə köçüb 9-cu nömrəsini orada təbi nəşr etdilər. Bu nömrədəki Misirdə çıxanların birincisi deməkdir. "Rusiya müsəlmanları oyanıyor" ünvanilə bir məqalə mündəricidir. Məzkur məqalədə qəzetəmiz haqqında məlumat verilərək deniliyor ki: "Həyat" Qafqaziya müsəlmanlarının acı bir fəryadi-intibahıdır. Fəryad deyiriz, zira Kəbəyi-nicat ilə aralarında açılmış olan girdabın müşahidəsi onlara dəhşət və fəryaddan qeyri nə ilham edə bilir?" "Həyat" və "İrşad" Qafqaziya müsəlmanlarının acı bir

fəryadi-intibahı isə "İctihad" cəmi müsəlmanların bir fəryadi-intibahı olduğuna şübhə etməməlidir. Zira o nəsihətdir ki, "İctihad" bizə veriyor, bir fəryadi-ümumiyi-islamdan başqa nə ola bilir? Baxınız "İctihad" bizə nə yolda nəsihət ediyor":

"Bir millətin milləti-hakimə olması, o millətdən bir fərdin təxti-səltənət üzərində bulunması ilə qaim deyildir. Milləti-hakimə o millətdir ki, ümumiyyəti etibarilə alim, sənətkar zəngindir. İş bir çox əsrlərdən bəri böylə olmuş və hər zaman böylə olacaqdır.

Bu gün milləti-İsrailiyyənin heç bir hökuməti, müəyyən bir vətəni yoxdur. Fəqət fəaliyyətləri, sərvətləri, sənətləri, elmləri ilə hakimi-aləmdirlər. Bu böylədir...

Binaənəleyh cahil və mütəkəbbir biz müsəlmanların dərhal yapacağımız bir şey varsa, o da kibr və qüruru artıq buraxıb, mazinin cəlali-şənilə öyünməyi tərk edib, kəndi-kəndimizi və övladlarımızı zamanın və zamani-atinin ehtiyacatına görə təlim və ehzar etməkdir. Qəzetə, məktəb, kitabxana, qiraətxana, teatro, islahxana, bunlar kəbəyi-nicata doğru atılacaq ilk addımlardandır. "Qardaşlarımıza çox rica ediriz ki, bir millətin mənbəi-rifah və sərvəti olan sənayei, ticarəti istisğar etməsinlər, övladlarını Avropaya göndərsinlər. Kimi mühəndis, kimi makinist, kimi memar, kimi ciftçi (aqronom) olsun. Kimi mətbəəçilik öyrənsin, bunlar Avropanın mədarisində ikmali-elm və hünər etdikdən sonra məmləkətlərinə övdət edər, fabrikalar, ticarətxanalar yapar, kəsbi-qüdrət və nüfuz edərlər.

Bir millətin həyat və bəqası da ancaq bu surətlə təmin olur"...

Bu sözlər, bütün aləmi-islama əksəndaz olan fəryadların ən büləndi, ən mənidarı, ən suznakidir. Baxalım, fəryad edən özü kimdir? Abdulla Cövdət əsasən təbib, həkimdir, İstanbulun darülfünuni-tibbində yetişmişdir. Şüəbati-tibbdən kəhallığa ayrıca həvəs etmişdir. Lakin sadə cismani gözlərin deyil, mənəvi gözlərin dəxi təbibidir. Çünki ədib və şairdir, həm də osmanlının ən güzidə ədib və şairlərindən biridir. Təbi-şairanəsi türkcəyə münhəsir deyildir: Abdulla Cövdət eyni məharətlə farsi, ərəbi və firəng dillərində dəxi şeir deyə bilmişdir.

Fransız dilində bir neçə cild əşar nəşr etmişdir. Əz cümlə "Pafale de parfums (Fievre d'Ame)" ünvanları ilə Avropada təb və nəşr edilən firəngcə şeir məcmuələri onun öz təbi-asarındandır. Lakin müxtəlif lisanlarda hünərini göstərməklə bərabər Abdulla Cövdətin ən ziyadə sevdiyi lisan türkcədir. Bu lisana Avropa şüərasından Şiller,



Şekspir, Bayron kimi ən böyüklərinin asarını tərcüməyə qeyrət etmişdir.

Bu gün "Vilhelm Tel", "Hamlet" kimi asari-nəfisəyi onun himməti-şairanəsi sayəsində türkcə mütaliə edib zövqyab olmaq mümkündür. İndi də məşhur Lord Bayronun "Şilyon məhbusu" nam mənzuməsini təb edib bir töhfəyi-giranbaha olaraq bir cild də bizə göndərmişdir. Nümunə üçün qəribən bu əsərdən bəzi parçalar iqtibas edib qəzetəmizə dərc ilə qarelərimizə ərz edəriz...

İştə, böylə insaniyyət yolunda yorulmaq, usanmaq bilməyərək, çalışan bu zati-aliqədrin, bu vücudi-nadirüləmsalın vətən və millət xeyrinə etdiyi dad və fəqandan naşi görmədiyi bəla, çəkmədiyi əziyyət, uğramadığı möhnət qalmamışdır. Hürriyyət, haqq və həqiqət üzündən məhbəslərdə, mənfalarda, qürbətlərdə sürünməklə, vücud çürütməklə Dantelər, Tassolar kimi şərəfyab olanların da biri bu zatdır...

Buralarını layiqi-vəchlə anlatmaqdan bən də aciz qaldığım üçün meydani-süxəni zülmdidə olan müşarileyh şairin özünə tərk ediyoram.

Cövdət "İctihad"ın son nüsxəsində öz həyatından bu surətlə şikayət ediyor:

"Bana xumar məbid verən bu cami-təhi,
Pür oldu qanla, dəmu ilə ömri-fanimin.
Xəyal əlində həqiqi əzablar çəkmək
Budur xülaseyi-məşuməsi məanimin...

* * *

Bu gün müəqqəbiyəm musiqi bükalardan,
Daha bünləndü səmimi və saf bir amalın.
Düşər məşaili-idrakim üzrə biaram,
Xüruşi-zülməti-cavidi leyleyi-əzəlin...

* * *

Şəbi-ədəmdə sükunpərvəru qünudə ikən,
Bəni sürüklədi bir məhşərə kəməndi-həyat.
Hüdudsuz olan işfaqimə mücazatən,
Hüdudi-mövtdə oldum pərran ki, bəndə həyat".

*Ə.H.-zadə*
*"Həyat", 1906, №59*

# İNGİLİS ƏŞARI TÜRK DİLİNDƏ VƏ "ŞİLYON MƏHBUSU"

Bu gün türkcədən başqa bir dil bilməyənlər dəxi Lord Bayron kimi müəzzəm bir ingilis şairinin asari-hürriyyət-pərvəranəsindən müstəfid və zövqyab ola bilərlər; çünki o asari-nəfisəyi-ülviyyə birər-birər öz ana dilimizə nəql edilməgə başlamışdır. Bu saat qarşımda Abdulla Cövdət bəy tərəfindən tərcümə edilib bizə hədiyyətən göndərilən "Şilyon məhbusu" duruyor...

Bayronun əşarını əvvəlcə rus və Avropa dillərində mütaliə etmiş idim. Lakin heç bir vaxt o əşari-büləndamal məzkur dillərdə mənə öz dilimizdə olduğu qədər zövq və ləzzət verməmiş idi. Mən bu andakı zövq və məmnuniyyətimi tərif edəməm!..

Bayronun əşarını türkcə oxumaq nə böyük nemət, nə böyük səadət! Abdulla Cövdət Avropa şairlərini bəzən nəzmən, bəzən də nəsrən tərcümə ediyor. Fəqət hər hansı surətlə olursa olsun, bu tərcümələr fövqəladə gözəl düşüyor. Adətən, əslindən heç bir vəchlə geri qalmıyor!.. Mənzum tərcümələrdən şairi-əzəm Şekspirin "Hamlet" ünvanlı faciəsinin tərcüməsini zikr edə bilərəm. Bu əsər avropalıların "ağ şeir" dedikləri nəzmi-qeyri-müqəffa üsulu ilə dilimizə nəql edilmişdir. Çünki, ingiliscə olan əslində dəxi külliyyati etibarilə nəzmi-qeyri-müqəffadan ibarətdir. Britaniya şairinin fikrinə görə kəlam mövzuunda təbiilik mətlub isə, qafiyələrə əsla ehtiyac yoxdur. Surətən nəzmi-qeyri-müqəffa ilə şeir demək, müqəffa mənzumələrdən daha asan kimi görünürsə də həqiqət halda daha çətindir, çünki mərhum İshaq Sükutinin dediyi kimi, kəlamı bəyəndirmək qayətlə müşküldür. İş də kəlamı bəyəndirməkdir, yoxsa qafiyələri yan-yana düzmək deyildir.

Nümunə üçün ingiliscə "Olum, ya ölüm" sözlərilə başlayan monoloqdan bəzi əbyatı burada zikr ediyoram:

Varmı olayım, yoxmu, budur məsələ,
İştə!
Zalım qədərin qədrinə etməkmi təhəmmül,
Ya qarşı gəlib cuşinə bu seyli-fənanın,
Verməkmi bu tufani-bəlayayə nəhayət!
Bunlardan əcəb hankısı icabi-nəcabət?
Ölmək uyumaqdır: Olamaz başqa bu bir şey!
Bəncə bitir ol uyqu ilə zəcrəti qəlbin,



Bin zəxm ki, mirasi-təbiisi bu cismin!..
Dövrani-sitəmpərvərə təhqiri-zəmanə,
Bidadların etdiyi bidadi və zülmə,
Təriz və təsəllütlərinə kibr və qürurun,
Sevdayi-mühəqqərlə gələn yəsü fütürə
Laqeydiyi-qanunə, hökumətdəki cəbrə,
Alçaqların əhli-hünərə etdiyi ləvmə,
Kim eylər idi səbr, kim eylərdi təhəmmül,
Bir xəncər ilə mümkün ikən xatimə çəkmək!..
Bir aləmi-məchul ki, azimləri dönməz,
Etməkdə tərəddüdlə iradatı pərişan! və ilx.

Lakin sədəddən ayrılmayalım, mövzui-bəhsimiz Abdulla Cövdətin nəsrən tərcümələrindən biri olan "Şilyon məhbusu"dur.

Bu kitabın başında Cövdət Bayronun şəxsi və tərcümeyi-halı haqqında bəzi məlumat verdikdən sonra onun hürriyyətpərəstliyinə və türkməci bulunduğuna nəqli-kəlam edib deyir ki:

"Bu gün Bayron sağ olsaydı, türklər dəxi ələn Türkiyədə icrayi-hökm edən bişüur məmurların idareyi-müstəbidəyi-mütləqəsindən qurtulmaq üzrə qiyam etsələrdi, əcəba Bayron türk mücahidlərinin səfləri arasında bulunmazmı idi? Bu suala "əvət bulunurdu" – deyə cavab verməyə pək mütəmayiliz, bu təmayüldə haqlı olduğumuza Bayronun Çayld Harold (Chiold Harold) ünvanlı əsərindən müstəxrəc şu sözləri işhad edəriz: "Türklər nə aldatıcıdırlar, nə alçaqdırlar, nə də qatildirlər, etiqadsızları ehraqi-binnar etməzlər. Daima ingivizyonsuz olaraq öz bir olan allahlarına sadiqdirlər" və ilx.

Bir əsr əvvəl Bayron kimi haqpərəst, bir böyük dahi tərəfindən söylənən bu sözlər, bu gün türkləri vəhşilikdə ittiham etmək istəyən qərəzkaranə bir mətbuata gözəl bir cavab olduğuna diqqət etməlidir!..

Bayronun nə yolda bir şair olduğunu anlatmaq üçün Cövdət fransız şairi Viktor Hüqonun Bayron haqqında yazmış olduğu sözləri tərcümə ediyor: Viktor Hüqo diyor ki:

"Zəka və dühasındakı hüzn, təbiət və səciyyəsindəki vüqar, həyatındakı fırtınalar ilə Bayron bir növ şerin ünmuzəcidir. Onun hər mənzuməsində qare adətən bir ridayi-matəm arxasından müzlüm və məğrur bir çöhrənin keçdiyini görər. Ümum dərin mütəfəkkirlər kibi, bəzən mübhəmiyyət və məzlumiyyətə uğramaqla bərabər Bayronun öylə sözləri vardır ki, bütün bir ruhu istemal edər. Öylə ahları vardır ki, bütün bir həyatı hekayə edər. Zənn olunur ki, onun qəlbi

hər fikrə açılır və yıldırımlar saçan bir vulkan, bir yanar dağ kimi dərunundan atəşin fikirlər fışqırır. Zəkayi-xariqüladəsi, ələləksər heç bir nöqteyi-məqsudəyə mütəvəcceh olmaqsızın yürüyən, yürürkən düşünən bir rəhrova bənzər ki, mülahizati-dəruruna müstəğrəq bulunduğu üçün keçdiyi məhəllərdən xatirində ancaq məşkuk və namüəyyən bu xəyal qalır. Lakin daima bir xəyal qanadsız vüsulu mümkün olmayan yüksəkliklərə vasil olur. Qartal nəzərin zəmin üzərinə rəkz etsə də aftabgir olan nigahi-ülvisini qayib etməz".

Viktor Hüqonun bu sözlərini daha ziyadə şərh edərək Cövdət diyor ki:

"Bayron hər yazdığı əsərdə öz ruhuna tərcüman olmuşdur. Bayronun qəhrəmanları Bayronun heç qeyri deyildir..."

Saheyi-təcəssüs və təsviri öz ruhuna münhəsir bulunmaq cəhətilə Bayron, Şekspirə heç qiyas və təşbih qəbul etməz. Şekspirin təsvir etdiyi əşxas ilə öz ruhu arasında münasibət yoxdur... Bayronun istinbat etdiyi yeganə mənbə öz ruhi-biüfüqüdür. Biüfüqi deyiriz, zira Bayronun ruhi-tufanmədari hüdudi-nəzər olan üfüqləri çak edər bir ümmani-nur və nardır. Bu səbəblərdir ki, daima bir dairəyi-üfüqiyyə ilə məhdud olmağa alışmış nəzəri-ərbabı Bayronu oxurkən başlarının döndüyünü və göz qapaqlarını endirmək və o namütənahiliyə nəzərlərini tədricən alışdırmaq ehtiyacını hiss edirlər...

Bayronun özü haqqında bu qədər məlumat aldıqdan sonra bu şairin asari-ələməfzasından biri olan "Şilyon məhbusu" ünvanlı mənzuməyi Abdulla Cövdətin tərcüməsi sayəsində mütaliə edəlim: 16-cı əsri-miladidə Bonivar adlı alim, fazil, qəyur bir zat vətəninin hürriyyəti və bəlayi-istibdaddan mühafizəsi uğrunda cannisar olaraq İsveçrə ölkəsində bulunan Şilyon qalasında həbs edildi. İştə, "Şilyon məhbusu" da bu zat olub, bunun müsibəti-məhbusiyyətini Bayron suzişli bir lisan ilə nəzmə çəkmişdir. Hürriyyət haqqında binəzir olan bu mənzumə böylə başlayır:

"Ey zəncirlərin zəbt və təqəyyüd edəmədiyi dühayi-əbədi ruh, ey hürriyyət! Sənin rövnəq və cəlalın zindanlarda daha müşəşədir. Könüldən yapılmış olan aramgahını orada bünyad edərsən... Sənin məhəbbətindən başqa heç bir şey o könülləri müqəyyəd qılamaz. Aşiqlərin zəncirbənd olduqları və bir məhbəsin rütubətli zülmətinə müstəqrəq bulunduqları zaman, vətənləri onların fədakarlıqları sayəsində məzhəri-zəfər olur və tairi-istiqlal hər ruzgardan qanad istiarə edər.



Ey Şilyon! Sən bir cayi-müqəddəssən, məhbəsinin hüznəngiz daşları bir nişiməngahi-ibadətdir, zira bir soyuq daşlar yumşaq bir torpaq imiş kimi Bonivarın ayaqlarının izini mühafizə etmişdir. O izlər silinməsin, zira onlar, insanların zülm və istibdadını cənab həqqə ixtar edəcəkdir".

Bu müqəddimədən sonra şair bütün vüquatı Bonivarın öz dililə nəzmən hekayə ediyor. Hekayənin bəzi müəssir qitələrini qəzetəmizdə dərc ediriz:

"...Yeddi kişi idik, familiyamdan bir fərd qaldı, o da mənəm, altı gənc, bir ixtiyardıq. Cümləsi zülm və təcavüzü təhqir etməklə mübahi olaraq, başladıqları mücahidə meydanında təkmili-ənfas etdilər.

Birisi alovlar içində can verdi, ikisi qovğayi-həmiyyətdə hüccətinamuslarını qanları ilə imzalayaraq və pədərləri kimi düşmənlərinin inkar etdikləri haq yolunda öldülər. Digər üçü bir zindana soxuldu. O üç qardaşdan yalnız mən yaşayıram...

Üç qardaşdan hər birimizi bir dirəyə zəncirlədilər. Eyni zamanda üç kişi idik. Bununla bərabər hər birimiz münfərid və məhrumi-ixtilat idik... Zəncirlərimiz pək qısa idi. Bir tək addım atmağa müsaid deyildi. Bir-birimizi görə bilirdik. Lakin çöhrəmizi tənvir edən solğun və donuq ziya kəndi çöhrəmizə belə kəndimizi biganə kimi bulunduruyordu. Bu vəch ilə müctəme məəhaza münfərid idik. Qollarımız üzərində zəncirin siqlətini hiss ediyor, qəlbən daha ziyadə müztərib bulunurduq. Bu hal ilə ənasiri-safzəmindən məhrum bulunduğumuz bir zamanda biri-birimizin səsini duymaq və kəlimatitəsliyyəti təati edə bilmək bizim üçün bir lütf, bir nemət idi.

Bəzən içimizdən biri əski bir hekyə nəql edirdi. Digəri bir hərb şərqisi söylərdi. Lakin çox sürmədi... Bu təatiyi-kələmat bizim üçün bir zövq olmaqdan qaldı, səslərimizə zindan sədasına müşabeh, samiəfərsa bir təğyiri-əda ariz oldu. Artıq səslərimiz əvvəlki kimi sərbəst və gur deyildi. Ehtimal ki, bu hal bir qələti-hiss idi, bizi aldatıyordu... Fəqət bəncə hər halda səslərimizin pərdələri təbəddül etmişdi.

Mən, üç qardaşın ən böyüyü idim. Cəsarətlərini təqviyə edərək qardaşlarıma təsliyətsaz olmaq mənim vəzifəm idi. Əlimdən gəldiyi qədər bu vəzifəyi ifa etdim. Onlar da əllərindən gəldiyi qədər mənim qüvvəti-qəlbimi mühafizə etdilər.

Lacivərdiyi-səmayə müşabih olan mavi gözlərilə çöhrəsi validəmi andırdığından, pədərimin ən ziyadə sevdiyi və ən kiçiyimiz

ən ziyadə qəlbimi parçalayırdı. Bu qədər sevimli bir quşu böylə bir dami-zülmətdə görür də, nasıl dilxun olmam.

"Heyf başəd çu do morqi ke əsire-qəfəsi!"[1]

misrası xatirə gəlir.Bu cocuq gündüz kimi gözəldi. Ənvar içində kəmali-hürriyyətlə uçan qartal yavrularının nişat və hürriyyətinə məzhər bulunduğum zamandakı gündüzlər kimi gözəldi. Zadeyi-afitab olan və bərf ilə müzəyyən bulunub, gecəyi uzun bir yazın ziyasından sonra görən qütb gündüzlərindən bir gündüz kimi gözəldi... Sevimli olduğu qədər saf bir qəlbi vardı... Təbən xəndənüma olan gözlərini ancaq əbnayi-nəvinin fəlakəti giryənak edərdi...

Digər qardaşımın qəlbi də saf idi. Lakin bu, insanlarla mücadilə və müsariədə bulunmaya müsaid bir surətdə yetişmişdi. Ahəntən və ümum cahana meydan oxuyacaq yolda şəci idi. Bir ordunun ilk səflərində kəmali-nişat ilə fədayi-can edə bilərdi. Zəncirlər içində zəbun olmaq üçün doğulmamışdı. Zəncirlərin yalnız səsi onun ruhunu istehqar edərdi. Şücaətinin kəmali-sükunətlə düçari-inhitat olduğunu gördüm. Heyhat, kəndi əzm və cəsarətim də münxəsif olurdu. Bu qədər müəzziz bir familiyanın bu fərdi-baqisinə həyati-tazə vermək üçün, olanca qeyrətimi sərf etdim. Kəndisi bir dağ ovçusu idi. Dağlarda çox kərrə qurd və keyikin arxasını təqib etmişdi. Bu zindan onun üçün bir vərteyi-həlak, ayaqlarını zəncir içində görmək isə fəlakətlərin ən fənası, ən müdhişi idi...

* * *

Bizim məhbus olduğumuz müzlim zindan, külək səviyyəsindən aşağıdır. Gecə-gündüz başımızın üzərində, suların daşlara urmasından mütəhəssil gurultuları eşidirdik. Qışın, dalğaların, dəmir barmaqlıqlardan içəri girdiyini hiss etdim. Azadə və bəxtiyarinnüma olan səmadə bir ruzigari-qəzzub əsiyor idi. Əmvac və ruzigarın altında qayalar sarsılıyordı... Fəqət, mən qayanın təzəlzülünü mədhuş və mütəhəyyic olmaqsızın istima ediyordum. Çünki məni azad etmək üçün, mövtün gəldiyini görə bilsəydim, məsrur və xəndan olurdum. Söyləmiş idim: Ən kiçik qardaşımız zəifləyirdi, qəlbi-ülviyyətpənahı, yavaş-yavaş müntəfi olurdu. Hər növ yeməkdən nifrət və istikrah

[1] Tərcüməsi: "Heyif olar sənin kimi quş qəfəsdə əsir olsun".



ediyordu. Lakin həqiqəti söyləməkdə daha ziyadə təəxxür etməyə nə lüzum var? Qardaşım öldü! Can verərkən gördüm. Fəqət nə pəncəyi-nəz ilə bükülən başını tuta bildim, nə də əlinə təmas edə bildim. Hətta bürudəti-mövt əllərini dondurduqdan sonra belə zəncirləri qırmaq və ya gəmirmək üçün bilafayda təzifi-cəhd ediyordum. Öldü, zəncirlərini çıxardılar, zindanımızın rütubətli zəminində dərincə bir həfrə yapdılar. Bir kərəmi-məxsus olmaq üzrə cəsədini günəş görən bir məhəldə dəfn etmələrini istirham etdim. Bu bir fikri-məcnunanə idi, lakin mən o zaman qiyas edirdim ki, öldükdən sonra belə o, mərdi-hürriyyətin qəlbi böylə bir zindanda asudə olmayacaq. Böylə bifayda bir təmənnada bulunmaqdan kəndimi mən edə bilirdim. İstirhamıma, bardanə görünməkdən başqa bir şeylə müqabilə olunmadı. Qardaşımı açdıqları həfrəyə yatırdılar. Basıq və çəmənsiz bir topraq pərəstidəmiz olan o vücudi-müəzzizi sitr etdi... Böylə bir cinayətə layiq bir abidə (yadigar daşı), bir heykəli-müxəttər olmaq üzrə zəncirini məzarının üzərinə asılı buraxdılar.

Lakin ikinci qardaşım, o evimizin ən sevgili, ən rəngin çiçəyi... o vərdi-xəndan dəxi, budağı üzərində solan bir çiçək kimi soldu! Məhv oldu. Aman ya Rəbbi! Nə surətdə olursa olsun bir ruhun çıxdığını, ənfasi-vapəsinini görmək nə qədər müdhiş! Mən ruhun qan dalğaları arasında teyran etdiyini gördüm. Ümmanın əmvaci-xüruşanı üzərində bir hərəkəti-təşənnüciyyə ilə müsariəsini gördüm, fərraşimatəmi üzərində son dəmi-ehtizarın sayıqlamaları içində cinayətin çırpındığını gördüm, lakin bu mənazir, birər mənzərəyi-dəhşət idilər. Qardaşımın ölümü, bu dəhşətlər ilə qarışmaqsızın pək və cəmi həzin oldu. Bu mövt bəti, fəqət və qəti bir mövt idi. Sükun və nərmiyi-tam içində söndü. Kəmali-hüzur ilə və gözündə yaş olmaqsızın yalnız kəndisindən sonraya qalanların əndişəsilə dilxun olaraq daima rəhim, mülayim olduğu halda zəbuni-qəhriməmat və mütəaqibən tariki-həyat oldu. Bütün bu müddət əsnasında yanaqlarının rəngi xəndənümayi-istehza oluyor, əcələ, mövtə meydan oxuyur, – zənn olunurdu. Təravəti-lövni zavalda bulunan bir qövsi-qüzehin son ləməatı kimi yavaş-yavaş soldu. Gözlərində bir nuri-bərraq var idi ki, zindanı noümən tənvir ediyordu. Erkən gələn əcəlinə qarşı lisanından heç bir kəlməyi-təzəllüm, sinəsindən heç bir ahi-təəllüm çıxmadı. Soz sözləri məsud günlərə dair bir kaç kəlmə, ümidimi canlandıracaq bəzi kəlməti-təsəlliyyət oldu. Çünki, mən səmti-sükutə

müstəğrəq idim. Ziyalarımın ən zalimanəsi olan bu ziyai-əxirin hiss və əzabilə həlak olmuşdum. O kələmati-təsliyyəti, bitabu təvan qalmış olan vücudun inhizamından mütəvəllid sinəsində boğmaya çalışdığı iniltilər təqib etdi. İniltilər tədricən daha imtidadlı, daha zəif, daha seyrək oldu, dinləyirdim. Fəqət eşidəmədim. Çağırıyordum, çünki təsiri-qəhr və fəlakətlə dəli idim. Artıq ümid olmadığını biliyordum. Lakin xövf və dəhşətimin içində ağlımın hökm və vəsayasını dinləməyir, rədd ediyordum, çağırıyordum. Bir səs eşitdim, sandım. Bir həmləyi-ənifə ilə zəncirimi qırdım. Kəndimi ona doğru fırlatdım, o artıq yox idi. Bu cayi-siyahda yalnız qalmışdım, mən bir həyat idim. Rütubətli zindanımın məlun havasını yalnız mən tənəffüs edirdim. Mənimlə girdabi-əbədi arasında mövcud olan və məni hənuz nəslibədbəxtimə rəbt edən son yeganə və ən səmimi həlqəyi-rabitə bu məhəlli-məşumda yeni qırılmış idi. İki qardaşımdan biri torpağın üzərində, digəri altında yatıyordı. Hər ikisi də tənəffüz etməz olmuşlardı. Orada qeyri-mütəhərrik duran əlini əlimə aldım, heyhat! Mənim əlim də soyuq idi. Qımıldanacaq qüvvətim yox idi. Lakin hiss ediyordum ki, hala yaşayıram. Bu hiss ilə sevdiklərimizin əbədiyyən qayib olduqlarını idrak etdiyimiz zaman kəsbi-şiddət edərək, məhsus olur.

Nə üçün öləmədim, söyləməyəm, dünyaya təəllüq edər artıq bir ümidim yox idi. Lakin imanım var idi. Bu itqan vicdanı məni xudkamanə intihardan mən edirdi.

Bunu mütəaqib bu caygahi-fəlakətdə mənə nələr oldu iyi bilmiyoram, heç bir zaman bilmədim. Əvvəla, məni əhatə edən kaffəyi-əşyayı, ziyayı, hətta zülməti belə hiss etməz oldum, heç bir fikir, heç bir ehtirasım yox idi, daşlar miyanında bir daş kimi idim, kəndi-kəndimi xəyalməyyal müdrik sislər içində çəmənsiz tənəbbütanı yox bir qaya kimi idim. Çünki, çevrəmdəki əşya boş, müzlim, siyəhnüma idi. Mühitim gecə deyildi, gündüz deyildi. Zindanımın ağırlaşmış olan, basirəyə mənfur və müstəkirə görünən işığı da deyildi. Məsafəni bəl edən bir boşluq, aram və sükutsuz bərqərar idi. Mənim üçün artıq nə yıldız, nə ərz, nə zaman, nə qəvanin, nə təhəvvülat, nə fəzilət, nə də cinayət vardı. Mənim üçün mövcud olan ancaq bir xamuşi-əmiq ilə həyata da, məmata da qeyri mənsub bir nəfxəyi-qeyri-mütəbəddilə ...rakid, işıqsız, kənarəsiz, səssiz-hərəkətsiz bir dərya idi.

Dimağıma birdən-birə bir ləmə daxil oldu, bu, bir quşun nəğməsi idi, quş susdu, sonra yenə başladı, bu nəğmə samiənin aləmdə



eşitmiş olduğu nəğəmatın ən samiənəvazı idi. Qəlbim bu istima ilə ləbrizi-hissi-şükran oldu. Ənzarım lətif bir heyrət ilə, o yana – bu yana initaf edərək, səsin gəldiyi yeri aradı. Gözlərim o dəqiqədə səfalətimi görmədi, fəqət mütəaqibən həvasım kəmali-hüsn ilə və ələttədric cərəyani-mötadını aldı. Məhbəsimin kəma fis-sabiq, divarlarının qaldırılıb yavaş-yavaş üzərimə qapandığını gördüm. Əvvəlcə, olduğu kibi günəşin nuri-rəqsanının yerlərdə süründüyünü gördüm. Bu nur şəmsə rüxsəti-güzəran verən bir yarıqda bu quş əxzi-mövqe etmişdi. Bir nihali-tazə üzərinə qonmuş kimi şövqli, ülfətnüma idi. Lacivərdli qanadlı, dilbər bir quş idi. Nəğməsilə minlərcə şey söyləyirdi və hər söylədiyini mənim üçün söyləyir, sanılıyordı, bunun mislini görmədim və heç bir zamanda görməyəcəyəm. Bir arqadaşa mənim kimi möhtac olduğu zənn olunurdu. Fəqət mənim qədər kədərnak deyildi. Kəndisi kimi, məni sevmək üçün yaşayan heç bir fərdin qalmamış olduğu bir zamanımda məni sevmək üzrə gəlmiş idi. Zindanımın kənarına gələrək məni ehtisasat və təfəkkürata ilqa etmişdi. Az bir zamandan bərimi azadə idi. Yoxsa mənim qəfəsimin üzərində aram etmək üzrə kəndi qəfəsindən qaçmışmı idi? Bilməm. Sevimli quş, mən əsarətin acısını pək iyi dadmış olduğum üçün, sənin əsir bulunmanı arzu edəmiyordum. Möhtəmil ki, bu behişt aləmindən gəlmiş qanadlı bir zair idi. Məni həm ağladan, həm mütəbəssim qılan bu zəhabımı Allah əfv etsin. Ola bilər ki, bu quş qardaşımın ruhudur da, nəzdimə nüzul etmişdir. Zəhabında da bir çox dəfələr bulundum, lakin aqibətüləmr uçdu, getdi. O zaman, bunun bir məxluqi-fani olduğunu anladım. Öylə olmasaydı bu vəchlə getməz və məni böylə yalnız buraxmazdı.

Aylar, illər, günlər keçdi, fəqət saymadım, hesabını bilməm, nurişəmsi bir kərrə daha görəcəyimə, gözlərimi sitr etməkdə olan zülmətin mündəfe olacağına heç ümidim yox idi. Nəhayət, məni məhbəsdən çıxarmaq üçün adamlar gəldi. Məni nə üçün çıxaracaqlarını sormayırdım, məni nərəyə götürəcəklərini öyrənmək xatırıma gəlməyirdi. Zəncirlərə sarılmaq da, heç zəncirsiz olmaq da mənim üçün bifərq olmuşdu. Ümidsizliyi sevməyə alışmışdım. Vəxta ki, bu adamlar yanıma gəldilər, vəxta ki, kaffəyi-qüyudumdan azad olundum mənim üçün bu səqil, cəsim hasarlar, yalnız mənə məxsus bir söməə, bir guşeyi-üzlət kimi olmuşdu.

Adətən pədər yurdundan ikinci dəfə cüda ediliyor kibi oldum. Ənkəbutlara rabitəyi-müvanisət və dostu ilə mərbut idim. Onların guşişi-sakitanələrini nəzərlərimlə təqib edirdim. Farələrin ay işığında oynamalarını seyr etməyi sevərdim. Nə üçün bu heyvanlardan daha az mütəhəssis olayım. Biz, cümləmiz, bir məkanın məkinləri idik. Mən onların hökmdarı idim. Onları öldürmək iqtidarı yədimdə idi. Bununla bərabər qərib şey-kəmali-sülh ilə yaşamaya alışmışdıq. Zəncirlərim ilə mən biri-birimizə dost olmuşduq. Bu dostluğumuzun hüsuluna bu qədər uzun bir arqadaşlıq bais olmuşdu. Hətta mən libasi-hürriyyətimi, içimi çəkərək geyindim.

*Ə.H.*

*"Həyat", 1906, №68, 69*

## MİLLİYYƏT VƏ İNSANİYYƏT

Qəzetimizin 71-ci və 74-cü nömrələrində panislamizməyə dair "Mşak" qəzetindən tərcümə olunmuş bir məqalə mündəric idi. Bu münasibətlə bir-iki söz söyləməyi vəd edib məqaləyi-məzkurədəki əfkarın qismən batil və qismən də həqiqət olduğunu bəyan etmiş idik. Həqiqətlər ələlümum aləmi-islamın bir müddətdən bəri bu anə qədər tərəqqi edəməyib, maarif, iqtisad və ictimaiyyət nöqteyi-nəzərlərindən geri qalmasına dairdir. Əfkari-batilə isə ümumiyyətlə istiqbalımıza aiddir. Bizim məqsədimiz nə bu həqiqətləri birər-birər tedad *etməkdir, çünki millət rəhbərləri olan öz əhli-irfanımız dururkən* onları "Mşak" mühərrirlərindən öyrənməyə möhtac deyiliz, nə də əfkari-batiləyi bir-bir rədd etməkdir. Zira erməni mühərrirlərindən əksərinin gözlərini təəssüb və ənaniyyətdən çox da fərqi olmayan "Dar bir milliyyət" fikri qapadıqca onları əfkari-batilə bəlalərindən xilas etmək mümkün deyildir... Səhih, ya batil olsun. İş erməni mühərrirlərinin yazdığı sözlərdə deyildir. O sözləri yazdıran ürəkdə, qəlbdədir. Onun dediyi haqq sözlərin kaffəsini, bəlkə ziyadəsini, qat-qat ziyadəsini Kamallar da, Kəmalilər də, Əlikəmalilər də, Süavilər də, Samilər də, Midhətlər də, Cövdətlər də, Əhmədlər də, Razilər də, Muradbəylər də, İsmayıl bəy Qaspirinski də, Əbdürrəşid İbrahimov da dedilər və deyirlər, lakin deməkdən deməyə, ələlxüsus dedirdən qəlbdən qəlbə fərqi-əzim vardır. Bizim məqsədimiz məqalə marruzikrin sözləri, haqq və nahaq sözləri məvərasında gizlənən bir qəlbin, bir ruhun insaniyyətpərvərliyini göstərməkdir. Bu qədər ali bir sifəti-qəlbiyyəyi göstərmək üçün məqaleyi təşkil edən cümlələrdən üç-dördünü yan-yana düzmək kafidir.

"Panislamizmə bir məqsəddir ki, nəticəsi cəmi əqvam və məmaliki-islamiyyəyi bir-birinə rəbt edib qayət vasc və həddən ziyadə böyük bir məmləkət, bir hökumət təşkil etməkdir".

"Müsəlmanlar (osmanlı, iranlı, qafqazlı, hətta hindistanlılar) panislamizmə məqsədinin ətrafına cəm olmağa hərəkət ediyorlar və dəryada qərq olub boğulanlar kibi onun vasitəsilə nicat tapmağa səy və qeyrət ediyorlar... Məgər panislamizm məqsədinin gələcəkdə qüvvədən felə çıxması mümkündürmü? Biz deyirik ki, xeyr!

Bu üç cümlədən nə anlaşılıyor?..

Üç-dörd yüz milyon nüfusdan ibarət bir camaət dəryada qərq olub boğulmaqda ikən, guya yeganə çarə, nicat zənn olunan panislamizm də bir Nuh gəmisi kibi təcəssüm edib meydana çıxıyormuş!.. Deməк ki, boğulacaqları mühəqqəqdir".

Görülüyor, ya erməni rəssamlarından dəryayi, əmvaci-bəhri təsvirdə məharətilə şöhrət qazanmış olan Ayvazovskinin "Tufan" adlı məşhur lövhəsi dəxi bu qədər fəci və əzəmətli bir mənzərə irayə edəməz. Afərin erməni məhərririnin bu qədər rəssamanə qələminə!.. Ancaq insanpərvər olan mühərrirlərə bu qədər əzim bir fəlakəti sahili-səlamətdə durub seyr və tamaşa etmək kafi deyildir: lazımdır ki, bir kəməndi-nicat gətirib, boğulanlara atsınlar, ya bunu bacarmıyorlarsa, ələ bir yaylıq alıb ağlaya-ağlaya mərsiyələr desinlər!.. Lakin erməni mühərriri bunların heç birini etmədiyi üçün istidlal edə bilərik ki, aləmi-islamın bu fəci olan mənzərəyi-həlakına sevinə-sevinə böyük bir ləzzətlə tamaşa eliyor, bəlkə də, kim bilir, sevincindən rəqs dəxi ediyor. Ancaq hal və kef böylə ikən anlamıyoram ki, sair "Panislamizm" mühərrirlərinin xof və təlaşları nərədən iləri gəliyor?!

Qüvveyi-vahimə insanları nə qərib, nə gülünc hallara ilqa edərmiş!.. Nə qədər doğru sözdür. Deyirlər ki, yalançı bir yalanı deyə-deyə axırda özü də o yalana inanmağa başlar!..

Lakin məqalədə bir cümlə daha vardır ki, mühərririnin vicdan və qəlbindəki, niyyətindəki xülusi-səfvətin dərəcəsini, daha doğrusu, dərrakəsini göstərmək üçün yeganə o cümlə kafidir.

O da budur:

"Müsəlmanlar (müxtəlif siniflərdən bəhs olunur) tərəqqi edəmmədilər və edənləri də bimənа oldu, onların da əksəri Qafqazdadır..."

Bu sözə diqqət ediniz! Tərəqqi etməsək, şikayət olunuyor, tərəqqi etsək, yenə şikayət olunuyor. Bu hal sadə bir erməni mühərririnə məxsus deyil, bütün avropalılar cüzi bir istisna ilə aləmi-islama qarşı bu məsləkdədirlər. Əgər biz tərəqqi yolunu tutsaq, sürətlə tərəqqi etsək, tərəqqimiz, sürəti-tərəqqimiz bunların təlaş və əndişələrinə, dadü fəryadlarına bais olur, "Maki xanından ziyadə teleqrafların, dəmir yolların çəkilməsinə, darülfünunların açılmasına, cəmiyyətlərin, cəmiyyəti-xeyriyyələrin təşəkkülünə mümaniət edərlər, mümaniət etmək üçün ənva' hiylələr, dəsisələr icad edərlər. Yox, biləks, əgər bətalət və ətalətə meyil edib, tədənniyə, geridə qalmağa qeyrət etsələr, geri qalmamızdan, vəhşiliyimizdən, cəhalətimizdən ələman deyib bütün aləmi vəsvəsəyə, vəlvələyə salırlar, vaveylalar qoparırlar!.."

Sərvət və saman qazansaq, bizdəki "kapitalizmə"dən, kapitalizmə təhlükəsindən şikayət edərlər. Fəqrü zərurətə düçar olsaq, "proletariat" bəlasından zarü bizar olurlar, ya kəsbü kar üçün diyari-qürbətə gedən füqəraya Amerika kibi məmləkətin qapılarını bağlarlar. Bağlamaq üçün qanunlar ixtira edərlər, yaxud qürbət şəhərlərin küçələrində də bunları ova çıxarlar!..

İttihad və ittifaq istəsək də, şikayət edərlər, nifaq və şiqaqa düçar olsaq da, şikayət edərlər! İttifaqımız bunlar üçün bir təhlükə, nifaqımız yenə təhlükə. İttifaq etsək, "panislamizm" adı qoyarlar. Mitinqlərdə, məclislərdə və qəzet sütunlarında xatirü xəyala gəlməyən iftiraları, kizbü-böhtanları söyləməkdən çəkinməzlər. Xəyaldan ibarət bulunan, əsla vücudu olmayan bir qüvvətin əleyhinə mühib və həqiqi kualisiyalar təşkil edərlər.

Öz aramıza təfriqə düşüb öz xanəmizin içində qardaş biri-birimizlə dava etsək yenə narahat və bizar olurlar. Fasda, Marokda olduğu kibi, müttəfiqən məmləkətə girib bütün ölkəyi təqsimə qalxışarlar!.. Vəlhasil tərəqqi və təali edib göylərə çıxsaq, deyəcəklər ki: Ay haray, qoymayın!.. Müsəlmanlar göyə çıxıyorlar. Olmuya ki, başımıza asimandan şərərbar olalar, ildırımlar, şəhablar, atəşlər yağdıralar! Yox, tədənni və tənəzzül edib, yerin dibinə keçəcək dərəkələrə gəlsək bağıracaqlar ki, ay haray!.. Qoymayın ki, nari-cəhənnəmi iqaz edən bunlardır. Vezuvi yanar dağın ətrafa saçdığı odları, külləri, kükürdləri, lavaları püskürən bunlardır! Yerdən də, göydən də əl çəksək, dəryalara, dənizlərə iltica etsək, yenə susmayacaqlar, fəryad edəcəklər ki, ay haray!.. Əqvami-islamiyyənin qüvvəyi-əskəriyyəyi-bəhriyyəsi artıyor!.. Sahillərimizə barıtlar, güllələr, mərmilər, bombalar yağdıracaqlar!..



Bu adamları nə ilə məmnun etməli? Bunların xoşuna getmək üçün nə etməlidir? Nə etməli? Ya boynumuza bir zənciri-əsarət salmalı! Zəncirin bir ucunu da əllərinə verməli, yaxud məhvü nabud olmalı, vəssalam!.. Üç-dörd yüz milyon xalq ya əsarətdə, ya məhviyyətdə!.. Başqa heç nə!.. Bu mümkünmü?.. Bizim halımız "Min bir gecə" hekayələrində böyük bir dəfinə aramağa gedən bəzi qəhrəmanların halına bənzəyir. Dəfinənin yolu tilsimlidir. Dəfinə niyyətilə gedənin arxasından və iki tərəfindən guya minlərcə divlər, cinnilər, ifritlər onun üzərinə hücum edirlərmiş kibi qərib-qərib qorxunc, məxuf, müdhiş səslər, nərələr eşidiləcək! Əgər dəfinə və xəzinə custucusunda olan qəhrəman bunlardan qorxub, dönüb gerisinə, ya sağına-soluna baxacaq olursa, dönüb bir daş heykəl olub yolun ortasında qalacağı mühəqqəq!.. Əzizim, erməni mühərriri! Biz nə boğulub qərq oluyoruz və nə də panislamizməyi, vase və böyük bir dövlət təşkil etməyi özümüzə bir vasitəyi-nicat biliriz. Səhvin var, xətan var!.. Biz bir sövqi-təbii ilə naqabili-təğyir bir hökmi-qədərlə, bütün ədyanın, əqvam və millətin getdiyi yollarla gediyoruz!.. O yolun ibtidası qaranlıq və tikanlı isə də, iləri işıq və çəmənlidir!.. Millətlərin bir qismi yolun ortasında getdikləri və ya nəhayətinə yetişdikləri halda, digərləri o yolu başlarlar!.. Bu bir qanuni-təbiətdir ki, adına "evolyusiya" – təkamül qanunu deyərlər... Biz də bu yol ilə gediyoruz. Məqsədimiz, əməlimiz, ittihad, ittifaq, ictima, maarif, kəsbü kar, sənaye, ticarət və sairə qüvvətlərilə kürəyi-ərz üzərində insanlara mövud olan səadətə nail olmaqdır. Menşikov, Mağda Neyman, Çerevanski, "Mşak", "Arşalyus" və sairə nam, divlər, ifritlər arxadan, sağdan, soldan istədikləri qədər çığır-bağır etsinlər, biz qorxub geri baxanlardan deyiliz!..

Biz "öylə bir şiddəti-təsmim ilə çıxdıq ki, yola qarşıya çıxsa əgər səngi-məzarımız" dönənlərdən deyiliz!..[5]

Əgər bu əsrin ortalarında baş göstərən "nasiyonalizmə", yəni "milliyyət fikirləri serblərə, bolqarlara müsaid, onların amalına müvafiq ola bildi isə, əlan onların modası keçməyə başlamışdır. Bu gün Avropanın qismi-əzəmini təhdid etməyə başlayan "sosializm"ə, "internasiyonalizm"ə (yəni ictimaiyunluq, beynəlmiləliyyət) və "Marselyoz" nəğməsi müqabilinə çıxan "İnternasiyonal" mahnısı muxtariyyəti-milliyyələrə deyil, istiqlalati-insaniyyəyə müsaiddir!.. İslamiyyətin məqsədi isə istiqlalati-insaniyyədir. Çünki islamiyyət bir dindir ki, millət və milliyyət tanımaz, kəlmei-şəhadət gətirib onunla mütədəyyin olanlara rəsmsiz, şəkilsiz, yoldaşsız bir Allaha

iman gətirənlərə bir nəzərlə, bir ümmət nəzərilə baxar!.. Zəkat qanununu vəz edən "Əlkasibü həbibullah" "Külli müslümün üxüvvətün" deyən və "vələdi-qeyri-məşru" namilə Avropa şəhərlərini dolduran hüquqi-mədəniyyədən, hüquqi-vərasətdən məhrum bir firqənin törəməsinə mane olan faizi, mürabihəçiliyi, hər növ monopolya və inhisarlığı haram bilən islamiyyətin nasiyonalizmə ilə deyil, sosializmə ilə əlaqəsi vardır!.. Ən mədəni saydığımız inglislər belə bu gün müsəlman olmağa başlamışlardır! Yüksəlin! Qonşular, yüksəlin! Dar bir milliyyət, bir nasiyonalizmə dairəsindən dişarı çıxınız!.. Əfradi-millətinizi zəlalətə düçar etməyiniz... Şekspirlərin, Getelərin, Heynelərin, Jan-Jak Russoların, Lasalların, Marksların, Tolstoyların məziyyətləri, qədr-qiymətləri yüksəlib milliyyət xaricinə çıxdıqları üçün, bilafərq qövm və millət ümum bəşəriyyətin, insaniyyətin vəlinemətləri olduqları üçündür... Bir işıq yüksəldikcə, yuxarılara çıxdıqca, o nisbətdə uzaqları tənvir edər. Odur ki, bütün aləmə işıq və hərarət verən şəmsi-taban ən uca, ən bülənd bir nöqtədədir. Bu gün bu qədər elm və maarifinizlə, sərvət və samanınızla bərabər deyil, ümum insaniyyətə, hətta bir-iki qonşularımızı dəxi müstəfid edəcək içinizdən bir fərd yetişmədi!.. İçinizdən nə bir Əbu Əli Sina, nə bir Mollayi-Rumi, nə bir Uluğ bəy göstərəməzsiniz! İki minillik tarixinizi qarışdırsanız yenə göstərəməzsiniz! Əflatunlar, Ərəstunlar, Homerlər yetişdirən yunanilərə Musalar, İsalar, Spinozlar, Heynelər, Lasallar yetişdirən yəhudilərə heç bir vəchlə müşabihətiniz yoxdur! Yüksəlmədikcə, əxlaqınızı təthir etmədikcə milliyyət xəyalat vahiyyəsini beyninizdən çıxarıb atmadıqca, ümum bəşəriyyətə, insaniyyətə İsalar, Məhəmmədlər, Buddalar kibi bir nəzərlə baxmadıqca müşabihədə olamazsınız, bir vərteyi-həlakə düşüb gedərsiniz!.. "Mşak" mühərriri deyir ki, mədəniyyət və kapitalizmə tərəqqisi cərəyanlarının əksinə müsadimə etmək eyni Don-Kixotun yel dəyirmanlarının əksinə çalışmağına bənzəyir. Heç bir mümaniət onun qabağını saxlayıb dayandıramaz. O ən möhkəm Çin hasarlarını yıxıb viran edər... Qalib olmaq o cəmaətindir ki, həyata açıq göz ilə nəzər edər, zəmanənin ruhunu, icabatını anlar, dərk edər...

Cavabən deyiriz ki, zəmanəmizin cərəyani-mədəniləri kapitalizmə və nasiyonalizmənin ziddinədir. Kor qalıb bunu görməyən, fəhm və idrak edəməyən cəmaətlər bu cərəyanlara müqabilə etdikcə içindən çıxılmaz girdablara düşəcəkləri gün kimi aşikardır!..

*Ə.H.*

*"Həyat", 1906, №77*



## "MOLLA NƏSRƏDDİN" VƏ "DƏBİSTAN"

Həqiqətin də dadı və ləzzəti var. Guya həvasi-xəmsədən qüvvəyi-zaiqəyə təsir ediyor. Binaənəleyh həqayiqi dad etibarilə acı və şirin iki qismə ayırmaq olur. Əksər adamların şirin, şəkərli şeylərdən xoşu gəlir. Mən bəharat və ədviyyəyi-mürəkkəbi kimi acı məvaddi sevənlərdənəm. İstiot, bibər və zəncəfil olmasa, xörəgin təmi, ləzzəti olmaz, qənə-qənə, kinə və acı otlar olmasa, vücud hummadan xilas olmaz, səlamət tapmaz!.. Bizim dərviş də ahü nalə edib bir acı həqiqət demiş, bəzi adamlar bundan dilgir olmuşlardır. Halbuki, dilgir olmağa heç haqları yoxdur. Çünki söylənən acı həqiqət nafe və şəfabəxş acılardandır. Cənab dərviş deyir ki, "Biz müsəlman bənzərik nahəmvar qoz kötügünə..." Necə gözəl, əntiqə şeylər əmələ gəlir o kötükdən!..

Əvət, biz müsəlman bənzəyiriz qoz kötüyünə, mərmər daşına, qranit qayasına... nə zərif şəkillər, nəqşlər, heykəllər oymaq olur mərmər daşından; nə gözəl mətin, əzəmətli binalar, imarətlər vücuda gəlir qranit qayalarından!.. Bunca bu həqiqətə acı deyənlər səhv ediyorlar. Bu həqiqət o qədər acı degil, bunda bir şirinlik də var, deyə bilirəm. Çünki bu təşbihə görə bizim hənuz elm və mərifətlə, tərbiyə və təlib ilə yontulmamış bulunan vücudi-millimizdə bir mətanət, bir səlabət var, deməkdir... Yontulmamış olmamızı hal-hazırda idrak və etiraf etməmiz də ayrıca təsellibəxşdir!.. Peterburq darülfünununun ülumitəbiiyyə şöbəsində elmi-heyvanatı tədris edən xacəyi-möhtərəməmiz məşhur Vaqner dəxi bir vaxtlar vətəndaşları bulunan insanları heyvanata degil, nəbatatdan palıd meşə ağacı qabıqlarına bənzətmiş idi... Bənzətdiyi üçün rusların tənzibi-əxlaqı uğrunda yazdığı silsiləyi-hekayata "Palıd qabıqları" (dubovaya kora) ünvanı vermişdir. Müəllimi-müşarileyh palıd qabıqlarını yonta-yonta igirmi, otuz ildən bəri ortaya bir xeyli xeyrli adamlar çıxartdı...

Qafqaziyamızda "qoz kötüklərini", qaya daşlarını yonmağa, yonmaq üçün müxtəlif alətlər icad etməyə əzim bir meyil və həvəs müşahidə olunur. Bu növ alətlərdən biri də Tiflisdə həftədə bir dəfə çıxan "Molla Nəsrəddin" adlı türkcə cəridəyi-müsəvvəreyi-əzhukiyyənin baltalarıdır.

Qoz kötüklərini yonmaq üçün "Molla Nəsrəddin"in ələ aldığı baltayi-zəhk və xəndə, istehza və rişxənddən, müstəhziyanə yazı və şəkillərdən ibarətdir...

Vəhləyi-oulada bu qədər qəmli bir zamanda böylə bir müzhik qəzetənin çıxması qərib görünürsə də, lakin yaxşı diqqət edilib dərin bir nəzərlə baxılırsa, görünür ki, bu zəhk və xəndə ancaq zahiri olub, onun təhtində bol-bol axan göz yaşları gizlidir.

Bu xəndənin üzündən pərdəyi rəf etsəniz, mavərasında ahü zar, girye və büka görərsiniz!.. Bu Qoqolun, Sviftin, Dikkensin xəndəsidir... Xeyr, bu ürəgi yəs və ələmlə dolu "Molla Nəsrəddin"in xəndəsidir.

Qarşımda "Molla Nəsrəddin"in üçüncü nömrəsi duruyor. Bu nömrə qırmızı və mavi rənglərlə müləvvən dörd ədəd gülünc rəsmlərlə müsəvvər və müzəyyəndir. Rəsmlərin dördü də qayət mənidardır: Biri dərəceyi-maarifimizi, biri dərəceyi-təməddünümüzü, biri əhvali-siyasiyyeyi-islamı, biri də nisvani-islamiyyənin vəziyyətini surəti-müstəhziyanədə iraə edər. Bunlardan əhvali-siyasiyyəyi göstərən lövhənin təhtində "sərhəd məsələsi" yerinə "panislamizm" yazılsa idi, daha münasib olurdu – zənn edəriz... Bu növ gülünc şəkillərə məxsus bir istilah bulmaq lazım isə, ya "xatir nigar" vəznində "xəndənigar", yaxud "zəhrxənd" və "rişxənd" tərkibində "nigarişxənd" demək icab edər...

"Molla Nəsrəddin"in məzahlı məqalələri, lətifələri, həcviyyələri dəxi nigarişxəndələrindən geri qalmayır, böyük bir hünər və istedad ilə yazıldığı aşikardır... Hər halda "Molla Nəsrəddin"in müdiri və "Molla Nəsrəddin"in müridi Cəlil Məmmədquluzadə cənablarını müvəffəqiyyətdən naşi təbrik və qəzetəsinin qiraətini bütün qarelərimizə tövsiyə edəriz.

"Dəbistan" məcəlləsinə gəlincə bunun camaətimiz haqqında fikir və nəzəri və arzu və məqsədi həman "Molla Nəsrəddin" nəzər və məqsədinin eynidir. Bu məcəllə dəxi camaətimizə yontulmamış qaya və odun nəzərilə baxıyor və bu növ məvaddan zərif şeylər emal etmək məqsədin təqib ediyor... Ancaq "Dəbistan"ın əlində "Molla Nəsrəddin"in baltası kimi qəvi və kəsgin bir alət olmadığından, bərkişib səlabət peyda edən daş, ağacı yonmaq xüsusunda bəyani-əcz edib mühərrirlərindən biri deyir ki, "Əl-elmə fis-səğər kənnəqşi bilhəcər", yəni "uşaqlıqda kəsb olunmuş elm, daşa nəqş olunmuş kimidir": "Tüfuliyyət zamanı keçəndən sonra təlim və tərbiyə vaxtı əldən gedir, cəhalət və qəflətə heç bir vəchlə çarə etmək mümkün olmaz..." Hər kəsə ki, uşaqlıqda ədəb və tərbiyə verilməsə, böyüklükdə onun üçün nicat olamaz. Yaş ağacı hər tövr istəsən əymək mümkündür. Lakin quru ağacı ancaq od ilə düzəltmək mümkün olur...



Bu sözlərdən sonra "Molla Nəsrəddin" ilə "Dəbistan"ı yekdigərinə qiyas etmək lazım gəlsə, demək olur ki, quru ağacı yonta bilən "Molla Nəsrəddin" daha hünərli isə, yaş ağacı əyib düzəldən "Dəbistan" daha tədbirlidir. "Dəbistan" ətfala məxsus iki həftədə bir Bakıda nəşr olunan müsəvvər türkcə bir jurnaldır. "Dəbistan"ın ayda bir kərrə çıxan "Valideynə məxsus vərəqə" ünvanilə bir də əlavəsi vardır. Bu məcəllələrin naşir və mühərrirləri müqtədir mürəbbi və müəllimlərimizdən Məhəmməd Həsən Əfəndizadə ilə Əli İskəndər Cəfərzadə cənablarıdır... Bunları dəxi müvəffəqiyyətlərindən naşi təbrik edəriz. Məcəllənin birinci nömrəsi Mirzə Həsib Qüdsinin bir münacatı ilə başlanıb Abdulla Qovilyam həzrətlərinin dəxi bir qitə nəzmlərilə təzyin edilmişdir. Məcəllənin dilinə gəlincə bu dil bəzi yerlərdə qayət sadə və asandır. "Nənə və onun balaca qız nəvəsi" ünvanlı Ə.Əfəndizadənin bir mənzuməsi yanımda bulunan üç-dörd yaşındakı bir tiflə oxunduğu zaman tiflin mütəəssir olduğunu müşahidə edim. İki-üç qitəsini nümunə üçün buraya dərc edirəm:

"Sən də, nənə, bağçada seyr etmisən?
Mənim kimi oynamağa getmisən?
Xırda-xuruşdan gəlinə ev tikib
Oynatmağa çəməndə meyl etmisən?

Yoxsa həmişə başının tükləri,
Dümağ olub qaşları, kiprikləri,
Qabaqda taxırdınmı burnuna,
Şəfəq verən qorxulu gözlükləri?..

Hansı səbəbdən üzünün dərisi,
Qırış-qırışdır çölü, içərisi.
Mənim üzüm də saralarmı, nənə,
Qırışarmı sənin kimi dərisi?.."

*Ə.H.*

*"Həyat", 1906, №91*

# MÜXTƏLİF BƏHANƏLƏRLƏ ADAM ÖLDÜRMƏK

*(Edam cəzası, qisas və qətl cinayəti)*

Əgər doşmən nəsazəd ba to cy dust,
To mibayəd ke, ba doşmən besazi.
Və gər nə çənd ruzi səbr fərmay
Nə u manəd, nə to, nə Fəxre Razi[1].

İnsanın əql və şüur, qüvveyi-müfəkkirə və müdərrikə kibi mələkati-ruhaniyyə və mənəviyyəsi dəxi tərəzi ilə çəkilib dartıla bilir, arşın ilə ölçülə bilir. Şu qədər ki, tərəzi ilə vəzn etmək ancaq insanın vəfatından sonra qabil olduğu halda arşın ilə məsahə etmək diriliyində dəxi mümkün olur. Bu xüsusda "Fisiolociya", yəni "Elmimünafiül-əza" mizana və "antropolociya", yəni "elmi-əhvali-bəşər" arşına müraciət etməyi tərcih edər... Bu fikri bir az şərh edəlim: Məlumdur ki, insanın qüvayi-əqliyyəsi, onun cümcümə denilən baş tasının içindəki beynin, dimağın miqdar və kəmiyyətilə[2] məbsutən mütənasibdir... Beyinləri böyük və çox olan insanların ağılları da böyük, çoxdur. Heyvanat da öylədir. Selm təkamülünün müxtəlif dərəcatında bulunan heyvanların şüurları beyinlərinin miqdarı nisbətindədir. Pişik dovşandan ağıllıdır, it pişikdən ağıllıdır və ilx. Çünki pişiyin beyni dovşanınkindən və itin beyni pişiyinkindən artıqdır. Bu həqiqətləri bir az təfsilatı ilə mütaliə etmək istəyənlər "İctihad" sahibi Abdulla Cövdət Əfəndinin "Fiziologiyayi-dimağ" ünvanilə türkcə yazmış olduğu bir kitaba müraciət edə bilərlər... Fransız üləmasının ən böyüyü bulunan Küvyenin, ingilis şüərasının ən məşhuru olan Lord Bayronun və Germaniya diplomatlarının ən mahiri, ən ağıllısı sayılan Prins Bismarkın beyinləri vəfatlarından sonra vəzn edilib görülmüşdür ki, bu beyinlər insan beyinlərinin ən ağırıdır.

Bu beyinlər bir neçə girvənkə gəlmişdir... İndi iki, üç girvənkəlik deyil, yeddi-səkkiz yüz girvənkəlik bir beyin təsəvvür ediniz...

[1] Tərcüməsi: Ey dost, əgər düşmən səninlə yola getmirsə,
Sən gərək düşmənlə yola gedəsən.
Əgər belə olmasa, bir neçə gün səbr elə
Nə o qalar, nə sən, nə də Fəxr Razi.

[2] Burda kəmiyyətdən başqa keyfiyyətin dəxi dəxli vardır... Ancaq çox uzağa getməmək üçün keyfiyyət bəhsindən sərfi-nəzər ediyoruz.



Böylə bir beyni möhtəvi bir baş tasının cəsaməti arşın ilə, daha doğrusu həndəsə üsulu ilə ölçülərsə, hər halda bunun bir hamam qübbəsindən ziyadə olması lazım gəlir!.. Böylə div qafalı bir zişüur təsəvvür edə bilirmisiniz?! İnsan bir heyvani-ictimai olub şu rəy ilə, məşvərətlə, üquli-müştərəkə ilə iş gördüyü üçün bən bunu təsəvvür edə biliyoram...

Böylə bir zişüurun adı Dövlət Dumasıdır ki, 27 nisandan bəri Peterburqda əqdi-məclis etməyə başlamışdır!..

Dövlət Duması denilən bu böyük zişüur ictimaı bu günlərdə dövlətdən mətalibi-mütəəddidə miyanında bir də edam cəzasının bilkülliyyə və iləbəbəd ləğv və fəsx olunmasını tələb ediyor, etmək istiyor! Rusiya tarixinin müşəşə və müəzzəm olan bir dövri-cədidi hürriyyət və insaniyyət xatirəsi üçün müttəhimlərin əfvi-ümumisi və edam cəzasının bilkülliyyə ləğvi ilə başlıyor! Bu nöqtəyə diqqət edəlim, bu işin əzəmətini, ülviyyətini dərk edəlim!.. Dərk edəlim, çünki dərk etmək hər iki, üç gündə bir qətli-cinayətin şahidi bulunan bizlərə, Bakı müsəlmanlarına vacibdir!..

Edam, qisas, qətl!..

İştə üç mənfur kəlmə ki, əsasən yekdigərlərinə müşabeh olduqları halda aralarında fərqlər də vardır... Bunların üçü də adam öldürmək deməkdir...

Ancaq edam şərən və qanunən bilmühakimə bir adamı öldürmək və qisas qətli irtikab edən bir adamı şərən öz cinayətinin mislilə cəzalandırıb öldürmək olduğu halda, qətl cinayəti düşmənçilik, intiqam, oğurluq, quldurluq, ya bir mənfəət niyyətilə adam öldürməkdir!..

Əqli, beyni bir neçə yüz girvənkə gələn böyük başlı dövlət duması diyor ki, insanı hətta qəbahət və cinayət sahibi olan insanı öldürməyə, hətta qanun və ədalət dairəsində və mühakimədən sonra dəxi öldürməyə heç bir kimsənin, hətta nə padşahın, nə dövlətin və nə də millətin haqqı olmasın!.. Bu haqq insana həyat bəxş edən cənab həyyilayəmutdan[1] başqa kimsənin deyildir!.. Ağır beyinli, böyük başlı dövlət duması böylə diyor... Bakalım, balaca başlı, yüngül beyinli, bizim bakılı qatillər nə diyorlar?.. Bunlar da diyorlar ki: "Biz nə şəriətə, nə dövlətin qanununa baxarız!.. Biz öz balaca beynimiz ilə qayət adilanə bir mühakimədən sonra, yaxud sualsız, cavabsız və mühakiməsiz olaraq bir adamın qətlinə hökm edəriz, bədə hökmümüzü

[1] Ölməz bir diri

mövqei-icraya qoymaq üçün mədəni bir şəhərin küçələri ortasında camaatin gözü qabağında o adamı tapancamızın gülləleri ilə gözəlcə öldürəriz!.." və öldürərlər də!.. Bununla iş bitməz, sonra məqtulun qövm və əqrəbası əxzi-intiqam edib, qan almaq üçün qatilin, yaxud qatilin qövm və əqrəbasının peşində dolaşırlar... fürsəti bulduqda öldürərlər!.. Sonra bərikilər başlarlar, yenə ötəkiləri təqibə. Bu surətlə, bir müqatilə illərcə, əsrlərcə, ila nəhayət silsiləvari davam edər, durar!.. Qəribə burasıdır ki, qisas məsələsində şərən qətl cəzası ancaq qatilin özünə münhəsir ikən intiqamçılar qatilin qövm və əqrəbasını da əsirgəməzlər... Guya hər insan öz qövm və əqrəbasının cinayətindən məsuldur!.. Böylə əqlə, məntiqə, insaniyyətə müğayir olan bu qan güdmək adəti-mənhusəsini bura xəlqindən başqa, bir də Balkan şibh cəzirəsində arnavudlar arasında müşahidə etmiş idim. Lakin bu cəsur və nəcib millətin bu dərdə qarşı gözəl bir dərmanları da var ki, məəttəəssüf o dərmanı burada görmiyoram!.. O dərman arnavudca bəsa denilən adətdir. Bəsa nədir? Bəsa camaatin bir yerə cəm olub əhdi-peymanla müqatilədən əl çəkib qan güdən xəsmlərin bir-birini əfv etməsinə denilir... Silsiləvari müddəti-mədidə bir müqatilənin davamını görməkdən bizar olan arnavudlar beş-on ildə bir kərrə xeyirxah bir zatın, ya bir alimin təşviqilə şu bəsa adətinə müraciət edərlər...

İndi Peterburqdakı məclisi məbusanın Dövlət Dumasının yeni başlayan bir dövr səadət üçün edam cəzasının, yəni adam öldürmək üsulunun ləğvini padşahdan istida etdiyi bir zamanda bizim Bakının və Bakı ətrafındakı kəndlərin bu bəsa qaidəsinə müraciətlə böylə intiqam və qisas üzündən adam öldürmək əməllərinə xitam verməleri münasib olmazmı?.. Camaəti bu əmri-xeyrə təşviq etmək vəzifəsi camaət arasında sahibnüfuz olan zatların, camaət mücahidlərinin, ələlxüsus bizim ruhanilərimizin, alimlərimizin, mollalarımızın öhdələrinə tərəttüb edən bir vəzifədir, zənn edərəm. Camaatin hörmət və rəayətinə məzhər olmuş bu kimi zəvat yığılıb bu işə bir tədbir, bir çarə etməlidirlər. Bu müxasimələrə, bu müqatilələrə bir xatimə çəkməlidirlər!.. Xalq orqanizasiya ilə, yəni üzviyyəti-ictimaiyyə ilə "intizami-təşəkkül"[1] ilə, türkcəsi camaəti yekvücud bir halda qoyub əfradi-camaəti bir intizam daxilində o vücudun əzası qılmaq surətilə öz millətlərini qüvvətləndirmək, təriqi-nicat və səlamətə çıxarmaq istiyorlar. Bizdə isə bu müxasimələr üzündən orqanizasiya yerinə dezorqanizasiya, "intizami-təşəkkül" yerinə "ixtilali-təşəkkül", "üzviyyəti-ictimaiyyə," yerinə "ənaniyyəti-şəxsiyyə"; əqrazi-nəfsaniyyə hökm sürüyor!.. Vücudi-ictimaimizin əzası olan əfradi-milliyyəmiz beynində ziddiyyət, xüsumət, ədavət rəf olunmadıqca, müxasimin arasında təlifi-beyn edilmədikcə, bədəni-milliyyəmizi əlil və məriz hesab etmək və bu dərdə bir dərman almaq lazımdır!.. Qəzetələrdə, Yekaterinoslavdan çəkilmiş böylə bir teleqraf mündəricdir: Yekaterinoslav məbusi İsposobni dövlət dumasında edam cəzasına bir az tərəfdarlıq etdiyi üçün Yekaterinoslav əhli onun əleyhinə protesto etmişlər, təhtində 500 imza olan bu protesto "Yujnaya zarya" (Fəcri-cənub) qəzetəsində təb və nəşr edilmişdir. "Əgər paytaxtda ictima edən dövlət duması, əgər dövlət dumasına məbuslar göndərən şəhərlər vəlou qanun dairəsində, edam cəzası şəklində olsun, adam öldürmənin əleyhinə protestolar edərlərsə, bu cəzanın insaniyyət namına ləğvini şiddətlə tələb edərlərsə, adam öldürmələrin ən ədna, ən mənfur, ən çirkin şəkli olan qətl cinayətinə qarşı bizim surətlə hərəkət etməmiz lazımdır? Biz beş yüz, beş min imza ilə deyil, əlli min, yüz min fəryad ilə protesto etməliyiz!.."

Afrikanın vəhşi zuluslarına, niyam-niyamlarına oxşamaq yetər... Bir az da albaniyalılardan, arnavudlardan ibrət alalım. Bəsa qaydasını burada qəbul edəlim. Rusiya üçün tarixlərdə misli görülməmiş tazə bir dövr başlıyor. Bu dövri-cədidin ibtidası mövludi-nəbiyə müsadif olduğunu zikr etmiş idik!.. Dövri-cədidi nəzəri-diqqətə alalım, peyğəmbərimiz xatəmül-ənbiya hörmətinə, insaniyyət və ittihadi-ümmət namına keçmiş hesablardan əl çəkəlim, olan oldu, keçən keçdi, deyib günahkarları əhv edəlim, bağışlıyalım... Bu günlərdə bizə nə lazım? Bəsa lazım!.. Bəsa, bəsa, bəsa!.. Yerə batsın keçmiş ədavətlər!.. Yaşasın bəsa!..

*Ə.H.*

*"Həyat", 1906, №100*

[1] Yeni türk qəzetələrindən bəziləri orqanizasiyayi böylə tərcümə edirlər.

## AXUND ƏBU TURAB HƏZRƏTLƏRİ "ELMİ-ƏBDAN"

"Həyat"ın yuxarıdakı sütunlarında fazili-möhtərəm Axund Əbu Turab həzrətlərinin "Bizə hansı elmlər lazımdır" ünvanlı məqaləsini dərc ediriz, lakin bu xüsusda əvvəl əmrdə qareini-giramə bir neçə ixtaratda bulunmağı özümüzə vacib bildik. Axund həzrətlərinin məqaləsi qəzetəmizin tutduğu məsləkə, o məsləkə ki, "Həyat"ın təxminən bir sənə əvvəl çıxan birinci nömrəsində tövzih edilmiş idi, tamamilə müvafiq deyildir, daha doğrusu, qismən müvafiq olduğu halda, qismən də müvafiq deyildir!..

Bununla bərabər məqaləyi iki-üç səbəbə görə böyük bir məmnuniyyətlə dərci-sütun ediriz: Səbəblərin birisi budur ki, məqalənin əl vurduğu məsələ fövqəladə mühümmdür.

Rusiya inqilabati-ictimaiyyə və siyasiyyəsilə açılan bu qədər əhəmiyyətli bir dövri-cədidin ibtidasında, müsəlman cəmaətlərinin rahi-tərəqqiləri üzərində bulunan mancə və hailələrin, əngəllərin bir-bir rəf və dəf edildiyi bir zamanda və müsəlmanların önlərində bir neçə yol açılıb bu yollardan hansı ilə gediləcəyi xüsusunda tərəddüdə düşdükləri bir anda, bizə "hansı elmlər lazımdır" məsələsindən daha əhəmiyyətli bir məsələ təsəvvür olunamaz, zənn ediyoruz!

Bu qədər əhəmiyyətli bir məsələyi ortaya vəz etdiklərindən naşi axunda təşəkkür etməklə bərabər, digər tərəfdən dəxi məsələyi layiqilə həll edəmədiklərini bəyana məcburuz!

...Axund həzrətlərinin ülumi-əqliyyəyə o qədər etibarlı olmayıb buyuruyorlar ki, "Bizim oxucularımız Avropa əhalisini insaniyyət və mədəniyyətə dərəcəyi-kəmalə yetiribdirlər, amma mən deyirəm, Avropa əhalisi qanuni-siyasiyi-ilahiyyədən azad olduqlarına görə eyni vəhşətdədirlər...". "Hikməti-təbii bilməklə insan olmaq olmaz, hikməti-ilahi ilə kamil olmaq insanı insan edər". Əgər insan... dəyanəti-islamiyyəyə alim və arif ola və ülumə cahil, əlbəttə insaniyyətə zərər yetirməyəcəkdir... Əgər bir şəxs tamam ömrünü ülumi-riyazi və hikməti-təbii təhsilində sərf edə, müəllimi-əvvəl Aristotalis məqamını dərk edə, əlbəttə təriqi-übudiyyətə, həqqtəalayə, alim və arif olmayacaq və insaniyyət və mədəniyyət şəhrinə daxil olmayacaqdır".

Bu sözlər sadə "klerikalizma" saiqəsilə yazılmayır: Fransa alimi-ədibi-məşhuri Jan Jak Russo da böylə bir fikirdə bulunmadımı? Nə qərib təsadüf?! Biz bu saat Rusiya dövri-inqilabının, inqilabi-kəbirinin ibtidasında bulunuruz... XVIII əsrin ortalarında, yəni Fransa



inqilabi-kəbirinə bir az təqəddüm edən bir zamanda axundun məqaləsi məzmununa qərib məzmunda Fransanın Dejon akademiyası mühərrirləri tərəfindən böyük bir mükafati-nəqdiyyəyə müqabil, qələmə alınıb həll edilmək üçün bir məsələ dərmiyan etdi ki, böylə idi: "Ülum və fünunun tərəqqisi və bəşəriyyətin kəsbi-mədəniyyət etməsi əxlaqi-insaniyyəyə hüsni-təsirmi, yoxsa sui-təsirmi etdi? Təbiri-axərlə insanların əxlaqını təhzib edib düzəltdimi, yoxsa pozub fəsadamı uğratdı?" ... Bu suala cavab yazanlar içində mükafatı qazanan mühərrir ülum və fünunun tərəqqi və təməddünün məzərrətinə hökm edən məhşur Jan Jak Russo oldu, lakin heyhat!!! Jan Jak Russo məsələyi dürüst həll etdiyi üçün deyil, məqaləsini böyük bir fəsahat və bəlağətlə, əzim bir qüdrəti-qələmiyyə ilə yazdığı üçün mükafatı qazandı!.. Onun əsasən fikri batil idi, akademiya özü onun fikrini təsdiq etmədiyi halda mükafatı verdi... Russonun hökmü qətiyyən ülum və fünununun ziddinə, əleyhinə idi... Lakin Əbu Turab axund bu qədər iləri getmiyor!.. Müşarileyh ancaq buyurur ki, ülum və fünunu, ülumi-müsbətəni, fünnuni-əqliyyəni təhsil etməkdə, onlardan məhrum olmaqda bir bəəs yoxdur, yetişir ki, ülumi-diniyyə və məzhəbiyyəyə, ülumi-nəqliyyəyə haqqı ilə vaqif olaq!.. Öyləmidir?

Bən bu anda qayət müşkül bir mövqedə bulunduğumu hiss edirəm, çünki məsələ öylə bir məsələdir ki, bu xüsusda yazılası məvad üçün yövmi bir qəzetə məqaləsinin vüsəti kafi və müsaid deyildir. Həqiqət aydın bir surətdə göstərilə bilmək üçün bir neçə ilin tətəbbüati-əmiqədən sonra üç-dörd yüz səhifəlik bir kitab vücuda gətirməlidir. Bir qəzetə məqaləsində isə böylə bir kitabın möhtəviyyatını müxtəsər və müfid surətdə bəyan etmək hər mühərririn həddi deyildir!.. Bu mübahisə qədimdir: Əflatun, Ərəstu və Lukretsi dövründən başlayıb zamanımıza qədər davam etmiş və etməkdədir. Bu mübahisəyə müsəlman üləmasından Əbu Əli Sina, Farabi, İbn Rüşd kibi dahilər girişmişlərdi... Zəmanəmizdə belə bilxassə bu məsələ ilə məşğul olanlar az deyildir. Rusiya, Avropa və Amerika üləmasından Tolstoy, Renan, Dreper kibi zəvatı zikr edə biləriz. Hətta amerikalı Dreper bu növ mübahisəyə "Nizai-elmü din" adı verib bu ünvanla mühüm bir kitab belə vücuda gətirmişdir. Kitab məşhur osmanlı ədibi Əhməd Midhət tərəfindən türkcəyə dəxi nəql və tərcümə edilib İstanbulda çap edilmişdir... "Nizai-elmü din"!..ixtilafi-fənnü məzhəb!.. qorxulu sözlər deyilmi?! Lakin heç qorxmayın, çünki həqiqət halda niza və ixtilaf elm ilə din arasında deyildir!..

Çünki nə həqq və mübin olan din elmdən qorxar və nə də elmi-həqiqi din və məzhəbə düşməndir. İxtilaf bunlar arasında deyildir! İxtilaf özlərini həris və hamili-din bilən mollalarla ülumi diniyyədən xəbərdar olmayan ərbabi-elm və maarif arasındadır!..

Axund həzrətləri çox gözəl buyururlar ki: "Kişi bilmədiyi elmə düşmən olur, şəxs özgələrini öz düşməninə tərəf dəvət etmək qeyri-məquldur!"

Biz ülumi-diniyyə təhsilinə lüzum görməyən, əhəmiyyət verməyən "oxucularımızın" əslən və qətən tərəfini iltizam edəməyiz! Fikrimizi daha aydın və daha cəsarətlə söyləyəlim: Bunlar çox böyük "qələt eliyorlar"! Bunlara iqtida edənlər həqiqətən zəlalətdədirlər! ...Lakin digər tərəfdən ülumi-əqliyyədən ülumi-müsbətəyi-mütərəqqiyyədən, ülumi-cədidədən sərfi-nəzər etmək istəyən ruhanilərimizin dəxi heç bir vəchlə tərəfkiri olamayız!.. Cəmaətə pişvalıq, müqtədalıq, rəhbərlik iddiasında bulunan böylələri nə milləti qabağa apara bilərlər, nə də ümməti nicat və səlamətə, ictimai, siyasi, iqtisadi bir nicat və səlamətə isalə qadir olurlar. Biləks böylə üləmayi-diniyyə, sadə ülumi-qeyri-diniyyə ilə pərvərişyab olmuş şəbanımızı dinin haqlığı, həqqaniyyəti, ülviyyəti haqqında daha ziyadə bir şəkk və şübhəyə salalar!..

Axund həzrətləri, biz öylə zənn ediriz ki, bizə ülumun kaffəsi eyni dərəcədə lazımdır: həm ülumi-diniyyə, şəriyyə və ruhaniyyə, həm riyaziyyat və təbiyyat kibi ülumi-mücərrədə və cismaniyyə! Mədinəyi-elm olan Həzrəti-Peyğəmbərimizin (s) fikri də böylədir, babi-elm olan və riyaziyyat və təbiyyat və ədəbiyyat kibi ülumə vüqufi-tamməsi bulunan cənab Əli (kərrəm-məllahu vəchə) də bu yolda bir alimi-küllidir!..

Ayrı-ayrı yollarla bir məqsədə vasil edən tirqi-aliyyədən birinin banisi olan və övliya içində Hikməti-Quranı mükəmmələn dərk edən Həzrəti-Mövlananın da

"Çənd çənd əz hikməti-yunaniyan
Hikməti-imaniyanra həm bexan"[1] –

deməkdən muradı yenə bilatəxsis ülum və fünunun kaffəsidir, kaffəyi-şüəbatıdır!.. Bu gün yunanilərin məqamını avropalılar tutur.

[1] Tərcüməsi: "Neçə-neçə yunanların hikmətilə yanaşı;
İmanlıların da hikmətini oxu".



Rəsuli-əkrəm buyurur: "Tələbül-elmi fərzən əla küll müslimin və müslimə, ütlübül-elmə minəlməhdi iləlləhəd, Ütlübül-elmə vəlau bis-sini!.."[1] Bu kəlami-şəriflərin cümləsində elm ələlümüm elmdir! Sadə elm şəriət olsa idi, Çinə qədər təhsilə gedək deyilməzdi. Buna bir dəlil də hər nədənsə Axund həzrətlərinin zikr etmədikləri: "Əl-elmü elməni elmül-əbdan, elmul-ədyan"[2] kəlami-şərifidir.

Bu kəlamda iki nöqtəyə diqqət etməlidir: Nöqtələrdən biri elmül-əbdanın elmül-ədyana təqdim edildiyidir. Bu bir təqdimül-əhəmm ələl-mühümmdür!.. Digəri ədyan kəlməsinin cəm siğəsində istemal olunduğudur. Kəlmənin cəm siğəsində istemalından anlaşılıyor ki, sadə dini-islami bilmək kafi deyildir. Sair dinlərə dəxi vüquf peyda etməlidir. O dinlərin nə olduğunu bilməlidir!.. Bu nədən böylə icab ediyor? O dinlərin əhkamına əməl etmək üçünmü? Xeyr!.. O dinlərin batil olduğunu anlayıb rədd və cərh etmək üçün, onlara süluk edənlərlə mübahisəyə girişib nəşri-dini-mübini-islam etmək üçün onları bilməlidir!.. Liverpollu Şeyx Abdulla Qovilyam həzrətləri bu axır zamanda ermənilərin Qriqoryan məzhəbini mütaliəyə qonulmadımı? Peyğəmbərimiz və əshabəyi-kirami müşriklərin və bütpərəstlərin dəxi etiqadlarına vaqif idilər!.. Biz isə Zərdüşt və Buddanın dini şöylə dursun, süluk etdiyimiz bir məzhəbdən başqa sair məzahibi-islamiyyəyi belə layiqilə bilmiyoriz!.. Bir darülfünuni-islamiyyəmiz olsa, onun ilahiyyat şöbəsində mollalara tarixi-ədyanı oxutdurmaq lazım gəlməyəcəkmi?.. Nə isə sədəddən ayrılmıyalım.

Ülumi-diniyyəyi-ruhaniyyəyi, qanuni-ilahiyi, şəriəti, elmi-əqaidi, elmi-təfsiri, elmi-hədisi, elmi-fiqhi bizə oxumaq vacibdir! Bu bir aşikar şeydir, bunu kimsə inkar edəməz! Lakin ülumi-riyaziyyə və təbiyyəyi, ülumi-iqtisadiyyə, ictimaiyyə və siyasiyyəyi də, fünuni-ziraiyyə, tüccariyyə və sənaiyyəyi də təhsil etmək eyni dərəcədə və bəlkə daha ziyadə və vacibdir!.. Bu isə isbata möhtacdır, şimdiki halda və bizim aramızda möhtacdır. Çünki mollalarımız və əz cümlə axund Əbu Turab həzrətləri bu xüsusda bir az şübhə ediyorlar. Məlumdur ki, həqayiq iki növ olub əqliyyat və nəqliyyatdan ibarətdir. Həqayiqi-riyaziyyə və təbiə əqliyyati sinfindəndir... Bu o həqiqətlərdir ki, cəmi bəşəriyyət onu müttəhidən qəbul edir, heç bir insan

[1] Elm oxumaq bütün müsəlman kişi və qadınlarına vacibdir.Beşikdən qəbrə qədər elm öyrən, Çində olsa da, elmi ara.

[2] Bədən (tibb) elmi və dinlər elmi elmlərin ən yaxşısıdır.

hansı qövmə mənsub olursa-olsun, istər yaponlu, çinli, istər rus, firəng, istər türk, ərəb, fars hansı dində bulunursa-bulunsun, istər buddist, brəhmən, istər xristiyan, istər müsəlman onu inkar edəməz!..

Hamı oxursa anlar ki: elmi-hesabda iki dəfə iki dörd edir. Həndəsədə bir müsəlləsin üç zaviyəsi iki zaviyəyi-qaiməyə müsavidir. Elmi-heyvanatda balıqlar suda qəlsəmə ilə tənəffüs edirlər. Elmi təşrihdə insanın qəlbi qəfəsi-sədrdə sol tərəfdə və qara ciyəri coufibətnində sağ tərəfdədir və fələkiyyatda ərz bir kürə şəklindədir, öz məhvəri ətrafında dövr ediyor. Küsuf ya xüsuf filan səbəbdən, ya filan gün vaqe olaraq və ilx... Həqayiqi-nəqliyyə isə böylə deyildir. Bəşəriyyət, yəni müxtəlif miləl və əqvamdan ibarət bəşəriyyət-həqayiqi-nəqliyyə xüsusunda çox kərrə ittihad edəmiyorlar. Çox dəfə biri digərinkin qəbul etmiyor, şübhə ediyor. Həqayiqi-əqliyyə insanları bir növ ilə ittihada dəvət etdiyi halda, həqayiqi-nəqliyyə araya ixtilaf salıyor, bir millət digərinin həqayiqi-nəqliyyəsini qəbul etmək üçün lazımdır bunlar ümum bəşəriyyət tərəfindən qəbul olunan əqliyyata müstənid olsun... Bu sözlərdən əqliyyatın nəqliyyatdan əhəm olduğu anlaşılıyor! Əhəmmi buraxıb sadə mühüm ilə iktifa etmək isə caiz olamaz!..

Axund həzrətləri buyuruyorlar ki, "əgər bir şəxs ülumi-riyaziyyə və hikməti-təbiiyyədə Aristotalis məqamını dərk edə, əlbəttə, həqqtəalaya alim və arif olmayacaq". Cavabın deyiriz ki, nə Sokrat və nə də Ərəstu peyğəmbər deyillər idi və peyğəmbərlərin ən böyüklərindən hənuz xəbərləri yox idi. Lakin ülumi-məzkurə və əqliyyat sayəsində vəhdaniyyəti-rəbbaniyyəyə qail oldular və həmşəhəriləri olan yunan müşriklərinin etiqadlarına rəğmən vəhdaniyyəti isbat etdikləri üçün bu yolda əziyyət və cəfa çəkdilər. Sokrata zəhər içirib öldürdülər, Ərəstuyu da qətl ilə təhdid edib vəfatından bir sənə əvvəl ixtiyari-qürbətlə Xalkidə şəhərinə fərara məcbur eylədilər. Bu isə eşqi-həqiqiyə dəlalət edər!.. Demək oluyor ki, həqq təalayə alim və arif olmaq üçün ülumi-əqliyyə dəxi kömək eyliyor... Zatən ülumun hankısı insanı vəhdaniyyətə, hikmət və qüdrəti-rəbbaniyyəyə arif etmiyor? Həndəsə və riyaziyyat gücü ilə dərk edilə bilən elmi-heyətmi? Əhvali-səmaviyyəmi? Hikmət və təbiiyyat vasitəsilə mütaliə oluna bilən əhvali-qəşri-ərzmi? Daşlar, ağaclar, heyvanlarmı?.. Təbabət və səhhət niyyətilə təşrih edilən bədəni-insanmı? Bu ülumun kaffəsini əsbabi-atiyyəyə məbna dəxi təhsil etmək zəruridir.



Lakin əsbabı müxtəsərən tedad etmədən əvvəl balaca bir hekayə nəql edəyim: Bir gün köhnə üsulda, ata-babadan qalma köhnə bir üsulda qayırılmış bir lodkanın dəniz ortasında durulub iki balaca tiflin dənizə düşüb qərq olmaq üzrə bulunduqlarını müşahidə etdim. Sahildən bu halı görən uşaqların validəsi canxəraş bir surətdə fəryada başladı. Səri hərəkətli bir buxar lodkası (istimpot) bunların imdadına yetişdi, lakin uşaqların birisini bərhəyat və digərini meyit halında olaraq sudan çıxara bildi... İkinci tiflin bulunduğu hali-mövti-həqiqi olmayıb mövti-zahiri idi. Sahilə yığılan xalq arasında bir molla ilə bir də bir təbib var idi... Əgər uşaq həqiqətən vəfat etmiş ola idi, molla ancaq onu qüsl və təkfin edib ölü namazını qılacaq idi!.. Biz inkar etməyiriz ki, yerində bu da lazımdır. Lakin bundan əlzəm bir tədbir var idi ki, molla etmədi... O da təbibin müraciət etdiyi tənəffüsi-süni və sairə idi!.. İndi hikməti-təbiyyə gücü ilə qayrıla bilən səri hərəkətli istimpot olmasa idi, ülumi-tibbiyyəyə aşina bir təbib orada bulunmasaydı, uşaqların validəsini sevindirmək mümkün olacaqmı idi? Bu insaniyyət və mədəniyyət deyilmidir və dolayısilə Allah yolunda bir əməli-xeyr deyilmidir?.. Franklin tərəfindən icad və emal olunan sipəri-saiqə, yer altındakı mədənlərdə işləyən fəqir fələlərin möhlikədən xilas etmək üçün hikmətşünasi-şəhir Devi tərəfindən ixtira edilən lampa, Devi lampası, qudurmaq bəlasından insanı azad etmək üçün Pastor tərəfindən kəşf olunan məsəl, hökuməti-mütləqeyi-müstəbidə zülmündən rəiyyəti xilas etmək üçün Monteskyö tərəfindən göstərilən tədbirlər, ruhül-qəvanin, sərmayədarların hirs və təməindən, ehtikarından füqərayi-kasibəyi azad etmək üçün Marks tərəfindən göstərilən çarələr və Avropanın bu qədər darül-əczaləri, darül-itamları, darül-məsakinləri, darül-tərbiyələri və ilx. və ilx. həp insaniyyət və mədəniyyətə xidmət deyilmidir?..

Allahı bilmək üçün, onu düşünmək üçün, əvvəl əmrdə bədəni-insan salim olmalıdır və insanın məişət və güzəranı başqalara, ələlxüsus başqa millətlərə möhtac olmamalıdır.

On ke şiranra konəd rubəhməzac
Ehtiyac əst, ehtiyac əst, ehtiyac!..[1]

Əqvam və məmaliki-islamiyyə qüvvətlənib dini-islamı rövnəqləndirmək üçün məmaliki-islamiyyə: Misir, Cəzair, fars və sairə kibi

[1] Tərcüməsi: Aslanları tülkü sifətinə salan
Ehtiyacdır, ehtiyacdır, ehtiyac!

bir-bir yədi-əğyarə keçməmək üçün bu əqvam arasında, bu məmalik içində hər şeydən əvvəl ülumi-əqliyyənin tərəqqisi və intişarı lazımdır! Cihad, quru yumruq ilə olmaz, silah lazımdır, elmi-hikməti-təbiyyə və kimya sayəsində qayrılan barıt, tüstüsüz barıt və güllələri igirmi verstdən atan barıt lazımdır!..

Hərəmeyni-şərifə dəmir yollar qayrılmaqla hüccacə və dini islamə xidmət edilmiyormu? Bunları özümüz qayırmayıb firənglərəmi yapdıralım?.. Firənglərəmi yapdıralım ki, məmləkətin enini, uzununu, daşını, torpağını, dərəsini, təpəsini həndəsə üsulu ilə ölçüb-biçərkən sövqəlceyş və sühuləti-istila nöqteyi-nəzərindən bütün məlumatı əldə etsinlər?.. Xeyr! Müsəlmanlara əqvam ilə məqul bir surətdə rəqabət etmək üçün ülumi-əqliyyə lazımdır!.. Vəxti-səadətdə cihad əsnasında qazılan xəndəklər, tikilən qalalar, istehkamlar, həndəsəsiz ülumi-hərbiyyə və memariyyəsizmi yapıldı? Mücahidlərin əllərindəki qılınclar, şəmşirlər məlumati-sənaiyyəsizmi qayrıldı?! Ülumi-diniyyəyi sadə insaniyyətə, ixvani-diniyyəyə xidmət etmək üçün lazım deyildir!.. Bəlkə ülumi-diniyyəyi behəq fəhm və dərk üçün dəxi lazımdır! Ülumun kaffəsi yekdigərinə mürtəbitdir, bağlıdır!.. Birini digərsiz anlamaq olmaz! ...Oxuduğu bir kitabdan hər kəs öz məlumatının dərəcəsində bir məna istixrac edə bilir. Kəlamullahi Musa, Musa kimi çoban, çoban kimi anlar. Alim ona alimanə, cahil cahilanə bir məna verər!.. Cahil Quranı oxursa, deyər ki, ərz öküzün buynuzu üzərindədir. Alim oxursa, həqiqətin nədən ibarət olduğunu dərk edər!.. Qurani-kərimi şərh və təfsir edən zatın əqli cəmi ülumun, həm ülumi-əqliyyə, həm nəqliyyənin qüvvətilə tənvir edilmiş, pərvərişyab olmuş olmalıdır!..

Rusiya darülfünunlarında, universitetlərdə ilahiyyat şöbəsi məfquddur. Bu növ ülumi-diniyyə ayrıca xüsusi məktəblərdə, darülfünunlarla əlaqəsi olmayan məktəblərdə tədris ediliyor, kim bilir, bəlkə rus keşişlərinin ülumi-əqliyyədən qorxduqları üçün iş böylə olmuşdur!.. Germaniya darülfünunlarında isə ilahiyyat sair ülum ilə bir yerdə tədris edilir... Öz kölgəsindən qorxan osmanlı hökuməti diyanəti-islamiyyənin əsla və qətən ülumi-əqliyyəyi-mədəniyyədən qorxmadığını fəhm və idrak etmiş olmalıdır ki, beş-altı sənə əvvəl İstanbulda təsis və güşad etdiyi universitetdə (yəni darülfünuni-külliyyədə) Germaniya üsulunda olaraq sair şüəbati-ülum miyanına ilahiyyat şöbəsini dəxi daxil etdi.



İndi bir məsələ daha: Bu qədər ülumun kaffəsinə hər kəs, hər fərd vaqif ola bilərmi? Xeyr! Hətta tibb kimi bir elmin belə hər şöbəsinə hər həkim vaqif olamaz! Olamadığı üçün tibbin ələlümum məbanisinə bir dərəcə kəsbi-vüquf etdikdən sonra şüəbati-tibbdən birində ixtisas peyda edər: Biri diş həkimi, biri göz təbibi, biri cərrah olur, biri ancaq məcanini tədavidə haziq olduğu halda, o biri bir məharətlə əmrazi-daxiliyyəyi müalicə edər və ilx. Sənayedə "təqsimi-məsai" qaydası vardır. Bu qayda ələlümum ülumu təhsil xüsusunda dəxi caridir!..

Hər kəs ülumdan bir qisminin bir dərəcə məbanisinə aşina olduğu halda, məzacına, təbiətinə, istedad və qabiliyyətinə görə vəxt və zəmanını, ömrünü ülumdan bir növünə vəqf və həsr edər. Ülumun kaffəsinə aşina ola bilən əqillər, zəkalar nadiratdandır. Bunun üçün Əflatun, İbn Sina, Farabi, Kont, Kant, Spenser olmaq, anadan öylə doğulmaq lazımdır...

Bir millət, bir cəmaət isə ancaq təqsimi-məsai qayidəsilə tərəqqi edə bilir!.. Rus malakanlarının istədikləri kibi hamımız molla olamayız!.. Malakanlar böylə olduqları üçün keşişləri aralarından qovub tərd etmişlərdir... Biz hamımız molla ola bilsək bizə də mollaları, axundları qovmaq lazım gəlir! Öylə etsək və hamımız ancaq molla olsaq, ümməti-islamiyyə tərəqqi edib təriqi-nicatamı çıxar?.. Xeyr! Çünki Rimdəki papalıq hökuməti Qarribaldiyə, Fars hökuməti Avropa siyasiyonuna yem olduqları kibi bizi də qonşularımız böyük bir sühulətlə bəl edib udarlar!..

Udulmaq üçün ülumun kaffəsinə, həm ülumi-diniyyəyə, həm ülumi-dünyəviyyəyə, həm elmül-əbdanə, həm elmül-ədyanə eyni nəzərlə baxıb eyni dərəcədə rəğbət göstərməliyiz. Kimimiz molla, kimimiz təbib, kimimiz mühəndis, kimimiz kimyagər olmalıyız!.. Lakin behəq olmalıyız!.. Yoldaşlarımızdan bir zat (Nər) Peterburqda vaqe nizai-millət və hökumətdə millətin qazanacağını anlayıb keçən nömrələrin birində dedilər ki, "Yol verin, millət gəliyor!.. Millət və hökumət nizaının heç olmazsa böyük bir mənası var, bimənə olan "nizai-elm və dinə" qarşı nə deyəlim? Biz də mollalarımıza xitabən deyiriz ki: Yol verin! Ülumi-diniyyə, ülumi-əqliyyəyə yoldaş olduğu halda gəliyor!.. Biz öylə zənn ediriz ki, həqiqi iman bunu icab ediyor, onun üçün İbn Sina Əbu Əli Hüseynin kəlamı ilə xətmi-kəlam edəriz:

Kofrc ço məni gəzafu asan nəbuvəd,
Möhkəmtər əz imane mən iman nəbuvəd.
Dər dəhr çu mən yekiyo an həm kafər,
Pəs dər həme dəhr yek müsəlman nəbuvəd[1].

*Ə.H.*
*"Həyat", 1906, №106*

## ZİŞTBİN BİR FİLOSOFUN VƏFATI

Məmat həyatın şərtlərindən biridir: həyati-kainat və məmati-mühit və şamildir. Şəhabi-saqiblər, axan yıldızlar, daha doğrusu, atəşparələr lövhi-asimanda nurani və atəşin bir xətti-mədid şəklində əsər buraxdığı kibi öylə də çox kərrə məmat lövhəyi-həyat üzərində uzun bir iz tərk ediyor. Bu növ izlər dəxi həyatın təzyinatındandır. Böylə iz buraxan məmatları həyati-aləmin muradı olmaq istəyən "Həyat" qəzetəsi zikr etmədən keçəmiyor... Keçənlərdə İbsenin vəfatı münasibətilə qəzetimizdə bir neçə söz söyləndi... İndi də teleqraf bizə Qrossellixtifeld bələdəsində Germaniya filosoflarından məşhur Hartmanın vəfatı xəbərini verdi... Bu münasibətlə müşarileyh həkimin məsləki-fəlsəfəsi haqqında bir nəbzə məlumat vermək istiyoruz... Lakin ey qare, sənin bu nəbzə etiraz edəcəyini biliyoram, biliyoram deyə deyəcəksən ki, "Böylə bir zamanda nə fəlsəfəbazlıqdır!.. Şəhərimizdə xalq Dumaya məbus seçmək üçün bir hay-huy intixab içində bulunurkən Hartmanın fəlsəfəsi kimə lazımdır!..

Sən bizə anlat ki, Dumaya, dövlət dumasına seçilməyə layiq içimizdə filosof kimdir? Kimdir Bakıda o filosof, o həkim ki, gedib Peterburqda məclisi-məbusanda sair əzalar kibi bağırsın ki, bizə də, biz Qafqaziya müsəlmanlarına da, yersiz, yurdsuz qalan, əsarət bəlasına düçar olan biz müsəlmanlara da "yer və azadlıq" lazımdır. "Yer" – yəni əkin və ziraət yeri lazımdır. "Azadlıq" – yəni müsəlman və türk cəmaətinin külliyyat etibarilə öz tərəqqi və səadəti üçün hər növ vəsaitə hürr və sərbəst müraciət edə bilmək üçün azadlıq lazımdır!.. Sən bizə "yer və azadlıq" fəlsəfəsini anlat!.. Cahanı bir qiylü qaliinqilab və təcəddüd tutmuş, sən Hartmanın "pessimizmə"sindən bəhs etmək istiyorsan?! Peterburqda Rüstəm pəhləvan ilə Devi-Səfid güləşiyor, dövlət Dumasının əzası vəzirləri, nazirləri qovurlar, qovmaq istiyorlar, gah hiddətlənib "rədd olun" diyorlar, gah nəzakət xatirəsi üçün sadəcə "çıxın gedin" diyorlar... Bəri yanda isə şeyxülislamları, müftiləri, qaziləri də qovmaq istiyorlar... Peterburqda vəzirlərin qovulacaq bir halda bulunduqlarını görən Əhməd bəy və tərəfdarları diyorlar ki, canım, rəvamıdır ki, vəzirlər özləri qovulmaqda ikən onların qulluqçularının qulluqçuları bizə şeyxülislam, müfti, ya qazi təyin etsinlər... Vəzirlər gərək camaatın əksəriyyətindən seçilsin. Binaənəleyh şeyxülislamlar, müftilər, qazilər də gərək cəmaət tərəfindən, müsəlman cəmaəti tərəfindən seçilsin... Bütün Rusiya cəmaəti başdan-başa iki böyük firqə olub, yekdigərinin müqabilinə çıxmış, bu gün, sabah böyük bir görüş və mübarizə tamaşası hazırlanırkən Hartman vəfat etmiş, etməmiş kimə vəzifədir?! Bir neçə yüz ildən bəri Əflatunun, Ərəstunun, İbn Sinanın, Farabinin quru adları ilə iktifa etdik, onların asar və təlifatlarını bilmək istəmədik və nə də türklərə bildirmək üçün tərcümə etdik. İndi də Hartmanın quru adını teleqraf xəbərləri sırasında görsək, kafi degilmidir?.. Heç o adı eşitməsək nə lazım gəlir!..

Ələlxüsus, içimizdən bəzi zovatın eşitdiyinə görə Şopenhauer məsləkində olan bu filosofun kitablarını oxuyanlar, mütaliə edənlər intihar ediyorlar!.. Yəni etilafi-nəfs edib öz-özlərini öldürüyorlar. Çünki bu filosof öz qarelərinə intiharı tövsiyə ediyormış!.. "Gedin, özünüzü öldürün", deyirmiş. Qareləri də əmrinə itaətdə qüsur etmiyorlarmış!.. İndi böylə müzürr, fəqət nafiz bir tövsiyədə bulunan bir həkimin kitablarını bizə tanıtdırmaq nədən icab ediyor?.. Böylə deyəcəksiniz, deyilmi?.. Mən də cavabən deyərəm ki, zatən onsuz da bizim cəmaət heç bu filosofun məsləkinə agah olmamış öz-özünü öldürmək yolunu tutmuşdur!.. O halda böylə bir həkimi tanımaqdan onlara heç bir zərər gəlməz... Bir də mütəvəffi həkimin hamı asarı müzürr olmayıb içində nafe olanlar da var, biz də müzürlərdən sərfi-nəzər edib, faydalı sözlərindən bəhs edə biləriz! Əcəba, bəhs edə bilirmiyiz, bu da bir məsələdir. Çünki qarelərimiz böylə bir bəhsə izn və müsaidə versələr də, lisanımız istilahati-fəlsəfiyyə cəhətindən naqis və fəqir olduğu üçün müsaidə etməyəcəkdir. Yenə Osmanlı şivəsi ilə böylə bir bəhsə girişmək olur və İstanbul üləmasından filosof Rza Tofiq əfəndi böylə bəhslərdə lisan cəhətdən əsla zəhmət

[1] Tərcüməsi: Mənim kimisini kafir adlandırmaq asan deyil,
Mənim imanımdan möhkəm inam ola bilməz
Dünyada mənim kimisi bir dənədir, o da kafir,
Dünyanın hər yerində bir müsəlman yox imiş.

çəkməyir. Lakin bizim Azərbaycan şivəsilə fəlsəfədən dəm vurmaq çox çətindir! Farabinin, İbn Sinanın asarına müraciət etsək onların bol-bol yunan istilahatını və yaxud bu istilahatın hərfiyyən tərcüməsini istemal etdiklərini görürüz! Kateqoriya, metafizika, mabədəttəbiiyyə və sairə kibi!.. İndi biz də şivəmizin dərəcəyi-vüsətini, daha doğrusu, məhdudiyyətini nəzərə alıb müşarileyh həkimlər kimi hərəkət etsək olmazmı?.. Bir də məsələyə çox da dərin girişməyib özümüzü bu qədər müşkülata salmasaq daha yaxşı dcgilmi?..

Binaənaleyh Hartmanın fəlsəfəsini müxtəsər və səthi bir surətdə bəyan etməyi münasib gördük. Hartman, Şopenhauer kimi "pessimizm", yəni "ziştbini" fəlsəfəsini bina edənlərdər biridir. "Ziştbini" nədir?..

Bu fəlsəfəyə görə həyat daimi bir səhnəyi-ələm və iztiraba rəğmli bir rəhgüzardır. Bu "qəmli rəhgüzarda" "zövq və ləzzət" bir quru xəyaldır. Həqiqi və müsbət olan ancaq ələmdir. Bu ələm, iztirabatın pəncəsindən xilas olmaq üçün bir çarəyi-nicat varsa, o da yoxluqdur, yox olmaqdır.

İştə böylə fikirdə bulunan Eduard Hartman 1842-ci sənəyimiladiyyəsində Germaniya paytaxtı olan Berlin şəhərində təvəllüd etmişdir. İbtida ülumi-hərbiyyə təhsil edib əsgər olmuş isə də lakin bilaxərə hikmət və fəlsəfəyə böyük bir meyil və istedad göstərdiyindən əsgərliyi tərk edib bütün ömrünü hikəmiyyata həsr ilə və o gündən bəri bu yolda mütəəddid asar nəşr elədi...

Bu əsərlərə bütün Avropada böyük rəğbət göstərildi. Bunlar hər tərəfdə moda hökmünə keçdi... Bunlardan ən məşhurları "Məşiyyəti-kainatın əsası" ilə "Ziştbinligin tarix və əsası" ünvanlı əsərlərdir... Hartman öz fəlsəfəsinə "mafövqəl-idrak fəlsəfəsi" namını veriyor. Məlumdur ki, Şopenhaurin nəzəriyyatına görə iradə hər növ mövcudiyyətin, yəni bütün kainatın üssül-əsasıdır. Ərəstuya bir az tərəfdar olan Hartman isə bunu qəbul etməyir və deyir ki, iradə təsəvvürsüz, idraksız, yəni duyğusuz ola bilməz. Binaənaleyh hər varlığın əsası iradə və təsəvvürdür. Təbiri-axərlə "iradəyi-müdrikə"dir. Ayrı-ayrı hər fərddə, hər heyvanda, hal və keyfiyyət böylədir. Əcəba, bütün mövcudiyyəti-kainatın dəxi məbdəi-əsli-ümumisi iradə və təsəvvürmüdür? Buna dəxi Hartman bəli, iradə və təsəvvürdür və başqa cür ola bilməz deyir. Çünki bizim bu aləmi-zahirdə öylə şüun və təcəliyyat vardır ki, sadə cismaniyyət, təbiiyyat və hikəmiyyat ilə heç bir vəchlə şərh və izah olunamaz. Bir məbdəi-əsliyi-mənəvinin (ruhaninin) vücudu labüddür. İştə vücudi-kainata bais olan da bu məbdəi-mənəvidir ki, "iradə və təsəvvür"dən, yəni iradəyimüdrikədən ibarətdir. Hartmanın "mafövqəl-idrak" dediyi də bu "məbdəi-əsliyi-küll" olub cismaniyyət və şəxsiyyət ilə təcəlla edən iradəyi-cüziyyənin mafövqündə, mavorasındadır. Cismaniyyət, şəxsiyyət və bütün şüuni-kainat ancaq onun əsəridir, zillidir.

Bu məbdəi-mənəvinin asarını və mövcudiyyətinin dəlailini əyan surətdə müşahidə etdiyimiz məqamlar Hartmana görə şunlardır:

1. Bu "mafövqəl-idrak"dır ki, hər bir üzviyyətin nəşv və nüması, tənəvvüri əsnasında onu müqavimi-səlimi-müntəzəm və məqul bir şəklə qoyub iradəyi-müdrikəyi-cüziyyəyə münasib və müvafiq bir alət qılıyor.

2. Bu "mafövqəl-idrak"dır ki, qüvvəyi-əqliyyənin, qüvvəyi-müfəkkirənin kafi bulunmadığı məqamlarda "sövqi-təbii" dediyimiz bir qüvvət sayəsində ümum zihəyatı, məsələn, insanı hifzünnəfsə qabil qılıyor... Kəlam və ictimaiyyət buradan nəşət ediyor.

3. "Mafövqəl-idrak"dır ki, eşq və məhəbbət və şəfqəti-madərанə vasitəsilə gələcək bətnləri, nəsilləri mühafizə ediyor və feli-müaşiqədə daima "istefayi-təbii" ilə, yəni daha gözəl və daha qüvvətli olanları intixab edə-edə nəsilbənəsil bəşəriyyəti tədricən tərəqqi və təkamülün ən uca, ən bala mərtəbələrinə sövq eliyor.

4. "Mafövqəl-idrak"dır ki, çox dəfə ağıl və vicdanın iş görmədiyi, aciz qaldığı məqamlarda "hissi-qəbləlvüqu" denilən bir növ duyğu vasitəsilə insana kömək ediyor.

5. "Mafövqəl-idrak"dır ki, qüvvəyi-təfəkküriyyəyə kömək edib mistika, yəni təsəvvüf təriqlərilə (vəchi-hal, vəhdəti-fəna və ilx.) mafövqəl-təbiə olan vəhdaniyyəti-ələnın varlığını bir hissibatini ilə dərk etməyə insanı qabil qılıyor.

6. Hüsn və cəmalı dərk etmək, gözəllikdən zövq almaq xasiyyəti dəxi bizə o məbdə və mənbədən gəliyor.

Hartman kainatın mürəkkəb bulunduğu zərrata, daha doğrusu, cövhəri-fərd denilən icrayi-fərdiyyəyə dəxi bu nəzərlə baxıyor. Onun fikrinə görə hər bir cüzi-fərd bir "ünsüri-iradə və təsəvvürdür", başqa bir şey, ya maddə deyildir və bunların mənbəi "vücudi-küll olan vahiddir" (vəhdəti-vücud – ?). Diyor: O vahidi-küll isə özü naqabili-təqsimdir.

Burada Hartmanın fikrini Feyziyi-Hindinin şu beytilə ifadə etmək olur:

"Hüsn yekist, cilvə bərun əz şomar,
Bəhr yekist mövci-həzaran həzar!.."[1]

İştə Hartman fəlsəfəsinin əsası!.. Bu fəlsəfədə böyük səhv və xətalər var idisə də, lakin digər tərəfdən müşarileyhin balada zikr olunan fikirlərilə böyük xidmət etdiyi dəxi inkar olunmamalıdır... Çünki bu filosof hər halda ilhadın böyük düşməni olduğu aşikardır. Ülumi-təbiiyyəyi səthi surətdə təhsil edib ilhad (dinsizlik) yolunu tutmuş və heç bir şeyə etiqadları qalmamış bizim bəzi mülhid cavanlarımız Hartmanın balada zikr olunan sözlərini bir az nəzəri-diqqətə alsalar bəlkə düçar olduqları zəlalətlərdən bir dərəcə azad ola bilərdi. Bu kimi mülhid cavanlara qarşı fazili-möhtərəmimiz Əbu Turab Axund və mühərriri-ədibimiz Həsən Səbri Ayvazov həzrətləri nə qədər fəryad etsələr haqları vardır!..

Məktəblərdən yarım-yamalaq çıxmış mülhidləri gördükcə bənim dəxi: "Bizə ancaq elmi-ilahiyyat lazımdır" deyəcəyim gəlir!.. Fəqət hər halda deyirəm ki, bizə ülumi-sairə sırasında elmi-ilahiyyat dəxi lazımdır... Müsəlmanlar üçün bundan sonra təsis olunacaq məktəblərin proqramında nəzəri-diqqətə alınacaq məvaddi-mühimmədən birisi də bu cəhətdir!

*Ə.H.*

*"Həyat", 1906, №118*

## BAKI VİLAYƏTİ MƏBUSLARI

Axirüləmr biz də imtahanımızı verdik. Qovğa meydanından müzəffərən çıxa bildik! Bir müddətdən bəri halımız tamamilə, məktəblərdə imtahana müntəzir olan şagirdlərin, yaxud müharibə zamanı cəngə hazırlanan əsgərlərin halına bənziyordu. Tələbəlik etmiş, ya əsgərlik görmüş hər adam şagirdlərin imtahandan və əsgərlərin cəngdən əvvəlki hissiyyatlarını bilir. Bunların qəlblərində bir çırpıntı, bir həyəcan, ruhlarında bir intibah peyda olur, rahatları qalmaz... fikirlərinə daima hüzur və aramlarını cəlb edən böylə bir sual varid olur:

[1] Tərcüməsi: Gözəllik birdir, cilvəsi saysızdır,
Dərya birdir, dalğa minlərcədir.



Əcəba, imtahanımda müvəffəq olub sinifi keçə biləcəkmiyəm? Əcəba, fərda düşmənə qalib gələcəkmiyiz?! İştə cəmaətimiz də bir-iki həftədən bəri intixab məsələsindən naşi böylə bihüzur, biaram idi... Min dürlü qorxular, vahimələr!.. Şayəd dövlət Dumasına heç ləyaqəti olmayan acizin biri seçilirsə, halımız nə olacaq, hüququmuzu kim müdafiə edəcək, dərdlərimizi, ehtiyaclarımızı kim bildirəcək?!. Bu gün lahülhəmd bu qorxulara, bu vahimələrə meydan qalmadı. Cəmaətimiz bu intixabat imtahanından kəmali-müvəffəqiyyətlə keçdi... Dövlət Dumasına üzv seçilən zəvati-möhtərəmənin üçü də bu ünvana behəqqi layiq adamlar çıxdılar...

Bu zəvatdan hər biri ayrı-ayrı ərbabi-elm və kamaldan bulunmaqla bərabər, birlikdə də mükəmməl bir müsəlləs təşkil edərək, yekdigərlərinin müini, mütəmmimi bulunurlar. Bunlardan biri rəfiqim və mühibbi-əzizim Əlimərdan bəydir ki, Peterburq darülfünunda ikmali-təhsil edən hüquqşünas və qəvanin aşina kamil bir mühərrir olub illərdən bəri cəmaətimizin mənafei yolunda mücahidliyi ilə kəsbi-şöhrət etmiş bir zati-aliqədrdir. Digəri Qori məktəbindən yetişən əziz dostum və həmşəhərim Əsədulla bəy Muradxanov olub ötədən bəri ömrünü övladi-vətənin tərbiyəsinə həsr edən və Səlyan və Cavad cəmaətin və ələlümum əkinçi cəmaətin əhval və ehtiyaclarına əz hər cəhət mükəmmələn vaqif və agah bulunanların biridir... Üçüncüsü isə, əqrəbamdan Məhəmməd Tağı Əliyev olub, bu zat Moskva məkatibi-aliyyəsindən ülumi-iqtisadiyyə və ziraiyyə akademiyasında ikmali-təhsil edib bədə axır zamana qədər ömrünü ülumi-ictimaiyyə, maliyyə və tüccariyyəyə həsr etdiyi üçün ülumun bu şüəbatında böyük bir mümarisə və ixtisas sahibidir. ... Binaənəleyh böylə qabil və kamil vəkil məbuslara malik olduğu üçün cəmaətimizi və digər tərəfdən də böylə qədrşünas və müstəid bir cəmaətin vəkili bulunmaq şərəfinə nail olduqları üçün məbuslarımızı ən səmimül-qəlb təbrik ilə yeni girdikləri meydani-mücahidədə müvəffəqiyyəti-tammə qazanmalarını təmənna edəriz. Deyiriz ki: Ey məbuslar! Millətimiz bütün ümidlərini indi sizə bağlamışdır.

Biz İnsanız: Binaənəleyh hər şeydən əqdəm bütün Duma ilə bərabər bilafərq məzhəb və qövmiyyət insanlığı, insanlıq hüququnu müdafiə ediniz. Məzlum olan sinifləri zalım siniflərin təcavüzatından azad etməyə çalışınız, müsavati-tammə istəyiniz. Yersiz, yurdsuz əkinçilərimizə, kəndlilərimizə yer-torpaq tələb edin, füqərayi-kasibəmizin şəraiti-təəyyüşünü təshihə çalışınız.

Biz Qafqazlıyız: Qafqaz əhlinin öz ümuri-idarəsinə özü baxa bilmək üçün lazım gələn muxtariyyət tələb ediniz.

Biz Müsəlmanız: Binaənəleyh öz əqayidi-diniyyəmizdə hürriyəti-vicdanımıza hər nə lazımsa onu istəyiniz, onu tələb ediniz.

Biz Türküz: Dilimizin, lisanımızın tərəqqisinə mane olan hər növ səddlərin, divarların yıxılmasına, rəf olunmasına qeyrət ediniz!..

İştə bu dörd nöqtəyi əsla yadınızdan çıxarmayınız!

*Ə.H.*
*"Həyat", 1906, №119*

## SOLA, SOLA, SOL TƏRƏFƏ!..

Sola! Çünki bu dəfə uçurum, girdab, girdabi-hail sağ tərəfdədir. Əlhəzər, mühafizəkar bəylərin, köhnə fikirli, ya fikirsiz ağaların, kavpərəst, dünyapərəst sərmayədarların, korpərəst, axirətpərəst, lakin yenə sərmayəpərəst mollaların, keşişlərin, kiçik əqilli, böyük hiyləli, mürüvvətsiz, insafsız, vicdansız, münafiq, fitnəçi, provokator "bürokratların", "divannişinlərin", ümum əsarət və istibdad qullarının çəkdikləri, sürüklədikləri sağ tərəfdən! Əlhəzər sağ tərəfdən!.. Əlhəzər sağ tərəfdən!.. Uçurum oradadır!.. Əlhəzər Komissarovların, Pavlovların və əmsalının gizləndikləri sağ tərəfdən! Sola! Sola! Ramişvililərin, Kovalevskilərin, Şepkinlərin, Aladinlərin, Anikinlərin, Radiçevlərin, Vinavorların dəlalət və rəhbərlik etdikləri sola!.. Fərasət, zəka, ağıl, huş, elm, tədbir, insaf, mürüvvət, nicat, səlamət həp sol tərəfdədir!.. Hətta bu sol tərəfdən professor Şepkin kürsüyi-xitabətə çıxıb çığırsa ki: "Ağıl və huş yeri deyil, tələsməli, cürət və əcələ ilə iş görməli, dəlilik, divanəlik lazımdır!.. "Yenə sol tərəfə getməli. Çünki bu dəlilik, bu divanəlik elmin, ağlın çoxluğundan, zəkanın fərtindən iləri gəliyor!.. Kim dedi ki, bitərəf olmalı?.. Xeyr, əsla bitərəf olmamalı! Bitərəflik ayaq altında qalmaqdan, əzilməkdən başqa nəyə baqi olacaq? Su belə bir yerdə sakit və rakid durmaqdan qorxuyor, qorxuyor, çünki pozular, qoxar, kiflənər, yosun bağlar!.. Təmiz və salim olmaq üçün su bir tərəfə axmalı, cərəyan etməli, ya heç olmazsa dərya kimi ləpələnməli, cuş və xüruşa gələ bilməli!.. Ya sağa, ya sola!.. Xeyr, ancaq sola!..



Sağ tərəfdə bir uçurum hazırlanmışdır ki, əjdaha kimi ağzını açıb bütün cəmaətləri, bütün qövm millətləri, dinləri ilə, dillərilə, elm və məarifləri ilə, sənətləri və kəsbü karları ilə bəl və nabud etməyə amadədir!..

Sol tərəf isə Rusiya üçün, Rusiya imperatorluğu üçün, xeyr, bütün aləmi-bəşəriyyət üçün bir dövri-cədid, bir səadəti-ümumiyyə dövri-cədidi ehzar eyliyor. Bu səadəti – ümumiyyə, bu dövri-cədid həqiqi bir dövri-cədid olacaqdır. Bəşəriyyət üçün səadəti-ümumiyyə dövrünün fəcri, sübhi-sadiqi başlayor, bunun əlamətləri bir-bir nümayan oluyor... Bəncə edam cəzasının ləğvi və dövlət duması əzasından bir qisminin beynəlmiləl hökm məhkəməsi təşkili üçün beynəl-məcalisi-məbusan bir heyəti-ittifaqiyyəyə daxil olmaları bu əlamətlərdəndir!

Edam cəzasının ləğvi ilə məmləkət daxilində "qanun" pərdəsi altında icra edilən qətl cinayətlərinə və beynəlmiləl hökm məhkəməsi vasitəsilə məmləkət xaricində müharibə nami təhtində yapılan müqatilə vəhşətlərinə xatimə verilmək istəniliyor!

İştə bəşəriyyət üçün ən həqiqi bir dövr, səadətin ən müəzzəm, ən həqiqi bir dövri-cədidi!.. Əvət, ən həqiqi bir dövri-cədidi! Qüruni-əvvəl, qüruni-vüsta inda xitam buluyor, qüruni-cədidə, qüruni-əxirə indi başlıyor!

Xeyr, səhv etməyirəm, qüruni-cədidə indi başlıyor. Mən də, ey qare, sənin kimi vəxtilə məktəblərdə tarix dərsi oxumuşdum, həm də rus və Osmanlı məktəblərində bu elmi təhsil etmiş idim. Bizə öyrətmişdilər ki, tarixi-bəşəriyyət dörd dövrə təqsim olunur:

Qüruni-əvvəli ki, Roma (Rim) imperatorluğunun ikiyə inqisamilə İstanbulun binasinadək, qüruni-vüsta ki, İstanbulun Fateh Sultan Məhəmməd tərəfindən fəthinə və Amerikanın Xristov Kolumb tərəfindən kəşfinədək, qüruni-cədidə ki, Fransa inqilabına və qüruni-əxirə ki, bu inqilabdan sonra bugünədək imtidad edən əzminədən ibarətdirlər. Bən indi anlayoram ki, müvərrixlərin bu təqsimi-keyfi əsassızdır? Ərz edəyim nə üçün əsassızdır.

Tarixi dövrlərə təqsim üçün vəhşət və heyvaniyyət ilə mədəniyyət və insaniyyətdən daha mətin əsas olamaz! İnsaniyyəti-heyvaniyyətdən, mədəniyyəti vəhşətdən (bədəviyyətdən demiyoram, çünki insaniyyət olduqca bədəvi də mədəni sayılmalıdır) təfriq edəcək bir əlamət varsa o da, qətl və qitalın, xunxarlığın, xunrizligin ortadan rəf olunmasıdır. Roma imperatorluğu ikiyə təqsim olundu,

Konstantəniyyə bina olundu, qətl və qital xitam buldumu? Xeyr, bundan sonra qətl cinayətləri, müqatilə vəhşətləri daha ziyadə artdı: keşişlərin, rahiblərin hökmü ilə icra edilən inkvizisiya cinayətlərinin, səlib namına, cihad namına edilən müharibələrin həddi-hesabı yoxdur!.. Deməк ki, bəşəriyyət əsla heyvaniyyətdən, vəhşətdən xilas olmadı!..

İstanbul fəth edildi, Amerika kəşf olundu, müqatilə, səfkidəmə xitam buldumu, bəşəriyyət heyvanlıqdan xilas oldumu? Əsla! Avropalıların kəşf olunan Amerikada etdikləri vəhşilikləri, xunaşamlığı tarix kitablarında oxuduqca insanın tükləri biz-biz duruyor! Fransa inqilabı ilə edam və qətl cəzası ortadan götürülmədi, ancaq ənvai və əşkalı ləğv edilib cümləsi gilyotin denilən baltaya həsr edildi. Lakin bu baltanın altında kraldan, padşahdan başlamış axırıncı fəhləyə qədər (Andre Şeniyə, Lavuaziye kibi şairlərdən, alimlərdən başlamış axırıncı avama qədər ən məsum, ən günahsız adamların başları yuvarlandı!.. Xeyr, xeyr! Müvərrixlər nə deyirlərsə desinlər, bəşəriyyət heç bir vaxt qüruni-vüsta, hətta qüruni-ouladan xilas olmamışdır. Vəhşətində, heyvaniyyətində bu günə qədər israr edib durmuşdur!.. Lakin indi qətlü qital tərəfdarlarının axır nəfəsidir. Bu da sol tərəfdən nərəzən olan xətiblərin, fəryad edən natiqpərdazların nəfəslərinin, mühruq, atəşin nəfəslərinin kəramətindən, səvaiqbar, rədəndaz nitqlərinin təsirindən, bərəkətindəndir!..

Əvət, qətlü qital tərəfdarlarının son nəfəsidir. Onlarla bərabər bütün bir güruhun son nəfəsidir ki, cümləsinin yeri məşhur Dantenin tərif etdiyi cəhənnəmdə əsfələssafilindədir...

Kimdir onlar! Onlar o adamlardır ki, Allahın əkinçi insanlara ehsan etdiyi, fəqət bir xətayi-ictimai-tarixi nəticəsi olaraq igirmi, otuz tənpərvər müftəxorların əlinə keçmiş, ya ənva bəhanələrlə zəbt olunmuş yerdən, torpaqdan əkinçilərin, cüftçülərin, fəllahların məhrum buraxılmalarını, bunların əsrlərcə ilanəhayə baronlara, xanlara və bəylərə qul və əsir qalmalarını tələb ediyorlar. Yaxud bunları dərbədər salıb övlad və əyalları ilə çıl-çıplaq qərib diyarlara, ülfət edilməyən iqlimlərə hicrətə və hicrət edilən yerlərin əhalisi ilə niza və qovğayə məxbur qılıyorlar!.. Onlar o adamlardır ki, fəhləyi, əmələyi, alın tərilə çalışanları, həlal kəsbi-kar dalınca gedənləri öz əllərinin əməklərindən, öz məhsul məsailərindən məhrum edib, bunların əlilə hasil olan sərvəti-milliyyəyi bir neçə səfahətpərvər sərmayədarların əlində tərakim etdirmək üçün şərtlər, qanunlar ixtira ediyorlar!..



Onlar o adamlardır ki, müsavati-qətiyyə yerinə milləti baron, xan, bəy və daha bilməm nə namlarla siniflərə, mümtaz-mümtaz siniflərə ayırıb, imtiyazdan, hüquqdan məhrum olanları anarxiya yollarına sövq ediyorlar...

Onlar o adamlardır ki, sərbəst, hürr və bitərəf bir məhkəməyi-ədliyyə yerinə keyfə, mayəşa bir hökm divanxanası təsis etmək, cəmaəti, külliyyət cəmaəti nuri-maarifdən məhrum edib, özləri isə zülmət, cəhalət içində hökmfərma olmaq istəyirlər... Lakin nə böyük səhv, nə əzim xəta! Bunlar mütləq kordurlar, kardırlar, beyinsizdirlər. Bütün bu heyət "Ya kur əst, ya məst əst, ya divaneyi!"[1]. Bunlar görməyirlər, anlamayırlar ki, Rusiyanın bir başından o başına qədər bütün cəmaətin gözü açılıb haqqını istəyir. Zalımların, cəmaət qatillərinin məhkəməyi-ədalətə təslim olunmasını tələb ediyor.

Qafqazımızın ən küzidə vəkillərindən gürcüstanlı Ramişvili ki, əmək və məsai firqəsinin pişvalarındandır, atəşli bir nitqində baxınız nə diyor: "Bizim ümuri-daxiliyyə nəzarəti ədliyyə nəzarətini külliyyən bəl edib yutmuşdur. Bizdə qanun yoxdur, bizdə mühakimati-ədliyyə yoxdur. Bizdə ancaq polis nizamnaməsi vardır. Zənn etməyiniz ki, bu polis nizamnaməsinin hökmü sadə polis dəvairində car edir, xeyr, onun hökmü məhkəmələrimizdə və kəlisalarımızda dəxi caridir. Buralarda o nizamnamə incili-şərifin mafövqünə vəz edilmişdir. Bizim keşişlər rəhban libasını labis polis məmurlarından başqa bir şey deyildir. Özlərinə vərəsəyi-İsa deyən bu cənablar xəfiyyəliyi və provakatorluğu (münafiqliyi) dəröhdə edərək kəlisa mənbələrindən edam cəzasına və qətl və qarətlərə tərəfkirlik edib, o yolda vəz ediyor idilər. Əvət, bizim daxiliyyə nəzarəti kəlisayı dəxi bəl edib yutmuşdur!" Ramişvili böylə diyor! Lakin bizim mollalarımız, xacələrimiz, Rusiyada, Türkiyədə və İrandakı mollalarımız sevinməsinlər. Ramişvilinin tən və sərzənişindən onlar dəxi azad deyildirlər!.. Hər nə hal isə, əsarətin, siyasi və iqtisadi bir əsarətin yavaş-yavaş ortadan rəf olunmasilə və edam cəzası qanununun ləvğ və fəsx edilməsilə bəşəriyyət üçün yeni və müşəşə bir dövr başlıyor. Bəşəriyyət üçün diyoruz. Çünki Rusiyadan başlayıb Asiyanın hər tərəfini istela edəcək bu əfkari-aliyəyi-hürriyyətpərvəranə seli müqabilində heç bir şey dura bilməyəcək, hətta nə Tehrandakı və nə də İstanbuldakı Dara və Konstanteninin təhti-büləndləri, küreyi-ərz üzərində

[1] Tərcüməsi: "Ya kordur, ya məstdir, ya divanə!"

bidad və istibdadların o son və axırıncı istinadgahları!.. Dövri-cədid nə İstanbulun binası ilə, nə də onun fəthilə başlıyor. Dövri-cədid ikinci və "üçüncü" Romanın, yəni İstanbul və Moskvanın hürriyyət sayəsində təzədən "Gülüstani-İrəm" olması ilə başlıyor!.. Hürriyyət isə soldan təvəllüd ediyor, binaənəleyh sola, sola, sol tərəfə!..

*Ə.H.*

*"Həyat", 1906, №142*

## KUHİ-QAF VƏ SİMURĞ

Əsatir və xurafatda çox kərrə dərin və nəhan mənalar vardır. Ancaq o mənaların zahir və əyan olması zamana möhtacdır. Keçən nömrədə bir nöqteyi-nəzərdən tarixi-bəşəriyyətin ədvari-ərbəəyə təqsimini qəbul etməyib qarelərimizin əfvinə məğrurən ikiyə təqsimini münasib gördük ki, o da ancaq bu günlərdə xitam bulmaq üzrə olan qüruni-vəhşiyəyi qədimə ilə ancaq indi başlamaq üzrə bulunan, yaxud bundan sonra başlayacaq olan qüruni-mədəniyyeyi cədidədən ibarətdir. O halda zəmanəmiz pak mühüm bir zamandır. İki dövr arasında bir nöqteyi-fasilədir, bu nöqtəyə diqqət etməlidir. Lakin sadə zəmanəmiz mühüm deyildir. Məkanımız da pak mühüm bir məkandır. Bu nöqtəyi də anlamalıdır, həm də gözəlcə anlamalıdır! Daim zamanca ən mühüm olan hadisat məkanca dəxi ən mühüm bir mövqedə baş göstərmişdir.

Rusiyada bu günlərdə vaqe olan hərəkati-qəyuranəyi-hürriyyətkaranənin əhəmiyyəti-əziməyi-aləmiyyəsi inkar olunmaz. Lakin burası da inkar olunmaz ki, ümum Rusiya və bilxassə bizim Qafqaziya cahanın ən əhəmiyyətli bir nöqtəsidir. Bunu ən əski zamanlarda belə bütün əqvami-müəzziməyi-tarixiyyə anlamışlardı: yunanilərin, turanilərin, iranilərin ən mənidar xurafat və əsatirləri, ən zərif, ən müdhiş əfsanələri Qaf dağına aiddir. Qaf dağı isə Elbrus olub Qafqaziyadadır. Qafqaziya nədir? Qafqaziya Asiya ilə Avropa arasında əzim bir bərzəx, cəsim bir körpüdür. Qədimdən bütün cahanın qapısı bu körpü üzərində idi, o qapının adı ərəblərcə babül-əbvab, yəni "qapılar qapısı" idi ki, bugünkü Dərbənddən ibarətdir. Bu gün Qafqazın bu qapılar qapısından belə mühüm daha iki qapısı vardır ki, birinin adı Bakı, digərinin adı Batumdur. Qədim ataşpərəstlərin qibləgahı, cədid petrolçu zərpərəstlərin səcdəgahı olan şu Bakı bütün Avropanın Asiyaya olan qapılarından biridir. Batum, o süräti-sahiranə ilə tərəqqi edən Batum isə bütün Asiyanın Avropaya qapısıdır... Cahanın körpüsü olan, cahanın qapıları bulunan bu məmləkətdə vücud və bədəncə dəxi cahanın ən gözəl, ən yaraşıqlı, ən məlih xalqı sakin bulunuyor. Bəşəriyyətin hüsn və cəmal etibarilə, ən güzidə qismi "irqi-Qafqaziyyə" mənsubiyyətlə fəxr etmiyorlarmı?

Ərəblərin "Huristan" dedikləri cənnət bu ölkədə deyilmi?.. Şair nərənin həqqində deyir: "Yığılıbdır ora cəmiyyəti-huri pərinin?" Əvət cismən və bədənən hur və mələk qədər gözəl xəlq?.. Lakin gözəl cismdə də gözəl də ruh və fikir olmaq lazım gəlir!.. Öyləmidir? Əlbəttə, öylədir!.. Ruh və fikir gözəlliyinin əlaməti nədir? Şübhəsiz, hürriyyət və azadlıqdır, azadlığa meyildir!.. Başqalarını bilməm, bəncə böylədir!..

Şən, namus və tar, heysiyyət, istiqamət, şücaət, həmiyyət, qeyrət, rüfət, nəcabət kimi sifətlərin cümləsi hürriyyətdən, azadlıqdan törər. Bu sifətlər ruhda, fikirdə, qəlbdə olduqca insanın nasiyəsinə, simasına inikas edib onu gözəl və nəcib qılar, qəddü qamətinə təsir edər, onu mövzun, rast və bülənd eylər!.. Qafqaz xəlqi gözəldir, cəmildir. Çünki, zikr olunan mühəssənatın mənbəi olan hürriyyət hissi heç bir vaxt onda sönməmişdir!

Qafqaz xəlqini qulluğa, əsarətə məluf etmək olmaz! Qafqazın üç-dörd min sənəlik tarixini qarışdırsaq onu daima öz hürriyyəti və azadlığı üçün müharibə edən görürüz! Onlar ya ölərlər, ya hicrət edərlər, fəqət qul olmazlar, onlar əsir düşərlər, lakin əsirliklərində belə qul olmayıb ağalıq edərlər!.. Çərkəzlərin, ləzgilərin, gürcülərin tarixlərini mütaliə ediniz! Çərkəslər Türkiyəyə, İstanbula hicrət edərlər, əsir gedərlər, fəqət orada bir sülaleyi-hökmdarının ərkanını təşkil edərlər... Misirə hicrət edərlər, orada hökmdar olurlar. Çərkəz hökuməti təşkil edərlər... Cahanın mümərri olan bu məmləkət vəqayeitarixiyyəyi-aləmin ən böyük sədəmatına uğradığı halda hürriyyətini, hürriyyətə olan meyil və məhəbbətini heç bir zaman qayib etməz! Kiçik bir gürcü milləti əsrlərcə, qərinələrcə eşqi-hürriyyət sayəsində cahanın ən quvaü-şəkimə dövlətlərinə müqavimət edər, durar!.. Bir ovuc ləzgi qövmi hürriyyəti üçün igirmi beş sənə mütəmadiyən şimalın ən müəzzəm dövlətinə meydan oxur, durar!.. Bu məmləkətin abi-havasında hürriyyət rayihəsi vardır, bu xalqın açıq nasiyəsində hürriyyət nuru borq urur, bu cəmaətin xilqət və təbiətində bir

bariqəyi-hürriyyət məknuzdur! Alp və Altay dağları insanın qəlbinə nələr ilham edərsə, Qafqaz da onu ilham edir! Qafqazda kim təvəttün edərsə, bu ilhamatın təsirindən xilas olamaz, onunla pərvərişyab olur. Bəncə Qafqaz türkləri ətrakın ən hürriyyət-pərəstidir. Köçəbəliyi ona qəbahət bulunyordular. Ah!

O köçəbəlik!.. O köçəbəlik mədəniyyətə kiçik bir maneəsə də, lakin hürriyyət şövqinin, hürriyyət saiqəyi-təbiiyyəsinin böyük bir əlamətidir!

Bu məmləkətdə heç bir qüvvət hürriyyət şövqünü məhv edəməz! Heç bir cəbr və təzyiq, heç bir cəfa və əziyyət, heç bir zülm və sitəm hürriyyət odunu söndürəməz.

Ey qare, Tiflisdəki "Qafqaziya muzesinə" getmişmisiniz? Getməmiş isəniz gediniz. O muzexananın divarında əzəmətli bir rəsm lövhəsi vardır, ona tamaşa ediniz. O rəsmdə ərz və səma oğlu Prometeyin hürriyyət və nuri-maarif uğrunda düçar olduğu ələm və iztirabat təsvir olunur. Prometey asimandan gətirdiyi o nemətlə bəşəri, bəşəriyyəti məsud etmək istədiyi üçün müdhiş, böylə bir əzayə məhkum edilmişdir. Onun vücudu zəncirlərlə "Kuhi-Qaf"a bənd edilib, cigəri müəbbədən yırtıcı bir qaraquş tərəfindən əkl edilməkdədir. Müəbbədən çünki cigər yeyildikcə yenidən təşəkkül edib böyüməkdədir, lakin böylə bir əzab-ələm içində dəxi o nasiyədə yenə bir vüqar, bir qürur nümayandır ki, o da heç bir əza və cəfa ilə izaləsi qabil olmayan bir hissi-hürriyyətin səmayə əks edən asarından başqa bir şey degildir. Bu halı miladi-İsadan bir neçə yüz il əvvəl yaşamış olan yunan şairi Esxilos bu yolda təsvir etmiş idi: Qafqaz qayalarına zəncirbənd olan, cigəri üqab tərəfindən parçalanan Prometeyin nəzdinə bir elçi gəlib ona deyir ki, əgər müştəriyə ərzi-inqiyad etsə, şu əzabdan xilas olur. Prometey isə cavabən diyor ki:

Sirlər kimi aləmdə bir qul olmadan,
Bu iztirabı çəkmək ovladır bəna.
Bəncə sitəmkarani-dəhrə bəndəlik,
Bu daşlara bənd olmadan bin qat fəna[1].

Hürriyyət namına bundan müəlla, bundan qəti, bundan şiddətli səhih olmaz ki, bir neçə min illərdən bəri Qaf dağlarına əks edib

[1] Yunan lisan və ədəbiyyatına həvəs etdiyim zamanlar, yunancadan tərcümə etmiş idim.



oradan bütün aləmə vəlvələ salmışdır. Prometeyin cigərini parçalamaq ilə onun qəlbindən hürriyyət hissini silmək olursa, Qafqaz xəlqini də əsarətə məluf etmək olur!.. Hürriyyət yolunda böylə eşidilməmiş iztirabata qatlanan qəhrəmanı nəhayət hürriyyət mühübbi olan yunan Rüstəmi Herakl azad edə bildi!..

Təəssüf olunur ki, Tiflis muzesi Prometey lövhəsilə iktifa edib digər bir hürriyyət mübarizi olan və şairi-əzəm Firdovsiyə ilhamat verən Zal oğlu Rüstəmlə Simurğ vəqəəsini təsvir etməmişdir[1].

Qafın bir tərəfində bir üqabi-müdhiş hürriyyət fədaisi olan Prometeyin cigərini parçaladığı halda, yenə o kühi-sərbüləndin üzərində sakin ünqaya Simurğ adlı bir teyri-mövhum daha var idi ki, o bil əks hürriyyətpərvəranənin ürəginə, qəlbinə qüvvət verirdi! ...Zalzeri azad və tərbiyə edən Simurğdur, oğlu Rüstəm fəlakətə düçar olduqca ona çareyi-nicat göstərən Simurğdur.

İran azadlığının, İran hürriyyətinin ən böyük mübarizi olan bu qəhrəman düçari-yəs olduqca, zəiflədikcə, paralandıqca, ona təsəlli verən, onu qüvvətləndirən, onun yaralarını qanadları ilə yaxşı eyləyən Simurğdur.

Kimdir Prometeyin pəncəyi-üqabda düçar olduğu iztirabata inanmayan?! Kimdir onun işıq və hürriyyət yolunda çəkdiyi əza və cəfayi əfsanə sayan?! O iztirabat bu gün dəxi gözümüzün önündə bütün Qafqaziyada davam edib durmuyormu?.. Fəqət, o iztirabat içində dəxi Qafqaz hürriyyətdən əl çəkiyormu?.. Kimdir, Simurğun qanadındakı təsirati-şəfabəxşayə inanmayan?! O quş bu gün dəxi balgüşayi-etila olub kuhi-Qafın bülənd zirvələri, şahiqələri üzərində pərvaz edib durmuyormu? Pərvərdələrini, tərbiyə etdiyi Zalzerlərini hürriyyət yolunda mücahidə və mübarizə üçün ta qütbi-şimaliyə qədər göndərmiyormu?!

Bütün bu əsatir bimənа deyildir: yəqindir o zaman ki, Qafqaz ölkəsi aləmin istibdad və bidad altında inləyən qismini əsarətdən xilas etmək xüsusunda ən böyük bir rol oynayacaqdır!.. Ey Türkiyənin, İranın vətəndən dur və cüda düşən hürriyyət yetimləri! İsveçrənin

[1] Tətəbbüati-cədideyi-lisaniyyə və ədəbiyyəyə görə Zal və Rüstəm hekayəsi sadə İran əsatirinə məxsus deyildir. Rusun milli masallarında məşhur qəhrəmanlardan birinin adı Yaroslav Lazareviçdir. Bu ad "Ruslan Zalzareviçdən mühərrəf olub bu da müşabihəti-ləfziyyədən dəxi anlaşıldığına görə "Rüstəm Zalzer"dən qələtdir. Hər iki tərəfin hekayələrində bu yolda pək çox əlfaz və vəqayə müşabihətləri var.

sizə biganə olan soyuq alplarından, Misrin lal və samit olan ehramlarından, hətta bütün Avropanın mərakizi-qeylü qalından imdad gözləməyərək, oralardan səsinizi, fəryad və fəqanınızı vətənə eşitdirəməzsiniz. Oralarda sizi kimsə himayə edəməz! Gəliniz, gəliniz Qafqaza, Simurğun qanadları altına!.. İran və Türkiyə istibdadını bir Arximed kimi yerindən qaldıra bilmək, tamamilə kökündən qopara bilmək üçün nöqtəyi-istinadınız, istinadgahınız ancaq kuhi-Qaf ola bilir!.. Sihhə və nərələrinizi ancaq buradan xabi-qəflətdə olan vətəndaşlarınıza eşitdirə biləcəksiniz. Uca tutduğumuz məşəli-irfanınızla vətənizdəki şəbi-tari buradan tar-mar edəcəksiniz. Zülm və bidadın binasını buradan yıxa biləcəksiniz!.. Sizin yazılarınız, mətbuatınız, ədəbiyyati-hürriyyətpərvərananəniz asanlıqla buradan o məmləkətlərə daxil ola biləcəkdir. Heç bir senzur onu mən edə bilməyəcəkdir. Heç bir "bürokratiya" onun önünə səd və divar çəkə bilməyəcəkdir!.. İstanbuldakı yanğınların, həriqlərin çoxu Qafqaz petrolundan iləri gəlmiyormu?.. Bundan sonra oranın həriqi-mənəviyyələrinə dəxi Qafqazın atəşi-fikrisi, Prometeyin buraya asimandan gətirdiyi atəşi-fikrisi bais olacaqdır!

Nə ingilis məmalikində və nə də Fransada, Avstriya və Germaniyada İran və Türkiyəyi oyandıracaq bir hürriyyət ədəbiyyatı hüsula gəlmədi və gələməz də. Çünki, o əqvamın dili Türkiyə və İranda söylənən dillərdən başqadır. Lakin ümum Rusiya ölkəsində hürriyyət sayəsində bir millət tərəqqiyə başlayır ki, onun dili Türkiyə və İran xalqına biganə deyildir. Bu millət Kazandan, Ufadan Səmərqəndə, Mavərayi-Baykaldan Krıma qədər müntəşir olan türk və tatar əqvamıdır. Bunların oyanıb hüsula gətirəcəkləri hürriyyət ədəbiyyatı bir sel kimi İran və Türkiyəyi istela edəcəkdir. Bu selin də məcrası bila şəkk və şübhə bu iki məmləkətə Qafqaz bərzəxi olacaqdır!.. İştə, görünür ki, Qafqaz hürriyyəti-aləmin tarixində mühüm rollar oynayacaqdır. Bu rolların da ən böyüyü Qafqaz və Azərbaycan türklərinə aiddir. Buralarını anlamalıyız da, ona görə hazırlanmalıyız!

Fəqət nə surətlə hazırlanmalıyız? Bu xüsusda bir ayrı dəfə bəhs edəriz...

*Ə.H.*
*"Həyat", 1906, №143*



# HÜRRİYYƏT VƏ VƏTƏNİ-FİRDOVSİ

Yeni fransız şairlərindən bulunan Fransua Kopenin külliyyati-şeriyyəsi miyanında gözəl bir mənzumə vardır ki, ünvanı "Müstəbid və mərqədi-şair"dir. Bu mənzumədə Fransua Kope hekayə ediyor ki, istibdadı ilə məşhur türk və tatar cahangiri Teymurləng Tus şəhərini zəbt etdiyi zaman Firdovsinin namına hörmətən oraya düxuli-əsakirinə mən edib özü də cahan şairi-əzəmin qəbrini ziyarətə getdi. Teymur sadə qəbri ziyarətlə iktifa edəməyib, bir də qəbrin daxili və şairin üzami-pakı nə halda bulunduğunu rəyül-eyn müşahidə etmək istədiyindən qəbrin açılmasını əmr etdi. Hökmdarın bu əmri üzərinə qəbrinin üzərindən məzar daşını rəf etdilər. Qəbir açıldı və Teymurun gördüyü orada dilara bir mənzərəyi-behişt oldu. Çünki qəbrin dəruni rəngin və nurəfşa olan güllərlə, lalələrlə, nəsrinlərlə ləbaləb olub, bunlar dərhal ətrafa yayılmağa, dağılmağa başladı və bütün civarı rövşən və müzəyyən qıldı!..

İran şairinin dəruni-məzarı böylədir. Türk hökmdarının müşahidə etmiş olduğu budur, firəng hekayənəvisinin tərifi bu yoldadır... Siz bu hekayəni bir əfsanəmi ədd ediyorsunuz?.. Xeyr, xeyr, bu əfsanə deyildir! Və əfsanə olmadığını siz də görəcəksiniz, təsdiq edəcəksiniz, qəribən beş-on ilin içində görüb təsdiq edəcəksiniz!.. Bu günə qədər bütün İran nə idi, əzim, vase bir qəbir deyilmi idi? Əvət, cahani-mədəniyyətin ortasında əzim bir şüəra və üləma qəbri idi, o qəbrin üzərinə mütləqiyyətdən, idareyi-keyfiyyədən, istibdad və bidaddan ibarət ağır bir səngi-məzar vəz edilmiş idi. Bir-iki əsrdən ziyadədir ki, oradan aləmi-mədəniyyətin guşinə bir səs, bir səda gəlmiyordu, bəşəriyyəti müstəfid edəcək bir şey görünmüyordu, nə şeir və ədəbiyyatdan, nə kəşfiyyati-elmiyyədən, nə ixtiraati-sənaiyyədən bir əsər müşahidə olunmuyordu! Guya aləmi-islamın mədari-fəxri olan bunca şairlər, alimlər bu yerdə gəlməmiş idi. Guya Firdovsilər, Sədilər, Əllamələr, Xacə Nəsir Tusilər burada zühur etməmişlərdi.

Demək olar ki, İranda Şah Abbas Səfəvi, daha doğrusu, Nadir şah dövründən sonra həyatın hay-küy vəlvələsi sükut və sükunətə, mədəniyyətin cünbiş və hərəkəti ətalətə, bətalətə münqəlib oldu. Mədəniyyətdən bir əsər, bir nişanə qalmadı, hər şey öldü. Bütün məmləkət tədricən bir məzar halını aldı. Lakin bir məzar ki, Pişdadiyan, Kəyaniyan, Sasaniyan məzarıdır, orada "həme morde əz

ruzigare-deraz"[1] – Cəmşidlər, Firidunlar, Kavuslar, Kiruslar, Rüstəmlər, Daralar, Bəhramlar, Nuşirəvanlar mədfundur, orada Sultan Mahmudlar, Məlikşahlar, Şah Abbaslar, Firdovsilər, Ənvərilər, Xəyyamlar, Hafizlər yatıyor... Əvət, İrani-əzim bir ölü qəbir olmuş idi. Bir qəbir ki, vəhşətəngiz idi. Onun vəhşəti dirilərə, daha doğrusu, nimzindələrə xövf və dəhşət ilqa ediyor idi, qorxuduyordu, vətəndən fərarə məcbur ediyordu, insanlar başlarını götürüb diyari-qürbətə can atıyorlar idi. Dərbədər düşüyorlar, pərişan oluyorlar idi!.. Bu surətlə, əlli-altmış milyon nüfusu mürəffəhən iaşəyə qabil olan bir ölkədə haqsızlıq, nizamsızlıq, ədalətsizlik, cəhlü cəhalət üzündən yeddi-səkkiz milyon adam yaşayor, ya yaşamıyor!.. Yaşayanlar da min zillətlə yaşayorlar, zülmət içində, zülm altında kimi ac, kimi çılpaq, kimi xəstə, kimi sərasimə və sərgərdan, kimi məğdur, məzlum, kimi zalım və qəddar!..

İndi bu əzəmətli qəbrin üzərindən gülləri, çiçəkləri əzən, işıqlara, nurlara hail olan məzar daşı qaldırılır. Rövzəyi-münəvvərəyi-İran, adı istibdad və mütləqiyyət olan o daşın zülmətindən, təzyiqindən, əza və cəfasından xilas ediliyor!.. Türk nəslindən olan yeni bir hökmdarın, Teymurun bütün zəfərlərinə bədəl böyük bir müzəffəriyyətə nail oluyor!.. Yaşa, Müzəffərəddin, yaşa! Şaha, şahənşəha, Xosrova, Keyxosrova! Çox yaşa!.. İndi sənin tacında parlayan yaqutları, zümrüdləri, almasları qopar at!.. O daşlar nəyə lazımdır!.. Həq və ədalət, insaniyyət, müsavat və hürriyyət qədər parlaq, rövnəqdar, pərtovəfza, şəşəəpaş cəvahirmi olur!.. Qoy bu cəvahir sənin tacında bərq vursun!..

Padşah, şahənşah! Tutduğun bu təriqi-nicat və səlamətdə sabitqədəm ol... zinhar, zinhar Sultan Əbdülhəmidlərə uyma! Zinhar qanuni-əsasinin xadimlərini, Midhət paşalarını tayiflərdə məhv və nabud etdirmə, zinhar Fransua Kopenin tərif etdiyi Teymur kibi biləxərə gedib Çingizin qəbri üzərindən daşı rəf etmə. Çünki o qəbirdən ətrafı sel kimi istela edən qandan başqa bir şey nəban etməz!

Eşidiyoruz, biliyoruz, sənin ilə Sultan Həmid arasında bu anda bir sərhəd münaziəsi var! ...Biz bu xüsusda bitərəf bulunuyorduq, sükut ediyorduq, bir şey demiyor idik.

Lakin bundan sonra üzümüzü Sultani-müşarünleyhə, istibdad və mütləqiyyətin o timsali-mücəssəminə çevirib deyəcəyiz ki: "Ey

[1] Tərcüməsi: Uzun ruzigardan hamısı ölmüşdü.



məmləkətini təhti-əsarətdə tutan hökmdar, İran torpağına təərrüz etmə, əlini oradan çək!.. Orası indi hürriyyət torpağı oldu! Hürriyyət livası rəkz olunan ölkəyə istibdad bayrağı girəmməz!" Bir mütəəssib demişdir ki, "Səlibin aldığı yerlərə hilal girəmməz". Bu sözlər cahilanə, təəssübkaranədir. Qladistonun ağzından çıxmış olsa da, təəssübkaranədir. Qladiston sözü yanlış demişdir, çünki böylə deməк icab edərdi: "Hürriyyətin aldığı yerlərə istibdad girəmməz!.. İranın ən böyük adamı Əbülqasim Həsən Firdovsidir. Firdovsinin ən böyük əsəri "Şahnamə"dir. "Şahnamə"nin ən böyük qəhrəmanı Səyavuşdur, bəncə Səyavuşdur. Çünki insaniyyətin, həqqaniyyətin, ədalətin, nəcabətin, ismətin, mərdliyin, elm və kamalın, ülviyyətin, ülviyyəti-əfkarın ən parlaq, ən şəşəli bir timsalıdır. Zülmün hökmü ilə Səyavuşun başı kəsildi, qanlarını teşti-zərrinə alıb apardılar, xakə tökdülər, lakin o qanlar boşa getmədi, zira Firdovsinin rəvayətinə görə o qandan "xuna səyavuşan" namində bir çiçək bitdi ki, indi də o çiçək İranın dağlarını, səhralarını təzyin ediyor... Ey Tusda yatan həkim! Ey məkanı Firdovs olan şair, qalx, qalx ayağa, vətəninə bir nəzər elə, sevin, şadü xürrəm ol, gör tazədən nə qədər şəhnamələr yazmaq lazımdır. Gör Tehran küçələrində şəhid olan yeni Səyavuşların qanlarından nə qədər gözəl lətif güllər, çiçəklər bitməkdədir!.. Gavələrin əlində dirəfşi-hürriyyət etila və təməvvüc ediyor, bidad və istibdadın mar və əjdəhaları sərnigun oluyor, təxti-pişdadyandan yeni Firudunun ədlü dad avazələri asimanə bülənd oluyor!..

*Ə.H.*
*"Həyat", 1906, №173*

## VİDANAMƏ

Bir gün Faust nam həkim dərin-dərin təfəkkürata dalmış ikən onun fəzayi-biintəhadə dolaşan nəzərləri önündə siyah bir qüvvəyi-əhrimənanə insan şəklində təcəssüm edib ərzi-vücud elədi. Həkim sual etdi ki, kimsən? Nəsən? O da cavab verdi ki:

Mən cüziyəm ol cüzün, o külli-əzəlinin,
Mən cüzi siyəhrəng olan ol zülməti-leylin.
Ki eylədi tovlid bu ənvari-ziyayi,
Məğruri-ziya validəsi zülmətə asi...

Amali şəbi tərd qılıb cövvi-fəzadan,
Qəsb etmək onun cayi-qədimin əbədiyyən,
Heyhat! Ziya olmayacaq qəsbə müvəffəq!..
Zira nə qədər eyləsə cəhd, olsa hünərmənd,
Əcsamdan ayrılmıyor, əcsam ona pabənd:
Ancaq işıq əcsama verir ziynətü-rövnəq
Əcsamdan eylər seylan seyli-ləvame,
Əcsam çəkər sədd, olur seyrinə mane.
Əcsam ona naqil olur, əcsam ona hail,
Çox keçməz əminəm, yenə əcsam ilə ənvar
Birlikdə olurlar ədəmin qərinə nazil!..

Bu sözləri deyən qüvveyi-müzliməyi-əhrimənanə sadə insan şəklində deyil, bəlkə camaat şəklində, ələlxüsus bizim Şərq camaəti şəklində dəxi təcəssüm edə bilir və ediyor da!.. "Qara məxluq" adı ona boşuna verilmiyor!.. O məxluq zülmət içində qalmaq ilə iktifa və qənaət etmiyor, hətta yuxarıdakı əbyatdan anlaşıldığı vəchlə öz zülməti ilə icabında fəxr dəxi edə biliyor! Diyor ki, zülmət və cəhalət həddi-zatında qayət asanlıqla mövcud və qayim ola bilib onun heç bir növ cismaniyyət və maddiyyata ehtiyacı yox ikən o biçarə işıq, o mənəvi və ruhani olan biçarə işıq hər halda cisim və maddəyə möhtacdır! Bunlarsız bir an vücudu davam edəmiyor! Nə qədər acı bir həqiqət, nə qədər böyük və həqiqi bir acılıq!..

İndi zülmət və cəhalətin yoldaşları olan ətalət və bətaəti nur və ziyanın lazım qeyri məfariqi bulunan tərəqqi və hərəkətlə qiyas edərsək, yenə eyni həqiqət mərrə təbyin edər!.. Ətalət və bətaət bir şeyə möhtac deyil ikən; tərəqqi və hərəkət cisim və maddəsiz olamıyor!.. Bugünkü gün bizim Şərq camaəti, bu camaətin külliyyəti, adlarının əhli-nur və müsəlman olmasına, məmləkətlərinin məşriq, şəmsitaban bulunmasına rəğmən qəri nayab, dərin bir çahi-ətalətdən vasc bir saheyi-zülmət və cəhalətdən ibarətdir! O ətalətin, o zülmətin müdhiş və mühib girdabları, təlatümləri vardır. Cismaniyyat və maddiyyata möhtac olmayan girdab və təlatümləri vardır!..

Şübhə yoxdur ki, Zərdüştün etiqad etdiyi vəchlə axirüləmr Hürmüz Əhrimənə, nur zülmətə qalib gələcəkdir. Ancaq indiki halda bu qalibiyyət məəttəəssüf ancaq maddiyyat və cismaniyyat gücü ilə təmin edilə bilər. Bu maddiyyat və cismaniyyatın fiqdanı üzündəndir ki, bir-iki ildən bəri zülam ilə mübarizəyə cürətyab olmuş olan "Həyat" ceridəsi müvəqqətən tətilə məcbur olur. Bir qəzetə lazım olan maddiyyat isə onun məsarifi-nəqdiyyəsini qapayacaq qədər olan bir məbləğdir ki, camaətin, daha doğrusu, qara camaət arasında nur və ziya tərəfdarı olanların kiseyi-qeyrət və himmətindən çıxmalı idi. Hər bir münəvvərüləfkar olan zat sənədə bir kərrə altı manatlıq bir abunə ücrətini verməkdən çəkinməməli idi. Bir Hacı Zeynalabdin, ya bir İsabəy illər uzunu bir qəzetin məxaric və məsarifi qədər olan böyük bir ziyanı təkbaşına özlərinə alamazlar!.. Bunu camaət idrak etməlidir. Binaənələyh camaətimizə tövsiyə ediyoruz ki, "Həyat"ın tətili müddətincə meydani-mücahidə və mübarizədə bundan sonra tək və tənha qalacaq olan "İrşad" qəzetəsinə əllərindən gələn kömək və müavinəti driğ etməsinlər. Yoxsa, rəbbim göstərməsin o qəzetədən də məhrum olacaq olurlar isə, məmləkətimizin təzədən inqilabdan əvvəlki zülmətə qərq olacağı şübhəsizdir!..

Ədədi-nüfusları bir milyona belə varmayan erməni camaəti yeddi-səkkiz qəzetə və məcmuənin mövcudiyyətini təmin edə bildikləri halda, altı-yeddi milyon Qafqaz müsəlmanlarının bir-iki qəzetə dəxi abunə qeyd olunmaq surətilə müavinət etməmələri həmiyyətsizliyə, qeyrətsizliyə həml olunamazmı? Eybdir, eyb! Hər nə hal isə "Həyat" tətilə məcbur bulunur, ancaq bu tətil məmat ədd edilməsin, ətalət də ədd edilməsin. Çünki "Həyat"ın zində bulunan və həyati-mühərrirədən ibarət olan ruh və canı istihalə və tənasüx qaydasilə "Füyuzat" adlı yeni bir məcmuəyi-ədəbiyyənin cisminə hülul edib bu şəklinövdə məsai və fəaliyyətini təzyid ilə millət və tərəqqi uğrunda olan mücahidati-maarifpərvəranəsində kəmali-mətanətlə davam və səbat edəcəkdir. Binaənələyh şimdilik "Həyat" namına qarelərimizə əlvida deyib eyni zamanda onlara "Füyuzat"ın salamını təbliğ edəriz. "Füyuzat" ədəbi, elmi, ictimai və siyasi həftəlik bir məcmuə şəklində olaraq bu ayın xitamından əvvəl intişara başlayacaq və səhifələri qüdrəti-qələmiyyəyi-ədəbiyyə sahibi olan cəmi mühərririni hürriyyətpərvəranə açıq bulunacaqdır.

"Füyuzat" istər ki, onun səhifələrinə dərc olunan məvad zəvalnapəzir asardan ibarət olub bunlardan böyük və mühüm olanlar icab etdikcə bilaxərə müfid və nafe kitablar şəklinə dəxi qonula bilsin. Rus və Avropa kütübi-elmiyyə və ədibələrindən edilən tərcümələr məəlməmnuniyyə qəbul olunacaqdır. Bu surətlə yavaş-yavaş bir neçə sənənin ərzində zəmanəmizə münasib camaətimizin, ələlxü-

sus bundan sonra yetişəcək şəbanımızın ehtiyacatına müvafiq ana dilimizdə milli bir kitabxana vücuda gətirmiş oluruz ki, bunun millətimizə nə dərəcədə mənafei-əzimə təmin edəcəyi aşkar və dərkardır. "Həyat" qəzetinə abunə qeyd etdirmiş olan qarelərimizə gəlincə bunlar üç şeydən birini intixabda muxtardırlar. Arzuları vəchlə, ya bu abunə ücrətləri özlərinə iadə olunur, yaxud "İrşad" idarəsinə verilir ki, "Həyat" yerinə onlara bu qəzetə göndərilsin. Böylə tələblərdə bulunmayanlara isə "Həyat" əvəzinə qəribən intişara başlayacaq olan "Füyuzat" məcmuəsi irsal ediləcəkdir.

Hər halda qarelərimizin və ələlümum ənvari-maarif və mədəniyyətdən feyzyab olmaq istəyən zəvatın "Həyat"dan ziyadə "Füyuzat"a rəğbət göstərəcəklərini və bu ana qədər "Həyat" sütunlarında bizlərdən şayəd bir günah, ya qüsur sadir olmuş olsa, bunları əfv buyuracaqlarını ümid edərək, "Həyat" tərəfindən cümləsinə xeyirxahanə əlvida eyləriz!..

*Ə.Hüseynzadə*
*"Həyat", 1906, №194*

## HƏYAT VƏ MEYLİ-FÜYUZAT

Məcmuəmizə "Füyuzat" adı ələttəsadüf verilmiyor, bu nam həyatdan təbii olaraq təvəllüd ediyor. "Həyat"ın mənası mənayi-həqiqisi nədir?.. "Həyat" qəzetəsinin birinci nömrəsində "Qəzetəmizin məsləki" ünvanilə bir məqalə vardır. O məqalədə bər vəchiati mütaliədə bulunmuş idik: "Məsləkimiz qəzetəmizin adından da istidlal oluna biləcəyi vəchlə həyatın mənayi-həqiqisinə xidmətdir. Həyat isə mənən, fikrən və maddətən daimi bir hərəkətdən, bir fəaliyyətdən, cismani və ruhani bir nəşvü nümadən, bizi bir dövri-kəmalə yaxınlaşdıran mütəmadi bir nəşvü nümadən ibarətdir". "...Digər tərəfdən məlumdur ki, dünya və həyat bir meydani-cəngdir. Bütün zihəyat daima yekdigərləri ilə rəqabət və mühiti-təbiyyələrilə mübarizədə bulunuyor. İştə qəzetəmizin əsil vəzifəsi bu cəhətdədir".

Bu sözlərə gözəl diqqət edilirsə, görülür ki, burada həyat bir dərəcəyə qədər tərif edilmiş isə də, lakin "həyatın mənayi-həqiqisi nədir?" – sualı cavabsız qalmışdır. Hərəkət, fəaliyyət, rəqabət, mübarizə nə üçündür? Nəşvü nüma, dövri-kəmal nəyə lazımdır? Həyatın



mənayi-həqiqisi nədir?.. Pək çox hükəma və üdəba bu xüsusda zehinlərini yormuşlardı. Bizə qalırsa, həyatın mənayi-həqiqisi meyli-füyuzatdır!..

"Füyuzat" ləfzən "feyz"in cəmülcəmi olub rəfah və bərəkətə, bolluğa, maddi və mənəvi nemətlərin bolluğuna, tərəqqiyyat və kəmalatın şəşəəyi-təcəllisinə dəlalət edərsə də fəqət əsil məfhumu səadət və ələlxüsus səadəti-mənəviyyədir, həqiqi zövq və səfalərdən ibarət bir səadəti-mənəviyyədir. Həyat isə mənayi-batinisilə daimi bir meyli-səadət, bir meyli-füyuzatdır!..

Sözümüzə diqqət buyurulsun: "Həyat-füyuzat"dır demiyoruz, "həyat meyli-füyuzatdır" diyoruz!.. Təbiri-axərlə həyat, füyuzati-vicdaniyyəyə meyil arzusudur. Həyatın övsafından olan, bütün mücahidat və mübarizatımız bu şövqi-mənəvinin sövqi ilə vüqua gəlməkdədir. Bir fərddə, bir cəmaətdə, bir millətdə, bütün bəşəriyyətdə şövqi-füyuzat yox isə, o fərdi, o cəmaəti, o milləti, bütün bəşəriyyəti ölü saymalıdır. Hərəkət və fəaliyyət göstərsə dəxi ölü saymalıdır. Çünki bir meyitin, ölü bir bədənin çürüyüb abu xak və həvayə mübəddəl olması dəxi bir növ hərəkət və fəaliyyətdir. Həyatın dərəceyi-əkməliyyəti, şövq və arzunun şiddətilə və nailiyyəti arzu olunan füyuzati-vicdaniyyənin ülviyyət və səfvət və imtidadı ilə ölçülə bilir... Şübhə yoxdur ki, hər bir fərdi – zihəyat füyuzatı bir növlə anlar: ola bilir ki, şikəmpərvərin biri füyuzatı gözəl-gözəl və bol-bol yeyib içməkdə görər. Ya dünyapərəstin biri xanəndə və sazəndələr arasında, bağ və bağça içində kəmali-söhbət və afət ilə müddəti-mədidə yaşamaqda bulur. Lakin o bağçanın, o səfaxanənin qapısı önündə yığılan bir sürü ac və çılpaq, məsələn, Zəngəzur fəlakətzadələrinin, dərbədərlərinin ahü fəğanlarından vicdanınız müəzzəb olmazmı? ...Müəzzəb bir vicdanla bağ və bağçanın nə səfası ola bilir?.. Yeyilən təam sühulətlə həzmə gedərmi? Həyatın əkməliyyəti üçün arzu olunan füyuzati-vicdaniyyənin imtidadı şərtdir, dedik. Bunu izah edəlim: Bir fəqir mömin vicdanın paklığı və saflığı sayəsində bədülməmat füyuzati-əbədiyyəyə dəxi nail olacağından əmindir. Bir zəngin mülhid, ya bədülməmat füyuzata məzhər olacağından əmin deyildir. Yaxud, öylə bir həyati-sərmədiyyeyi – səadətin varlığına əsla mötəqid deyildir. Bu iki həyatdan hansı mükəmməldir? Şübhə yoxdur ki, birinci həyat, çünki vicdanları bu aləmdə saf və pak olanlar füyuzati-müvəqqətə ilə deyil, füyuzati-sərmədiyyə şövqi ilə yaşayorlar... İştə əsil ülviyyət və səfvət də bu füyuzati-sərmə-

diyyədədir. Budur, vəlvələəngiz inqilabatda kəsrətlə görüb heyran olduğumuz bütün o əzəmətli qəhrəmanlıqlar, bütün o ülvi fədakarlıqlar ancaq böylə füyuzati-sərmədiyyə şövqünün saiqəsilə təcəllinüma olmaqdadır...

Bərxast ze səhraye ədəm gənce-məani
Çun bəhrə-vücudi-əzəli mövc fəşan şod..."[1]

O vücudi-əzəli ke, ona xitabən Feyziyi-Hindi:

Ey həme dər pərde nəhan raze to,
Bixəbər ağaz ze ağaze to.
Ey həde-hüsni to be didar nə,
Vey be təcəlliyi to, təkrar nə,
Hüsn yekist, cilvə berun əz şomar,
Bəhr yekist, mövci həzaran həzar![2] –

deyə münacat ediyor.

Onun haqqında kəmali-heyrətindən zəlaləti-əzimədə bulunan digər bir şair hərzəkuluqda bulunaraq diyor ki:

"Ya kur əst, ya məst əst, ya divanə"

Xeyr, xeyr bina ancaq odur, huşyar ancaq odur, hakimi mütləq ancaq odur!

Aləm cüz və küll, vaqifi elmü-əməl
Hakimi-rəddü qəbul, sahib mənü əta ancaq odur.[3]

Mən istərdim ki, öylə bir sehr, ya əfsun bulunsun ki, onun qüvvətilə bütün millətimizi birdən-birə cəmi füyuzati-vicdaniyyəyə

[1] Yoxluq səhrasından mənalar gənci qalxdı
Əzəli vücudu dəniz kimi dalğalandı.
[2] Ey bütün pərdədə sirri gizli olan
Başlanğıc sənin başlanğıcından xəbərsizdir.
Ey hüsnünün həddi görünməz olan,
Ey təcallası təkrarsız olan,
Hüsnün birdir, cilvən hesabsızdır.
Dəniz birdir, dalğa minlərcədir.
[3] Hissənin və bütövün alimi, elm və əməlin bilicisi, rədd və qəbulun hakimi, qadağan və bəxşişin sahibi.



məzhər etmək mümkün olsun! Heyhat nə öylə bir sehr və əfsun vardır, nə də füyuzat birdən-birə məzhəriyyəti-bəşərin vəs və iqtidarı daxilindədir. Lakin insanların tədricən dünya və ünbada naili-füyuzat ola bilmələri üçün əllərimizdə vəsait vardır.

Bu vəsaitin başlıcalarından biri söyləyib bildirməkdən, kəlam ilə vüquf hasil etdirməkdən və bu surətlə fikir və zehni tənvir, ruh və qəlbi təhəyyüc eləməkdən ibarətdir. Zehn və əql məntiq qüvvətilə tənəvvür, qəlb isə xəyal, təsvir və ahəng ilə təhəyyüc edər. Birinci təriqi tutan və zəka ilə hasil olan kəlamların məcmuuna ülum və fünun, ikinci təriq ilə gedən və zəkadan ziyadə ilhamat ilə vücuda gələn bədaye süxənə əşar və ədəbiyyat deyilir... Bəşəriyyət başlıca tənəvvürati-zehniyyə və təhəyyücati-qəlbiyyə ilə tərəqqi və təkəmmül edib irəliləməkdə və ancaq bu iki təriq ilə naili-füyuzat olmadadır.

Kəlamların ən mükəmməlləri vəhy ilə nazil olan məzamiri-Davud, Tövrati-şərif, İncili-şərif və ələlxüsus Qurani-əzimüşşən kimi kütübi-ərbəəyi-səmaviyyə ilə Zərdüştün, Konfuçeonun və Budda Şakiyamuninin[1] ilhamat və zəkayi-xariqüladə sayəsində vücuda gətirib əxlafa tərk etdikləri asardan ibarətdir. Ancaq bu əsərlər ibrani, ərəbi, zənd, sanskri və Çin dillərində olub bunlardan behəqq istifadəmiz cəmiyyəti-müctəhidin ilə bir əncüməni-maarifin cəhd və qeyrətinə vabəstədir... İngilis şüərasının sərəfrazlarından bulunan məşhur Milton aləmi-lahutda şəşəəpaş olan bir nuri-mənəvi mənbəini vəsf edərkən diyor ki, firiştələr o məqama təqərrüb etdikləri zaman gözləri qamaşdığından qanadlarını gözlərinin önünə sipər edərlər... Bizim də Hənuz gözlərimiz zəif, ağıllarımız qəsir, qəlblərimiz seyqəlsiz olduğu üçün baladə zikr olunan o "bineşgüdaz" mənbələrdən birdən-birə feyziyab olamıyacağız. O qədər büləndpərvaz olmağa cürət edəmiyəcəyiz... O müəllalara süud üçün özümüzün dəlilə ehtiyacımız vardır. Heyfa ki, bu gün dəxi ancaq:

Payə dəlili məra illəti ərəqünnisa![2] –

deyə biliriz. Binaənəleyh özümüzün əczimizə və cəmaətimizin dərrakeyi-idrakına görə, əksəriyən həvayə-nəsimiyi-mənəviyyənin

[1] Şakiyamuni qətiyyən Şapur dövründə gələn Mani-nəqqaş deyildir. Şəmsəddin Samibəy "Qamusi-elam"da bu iki adı qarışdırıyor.
[2] Ayağımın ağrısı belimin ağrısındadır.

aşağı təbəqatında pərvaz edəcəyiz, daha doğrusu hoplayıb duracağız. Bu aşağı təbəqat isə mədəniyyəti-hazirənin bədayeindən, ülum və fünun və sənayenin tərəqqiyyati-hazirəsi ilə miləli-müxtəlifənin əşar və ədəbiyyat və sənayei-nəfisəsindən ibarətdir. "Füyuzat" məcmuəsinin əsil meydani-mücahidəsi bu təbəqələrdə olacaqdır. Bu vasitələrlə məlumati-fənniyyəmizi tovsi, adət və əxlaqımızı təhzib, əşar və ədəbiyyatımızı təsfiyə, lisanımızı, türkcə lisanımızı islah edə biləcəyiz!

Bu surətlə küreyi-ərzi öküzün buynuzundan[1], bəşəriyyəti əjdahaye-hərbin dəhani-atəşfəşanından, milləti divi-mütləqiyyətin pənceyi-istibdadından, hər bir fərdi ifrit ənaniyyət və cəhalətin kəməndi-əsarətindən xilas etmək olur...

Osmanlı türklərinin ədəbiyyati-cədidələri müstəsna olduğu halda İranla bərabər sair türklərin əşar və ədəbiyyatları tilsimə giriftar olmuş kibi bir nöqtədə donub qalmışdır. Təbi-şairanə güldən, bülbüldən, mey və məhbubdan ayrılamıyordu. Bəzi rəhbərlərimiz buna çarəsaz olmaq istədilər, lakin şairlərimizi daha fəna yollara sövq etdilər. Bunlara dedilər ki: "Canım, bülbüldən, məhbubdan əl çəkiniz, bir az da elm və maarifə, sənayeə, məktəbə mədhiyyələr yazınız, cəmaəti elmə, sənətə təşviq ediniz". "Biçarə şairlər də məktəbin, elm və sənətin xidmətçisi olmağa başlayıb, şeri bütün-bütün tədəniyyəyə uğratdılar. ...Bilmiyoram ki, rəhbərlərimiz nədən rəssamlara, heykəltəraşlara, musiqi bəstəkarlarına bu tövsiyədə bulunmuyorlar! Görünür ki, aramızda bu zümreyi-nəfasətpərvəranə rast gəlmədilər, çünki rast gəlsəydilər, bunların da hünərlərini inqiraza uğradacaqları şübhəsiz idi!.. Canım! Nəqqaşa, ya rəssama demək olurmu ki, "nə üçün bir kuhsarın, bir məşcərənin, ya üfüqdür, ya da dəryada vaqe bir qürubun lövheyi-mənzərəsilə məşğul oluyorsan? Bizə bol-bol məktəb rəsmləri ver, cəmaətimizi elm və maarifə təşviq et!.." Şairliyin, rəssamlığın meydani-hünəri ayrıdır... ədiblərin, şairlərin borcu bir tərəfdən türkcəmizi fəsahət və bəlağətlə, ahəngi-üslub ilə islah və təzyin, digər tərəfdən ruhumuzu təsvirati-nəfisə və xəyalati-mühəyyicə ilə müaliyyatə sövq etməkdir. Həqiqi şair, həqiqi rəssam ancaq bizim rəhbərlərimizə bu sözlərlə cavab verməlidirlər:

"Do aləm ba foruğe hosne-yar əst
Məra ba mömin o kafər çe kar əst!.."[1]

*Həyati*
*"Füyuzat", 1906, №1*

[1] Misir qədim dilində əlif Allah deməkdir, Misir əhalisi üluhiyyətin bir öküzə hululuna qail olduqlarından heroqlif xəttində (məbud) fikrini bir öküz başı şəkli ilə ifadə edərlərdi. Avropalıların (a) hərfi bu şəkildən mühərrəfdir. Müruri-zəman ilə bu şəkildən bir buynuz qalıb bizim (əlif) olmuşdur. Yer öküzün buynuzu, yaxud özü üzərində duruyor deməkdən murad küreyi-ərzin hikməti-rəbbaniyyə ilə müəlləqdə bulunduğunu ifham eləmək idi.



## İCMAL

"Həyat" qəzetəsi tətil ediləndən bəri iki ay qədər bir müddət keçdi. Əcəba, bu müddət zərfində həyati-aləmin vüquatı nədən ibarətdir? Rusiyanın xaricində və daxilində vaqe olan əhvala bir nəzəri-diqqətlə baxılırsa, görünür ki, bunların əksəri, bəlkə kaffəsi rus-yapon müharibəsilə, Rusiya hərəkati-inqilabiyyəsi kimi iki vəqəeyi-üzmanın əlan davam edən asarından, əksi-sədasından başqa bir şey deyildir: Şərqi-əqsadə yaponlar Koreya və Mancuriya əndişəsindən xilas olub nəzəri-cahangiranələrini başqa məmalikə əz cümlə Filippin cəzairinə çeviriyorlar, bir az amerikalılar ilə pozuşuyorlar. Bu kimi səbəblərlə bir an boş durmayıb qüvayi-bərriyyə və bəhriyyələrini bir qat daha təzyidə çalışıyorlar. Lakin sadə maddiyyat ilə iktifa etmiyorlar, mənəviyyatlarını dəxi islaha quyluyorlar, tədqiqi-ədyan ilə məşğul oluyorlar. Bəzi rus və Avropa qəzetələrinin, hətta bizzat yapon mühərrirlərindən bir neçə zəvatın rəvayətlərinə baxılırsa, yapon cəmaəti arasında dini-islamı qəbula xeyli meyil edənlər bulunuyormuş. Bu sayədə yaponlar daha ziyadə bir qüvvət və şövkət qazanıb bütün Asiya cəmaətinə pişvalıq edəcəklərini ümid ediyorlar...

Şərqi-islama gəlincə, Türkiyə bolqarların hərəkatından əndişnak olub hər növ ehtimalata qarşı hazırlanıyor, əsgərini bir qat daha təslih edərək Rumeliyə cəm eyliyor. Bu kcşməkeşin arasında Sultan Həmid həzrətlərinin ara-sıra xəstələnməsi münasibətilə ortaya bir vərasətisəltənət məsələsi sürülüyor. Məsailə mətbuat aləmində, ələlxüsus yeni türk mətbuatında bir xeyli qiylü qalı mövcib oluyor. Çünki ortada Mehmed Rəşad əfəndi kimi ümum milləti-osmaniyyənin tərəfdar bulunduğu münasib və məşru bir vəliəhd dururkən, Bürhanədinlərdən, filanlardan bəhs əbəs görülüyor.

[1] Tərcüməsi: "İki aləm yar hüsnünün işığı ilədir.
Mənim mömin və kafərlə nə işim var".

Digər tərəfdən osmanlı maarifpərvərləri, türk hürriyyət mücahidləri sayeyi-Həmididə mərhum Midhət paşa qanuni-əsasinin həsrətini çəkib durmaqda ikən, İran məmalikində Müzəffərəddin şah kimi nəcib və vətənpərvər bir hökmdarın hümməti-aləmpəsəndanəsilə mühüm-mühüm islahat icra olunaraq qanuni-əsasi qüsurlu, qüsursuz yavaş-yavaş meydana çıxıyor. Biz "Həyat" sütunlarında dərc olunan "Vətəni-Firdovsi və hürriyyət" sərlövhəli məqaləmizlə bu islahatı alqışladıq, yenə də alqışlarız. Axır zamanda Tehranda heyəti-vüzəra təbəddül etdi. İndi cəmaət vəkillərindən mürəkkəb bir məclis islahat layihələri ilə məşğuldur. İran paytaxtında "Məclis" namilə intişara başlayan yövmi yeni bir qəzetə vasitəsilə bu xüsusda məlumati-müfəssələ almaq mümkün olacaqdır... İranın, Osmanlının başı bu surətlə qarışmaqda ikən Avropa dövlətləri Şərqin əhvalını nəzəri-diqqətlə tərəssüddən bir an geri durmayıb müşahidatlarından yeni bir tərzdə istifadə yollarını arayor. Rusiyanın əhvali-hazırəsindən naşi Avropa müvazinəyi-siyasiyyəsi rəxnədar olduğu üçün dövlətlər yeni-yeni ittifaqlar təşkilinə qalxışıyorlar.

Təşəbbüs olunan bu yeni ittifaqlarda əsas maddə çox kərrə islam məmləkətlərinin ümuri-daxiliyyəsinə ticarət və iqtisad ya nüfuzi-siyasiyyə bəhanələrilə müdaxilə, İranda, Osmanlıda, Fasda, ya Əfqanıstanda sərzədəyi-zühur olan, ya olacaq bulunan əhvali-cədidəyə qarşı nə surətlə hərəkət etmək məsələlərindən ibarətdir. Məhafili-siyasiyyədə Avstriya və Germaniya ittifaqı müqabilində bir ingilis, fransız, rus ittifaqı məsələsi dövran ediyor. Guya rus ministrlərindən bir-iki zatın da Avropada cövlanları istiqraz arzusundan ziyadə bu məqsədə məbni imiş, şaiyata görə bu ittifaq hənuz tamamilə qüvvədən fele çıxmamışdır. Çünki ingilislərlə fransızlar üç hökumətin deyil, üç millətin ittifaqına lüzum göstəriyorlar. Bu səbəbdən əvvəlcə Rusiya hökumətinin öz cəmaətilə uyuşmasını, bir surətlə barışmasını tələb ediyorlar. Rusiya cəmaətinə miləli-mütəməddinə içində ən ziyadə meyil və məhəbbət göstərənlər ingilislər oldular. Hətta bunlar öz hissiyyati-məhəbbətkaranələrini ruslara bildirmək üçün ümum ingilis cəmaəti arasından seçilmə mürəxxəslərdən mürəkkəb bir heyəti Peterburqa və Moskvaya göndərib sabiq dövlət duması rəisinə bir məhzəri-məhəbbət təqdimi ilə şənlikli nümayişlər ibraz etmək istədilər. Ancaq bunun xilafında olan rus köhnəpərəstlərinin qiylü qalları buna manc oldu. Əcəba, Rusiya hökumətinin millətlə uyuşmaq niyyəti varmıdır? Bəzi əlamətlərə baxılırsa vardır, deyə biliriz.



Çünki hökumət yeni dövlət dumasına intixabatın zamanını bildirib bu xüsusda böyük hazırlıqlarda bulunuyor. Bu hazırlıqlar əsasən dumada özünə əvvəlkindən ziyadə tərəfdar qazanmaq təşəbbüslərindən ibarətdir. Digər tərəfdən müxtəlif firqələrdə cəhdü qeyrətdə bulunuyorlar. Hökumətin öz meyli bu firqələrdən ancaq üçünədir ki, bunlar da "Həqq və nizam", "17 oktyabr" və əxirən Qraf Geyden sayəsində xeyli qüvvətlənən "Təcəddüdi-asayişipərvəranə" partiyalarından ibarətdir...

Hökumət yeni dumada bir müvəffəqiyyət qazanmaq üçün məzkur firqələri himayə ilə iktifa etmiyor, digər tərəfdən xilafgiran firqələrini, hətta ən qüvvətli firqələrdən biri olan kadetləri də təzyiq və təqib ediyor. Vıborq xitabnaməsini imza etmiş bulunan sabiq duma məbuslarını təhti-mühakimədə bulundurur kibi davranmaq da bu növ icraatdandır. Bu haldan bizim müsəlman məbusları da azad deyildirlər. Məlumdur ki, Rusiya məclisi-məbusanında müsəlmanlardan igirmi dördü qərib əza olub on nəfəri Vıborq xitabnaməsinə imza qoymuş idilər. Bunlardan dəva vəkili Axmatov, Ufalı Canturin, Sırtlanov və dəva vəkili Kazanlı Alkin cənabları mühakimə altına alınıb istintaq olundular... Ancaq Vıborq xitabnaməsinə vəzi-imza edənlərin çoxu dəva vəkili, tarixi-hüquq müəllimi, hikməti-hüquq üləması kimi ən mötəbər hüquqşünasandan bulunub Finlandiya torpağında gördükləri işin önünü, arxasını nəzəri-diqqətə almış olduqlarından bunları böyük bir cürm ilə ittiham etmək çox çətin oluyor...

Hər nə hal isə bir tərəfdən hürriyyət naminə islahat icra olunuyor, digər tərəfdən hürriyyəti-kəlamə, hürriyyəti-ittifaqə müğayir hərəkətlər göstərilib bir çox cəmiyyətlər dağıdılıyor, qəzetələr bağlanıyor, bəzi darülfünun qapanıyor, hökumətlə cəmaətin arasında üstüörtülü bir mübarizə olan davam edib duruyor. Bu sənə oktyabr ayının 17-sinin binnisbə sakitliklə keçməsi mübarizənin açıqda olmamasından iləri gəldi...

İnqilabçılar qüvvətlərini, hökumət isə niyyətlərini gizləməyə qeyrət ediyorlar... Gizli, fəqət şiddətli bir mübarizənin əlaimi meydandadır: hökumət məmləkətin hər tərəfində "divani-hərbi-ürfi" qurub terroristləri, yəni tədhişçiləri bol-bol edama məhkum eyliyor, gün, həftə keçmiyor ki, bir neçə adam dar ağacına asılmasın, ya qurşuna düzülüb güllələnməsin... digər tərəfdən gün keçmiyor ki, anarxistlər, tədhişçilər şəhərlərin birisində bombalar partlatmasınlar, qarətlər etməsinlər. Bu qarətlərə çox dəfə hökumət pulları, dövlət xəzinəsi

məruz oluyor... Bu son üç-dörd günün içində vaqe olan hadisələr bu qəbildəndir. Anarxistlər gündüz günortaçağı Peterburqun ən qələbəlik bir mərkəzində Yekaterina kanalı qürbündə jandarmalar ilə mühafizə olunan xəzinə pullarının üstünə bombalar ilə hücum edib yarım milyon qərib bir məbləği zəbt etməyə müvəffəq olurlar. Yenə bu günlərdəki teleqrafların bildirdiklərinə görə bu növ bir hadisə Varşava qürbündə Roqov mövqeyində vaqe oldu. Anarxistlər mühafizə qoşununu bombalarla partladıb dəmir yol qatarı ilə gedən dövlət pullarını zəbt etdilər... Bizim Qafqaz da bu əhvali-şurişəngizdən azad deyildir: Tiflisdə də bomba partladı, Bakıda isə altmışa qədər bomba partlamadan zəbtiyyə tərəfindən tutulub müsadirə oluna bildi... Demək ki, bizim Bakı cəmaəti dəxi bombalar üzərində oturuyormuş... Əcəba bizim Bakı müsəlmanları nə ilə məşğuldurlar?.. Bunlar da bir-birlərini qətl etməklə, mollalardan, pişvalardan mürəkkəb məclislərin vəzü nəsayehinə rəməzan günlərinin qüdsiyyətinə rəğmən yekdigərlərini öldürməklə məşğuldurlar.

Əcəba bizim "Füyuzat" nə ilə məşğuldur. "Füyuzat" da bir şairin bu sözlərini virdi-zəban etməklə məşğuldur:

"Dərheyrətəm konun ke cəhan por ze koştənist
Bikar dər niyam çera zülfüqar mand?.."[1]

Nə üçün o qüvveyi-mənəviyyədən ibarət olan Zülfüqar işsiz qaldı?

*Ə.H.*
*"Füyuzat", 1906, № 1*

[1] Tərcüməsi: "Heyrətdəyəm ki, dünya ölümlə doludur,
Qılıcn nə üçün qında işsiz qalsın".



## VƏQAYEYİ-ALƏMƏ BİR NƏZƏR

Bu nömrəmiz İranda vaqe hərəkati-inqilabiyyənin silsileyi-vüquatından bir vəqeyi-mühümməni irayə edən bir lövhə ilə müzəyyən və müsəvvərdir. Tehran üləması ilə əhalidən böyük bir firqə ingilis səfarətxanasına müraciət ediyor. Bu vəqəyə nə nəzərlə baxmalıyız? Burada həm bəyənilecək, təhsin ediləcək, həm bəyənilməyib təqbih olunacaq cəhətlər vardır. Surəti-zahirədə bir əhalinin biganələrin, əğyarın təhti-himayəsinə iltica etməsi vətənpərvərligə müğayir görülür və görülməlidir də. Ancaq bu məqamda xeyr! Məmləkətdə hürriyyət, ədalət nizam hökmfərma ola idi, biz də bu hərəkəti təqdir edər idik. Lakin məmləkəti-hürriyyət və ədalət kibi nemətlərə nail edib anı ehya və təcəddüd uğrunda həqiqi vətənpərvərlər heç bir vasitədən çəkinməməlidirlər. Əldə qan tökülməyəcək çarələr var ikən xunrizanə vəsaitə müraciət əbəsdir. Tarixə rücu edərsək görüyoruz ki, dövri-inqilab başlayan məmləkətlərin əksərində zümreyi-əhrarə əcanibin imdadına müraciəti heç bir zaman məyubədd etməmişlərdir. Fransanın Volterləri, Jan Jak Russoları dara düşdükcə İsveçrəyə fərar ediyorlar. Macarıstan, yəni Venqriyanın Koşutları hürriyyət naminə osmanlıların ziri-cinah himayələrinə qoşuyorlar: Türkiyənin Midhət paşaları, Səid paşaları səlaməti-vətən naminə ingilislərə, fransızlara iltica ediyorlar. Əxirən rus məbusları dəxi Finlandiyaya getmədilərmi, İsveçə getmək niyyətində bulunmadılarmı? Tehran əhlinin dəxi dünyanın nərəsində olursa olsun hürriyyəti alqışlayan ingilislərin himayəsinə sığınmaları bu növ hərəkətlərdən olub, inqilab əsnasında mümkün mərtəbə az qan tökülmək üçün hüsni-tədbirdən başqa bir şey degildir.

Bu da ingilislərin təşviqi-əsəri olmayıb iranlıların öz mücahidati-hürriyyətkəranələrinin nəticəsidir. Misirdə çıxan "Türk" qəzetəsi bu xüsusda bəzi mütaliatda bulunuyor. Lakin mütaliat yanlışdır. Bu yanlışlıqlar nərədən iləri gəliyor? Köhnə türklərin yanlışlıqlarının mənbəyi mütəəddiddir. Bizim bunlarla işimiz yoxdur. Bizim üçün yeni türklərdən bəzi firqələrin mənbəi-zəlaləti daha mühümdür, bunların zəlalətləri, səhv və xətaları nərədən nəşət ediyor? Bunları hər vəqt yanıldan üç məsələdir: məsələlərin birisi sünniliyi, şiəliyi ayrı-ayrı bir şey hesab edib islamiyyəti həqqilə anlamamalarıdır, ikincisi xilafət bəhsini islamiyyətlə qarışdırıb aləmi-islama mənafei-xilafət nöqteyi-nəzərindən baxmalarıdır, üçüncü məsələ isə sülalə bəhsi olub türklüyü osmanlılıqdan, yəni xanədani-ali-Osmana mərbut bilməkdən ibarətdir.

Onlar aləmi-islamın nicatını bu üç nöqtənin dairəsində arayorlar... Hər bir əhvalı bu üç şişeyi-büllurun mavərasində görülən əlvana boyanmış görmək istiyorlar... Bizim isə aləmi-islamda, ya aləmi-ətrakdə əhəmiyyət verdigimiz, rəbti-qəlb etdiyimiz, meylü məhəbbət bağladığımız şey nə məzhəbdir, nə xilafətdir və nə də filan, ya filan

sülaleyi-hökmdaridir. Bunların heç biri degildir, bunu bir kərrə anlamalıdır. Bizim sevdiyimiz, rəbti-qəlbi-məhəbbət etdiyimiz şey nərədə olursa olsun ancaq dindaşlarımız və həmcinslərimiz olan millət və cəmaətdir. Əfradi-nasdən ibarət millət və cəmaətdir. Qurani-məciddən, əhadisi-nəbəviyyədən ayrılmayan hansı hökuməti-islamiyyə, hansı sülaleyi-hökmdari olursa olsun, ədalət, hürriyyət və qanuni-əsasi sayəsində müsəlmanlardan və müsəlmanlar miyanında türklərdən ibarət cəmaəti, milləti təriqi-tərəqqi və mədəniyyətə sövq edərsə, bizim də meylü məhəbbətimiz o tərəfə olur. Quru xilafət ünvanlarının, sülalə şöhrətlərinin təfriqeyi-məzhəb mübahisələrinin vəqti keçmişdir. Bizim üçün xilafət Mütəvəkkil Əlallahınmı, Sultan Səliminmi əlində olacaq, yoxsa ləyaqət kəsb edər, həqq qazanırsa Mikadonunmu yədinə keçəcək, əsla əhəmiyyəti yoxdur. Kəza bizim üçün filan hökuməti-islamiyyənin təxtində kim oturur, oturan hansı sülalədəndir, yenə əhəmiyyəti yoxdur. İş o təxtin mətin və möhkəm olmasında və o sayədə müsəlman cəmaətinin kəsbi-qüvvət edib hürriyyət və məarif nemətlərinə nail olmasında, rifah və səadətlə yaşamasındadır... "İctihad" məcmuəsinin məsləkini bəyənməyən "Türk" qəzetəsi bu nöqtələrə əhəmiyyət vermədigi üçün İran hürriyyəti haqqında yanlış mütaliatda bulunmağa məcbur oluyor:

"Türk" zənn ediyor ki, İranda vaqe hərəkati-inqilabiyyə ingilis təşviqatının əsəridir. Bir fərdin sinni-büluğə yetişməsi ətrafında olan insanlardan kimsənin əsəri-təşviqi olmayacağı kibi, iranlıların da dəvayi-hürriyyət edərək, bu yolda asari-büluğ göstərmələri ingilis əsəri olamaz. İngilislərin aləmi-siyasətdə ən böyük hünərləri hadisələr törətməkdə olmayıb bəlkə binəfsə hüsulə gələn hadisələrdən istifadə eləmələridir. İran hadisatından ingilislər nə yolda istifadə ediyorlar və edəcəklər, o bəhsi axər, lakin hər halda hadisati-məzkurə ingilislərin keyfi ilə hasil olmamışdır. Bizim etiqadımızca bu vüquatda daha ziyadə Rusiyanın, Rusiya əhvalının təsiri vardır. Bu xüsusda mütaliatımızı sərd etmədən baxalım "Türk" nə diyor.

"Rusiya hərbin verdiyi zəf nəticəsi olaraq atəşi-ixtilal içində yanıyor, ingilislər yanğından kəndi hissəsinə əsabət edən malı qaçırmaqda təəxxür etmiyor, İrana tövcih nəzər ediyor. İranı rusların həm istilasından qurtarmaq, həm də Hindistan yolunu bu cəhətdən qapamaq təriqini düşünüyor. Əcəmlər zülm və istibdadi hiss etmiyor. Fəqət aclıqdan müztərib, şikayət ediyorlar. On sənə əvvəl Şiraz əhalisinin aclıq üzündən valini qovmaları buna bir dəlili-mətin təşkil ediyor. İngiltərənin əlində əcəmləri təhrik üçün bir vasitə var. İştə bu vasiteyi-qanuni-əsasi almağa alət ittixaz ediyor. Əcəm hökumətinin başqa yolda nicat bulmasının imkanı yox, əcəmlərin səfaləti artıyor, əskilmiyor, müctəhidlər zəngin, zövq səfa içində yaşayorlar. İngilislər bunların nəzər-diqqətlərini cəlb ediyor. Əhalinin fəqir və səfaləti nəhayəti-dərəcəyi bulmuş. Əgər xalq ixtilal edərsə, bittəb bu üsyandan kəndilər yenə də böyük bir hissə zərər isabət edəcəginə müctəhidləri iqna ediyor". Müctəhidlər kəndilərini zərərdən qurtarmaq və milləti hökumət əleyhinə təşviq eləmək üzrə rəyasətə keçiyorlar. İngiltərə səfarətinin tərtibi üzrə ixtilal pək bəsit surətdə vüqua gəliyor. Bazarları qapayıb İngiltərə səfarətxanasına iltica ediyorlar. Əhali ac, əkmək parəsini tədarük etməyə vasitə yox. İngiltərə səfarətxanasında yeyəcək, içəcək bol-bol mövcud, səfarətxanaya gedib qarnını doyurmaq əlbəttə rədd olunur nemətlərdən deyil, əhali fövc-fövc səfarətxanaya qoşuyor, səfarətxananın məbna bulunduğu böyük bağçada çadırlar quruluyor, səfil müsafirlərin qəbuluna təxsis ediliyor. İştə bu surətlə İngiltərə səfarətxanasına tam on altı min müsafir toplanıyor. Həftələrcə orada iaşə və istirahətləri təmin olunuyor. Yövmiyyə nəfər başına laəqəl beş quruş sərf edilsə, hər gün üçün əcəm tüccarlarının əlilə sərf olunmaq üzrə İngiltərə xəzinəsindən 800 lirə çıxıyor. Bu 16000 ixtilalçı səfarətxanada oturduqları əsnada ya məddahlar tərəfindən söylənilən misalı dinliyor və ya Kərbəla vəqaye dilsuzinin matəmi ilə ağlayor. Heç birinin istehsalı uğrunda üsyan etdikləri qanuni-əsasinin tərzi-idarə və mühafizəsindən bəhs etmək xatirinə gəlmiyor. İxtilalın tərzi cərəyanından da anlaşılıyor ki, bu hürriyyətçilər istədiklərini bilmiyorlar. Hürriyyəti hiss edərək, istehsalına qiyam edən 16000 kişinin qoyun sürüsü kimi bila vüquat səfarətxanaya iltica etməsi inanılır qərabətlərdən olması gərək. Bu qədər etidal və sükunət demə doğrusu təəccüb etməmək mümkün deyildir. Məbusanların ədədindən və üsuli-intixabından da anlaşılıyor ki, bu təşkilat sırf təqliddən ibarətdir. Məmafiyə bunun da faidəsi münkər deyildir. Zaman hər şeyi vasili-əqsayi kəmal eylər. Fəqət icab edən zaman zərfində bu təşkilat davam edə biləcəkmi? Bu sırf rəiskarda bulunacaq şahların hiss və fikrinə tabe bir keyfiyyətdir".

Burada bir etiraz dərmiyan oluna bilir. İngiltərə hökuməti Türkiyənin İrandan daha qəvi hökumətə bənzər təşkilatı da olduğu və ruslara qarşı daha mətin bir sipər ola biləcəyi halda Türkiyəyə müavinət etməsində neçün əcəmlərin hürriyyət almasına, qanuni-əsasi

ilə idarə olunmasına çalışsın? Xüsusilə, Türkiyəyi müdafiə üçün vəqtilə bu qədər də uğraşmışdı. İlk nəzərdə İngiltərəyə ən nafe Türkiyəni diriltmək siyasətini təqib etmək olduğu görülür. Fəqət bir az təmiq edərsək, İngiltərə nöqteyi-nəzərindən əhvalın dəyişdiyi anlaşılır.

İngiltərə ilə bərabər Rusiya və Fransanı düşündürən Türkiyə hökuməti hazirəsinin ittihadi-islam politikasını təqib etdiyinə olan qənaətləridir. Türk padşahları eyni zamanda aləmi-islamiyyətin rəisi bulunduqlarından bu qüvveyi-mənəviyyəyə isnad edəcək olan qüvveyi-əsgəriyyə İngiltərə mənfəətinin ən möhlük zərbəsi olur. Yuxarıdan bəri sərd mütaliatdan təzahür edə biliyor ki, Yaxın Şərqdə ruslara bir sipər olacaq hökumət arayan İngiltərə xilafət kimi qorxulacaq bir qüvveyi-mənəviyyəsi olmayan Əcəm hökumətini, məşrutiyyət idarə ilə diriltməyə çalışıyor. Fəqət, türk mühərriri yanılıyor. Çünki, İran əhlinin mücahidati-hürriyyətpərvəranəsində ingilis barmağı görmək və bu xüsusi ingilislərin xilafət və ittihadi-islam qorxusu ilə Hindistanı müdafiə etmək tədbirlərinin məhsulu kimi tələqqi etmək xətadır. Bizim etiqadımızca İrandakı əhval bir tərəfdən iranlıların həddi-büluği ictimaiyyəyə yetişmələri ilə, digər tərəfdən Rusiya inqilabının əksi-sədasının nəticəsidir. İran əhlinin ixtilatı ingilislərdən ziyadə ruslarladır. Bu ixtilat ötədən bəri iki vasitə ilə vüqu bulmaqdadır. Bunlardan biri ticarət və digəri də qövmiyyətdir. İranlıların çoxu tüccar olub, qürbətlə məlufdurlar. Bunların meyilləri ticarəti-bəhriyyədən ziyadə ticarəti-bəriyyəyədir. Onları Ummani-Hind qorxudub, Hind səfərinə o qədər rəğbət etmədikləri halda kəsbi-kar əməli ilə axın-axın həmhüdud olan Rusiya torpağına gəlməkdədirlər.

İranlılara bütün Qafqazda, bütün Mavərayi-Xəzərdə, hətta Volqa nəhri boyunca Rusiyanın ta qəlbgahında kəsrətlə rast gəlmək olur. Nijni-Novqorodda hər sənə vaqe olan yarmarkaya "panayir" deyilən ticarət sərgisinə əcnəbi müsəlmanlardan ən ziyadə iştirak edənlər iranlılardır. Mümkün deyildir ki, Rusiyanın hər tərəfinə yayılmış olan iranlılar bu ölkədəki hürriyyət vəlvələlərinə qarşı bihiss qalmış olsunlar. Bakıda və sair şəhərlərdə iranlıların bina etdikləri məktəblər, təşkil etdikləri cəmiyyətlər bu təsiratın əlamətlərindəndir. Qövmiyyət bəhsinə gəlincə məlumdur ki, Rusiya əhalisinin bir qismi türklərdən ibarət olduğu kimi, İranın da bütün cəhəti-şimaliyyəsi, bilxassə Azərbaycan qitəsi türkdür.

İranın əyaləti-cənubiyyəsinə gəlincə burada sakin olan farsların adət, əxlaq və hətta lisanca türklərdən o qədər fərqləri yoxdur, hətta



lisanca diyoriz, çünki hər iki dil müsəlmanlaşdığı üçün bir-birlərinə o qədər təqərrüb etmişdir ki, cüzi bir himmətlə fars türkün, türk farsın lisanını anlaya bilir, çünki fərq lüğətlərdə olmayıb ancaq qəvaiddədir. Misal üçün bir cümlə irad edəyim:

Fars deyir: İn coridə ke əhle-Qafqas qeraət mikonod,
be lesane-torki mühərrir əst.

Türk deyir: Bu cəridə ki, əhli-Qafqas qiraət ediyor,
lisani-türki üzrə mühərrirdir.

İran farslarının qanı türk və fars qanlarından ibarət olduğu kibi, İran türklərinin də qanı eyni-ənasirdən mürəkkəbdir.

Hal və keyfiyyət bu mərkəzdə ikən İrandakı hərəkati-hürriyyətkəranənin səbəbini ingilis hökuməti barmağının ucunda degil, Rusiya cəmaətinin qəlbindən fövran edən atəşi-hürriyyətin İrana düşmüş şərarələrində aramalıdır.

Suzişe-eşq əst ke əndər ney fotad[1].

Bizim buradakı axundlarımızdan Axund Əbu Turab həzrətləri məsələyə "Türk" cəridəsindən daha dərin, daha kəsgin bir nəzərlə baxıyor. Müşarileyh bir gün məsciddə buyurdular ki, İranı vəlvələyə verən qəzetəçilərdir. Axundun bu sözlərindən dilgir olanlar oldu. Lakin söz əsasən min-cəhətüh pək doğru idi.

Ancaq ortada neyistan kibi qabili-ehraq məvadd olmayınca heç bir şərarənin əhəmiyyəti olamaz, İran isə əvvəlcə Ziya paşanın dedigi kibi "İranda gələn hünərvəranın arayişi hər biri cahanın" Beyzavilərin, Zəməxşərilərin, Fəxri Razilərin, Cövhərilərin, Firdovsilərin, Sədilərin, Ömər Xəyyamların "izhari-ülum" ilə hazırladığı bir neyistandır. Hər bir iranlı ac da olsa, maarifdən məhrum da olsa yenə fitrətən hər bir sair qövmdən ziyadə bir istedad və qabiliyyətə malik olub o sayədə mühit müsaid olduqca hər zaman təfəyyüz edə bilir.

"Türk" diyor ki, iranlıları hürriyyət yoluna sövq edən qüvvət aclıqla mollaların, müctəhidlərin nüfuzudur. Fəqət hansı qövmün inqilabatında aclıq, pulsuzluq kibi əhvali-iqtisadiyyə ilə heyəti-ruha-

[1] Eşqin yanğısıdır ki, tütəyə düşdü.

niyyənin nüfuzu böyük bir rol oynamamışdır. İstər keçmişdə Fransa ya Germaniya inqilabında, istər bugünkü Rusiya inqilabında bu iki qüvvətin hökmü aşkar deyilmidir?

Lüterlər, Qaponlar, Xacə Təhsinlər, Əli Süavilər zümreyi-ruhaniyyədən degillərmi?..

İranın eyni yollar ilə getməkdə olduğuna əsla təəccüb etməməlidir. Qaldı ki, iranlıların ingilis səfarətində yığılıb hürriyyət və qanuni-əsasidən dəm vuracaqlarına, vəqeyi-dilsuz Kərbəla üçün mərsiyələr oxuyub ağlamaları bu xüsusda hərçənd ağlamaq insani bəs və rəxavətə düçar edən əhvaldan isə də ancaq "Türk" şurasını düşünmiyor ki, hərəkati-inqilabiyyəni bir müvəffəqiyyətlə əncamə yetirmək üçün, cəmaət üçün "orqonizasiya" deyilən bir intizami-təşəkkül lazımdır.

İranda isə qədimdən bəri bu matəmlər münasibətilə verilən xeyrat sayəsində bir növ "orqanizasiya"lar mövcud olduğundan firqeyi-əhrarın da o orqanizasiyalara müraciət etmələri təbii idi. On beş, on altı min bir cəmaətin iki həftə zərfində müntəzəmən yeyib-içmələri ingilis pulundan ziyadə bu orqanizasiyaların məharəti ilə olmuşdur... Əlhasil işin nə sürətlə cərəyan etdiyinə əhəmiyyət verməyib nəticəyə baxmalıdır: Nəticə isə osmanlı türkləri tərəqqiyi-məariflərinə rəğmən əlan istibdad əlindən dadü fəryad edib durmaqda ikən iranlılar yavaş-yavaş hər nə surətlə olursa olsun hürriyyət nemətlərinə nail olmaqdadırlar. Lazım olan da budur, vəssalam...

*Ə.Hyseynzadə*
*"Füyuzat", 1906, №2*

## TOLSTOYLUQ NƏDİR

Bir ailə əfradı o ailənin əzası bulunduğu kibi millətlər də bəşəriyyətin üzvləridirlər. Bir ailənin əzası kimi millətlər də heç bir vaxt bir sinndə, bir yaşda bulunmazlar. Bəziləri hənuz sinni-tüfuliyyət, ya şəbabda bulunduqları halda, digərləri dövri-kəmalə yetişmiş, ya dövri-zəvalə üz tutmuş olurlar.

Bir fərdin gah-gah mübtəla olduğu iləl və əmraz əlayimi – zəvaldən sayılmayacağı kibi, millətlərin də vaxt-vaxt düçar olduqları mərəzi-siyasilər, böhrani-ictimailər zəval əlamətindənədd olunmamalıdır. Vaqiən möhlik mərəzlər, şəfanapəzir illətlər vardır. Fəqət əqəbində daha gözəl bir afiyyət hasil olan xəstəliklər də vardır. Zəval və şeyxuxətin əlaimi ayrı, mərəzin əlaimi ayrıdır. Bəzi fərdlərin zəval və məmatları ilə bərabər nəsilləri də müntəqe olur, bəzilərinin də biləks vəfatlarından sonra öz nəsillərindən övlad və əhfadları qalır ki, bunlar tüfuliyyətdən başlayıb yenidən səfəhati-həyatı bir-bir keçməyə başlarlar.

Millətlər də elədirlər. Bəziləri finikiyalılar, ya assorilər kibi bilkülliyyə məhv və münqəriz olurlar, bəziləri də zaval bulduqca yerlərində yenə öz nəsillərindən bir qövm təzə bir həyata başlar. Turanın (tukuye) oğuzları ilə İranın zəndləri belədirlər: tukuyelərdən sonra uyğurlar, uyğurlardan sonra bugünkü türk və tatarlar; zəndlərdən sonra pəhləvilər, pəhləvilərdən sonra bugünkü farslar bir həyata başlayorlar.

Rusiyada bu gün müşahidə etdiyimiz əhval isə zaval olmayıb bir mərəz sayılmalıdır. Mancuriya alamı, inqilab böhranı mərəz əlayimidir. Bu mərəz hər nədənsə təmamilə rusların sinni-kəmalə yetişdikləri bir zamana rast gəldi. Əvət əsri-hazır bəşəriyyətin bir üzvi-mühümmi olan rus millətinin dövri-kəmalidir. Çünki meyvələrinin bolluğu və yaxşılığı bir ağacın kəmalda bulunduğuna dəlalət edər kibi, bu gün də bədayeyi-elmiyyə və ədəbiyyənin kəsrət və nəfasəti rusların sinni-kəmalə yetişdiklərinə dəlil və bürhandır. Şəcəri-milliyyətin meyvələri asari-elm və mərifətdir. Bu gün Rusiyada yetişmiş olan bir zümreyi-kəsireyi-hükəma və üdəbaya bütün Avropa və Amerika qibtə ediyor. Lakin bu zümrənin sərəfrazı heç şübhə yoxdur ki, qraf Lev Tolstoydur. Tolstoy sadə Rusiyanın deyil, bəlkə bütün cahanın ən böyük üdəbasından biridir. Onun yazdığı əsərlər əksər əqvamın dillərinə tərcümə olunuyor, sürətlə və milyonlarca nüsxələrlə intişar ediyor. Onun hər bir sözü böyük bir diqqətlə istima olunuyor. Hər bir nəsihəti əzim bir rəğbətlə tələqqi ediliyor. Onun əfkarından bütün aləmi-mədəniyyət feyziyab oluyor. Bu əfkar vaqiən səhv və xətalardan ari deyildir. Tolstoy çox dəfələr zəlalətdə bulunur. Lakin bu səhv və xətalar, bu zəlalətlər dəxi bədayepərvəranə olub ruhi-bəşəri məaliyyata sövq eliyor, ərbabi-ictihadın mənəviyyatını təhəyyic ilə məsaili-mühərrəqeyi-həyatiyyə və ictimaiyyənin həllinə kömək ediyor. Tolstoy bəlkə dərin bir mütəfəkkir degildir. Lakin hər halda vase bir bəhri-bədayedir.

Keçmiş əsrlərdə və sair məmləkətlərdə Şekspirin, Getenin, Jan Jak Russonun, Viktor Hüqonun ədəbiyyatda qədr və əhəmiyyətləri nə

isə, Tolstoyun da zəmanəmizdə, Rusiya ölkəsində əhəmiyyəti o qədərdir. Zatən rus və Avropa müntəqidi də onu zikr olunan məşahir ilə qiyas etməyi sevirlər. Ancaq bu növ qiyaslər Tolstoy haqqında bizə bir fikir verəmməz. Çünki Qərbin o məşahiri üdəbası dəxi Tolstoyun özü kimi bizim Şərq cəmaətinə hənuz məchuldur. Tolstoyun bulunduğu mövqeyi-büənd, tutduğu məslək bədaye haqqında bir fikri-səhih etmək üçün anın nəzirlərini müsəlman aləmində arayalım: Yeni türklərdən Namiq Kamal bəy xatirə gəlirsə də, fəqət Kamal bəy Tolstoya qiyas olunmaz. Çünki Kamalın ömrü vəfa etmədi.

Kamal bəy dövri-kamalına hənuz yetişdiyi sıralarda və ancaq əlli, əlli beş yaşlarında bulunduğu halda, Osmanlı istibdadi-hazırının seyyiatı qarşısında qəhrindən çürüyüb Saqqız cezirəsi mənfasında fövt oldu. Kamal Rusiyada və ruslar arasında dünyaya gələ idi, bəlkə behoqq bir Kamal olurdu. Tolstoy da Türkiyədə buluna idi, əsla Tolstoy olamazdı. Daha doğrusu, Rusiya idareyi-hökuməti Osmanlınınkı qədər səqim, Osmanlı idarəsi Rusiyanınkı qədər binnisbə məqul ola idi, Kamal Tolstoy olmasa da, Tolstoy mərtəbəsinə irtiqa, Tolstoy isə Kamal bəy olmasa dəxi Kamal dərdinə mübtəla olurdu. Bir də bu iki təb arasında heç bir vəchlə müşabihət yoxdur. Kamal atəşzəban bir ədib şairdir, onun kəlamı məhruqdur, od kibi yakar.

"Sərd tənan atəş əz u yaftənd...[1]

Tolstoy isə şirinzəban bir həkimdir". Sözləri çox dəfə məhruqülfuadlər üçün zülal yerinə keçər... "Məxzənül-əsrar" lisanilə burada

"Gərmrəvan ab ze u yaftənd"[2] –

deyə biliriz.

Hər nə hal isə mühitlərin, dərəceyi-mədəniyyətlərin müxtəlif olmasındanmıdır, nədənmidir, türklər arasında Tolstoyun eşini bulamıyoram. İrana keçəlim: Burada üç böyük şair vardır ki, onların üçünü bir araya gətirib Tolstoy ilə qiyas edərsək, bəlkə bu ədib haqqında daha dürüst bir fikir hasil etmiş oluruz. Üç şairdən muradımız Firdovsi, Sədi və həkim Sənaidir. Asarın mənzum və mənsur olmaq kimi fərqi-zahirisinə əhəmiyyət verməyəlim, mənaya baxalım. Tolstoy ayrı-ayrı bu üç şairin heç biri degildir. Fəqət hər birindən guya bir hissə alıb təbində cəm etmişdir.

[1] Soyuq bədənlilər onda atəş tapdılar.
[2] İsti bədənlər ondan su aldılar.



Tolstoyun həyati-ədəbiyyəsi üç dövrə təqsim oluna bilir. Birinci dövr Firdovsiyanə, ikinci dövr Sənaipəsəndanə, üçüncü dövr isə Sədi rəftarənədir. Birinci dövrdə Tolstoy Firdovsi kimi bir "Şahnamə" vücuda gətiriyor. "Hərb və sülh" ünvanlı əsəri-cəsim bir rus şahnaməsidir. Firdovsi Keykavus və Əfrasiyab dövründə vaqe iranilər ilə turanilərin mübarizə və müharibələrini vəsf və tərif edir. Tolstoy birinci Aleksandr və birinci Napolyon zamanındakı ruslarla firənglərin cəng və cidalını təsvir eləyir. Hər iki əsər bir silsileyi-hekayatdan ibarətdir. Hər iki əsərdə insan gah cəmaət və el şəklində, gah şəxs və fərd halında təsvir olunuyor. Hər iki ədib ara-sıra bəşərin əmaqiruhiyyəsini təmiq və təşrihə girişiyorlar. Hər iki ədib xeyir və şərin nədən ibarət bulunduğunu araşdırmaqda böyük bir cəhd və qeyrət göstəriyorlar. Hər ikisinin nəzəri-həkimanələri bir dərəcədə kəsgindir. Hər ikisi də əsərlərini öz millətlərinin vəsaiqi-tarixiyyələrini dərin və ətraflı bir mütaliədən sonra yazmışlardır. Hər ikisi də vətənpərvərdir. "Hərb və sülh"də yerlər vardır ki, Tolstoy Firdovsiyə təfəvvüq edər, "Şahnamə"də qitələr var ki, Firdovsi Tolstoya qalibdir.

Ancaq zənnimizcə "Şahnamə" daha şairanə və büləndpərvazanə olub, dövri-islamə qədər olan bütün İran tarixini itmam və təkmil etmişdir. "Hərb və sülh" isə daha təbii olduğu halda natəmamdır. Çünki Rusiya tarixinin bir qismi ilə iktifa edilmişdir. Firdovsi ömrünün axırına qədər tutduğu məsləkdən ayrılmadığı halda Tolstoyun həyatında mühüm bir böhran vaqe oldu. Bu böhrandan sonra başlayan ikinci dövrdə Tolstoy artıq nə Homerdir, nə də Firdovsi. Burada Tolstoyun halı həkim Sənainin halını andırıyor. Məlumdur ki, Sənainin həyati-ədəbiyyəsində mühüm bir təbəddül, əzim bir böhran vüqua gəldi. Sənai əvvələ dünyapərəst ikən və ömrünü paytaxtlarda, padşah və kübar məclislərində keçirməkdə ikən günün birində bu yolda bada gedən ömründən və o günə qədər yazmış olduğu əsərlərdən nifrət edib, illərcə cəm etmiş olduğu divani-əşarını ehraq elədi. Özü də guşeyi-inzivayə çəkilib dünyadan əl çəkdi. Bundan sonra Sənainin mücahidatı fisəbilüllah olub, yazdığı şeylər fəzailiəxlaqə, ehkami-diniyyə və əhvali-mənəviyyəyə dairdir. Sənainin fikri çox kərrə cavabsız qalan dərin-dərin məsələlərlə müztəribdir. Bununla bərabər biçarə Sənai özlərini din və məzhəb harisləri bilən

üləmayi-əsrinin sərzənişinə düçar oldu. Onun "Hədiqə"si əqaidi-islamiyyəyə müğayir ədd olundu. Bütün bu hallar zəmanəmizdə, Rusiyada Tolstoyun başına gəldi. Tolstoy ibtida ömrünü Peterburqun aləmi-hay-huyu içində keçirən əhli-dünya bir zat ikən bilaxərə bütün mazisinə lənətxan olub, o vaxta qədər yazmış olduğu "Hərb və sülh", "Anna Karenina" kibi asari-mötəbərəsindən özü nifrət etdi. Şübhə yoxdur ki, bu əsərlər mətbuat vasitəsilə ziyadəsilə intişar etmiş olmaya idi. Sənai kibi Tolstoy da onları cəm edib ehraq binnar edər, yaqar idi. Fəqət hər halda ehraqə məhkum etmişdir. Bu təbəddüldən sonra Tolstoy ribyandan olan filosoflar kibi vaxtını bir müddət şübhələr, tərəddüdlər içində keçirir, dünyanın faniliyi ona əzim bir yəs verir. Tolstoy bir an əvvəl həyatın əlindən xilas olub ölmək istiyor. Fəqət hər nədənsə öləmiyor. Yavaş-yavaş bir təriqi-nicat sezməgə, o nicatı da dində görməyə başlayor. Miləl və əqvamın kütübi-diniyyəsini qarışdırmağa quyuluyor. Bu məqamə yetişdikdən sonra Tolstoyun bütün yazdığı risalələr dindaranə və fəzaili-əxlaqa dair oluyor. Bu risalələrin çoxunda Tolstoy İsəviyyəti-hazirədə batili haqdan ayırmağa cəhd etdiyi üçün bu üzdən keşişlərin tən və sərzənişinə giriftar olub, nəhayət rus kəlisasından tərd olunuyor.

Buraya qədər həkim Sənai ilə Tolstoy arasında müşabehət tamdır, zənn edirəm. Ancaq müşabihətlər burada bitir. Bundan sonra Tolstoy artıq Sənai də degildir. Sənai ömrünün sonuna qədər səbat edib, guşeyi-inzivasından çıxmadı. Tolstoy isə hissiyyati-kübaranədən nifrət elədi. Lakin guşeyi-inzivayə də qənaət edəmədi. Onun fikrincə kübar aləmində dəmgüzar olub xassə məxsus "Şahnamə"lər, hərbnamələr, məhəbbətnamələr yazmaq şüari-insaniyyətə yaraşır, mücahidatdan sayılmayacağı kibi zaviyənişin olub minacatlar, tövhidnamələr yazmaq da fisəbilillah çalışmaq degildir. Ədibi-aqil, insani-kamil xalqa, elə qoşulmalıdır. Bədənin bütün əzalatilə, qolla, bacaqla, barmaqla, beyinlə, alın tərilə işləyib çalışmalıdır. Əkinçi kibi, fəhlə və həmmal kibi, dərzi ya başmaqçı kibi iş görə bilməlidir. Və əlhasil çalışa-çalışa elə xidmət etməlidir. Yazıb-pozmanın o qədər əhəmiyyəti yoxdur, hər nə yazılsa, dəxi elə, əksəriyyəti avamünasdan ibarət olan elə məxsus yazılmalıdır. Bu fikrə gəldikdən sonra Tolstoy məsləkini təqib edənlərə ibrət olmaq üçün elə qarışıyor. Bir kəndli kibi yaşamağa, yatıb qalxmağa, geyinməyə, işləməyə başlayor. Avamın məişətini islah, əxlaqını təhzib, fikrini tənvir üçün hər



kəsin anlayacağı bir dildə bol-bol kiçik hekayələr, risalələr vücuda gətiriyor. Külliyyəti əhli-qəryə olan cəmaət də onlardan müstəfiz oluyor.

Bu gün rus köylülərinin əlində olan kitabçalar başlıca Tolstoyun əsərlərindən ibarətdir. Bu hal ilə Tolstoy rusların Sədisi olmuş olur. Zənnimcə İranda, hətta bütün müsəlman aləmində heç bir ədib, heç bir şair avamünnası, yəni külliyyəti-əhalini Sədi qədər ədəbiyyatdan müstəfid etmədi. Kimsə lisanı ümumin anlayacağı vəchlə onun qədər gözəl bir surətdə sadələşdirmədi. Kimsə onun qədər xalqa hüsni-əxlaq dərsi verəmmədi. Kimsə onun qədər hikməti-məişəti cəmaətə öyrədəmmədi.

Sədi özü hənuz bər həyat ikən təlifatı müsəlman aləminin hər tərəfinə, hər guşəsinə intişar etdi. Bu gün İranda, bəlkə müsəlman məmləkətlərinin çoxunda Qurani-Kərimdən sonra ən müntəşir kitab "Gülüstan"dır. Savadlı-savadsız, az-çox rəfah ilə yaşayan hər bir müsəlmanın xanəsində "Gülüstan" tapılır. Pir və bürna, mərdü zən, böyük, kiçik, fəqir-zəngin hər kəs az-çox "Gülüstan"ın hekayələrini bilir. Onun əbyatı ciftçidən, rəncbərdən başlayıb şah saraylarına qədər hər kəsin ağzında dolaşır.

Sədi də bugünkü Tolstoy kimi tuli-müddət yaşamış, uzun səyahətlərdə bulunmuş, əsgərlik etmiş, dünyanın hər gərm və sərdini görmüşdür. Asarı təcarübi-həyatiyyə ilə doludur. Sədi həyatın özü kibi gah xəndan və məsrur, gah qəmgin və məyus, gah lətifəgu, gah faciənəvisdir. Məsudlara nəsihət edər, fəlakətzədələrə təsəlli verər. Tolstoy da bu anda belədir. Tolstoy məsləkinin əsası dindarlıq və elpərəstlikdir.

Bu "elpərəstlik" haqqında bir nəbzə izahat verəlim. Zəmanəmizdə Tolstoy ilə bərabər bir sinif Rusiya üdəbasının ağzında, qələmində bir "narod" kəlməsi dolaşır. Bu "narod" nədir? Bunu türkcəmizə nasıl tərcümə edəlim? Tolstoyun narod ləfzindən muradı nə ümmət, nə millət, nə cəmaətdir. Bunu bir xalq, nas, amma, əvamünnas, əhli-qəryə, əkinçi, ya fəhlə cəmaəti kimi kəlmələrlə də tərcümə edəməyiz, daima naqis qalır. Mənə qalırsa bizim xalis türkcə olan "El"dən başqa heç bir kəlmə haqqı ilə bu "narod" mənasını ifadə edəməz, o halda "narodniçestvo" sözünü də tərkibi bir az səqim olsa da, ancaq elpərvərlik, ya elpərəstlik kimi mürəkkəb kəlmələrlə tərcümə edə biləriz. İştə bu elpərvərlik ilə həqiqi və feli, fəqət geniş

bir dindarlıq tolstoyluğun əsasıdır. Gələcək nömrədə Tolstoyun bir az da tərcümeyi-halından bəhs edib, bədə vəqt və fürsət bulduqca asarından tərcümə edib, "Füyuzat"da dərc edəcəyiz. Mühərrirlərdən kim olursa olsun Tolstoyun asarından cəmaətimizin əhvalına müvafiq olanları intixab edib açıq, sadə, fəqət ədibanə bir surətdə tərcümə edərsə, məəlməmnuniyyə qəbula hazırız.

* * *

"Tolstoy məsləkinin əsası dindarlıq və elpərvərlikdir" dedik. Əcəba, bu dindarlıq nədən ibarətdir? Tolstoy xristian məzahibi-hazirəsindən birinin yolu ilə getməyə qeyrətmi göstəriyor? Xeyr, çünki Tolstoyun kəlisadan mətrud bulunduğunu biliyoruz. Tolstoyun özünəməxsus bir məzhəbi vardır ki, bu da ortodoks məzhəbi-hazirini guya təsfiyə edib isəviyyəti ayrı bir tərzdə anlamaqdan ibarətdir.

Tolstoy peyğəmbərlik iddiasında bulunurmu? Xeyr, bulunmuyor! Mövlana Cəlaləddin Rumi haqqında deyirlər ki, "nist peyğəmbər, vəli darəd ketab"[1]. Tolstoy peyğəmbərlik iddiasında bulunmiyorsa, heç olmazsa ortaya Molla kibi bir kitab çıxarırmı? Tolstoyun elə bir kitabı da yoxdur. Vaqiən Tolstoyun "Məzhəbim nədən ibarətdir" ünvanlı bir risaləsi vardır. Lakin Tolstoyun istər bu risaləsini, istər sair əsərlərini Şeyx Bəhai görmüş olsaydı, heç bir vaxt "Tolstoy darəd ketab" deməyəcək idi. Tolstoy nə peyğəmbərlik, nə də sahibi-kitab olmaq iddiasındadır. Fəqət bununla bərabər yeni bir məzhəb çıxarmaqda olduğu aşkardır. Bu məzhəbi təşkil edə biləcək əfkarı isə əsarında pərakəndədir. Biz keçən nüsxədə Tolstoyun çox kərrə zəlalətdə bulunduğunu, əfkarının səhv və xətadan ari olmadığını bəyan etdik. Bizim bu sözümüz həm ülum və fünuni hazirəyə, həm də islamiyyəti-əsasiyyəyə müstənəddir. Tolstoyun zəlalətdə bulunduğu öz əfkarının yekdigərə mübayin olması dəxi sabitdir. Mübayinət iki sözün yekdigərə xilaf və zidd olmasına deyirlər. Bəzi xristian üləması deyirlər ki, Qurani-Kərimdə mütəəddid mübayinətlər var. Lakin böylə iddiada Quranın naqis və qələt tərcümələrini səthi bir surətdə mütaliə ilə iktifa edib ayati-kərimədən bəzinin nasix və bəzinin mənsux bulunduğuna vaqif olmayanlar buluna bilirlər...

[1] Peyğəmbər yoxdur, lakin kitabı vardır.



Tolstoyun əfkari-məzhəbiyeyi-cədidəsi isə nasixlik, ya mənsuxluq keyfiyyətlərindən uzaq olub, çox kərrə apaçıq mübayinətlərdən ibarətdir. Bu xüsusda rus müntəqidinindən Yevgeni Solovyovun zikr etdiyi misallardan biri ilə iktifa edəlim: bir yerdə Tolstoy diyor ki, ən yaxşı arvad o arvaddır ki, öz zəmanəsinin hökemiyyati-aliyyəsinə aşina olub nisvanın fitrətində məknuz olan vəzifeyi-müqəddəseyi-madəranəyi behəqq ifayə qeyrət etsin. Bu vəzifə isə o arvadın öz məsləki-hakimanəsi dairəsində çalışıb bəşəriyyətə xidmətə qadir ola biləcək, mümkün mərtəbə çoxca övlad tövlid edib, bunları təğziyə və tərbiyədən ibarətdir. Lakin Tolstoyun "Qara yesir nəğməsi" ünvanlı əsəri mütaliə olunursa, görülür ki, Tolstoy bu sözün əksini iddia eliyor. Bu əsərə görə ən yaxşı arvad özündə validəlik xasiyyətini məhv edəndir. Məsləhət qətiyyən zövciyyətdən ictinab edib əsla tövlid etməməkdir. Ruslar bu iki fikirdən hansının nasix və hansının mənsux olduğunu çox araşdırdılar. Lakin Tolstoydan bir cavabi-şafi alamadılar. Çünki Tolstoy özü şübhə və tərəddüd içindədir. Tolstoy bir adama bənziyor ki, səfərə çıxıb müttəsil yol gediyor. Yolu təftiş edə-edə, araşdıra-araşdıra gediyor, lakin yolu bir tərəfə çıxaramiyor... nöqteyi-məqsudə iriyəmiyor, hər vaxt yarı yoldadır... Əgər Tolstoy dindarlıq, ya elpərvərlik deyərək elə, əvamünnasə qarışıyor, xalq kimi alın təri ilə işləməyə qeyrət ediyorsa, özünü aldadır. Məsaili-məzocədən xilas olmaq və bu surətlə bir təsəlli bulmaq istiyor. Hər halda yarı yolda bulunduğunu özü də hiss eliyor, anlıyor. Əgər Tolstoy məzhəbinin əssül-əsasına müraciət edərsək, burada bütün-bütün şaşırıb qaldığını da görürüz. Ədyanın əksəri kimi "Bəni növinə məhəbbət və müavinət et" – deyə vəz edən bu məzhəbin əssüləsası nədir? Tolstoy məzhəbinin əssüləsası şu qısa cümlə ilə ifadə oluna bilir:

"Fənalığa müqabilə etmə!"

Yəni zülm və sitəmdən, cövr və cəfadan, bəla və müsibətdən ibarət olan fənalığa qarşı səbr və təhəmmül elə!..

"Fənalığa müqabilə etmə" sözü tolstoyluqda bir qəziyyeyi-əsasiyyədir. Həman bütün sair qəziyyələr bundan nəticələnir. Lakin nəticələrdə o qədər qərabət, o qədər təzad və mübayinətlər, o qədər məhallar vardır ki, bunlara istinadən qəziyyeyi-əsasiyyənin qeyri-məqul olduğuna hökm etmək olur. Yuxarıda zikr etdiyimiz Solovyov

da zatən belə hökm ediyor. Tolstoy: "Fənalığa müqabilə etmə" yerinə "Fənalığa fənalıqla, cəbr ilə müqabilə etmə", yəni "fənalıqdan ari bir surətdə müqabilə et" deyə idi yenə bəlkə qəziyyənin bir məzhəbə əsas olacaq dərəcədə bir ləyaqəti olurdu. Lakin Tolstoyun sözündə heç bir qeyd və şərt yoxdur, söz qətidir. "Fənalığa müqabilə etmə", yəni "heç bir vəchlə müqabilə etmə! Vəssalam!" Lakin həyatın bütün zövqi fənalıqla mübarizədədir. Fənalıqla mübarizə caiz deyilsə, o halda "bəni-növinə məhəbbət və müavinət et" vəzifəsini nə surətlə ifa etməlidir? Bəni növinin alam və iztirabatını rəfə, yaxud tənqisə cəhd etmək, bu yolda mübarizə etmək, yəni fənalığa müqabilə etmək, "Bəni növinə müavinət et" sözünün şərtlərindən bir qismini təşkil etmiyormi? Hər halda anlaşılıyor ki, Tolstoy burada bir gərivəyə düşmüşdür. O gərivədə çapalayıb duruyor, oradan çıxacaq bir qapı bulamıyor. Əgər bu gün bizim Bakıda Əhməd bəy Ağayevlər, Qazi Ağa Mir Məhəmməd Kərim Ağalar və sair pişvalar Tolstoyun qövlünə ittiba etsələr, onların şəhərimizdə müsəlmanlar arasından yekdigəri qətli-fənalığını rəf üçün əsla ciddü cəhd etməmələri lazım gəlir. Çünki Tolstoyca bu ciddü cəhd, ələlxüsus "Difai" cəmiyyətinin təhdidatı fənalığa müqabilədən ibarətdir. Əcəba, Tolstoy özü burada bulunsa idi, sözündə səbat edərdimi? Tolstoyun bəzi sözlərinə baxılırsa, səbat edərdi kimi gəlir. Tolstoy Engelqard nam bir zatə yazdığı bir məktubda diyor ki, əgər xanəmə afrikalı bir zulus vəhşisi hücum edib mənim gözümün önündə ciyərparam olan övladımı xəncərlə doğrasa, mən əsla müqabilə etməm!" Tolstoy həqiqətən müqabilə edərdimi, etməzdimi bəhsi axər. Lakin bu sözdə bir həmaqət olduğu aşkardır. Ey qarə, bu xüsusda o qədər böyük bir zata həmaqət isnad etdiyimdən naşi dilgir olma. Çünki Tolstoyun ara-sıra axmaqlıq xoşuna gediyor. Baxınız şair Fetə yazdığı bir məktubda nə diyor: "Təlifatımın altıncı cildini tamam edib verdim təbə. Noyabr ayının birində ehtimal intişar edəcəkdir. İndi mənim ən avara və məəttəl bir zamanımdır, nə düşünürəm, nə bir şey yazıram. Özümdə xoşuma gedən bir axmaqlıq hiss ediyoram. Axmaqlara böyüklük əsla yaraşmiyorsa da, lakin böyük adamlara ara-sıra axmaqlıq hər halda yaraşıyor. Hansı böyük adamı zikr edə bilirsiniz ki, onun ağzından bəzi kərrə axmaqca sözlər çıxmış olmasın".

Keçəlim. Tolstoyun böyük bir ədib və şair, böyük bir kəlam rəssamı Sədi kibi əxlaqiyundan böyük bir həkim olduğunu gördük. Fəqət baniyi-məzhəb olmaq xüsusuna gəlincə, burada zəlalətdə



bulunduğu və məsləkinin əsassız olduğu təbyin ediyor. Bu zəlalətlər nərədən nəşət ediyor, rus üləması burasını çox araşdırıyorlar... Bizə qalırsa bu zəlalətin əsil səbəbini Tolstoyun ehkami-islamiyyəni bihəqq mütaliəyə rəğbət etməməsində aramalıdır. Tolstoy ömrünün bir qismini boşuna sərf edib ibrani və yunani lisanlarını əriz və əmiq təhsil edəcəyinə, ərəb və fars dilini gözəlcə öyrənib bu vasitələrlə bir də islamiyyəti tədqiq etməli idi. Şair Gete ömrünün axırında bu lüzumu hiss edib farscanı öyrəndi və bu təhsildən xeyli müstəfiz oldu.

Tolstoy etirafının bir yerində diyor ki, "Bən anlayordum ki, bizim bütün təfəkkürat və mülahizatımız öz məhvəri üzərində dönən bir təkərlik kibi, tilsimli bir dairədə dönüb durur, oradan ayrılamiyor". Nə qədər gözəl düşünsək yenə sualımıza bir cavab alamiyoruz, daima sıfır müsaviyi-sıfır oluyor. Bundan istidlal edirdim ki, ehtimal tutduğumuz yolun özü yanlış bir yoldur. Seziyordum ki, dinin verdiyi cavablarda ən dərin hikməti-bəşəriyyə məhfuz olub, o cavabları əqlə istinadən rədd və inkara haqqım yoxdur. Çünki məsaili-həyatiyyənin başlıca cavabları onlardır.

Bən bunu anliyordum. Lakin müşkül bununla asanlaşmiyordu. Bən hər bir məzhəbi qəbula hazır idim. Ancaq bu şərt ilə ki, o məzhəb əsla əqli inkar etməsin. Çünki belə bir inkar xətayə dəlalət edər. Bu səbəbdən Budda məzhəbini və islamiyyəti kitablar və xristianlığı həm kitablar, həm məni əhatə edən insanlar vasitəsilə mütaliə edirdim". Bu axırıncı cümlədən anlaşılıyor ki, Tolstoy şübhə və tərəddüdlər içində gəzərkən islamiyyəti dəxi kitablar vasitəsilə mütaliəyə quyulmuş, lakin o kitablar hansı kitablardır, zikr etmiyor. Zənnimizə görə o kitablar çox da mühüm kitablar olmasa gərəkdir. Çünki rast gəldiyim asarda Tolstoyun islamiyyətdən bir nəbzə bəhs etdiyini görmədim. Bir yerdə Tolstoy diyor ki, əxlaq nöqteyi-nəzərindən etiqadati-islamiyyənin dünya və üqbada vəd etdiyi feyzi-nəim şəxsiyyətə məxsus və qabadır (kobuddur).

Xatirimə müsəlman şüərasından Feyzinin bargahi-kibriayə xitabən bu niyazları gəliyor:

Taəti ma tabeçənd bəhre-nəime-behişt,
Bənde nəba xoce kərd in hame beyşəra.
Həst amidəm qəvi əz to ke yabəm be fəzl
Dər dəme-xabe-əcəl xaki dərt motəkka
Ta məgər əz nuri-to, bədr şəvəm bər sipəhr

Mitələbəm əz cahan, həm ço helal inziva
Zaviyeyi-təngna ba to məra laməkan
Badiyeyi-lakəman bito məra təngna[1].

Əfəndim, buna da deyəcək varmı?! Zənn edərsəm Tolstoya bundan bəliğ cavab olamaz. Lakin görünüyor ki, müşarileyhin bunlardan xəbəri yoxdur. Ortodoksluq Tolstoya yolunu qaib etdirdi. Tazədən dürüst bir yolu bulmaq üçün onun islamiyyətə aşina olması lazım gəliyordi. Böyük müfəssirlərimizdən, əllamələrimizdən, Fəxri Razilərdən, imam Qəzalilərdən, Zəmoxşərilərdən, Siyutilərdən xəbəri yoxsa, heç olmazsa, ədəbiyyati-islamiyyəyə vüquf peyda etməli idi. Üdəbayi-həqiqiyyeyi-İslamiyyənin sərəfrazları isə Mövlana Cəlaləddin Rumi ilə onun:

"Əttar ruh bud, Sənai do çeşme-u
Ma əz piye-Sənai vo Əttar amədim"[2] –

deyə zikr etdiyi zəvatdan ibarətdir.

Şərq-İslamda, şəhərlərdə və kübar arasında müskirata meyil və işrət kimi bir fənalıq görünürsə də, lakin məəlməmnuniyyəti-islamiyyət sayəsində Şərqin əvamünnası arasında o fənalıqdan bir əsər görünmiyor. Halbuki Rusiyada bu bəlayə düçar olanlar başlıca əvamünnasdır. O əvamünnas ki, Tolstoy onun uğrunda bu qədər cəhd ediyor.

Biz Tolstoyun böyüklüyünü onun məzhəbində deyil, onun məsləki-ədəbiyi-ictimaisində görənlərdəniz. Tolstoy böyükdür, çünki xassın deyil, külliyyəti-əhali olan əvamın fikrini tənvirə, əxlaqını təhzibə çalışıyor. Tolstoy böyükdür, çünki dahiyeyi-hərbin ortadan götürülüb ümumi-cahanın miləl və əqvamı arasında sülhi-əbədinin təqririnə qeyrət ediyor. Tolstoy böyükdür, çünki məzahib arasında bir təriqi-ittihad və məvəddət arayor. İttihad və məvəddəti ayrı-ayrı hər məzhəbin göstərdiyi səvabların cümləsindən əla biliyor. Tolstoy böyükdür, çünki üluhiyyəti və iradətüllahın növi-bəşərə tövdi etdiyi vəzaifidir ki, əlindən gəldiyi qədər cəhd eliyor.

*Ə.H.*
*"Füyuzat", 1906, №1, 2*

[1] Tərcüməsi:
İtaətimiz nə vaxtadək behiştin nemətləri xatirinə olacaq
Bəndə tacir ilə bu cür alver etmədi
Çox böyük ümidim var ki, səndən fəzlə tapım
Əcəl yuxusu zamanı qapının torpağına söykənim
Bəlkə sənin nurundan fələkə doğru gedim.
Dünyadan hilal kimi guşəninin istəyim
Səninlə darısqal guşədə olmağımız mənə laməkandır
Ucsuz-bucaqsız səhra sənsiz mənə darısqaldır.

[2] Tərcüməsi:
"Əttar ruh idi, Sənai onun iki gözü
Biz Sənai və Əttarın ardınca gəldik".



## ŞÜUNAT

Zəmanımız əcaib bir zamandır, hər kəs əndişə içindədir, hər kəs gələcəyin müqabilində, pərdeyi-əsrarə bürünən məchul gələcəyin müqabilində titrəyib duruyor, cəmaət titrəyor, cəmaəti təşkil edən firqələr, siniflər, heyətlər titrəyor, hökumət titrəyor, rəsi-hökumətdə duran ministrlər, məmurlar, bütün bürokratiya titrəyor. Səbəb nədir? Səbəb yeni dövlət dumasına intixabat zamanının təqərrüb etməsidir. Yeni dövlət dumasının nə şəkil və heyət alacağı, solamı, yoxsa sağamı meyil bulunacağı, cəmaətəmi, yoxsa hökumətəmi, inqilabamı, yoxsa tərzi-qədim idareyi-mühafizəyəmi tərəfdar olacağı önümüzdəki intixabata vabəstədir. Digər tərəfdən şuriş və ixtilalın, yaxud nizamsızlığın, idareyi-keyfiyyənin davam edib-edəməyəcəyi yenə bu intixabatın nətayicinə tabe bir keyfiyyətdir.

İntixabat nədir? İntixabat müxtəlif firqələrin mübarizəsi, daha doğrusu, müxtəlif fərdlərcə, firqələrcə, siniflərcə təqib olunan fikirlərin, məsləklərin, ictimai, siyasi və iqtisadi fikir və məsləklərin mübarizəsi deməkdir. Hər halda surəti-zahirədə böylədir. Həqiqət halda isə bülənd amallara, mücərrəd fikirlərə, müqəddəs həqiqətlərə aşiq olanlar qayət az bulunub mübarizeyi-əfkar pərdəsi altında mənafe mübarizəsi məxfidir. Mənafe isə müxtəlif fərdlərin, firqələrin, siniflərin heyəti-milliyyə və qövmiyyələrin mənfəətlərindən ibarətdir.

Hər kəs anlayor ki, qanuni-əsasinin təqərrür etməsi və qanuni-əsasi ilə bərabər heyəti-məbusan qarşısında heyəti-vüzəranın məsul

tutulması lüzumunun zamanı gəlmişdir. Bundan qurtuluş yoxdur, lakin hər kəs vaxt qazanmaq və qazanacağı vaxtdan bilaistifadə ortadan az bir zərər və ziyan ilə qurtulmaq istiyor: böyük məvaciblərə alışmış bürokratlar, hüquqi-mümtazə ilə yaşamış əsilzadələr, vasevase ərazinin mədaxili ilə keçinməyə öyrənmiş mülkədarlar, əmələ və fəhlənin üsarəsini istədikləri qədər əmib sormuş sərmayədarlar, lisan və məzhəblərindən bir boyunduruq qayırub hər kəsin boynuna taxıb öküz kibi o yan-bu yana çəkməkdən zövq almış rus ortodoks misyonerləri əsrlərdən bəri nail olmuş olduqları maddi və nəfsani nemətlərdən asanlıqla əl çəkmək və çəkilmək istəmiyorlar, çəkilsələr də heç olmasa özlərinə bəzi mənafe təmin edib öylə çəkilmək istiyorlar. Mübarizənin bu qədər davam edib sürməsi həp bu üzdəndir. Bütün məmləkətin hürriyyət, ədalət, müsavat deyə-deyə, fəryad edə-edə qanuni-əsasiyə doğru dərəcə-dərəcə etila və tərəqqi etməsi, hər növ ləkə və şaibədən ari, pak və müəbbəd qarlarla məstur bir dağ zirvəsinə çıxmaq həvəsində bulunan səyyahların yol getməsinə bənziyor. Yol gah yoxuşludur, baş yuxarıdır, gah enişdir, baş aşağıdır. Lakin burasını unutmamalıdır ki, hər ikinci eniş əvvəlkindən daha az olub mütəaqibən çıxılan hər bir təpə əvvəlkindən daha ucadır. Bu aralıq ümumiyyətlə, bir eniş enməkdəyiz, fəqət iləridəki, önümüzdəki dağ təpəsi keçmiş olduqlarımızın cümləsindən daha bülənddir.

Yolun ən məxuf, ən dəhşətəngiz yerləri dərə dibləri olan çuxurlardır. Ən kəsif qaranlıqlar, ən qorxunc yırtıcı heyvanlar orada bulunur: Əvvəlcə keçdiyimiz dərələrdə nələr gördük: əzəmətli-əzəmətli tətillər, dəmir yol, posta və teleqraf tətilləri, əmələ və fələ tətilləri, açıq küçə və meydan üsyanları, millətlər nizai, erməni-müsəlman, yəhudi-rus müqatilələri, qara dəstələr nəhb və qarətləri, yanğınları, əsbabi-həqiqiyyəsi, dumada knyaz Urusov və əxirən Peterburq polis departamenti sabiq rəisi Lopuxin tərəfindən bir dərəcəyə qədər izah edilmiş olan müqatilələr, nəhb və qarətlər... Çıxdığımız təpə isə bir kadet duması oldu... Bu təpədən sonra yenə bir eniş enib, indi yenə bir çuxurdayız. Bu çuxurun dəhşət və vəhşiləri əcəba nədən ibarətdir?

Bomba patırtıları, "terrorizm" nümayişləri, maksimalist sui-qəsdləri, məkatibi-aliyyə həyəcanları, divani-ürfiyi-əsgəri as-kəsləri, aclıqlar, qəhtü-ğəlalər, ənva-oğurluqlar, quldurluqlar... gün keçmiyor ki, şəhərlərdə revolver, bomba, cəhənnəm makinası, növbənöv barıt və dinamit alatı patlamasın. Dövlət məmurlarından adam vurulmasın, yaralanmasın, qətl edilməsin... Biz ancaq son bir-iki həftə zərfində mühümlərini saymaqla iktifa edəlim. Moskvada qradonaçalnik, yəni Moskva şəhər hakimi olan Raynbota bomba atıldı. Fəqət müşarileyh bir zərər görmədən qurtula bildi. Poltava şəhərində general Polkovnikov qətl edildi. Feodosiya şəhərində general Davıdovun həyatına sui-qəsd edilib bomba atıldı. Tiflisdə injener Brendet qətl edildi. Yenə bu şəhərdə un meydanında sabiq Qarabağ generalqubernator Qoloşçapov təhlükəli surətdə yaralandı. Ryazan şəhərində polismeyster Qurutov qətl edildi... Bu qəbildən daha bir çox suiqəsdlər, cərh və tətillər hər gün vüqua gəlməkdədir... Bunların səbəbi bir dərəcəyə qədər məlumdur. Bunlar "terror" qurbanı olmaqdadırlar. Lakin Şuşada Süleyman ağa Şəkinski nə üçün vuruldu, hənuz səbəbi anlaşılmamaqdadır?.. Anlaşılan bir şey varsa, o da budur ki, barıt ilə dinamit bəşəriyyətin başına bir bəla olmuş: əvvəldən heç olmazsa bunlar sərhəd boyunda iş görürdü. İndi bu məvadi-müxərribə təsirini şəhərlərin ortasında asayiş içində yaşayan xalqın arasında icra eyliyor. Görünüyor ki, bunun öhdəsindən divani-ürfiyi-əsgəri mühakimələri də gələmiyorlar. Bu iki-üç həftə içində divani-məzkurun fəaliyyəti bir qat daha təşəddüd etmişdir. Hər gün yeddisəkkiz adam qurşuna düzülüb, ya dara çəkilib edam olunmaqda, hətta çox kərrə edam olunanlar arasında bigünahlar da bulunmaqda... Nəinki rus divani-ürfiyi-əsgərisi, hətta İstanbulun məşhur xəfiyyələri də bombaçıların öhdəsindən gəlməməyə başladılar. Yenə bu həftə içində İstanbulun ən qələbəlik bir yerində müdhiş bir bomba patlayıb bir neçə adamı yaralayıb tələf etdi. Yaralananlar miyanında Osman paşa adlı xəfiyyə naziri dəxi bulunuyor. Barıtı kim icad etdi? Almaniyalı Şvarç. Allah ona lənət etsinmi deyəlim? Şair Milton "Cənnətiqaibə" ünvanlı "Lahutnamə"sində diyor ki: Barıtı iblis icad etdi... hər nə hal isə bu yüzdən cahana bir partapartdır düşmüşdür. Üç-dörd gün əqdəm Almaniyada Dortmond şəhərində məşhur Qrupun top fabrikası qürbündə böyük bir roborit[1] fabrikası patlayıb yüzlərcə canlar tələf oldu.

Almaniya filosoflarından üç-dörd ay əqdəm vəfat edən Şopenhauer diyordi ki, "rəhgüzari-qəm olan həyatın mənası meyli-ədəmdir. Bəşəriyyət tərəqqi edə-edə nəhayət bir məharəti-kamilə ilə birdənbirə özünü məhv edə biləcək və yer üzündə vücudundan bir əsər

[1] Roborit – dinamitdən daha şiddətlə partlayan bir maddədir.

buraxmayacaqdır..." Bundan gözəl də feyz olamaz diyordı. Əgər hokimi-müşarileyh, "bəşəriyyət" ləfzi yerinə "əsri-hazır" kəlməsini istemal etmiş ola idi, olduqca bir kəramət göstərmiş olurdu. Hər halda əsri-hazırda başəriyyətin öz-özünü tələf etməyə böyük bir meyli vardır. Bir sənədən ziyadədir ki, rus-yapon müharibəsi xitam buldu. Lakin o müharibədə istemal edilmiş olan minalar əlan təsirati-müxərribələrini göstərməkdədirlər. Əxirən teleqrafların verdikləri həvadisə görə bəhri-Əsfərdə tərk edilmiş olan minalar ara-sıra dəlilik edib, gah bir ticarət gəmisini, gah sahillərdə yaşayan fəqir kənd xalqını partlayıb tələf etməkdə davam eyliyor...

Bu hallardan bəşəriyyət ibrət almış olmamalıdır ki, indi də dinamitlə, şimuzə ilə müsəlləh hərb gəmilərini Marok səltənətinin pişgahındakı dənizlərə göndərməkdədirlər... Bu cinayəti-irtikaba hazırlanan dövlətlər Fransa ilə Anqliya və İspaniyadan ibarətdir.

Buna qarşı da tək qalmış Mərakeş sultanı Mövla Əbdüləziz həzrətləri paytaxtı olan Fas şəhərini tərk edib fərar eləməkdən başqa bir çarə görəmmiyor...

Axmaq bəşəriyyət!.. Deyirlər ki, guya o bir nuri-asimaniyə məzhər olmuşdur... Xeyr!

Əql, ismini vermiş bəşər ol nurə dilində,
Heyvanlığa lakin gözəl alətdir əlində...

Bəşəriyyət əqlini top, tüfəng, barıt, dinamit, roborit kimi heyvanlıq asarı icad edəcəyinə əqlini ziraət və sənaətin, iqtisadın tərəqqisinə həsr edə idi, bu gün ac və bialac qalmaz idi.

Yuxarıda zikr etdiyimiz bəlalar yetmiyormiş kimi qədid və skelet şəklində olan div qəhtü-qəlадə tərəfdən pəncələrini bəşəriyyətin üzərinə atmağa qeyrət eyliyor. İranda aclıq, Çində aclıq, Rusiyada aclıq, Qafqazın bir çox yerlərində aclıq. Rusiyadakı aclığın başlıca mehraqı və Volqa nəhri kənarlarında olub Samara, Saratov, Ufa quberniyalarını qəhətlik istila etməkdədir. Məlumdur ki, Ufa vilayətindəki əhalinin bir qismi-əzimi müsəlman qardaşlarımızdır. Bunlar bizlərdən imdad gözliyorlar...

Sui-istemalatı haqqında padşah imperatorun əmrilə təhqiqati icra olunan Lidval nam bir tacir peşin dövlətdən 800 min manat aldığı halda zikr olunan acların vaxtilə imdadına yetişmədi... Heç olmazsa



biz öz Ufadakı dindaşlarımızın imdadına şitab eyləyəlim... Lakin digər tərəfdən Şuşa, Zəngəzur, Cavanşir, Cəbrail uyezlərindəki öz aclarımızı da unutmamalıyız. Bunlara imdad üçün "İrşad"da Əhməd bəy Ağayevin, "Kaspi" sütunlarında Qarabəy Qarabəyovun fəryadları kainatı titrədiyor... Lakin insanlar sadə maddi aclıqlar üçün fəryad etmiyorlar. Bir tərəfdən də mənəvi aclıqlar başlıyor. Rusiyada mütəəddid məktəblər, darülfünunlar bağlanıyor, ülum və fünundan məhrum olan tələbə həyəcana gəliyor, fəryad edəmiyorlar, etsələr də Odessa şəhərində olduğu kibi mükəmməl bir kötək yeyorlar... Biçarə bizim "Nər"imiz Nəriman burada fəryad elədi, elədi lakin heç olmazsa döyülmədi. Amma Odessa tələbəsi arasında fəryadları kötək yeməyən keçmiyor. Görünüyor ki, Odessanın ağbaydaqlı qara dəstələri Bakı qoçuları qədər fəryadlara mütəhəmmil deyillərmiş... Hər nə isə sədəddən xeyli ayrıldıq, məqsədimizə rücu edəlim: bu keşməkeşlərin, bu ixtilalların içindən nə ilə çıxmaq olacaq? Etidali-dəmlə hərəkət edən qabil və müstəid məbuslardan mürəkkəb bir dövlət duması vasitəsilə, dumanın yaxşılığı isə intixabata vabəstədir. Yuxarıda intixabat bir əfkar və mənafe mübarizəsidir, dedik.

Əfkari-aliyeyi-mücərrədə nöqteyi-nəzərindən bitərəfanə bir mütaliə yürüdülürsə, bu mübarizədə o mənfəətlərin qalib gəlməsi arzu olunur ki, o mənfəətlər külliyyətin, ya heç olmazsa əksəriyyətin, ərbabi-məsai və əhli-kəsbükar olan əksəriyyətin mənafei olsun!..

Şübhə yoxdur ki, avam olan külliyyət, ya əksəriyyət öz mənfəətini anlamış olsaydı, mübarizə qayət asanlıqla hüsni-əncama irib onun mənafei intixabatın nəticəsində gözəlcə təmin edilmiş olurdu. Lakin ya əvamün-nasa yol verilmiyor, yaxud verilsə də onlar qoyun sürüsü kibi onun-bunun arxasından gediyor. Kim xalqı gözəl vədlərlə aldatmağa müvəffəq olursa, xalq da onun lehində rəy verər. Bu əsnada nə qədər pişvalar, firqə rəisləri varsa, cümləsi camaəti müxtəlif vədlərlə öz tərəfinə, ya öz firqəsi tərəfinə çəkməyə çapalıyor. Sosial-revolyusionerlərdən, sosial-demokratlardan başlayıb kadetlərdən təcəddüdi-asayişpərvəranə firqəsindən keçib 17 oktyabr və monarxist firqələrinə qədər cümləsinin rüəsası cəhd və qeyrətlərini bu cəhətə sərf edirlər.

Bunlardan başqa bir sürü ərbabi-nüfuz və kamal vardır ki, onlardan da hər biri bir surətlə camaəti öz tərəfinə çəkməyə, daha dürüstü aldatmağa qeyrət ediyorlar. O halda intixabata həqqi olacaq, seçkidə

iştirak edəcək camaətin borcu nədir? Bunların ən birinci borcu aldanmamağa çalışmaqdır. Aldanmamaq üçün nə etməli? Aldanmamaq üçün etiqadımızca əvvəli-əmrdə adlarını bitərəf qoyanlardan xövf və ictinab etməlidir. Çünki "bitərəflik" müəyyən bir məslək sahibi olmamağa, məzbut bir proqram, bir məramnamə təqib olunmadığına dəlalət edər. Bir adam çox da əhli-elm və kamal olsun, lakin mövcud olan firqə proqramlarından birini mənə göstərmədikdən sonra, mən nərədən anlaya bilirəm ki, onun məclisi-məbusanda müdafiə edəcəyi əfkar və mənafe nədən ibarət olacaq, əfkar və mənafeyimə təvafüq edəcəkmidir? Mən burada özümə vəkil seçərkən indidən bilməliyəm ki, o vəkil məclisi-məbusanda, yəni dövlət dumasında sağdamı, ortadamı, yoxsa soldamı oturacaq. Deməк olar ki, aldanmamaq üçün əvvəla "bitərəflərdən" sərfi-nəzər edib müəyyən firqələrdən birinə mənsub olanları və əvvəlcə firqə proqramını bildirənləri aramalıdır və bu kimilərin içində əhli-elm və kamal olanlardan da qanun və nizam dairəsində mənafei-milliyyə və ictimaiyyəni qövl və kəlam ilə ələlxüsus rəyi-müsəyyib ilə müdafiəyə qabil və müstəid olanlara rəğbət etməlidir. Aldanmamaq üçün ikinci çarə nədir? İkinci çarə də mövcud olan firqələrin proqramlarını bitərəfanə mütaliə edib bunların mündərəcatına kəsbi-vüquf eləməlidir. Biz irəlidə bu proqramlar haqqında qarelərimizə məlumat verməyə qeyrət edəriz. Ancaq biz arzu edərdik ki, müsəlmanların özlərinə məxsus bir proqram və firqəsi olsun və o firqədə müsəlmanların və bilxassə türk və tatarların hər növ müsavat və hürriyyətləri ilə bərabər hüquqi-qövmiyyə, lisaniyyə və diniyyələrini təmin edən sair firqələrə iltihaq etsin. Bizim üçün nicat, hər növ hürriyyət və hüquqi-müsavat tələb edən firqələrlə birləşməkdədir. İştə bizim deyəcəyimiz bu qədərdir... Artıq intixabat başlıyor. İntixabatın surəti-məqulədə cərəyan edib hüsni-nəticə verməsi camaətimizin bəsirət və hümmətinə vabəstədir, vəssalam!..

***Ə.Hüseynzadə***

*"Füyuzat", 1906, №3*



# QIRMIZI QARANLIQLAR İÇİNDƏ YAŞIL İŞIQLAR

*(12 dekabr)*

Dekadent olmadığımız və olamadığımız halda məqaləmizin sərlövhəsi dekadentizmə qaydasında oldu. Dekadentizmə zəmanəmizin, yəni bu son on beş, iyirmi sənənin məhsulu olduğu kimi, zəmanəmizdəki novüsul bir növ sənayenin, sənayei-nəfisənin, əşar və ədəbiyyatın vücuda gətirdiyi bir çox asar da dekadentizmə məhsuludur. Bir şey almaq üçün bir mağazaya gedərsiniz, orada sizə qərib-qərib rənglərlə, nəqşlərlə müzəyyən mənsucat, məfruşat, əsas və əvanibeytiyyə göstərib deyirlər ki, bunlar "dekadent şeyləri"dir. "Füyuzat"ın dördüncü nömrəsində, Zahid bəy Şamilin qeyrətilə Moskva şəhərində çıxacaq "Tərbiyeyi-ətfal" məcmuəsinə dair bir elanın başında kiçik bir şəkil görürsünüz. Sizə deyirlər ki, bu şəkilin xütut və nüquşu dekadent üsulundadır. "Füyuzat"ın ikinci nömrəsində Tofiq Fikrət bəyin nəsrə təhvil edilmiş əşari-cədidəsini oxursunuz, tərzi-əcib ifadəsinə, üslubi-qərib bəyanına təəccüb edərsiniz. Ehtimal heç bəyənməmək istərsiniz. Sizə bildirirlər ki, "Rübabi-şikəstə"dən məxuz olan bu şeirlər dekadent üsulunda şeirlərdən olub Tofiq Fikrət bəy də osmanlı dekadentlərinin sərəfrazlarındandır. Nəhayət, bu nömrəmizdə "Qırmızı qaranlıqlar içində yaşıl işıqlar" sözlərindən ibarət qərib və naşənidə bir sərlövhəyə rast gəlirsiniz. Sizə ta ibtidadən ixtar edəriz ki, bu da dekadentizmə qaydasında bir sərlövhədir. Şübhə yoxdur ki, bu surətlə qulağınız "dekadentizmə" sözləri ilə dolduqdan sonra, siz də məqaləmizin məzmunundan əqdəm ehtimal bu dekadentizmənin nədən ibarət olduğunu bilmək istərsiniz. Lakin biz də bunu əriz və əmiq izaha başlayacaq olursaq sədədimizdən, yəni "Yaşıl işıqlardan" ibarət olan mətləbimizdən bilkülliyyə ayrılıb pək uzaqlara düşmüş oluruz. Müxtəsərən də, hətta müfəssələn də dekadentizməyi anlatmaq qayət çətindir. Bəlkə də məhaldır. Bir də bunu anlamanın nə lüzumu var. Onu bir vəhm və xəyal kimi sezmək də kafidir. Dekadentlər diyorlar ki, biz "ləb" demədən siz "ləbləbiyi" anlamalısınız, biz gözlə görülməyəcək, qulaq ilə eşidilməyəcək şeyləri sizə bir-iki qısa söz ilə göstərməyə, eşitdirməyə çalışacağız, siz də öz qüvvəyi-müdərrikənizlə, surətiintiqalınızla görüb eşitməyə çalışınız. Şayəd buna müvəffəq olamaz

isəniz gözünüzü qulağa, qulağınızı da gözə çevirməyə və ələlümum həvasi-xəmsənizi yekdigərinə qəlb etməyə çalışınız, bununla da bir şeyi dərkə müvəffəq olmasanız, nəfsinizdə həvasi-xəmsədən başqa bir hiss, bir hissi-sadis peyda etməyə qeyrət ediniz. Şayəd bu surətlə də bir şeyə vaqif olamazsınız, o halda bizi anlamaqdan fərağət edib nafilə özünüzü yormayınız. Dekadentizmə təriqində olan şairlər şeirlərində rəssam və nəqqaş, nəqqaş və rəssamlar isə lövhə və rəsmlərində sazəndə və musiqişünas, sazəndə və musiqişünaslar isə ahəngi-nəğəmatlarında xətib, şair, rəssam olmaq istiyorlar. Hətta bəzi memarlar da bu xüsusda bunlardan geri qalmıyorlar.

Təbiblər isə... təbiblər də öz elmi-əmrazlarında, öz məhbəsi-əhvali-ruhiyyələrində bunların cümləsinə, hissiyati-təbiiyyələri istihaleyi-mərəziyyəyə düçar olmuş dəli, divanə və məcnun diyorlar, deмək istiyorlar... lakin təbiblərin böylə deмələri ilə məsələ həll olunmiyor. Çünki dekadentlər də bu iddiada bulunan doktorlara dərki-bədayedən, hissi-nəfaisdən hissi-sadisdən məhrum biçarələr ünvanını veriyorlar... haqq hansı tərəfdədir? Orası hənuz məchul... Ancaq şurası aşkardır ki, bunlar, bir dairəyi-məhdudə içində dönüb dolaşan və binaənəleyh o dairə içində mafövqi, mavərası təsəvvür olunmayan bədayei-mükəmməleyi-sənətə lüzumsuz təqlidlərdən və köhnə sözləri təkrarlardan ibarət qalan yolları tərk ilə əşar və ədəbiyyat və sənayei-nəfisədə külliyyətli bir təcəddüd vücuda gətirmək üçün özlərinə, əsla bu günə qədər eşidilməmiş, xatir və xəyala gəlməmiş, büsbütün yeni bir təriq, daha dürüstü təriqlər arayorlar.

Dekadentizməyə "simvolizmə" dəxi diyorlar. Bu kəlmələri ərəbidən alınma istilahat vasitəsilə türkcə ifadə etmək istəsək, bunlara "məsləki-inhitatiyun" və yaxud "məsləki-rəmziyun" demək lazım gəlir. "Dekadentizmə", yəni "inhitat və zəvala üz tutmaqlıq", "simvolizmə", yəni "rümuz və rümuzat ilə ifadeyi-məram üsulu" demək oluyor ki, dekadentizmə məsləkinin əsasi-batiniyyəsində guya inhitat əmarələri, üslub ifadeyi-zahiriyyəsində isə rümuzat ibarələri mühüm bir rol oynuyor. Bunlara inhitatiyon adı ibtida düşmənləri tərəfindən istehza təriqilə verilmiş idi, çünki simvolistlərin vücuda gətirdikləri asar onların nəzərində şeir və sənətin zəval və inhitatına, tədəniyyə düçar olmasına dəlalət ediyordi. Lakin simvolistlər özləri bu yeni adı ayrı bir nöqteyi-nəzərdən bir məmnuniyyətlə qəbul etdilər. Bunlar dedilər ki, zəval və inhitat bizim asarımızda olmayıb bəlkə zəmanəmizdədir. Asarımız isə zəmanəmizin mükəmməl bir ayinəsi olduğundan məsləkimizə verilən bu ad dəxi məqbulumuzdur... "Məsləki rəmzyun" adına gəlincə, dekadentlər diyorlar ki, lisan və lüğətlərdə vaqe tərəqqiyyati-ləfziyyə bizim, yəni dekadentlərin tərəqqiyyati-mənəviyyəmizlə mütənasib deyildir. Tərəqqiyyati-lisaniyyə cüzi olduğu halda tərəqqiyyati-mənəviyyəmiz küllidir. Binaənəleyh hazırdakı lisanlar bizim əfkarımızı ifadədən acizdir. Bu səbəbdən biz əhvali-mənəviyyəmizi, əfkar və hissiyyatımızı ancaq bir növ dudisəhabə bürünən əmsali-mücəssəmə ilə və yaxud rümuzat ilə təsvir və ifadə edə biliriz. Onun üçün ifadatımız mübhəmat və kinayatdan ibarət olmalı. Zatən şeir və sənətin məqbuliyyət və lətafəti də musiqi kimi qeyri-müəyyən və mübhəm olmaqdadır. Qarelər isə mübhəm olan bu rümuzat və kinayatdan özləri məna çıxarmalıdırlar. Şair, ya rəssam heç bir vaxt fikrini açıq deməyəcək, ancaq zehin və qəlbində müzmər olan bir fikri təlqinə çalışacaq: nə sövtdə, nə rəngdə, nə də bir xətdə o fikir görünməyəcək, zikr olunmayacaq, şairin, ya rəssamın xəyal və vicdanında peyda olan bir hiss, bir fikir ancaq bir təsiri-mənəvi ilə gizli, üstüörtülü bir surətdə qareinin, tamaşagiranın qəlb və vicdanına intiqal edib orada yenidən müqabili olan hissiyyat və əfkarı oyandıracaq, çünki:

Dər miyane-raze-müştəqan qələm naməhrəm əst![1]

Türk dekadentlərinin fikrincə avam olan türkün zatən qədimdən bəri dekadentizməyə bir meyli var idi. Çünki onun əlamətləri dilində məşhuddur. Ancaq keçmiş üdəbamız tərəfindən bu əlamətlər nəzəri-etibara alınmayıb tərəqqi etdirilməmiş idi. Türk dilindəki "qara günlər", "qara xəbərlər", "qırmızı yalanlar", "üz ağlığı" bu növ əlamətlərdən mədududur. Şübhə yoxdur ki, günün qarası olmaz. "Qaragün" ibarəsini ilk dəfə ixtira etmiş olan əcdadımızdan biri bununla bir halimənəviyi müxtəsər surətdə ifadə edərək "qəsvətəngiz olan qara rəngli bir qaranlığın insanda hasil etdiyi təsir nə isə, bu müsibətli, bəlalı günlərin də təsiri odur" demək istəmiş idi. Maddətən siyah olan bir zənci, ya həbəşin istiqamətdən naşi mənən üzü ağ olduğu kimi bəyaz dərili bir qafqazlı da doğruluqdan, namusdan ayrılırsa, mənən qara üzlü olacağı təbiidir ilx.

Dekadentlər iddia ediyorlar ki, zəmanəmizdə hər tərəfdə kəsif-kəsif inhitat və zəval qaranlıqları peyda olmaqda ikən onların da

[1] Tərcüməsi: Dostların sirri arasında qələm naməhrəmdir.

rümuzat və kinayətdən ibarət və bir növ buye-təsəvvüf nəşr edən əsərləri bu qaranlıqlar içində mübhəm-mübhəm işıqlardır. Yenidən təcəddüd və kəmali-feyzləri guya bir növ işıqlardan nəşət edə biləcəkdir. Ancaq feyz almaq həvəsində bulunan insanlar öz həvaslarına ayrı bir seyqəl verməyə qeyrət etməlidirlər...

Əşar və ədəbiyyat dekadentizməsi ilk əvvəl Fransa ölkəsində zühur etdi.

Verlen, Malarme və "Flor demal", yəni "Əzhari-fəna" ünvanlı divanı ilə məşhur Bodler bu məsləkdəki şüəradandırlar. Fransız dekatentizmə əfkarının vasiteyi-intişarı da ibtida "Lajon Frans", yəni "Cavan Fransa" adlı bir məcmuə idi. Çox sürmədən bunların əfkarıməsləki dünyanın hər tərəfinə, hətta Yapon və Amerikaya qədər sirayət edib Rusiyaya və Türkiyəyə dəxi keçdi. Ən ziyadə müsaid olan bir zəmini də dedakentizmə bu iki ölkədə, yəni Rusiya ilə Türkiyədə buldu. Çünki bunların əhvali-siyasiyyə və ictimaiyyələrində əvvəlki dövrlərə (Rusiyada altmışıncı, Türkiyədə isə 70-ci sənələrə) nisbətən bir irtica zəvalpəsəndanə əlaimi hökm etməyə başlamış idi. Rusiyada və ələlxüsus Türkiyədə hürriyyəti-əfkar və kəlam bilkülliyyə məfqud olmuş idi. Ancaq cəbr və təzyiq ilə vücuda gətirilən bu inhitat və zəval əsasən bir dövri-inqilabın müqəddəməsi idi. O inqilabın ki, Rusiyada başlamış, Türkiyədə isə qəribən başlayacaq, yaxud başlamaq üzrədir, çünki əxirən teleqrafların bizə gətirdiyi xəbərlərə görə Trabzon vilayətində Kerason qaimməqamı İbrahim paşanın həyəcana gələn əhali tərəfindən cəbrən təbid edilməsi, Ərzurum camaatinin qeyz və qəliyan edib siyasi məhbusları azad etmələri, bir neçə məmur qətl edib valiyi döymələri, əsgərin isə asilərə qarşı silah qaldırmaq istəməmələri qəribən Türkiyədə möhtəməl olan bir inqilabın müqəddiməsidir.

İştə hürriyyəti-kəlamın məfqud olduğu bu dövrlərdə və bu yerlərdə dekadentizmə sayəsində bir sinif üdəba və şüəra mübhəm-mübhəm rümuzat ilə əhalinin əfkarını tənvirə bir çarə kəşf etmişlərdi. Osmanlı dekadentizmə nəzminin ən mahir şairi "Rübabi-şikəstə"yi yazan Tofiq Fikrət bəy olduğu kibi, nəsrinin də ən bəliğ ədibi "Mavi və siyah" mühərriri olan hekayənəvisi-şəhir Üşşaqizadə Xalid Ziya bəydir. Hər ikisi də türkün şivəsini naqabili-təqlid, hətta bəzi Avropa lisanlarına faiq bir surətdə dərəceyi-qəsvaye-təkəmmülə isal edib üslubi ifadələri qayət səlis, qayət ahəngdar, qayət parlaq, fikir və xəyalları kimi qayət ruhlu və müəssirdir...



İştə zənn edərsəm, dekadentizmənin nə olduğunu bir az anlada bildim, lakin sədəddən bir xeyli uzağa düşdüm. Sədədimiz isə "Qırmızı qaranlıqlar içində yaşıl ziyalar" idi. Gərçi osmanlının Tofiq Fikrətləri, Xalid Ziyaları və bunların məsləki dəxi "Qırmızı qaranlıqlar içində yaşıl işıqlar" isə də, lakin bizim məqsədimiz bunlar deyil idi. Əsil öz sədədimizə rücu edəlim.

* * *

Zəmanəmiz bir inqilab zamanıdır. Bəşəriyyət iləliyə doğru bir addım atmaq istiyor. Addım atdıqca qarşısına reaksiya, yəni irtica şəklində mühib bir qüvvət çıxıb onu geri atmağa çapaliyor. İnqilab ilə irtica güləşiyor, mübarizə ediyor, bu mübarizə nəticəsində ortalıq al-qanlara boyanıyor. O qanlardan süud edən buxarati-kəsif bir səhabə halını alıb bütün ətrafı zülmətə qərq ediyor. İştə qırmızı qaranlıq!.. İki qüvvətin müsadiməsindən ara-sıra hasil olan dəhşətli gurultular şirin və ləzzətli bir uyqu içində yatan biz müsəlmanlara rahət vermiyor, istər-istəməz iyqaz ediyor. Biz də oyanmağa, ayağa qalxmağa məcbur oluyoruz. İbtida sərsəm bir halda bulunuyoruz. Sərsəmliyimiz ilə nə tərəfə gedəcəyimizi şaşırıb müsadimənin içinə düşüyoruz. Ötəmiz-bərimiz əzilib yaralanıyoruz. Bir zülmətin içində biz də al-qanlara boyanıyoruz, dərkən ağlımız başımıza gəliyor, özümüzə ayrı bir yol arayoruz. Bulur kimi oluruz da!.. Doktor Qarabəy Qarabəyovun daşnaksütunçulara və bilxassə Q.X. cənablarına "Kaspi" sütunlarında verdiyi cavabda olduğu kimi, "Biz özümüz bir yol bulub o yol ilə gedəcəyiz. Bizim başqalar ilə büğz və ədavətimiz yoxdur. Bizim özümüzə məxsus daha layiq, daha şanlı bir vəzifeyi-mücahidəmiz vardır ki, o vəzifə də zülməti-qəflətdə bulunan külliyyəti-avam arasında nuri-məarifi əkməkdir" diyoruz. İştə bu nuri-məarif də, Qarabəy Qarabəyov özü də və bütün onun kimi münəvvərül-əfkar olan mücahidini-şübbanımız da yaşıl işıqlardır. Qırmızı qaranlıqlar içində peyda olan yaşıl işıqlardır. Yaşıl deyiriz, çünki öz müsəlmanlarımızdırlar. Ənvari-zümrüdün islamiyyə qəndillərini iqad qeyrətində bulunanlarımızdırlar... Ancaq bana öylə gəliyor ki, qonşularımızın özləri kibi ibtida sərsəm bir halda ayılıb bir yol görməyib tövən və kərhən qanlı müsadimələrə uğradığımız, daha doğrusu, uğradıldığımız kibi indi də alaca qaranlıqlar arasında sezib kəşf etdiyimiz doğru yolların da biganəsi, öz təbirimizlə "nabələdi" bulunuyoruz. Zənnimcə, bütün hüzn və kədərlərimiz, bütün məyu-

siyyətlərimiz bu üzdən təvəllüd ediyor: "Şərqi-Rus", "Həyat", "İrşad", "Dəbistan" və sairə kibi qəzetələr çıxıyor, müştəri tapılmiyor, tapılmadığı üçün ya bağlanıyor, ya "İrşad" kibi Əhməd bəyləri şəhər-şəhər, kənd-kənd, qapı-qapı gəzdirib əhaliyi vəzi-nəsihətlərlə iyqaz etməyə, bu surətlə müştəri qeyd etdirməyə məcbur oluyor. Məktəblər açmağa qeyrət ediyoruz, lakin nə miqdar kafi pul, nə milli proqram mucibincə kitablar və nə də öz din və lisanına haqqı ilə [illegible]yma, lazım qədəri müəllimlər buluyoruz. Həmiyyətli, qeyrətli cavanlar yığılıb müxtəlif namlərlə cəmiyyətlər təşkil ediyor, fəqət orqanizasiyaları qeyri-müntəzəm, irtibati-üzvləri zəif olduğu üçün çox sürmədən dağılıyorlar. Teatrın faydasını anlayıb həmiyyətməndani-şübbanımız darülibrətlər, darülbədayelər[1] meydana çıxarmaq üçün dram kompaniyaları təşkil ediyorlar, "Həmiyyət", "Birinci şirkət", "İkinci şirkət" filan oluyorlar. Lakin nə sədrə şəfa verəcək bir repertuar buluyorlar, nə də camaat tərəfindən bir rəğbət görüyorlar.

Həp işlərimiz bu qəbildəndir. Bu əhvalın səbəbi nədir? Burda xatırıma bir hekayə gəliyor: hənuz məktəbi-ibtidaidə ikən mənim dərs yoldaşlarımın içində iki şagird var idi ki, ikisinin də nəqqaşlığa, rəssamlığa fövqəladə istedad və həvəsləri var idi. Bunların çəkdikləri şəkillərə sair rəfiqlər hər zaman qibtə edərlərdi. Bir gün bu nohəvəs nəqqaşların birini atası məktəbdən çıxarıb özünə köməkçi etmək üçün baqqal elədi. Digər yoldaşımız isə məktəbə davam edərək bir neçə ildən sonra ikmali-təhsil eyləyib öz istedadının saiqəsilə rəssamlıqda tərəqqi etmək üçün Peterburqa getdi. Orada sənayei-nəfisə akademiyasına daxil oldu. Bu məktəbdə də üç-dörd il təhsil gördükdən sonra gözəl bir şəhadətnamə almaqla iktifa etməyərək, Almaniyanın Drezden və Münxen şəhərlərinə gedib bu şəhərlərdəki əsatiz-sənətdən dərs aldı və ən nəhayət bədayei-sənətə təmamilə kəsbi-vüquf etmək üçün bir az Hollanda, Belçika və Paris muzeylərində gəzdikdən sonra İtaliya paytaxtı olan Rimə getdi, burada da bir-iki il qalıb Rafaellərin, Korrecioların, Mikel Anceloların, Leonardo da Vinçilərin, Tissiyanların, Botiçellilərin asarını tədqiq və mütaliə etdi. Bizim nəqqaş yoldaşımız ancaq bu qədər zəhmətdən sonra öz vətəninə övdət edib rəssamlığa başladı. Baqqal olan yoldaşımla bu rəssamın biri-birindən ayrıldıqlarının üzərindən tam igirmi

[1] Teatro, yaxud "tamaşaxana" adları Avropada hər növ teatrlara verildiyindən, bu istilahlar camaatin nəzərində bir az ləkəli olduğu üçün şübbani-qeyrətməndanımızın məqsudu olan Şillerlərin, Şekspirlərin, Molyerlərin, Mirzə Fətəli Axundovların teatrına darülbədaye namı verilsə, daha münasib olur zənn edəriz.



sənə keçmişdi. Bir gün bizim baqqalın yolu Moskva şəhərinə düşdü, orada bir rəsm sərgisi açılmış idi. Baqqal da oraya tamaşaya getdi. Bir neçə lövhənin üzərində öz qədim yoldaşının imzasını görüb tanıdı.

Lövhələrin altında isə bir vərəqparədə qiymətlərinə dəlalət edən bu sözlər yazılmış idi: üç min manat, beş min manat, yeddi min manat...

Bizim baqqal xəyala getdi. Vaxtilə yoldaşından ziyadə istedad və qabiliyyət göstərmiş olduğu bir sənəti tərk edib baqqallıq ediyordi. Baqqallıqda isə ayda yüz əlli, iki yüz manatdan, yəni ildə iki min manatdan ziyadə qazanamıyordı. Rəssam olan yoldaşı isə, şübhəsiz, sənədə qırx-əlli min manat qazanıyordı. Atası o zamanlar vəfat etmiş olan bizim baqqal şəhərinə övdət edər-etməz dükanı bağladı. Rəssamlıqdan otuz-qırx min manat qazanmaq mümkün ikən dükanın nə lüzumu var idi. Baqqal bir maqazaya gedib rəssamlığa dair bir çox alətlər və rənglər alıb yenidən rəssamlığa başladı. Bir neçə böyük lövhə vücuda gətirib sərgiyə göndərdi... Lakin, heyhat! Bu lövhələrə otuz, ya qırx manatdan ziyadə verən müştəri tapılmıyordı!.. Çünki baqqal bir şeyi xatirinə gətirmıyordı, bilmiyordı ki, lövhələr üç, dörd min manata getmək üçün əvvəlcə peterburqlarda, berlinlərdə, drezdenlərdə, münxenlərdə, romalarda igirmi sənə qədər çalışmaq lazımdır...

Baqqal öylə zənn ediyordi ki, yaşıl çəmənlərin, ağacların rəsmi yaşıl ilə boz rəngli daşların, qayaların rəsmi də ağ və qaradan məxlut rənglərlə çəkiliyor...

* * *

İştə bizim halımız da bu baqqalın halına bənziyor: Biz sədəmati-inqilabiyyə rəd və bərqin təsirilə ayılıb gördük ki, "Karvan rəfte-vəma bər səre rahim hənuz!.."[1]

Biz gördük ki, qonşularımızın iləri getməsinin səbəbi qəzetələr, mətbəələr, kitablar, məktəblər, mədrəsələr, sənətlər, cəmiyyətlər, şirkətlər, orqanizasiyalar, teatrlar imiş!.. Biz də ələl-əcələ bunları yarım yamalaq düzəltməyə başladıq. Bilmiyoruz ki, qonşularımız qırx, əlli ildən bəridir çalışıyorlar. Bilmiyoruz ki, on min manatlıq rəsmlər yapmaq üçün Ayvazovskilər əvvəlcə otuz il qədər əmək sərf etmişlər...

Bərəkət versin ki, millətimizdə təbii bir istedad, keçmiş mədəniyyətlərimizdən bizə irsən intiqal edən bir istedadi-əzim var imiş.

[1] Tərcüməsi: "Karvan gedib, hələ biz yolun yarısındayıq".

Yoxsa rəsmlərimiz, lövhələrimiz heç qırx, əlli manata da satılmayacaq idi!.. Lakin hər halda napaydar qəzetələrdən, məktəblərdən, məscidlərdən, cəmiyyətlərdən, darülbədayelərdən ibarət qırx, əlli manatlıq bu ictimai lövhələrimiz də "qırmızı qaranlıqlar içində yaşıl işıqlardır..." Əksəriyyən paydar olmasalar da gündən-günə ədədləri təzayid ediyor. İşığın biri söndükcə, yerinə digər ikisi qaim oluyor. Davam etməsə də sürətlə təkərrür ediyor: Bakıda "Həyat" sönüyor, Daşkənddə "Xurşid", Bağçasarayda "Millət" zühur ediyor. Daşkənddə "Xurşid" sönüyor, Bakıda "Təkamül", Moskvada "Tərbiyeyi-ətfal" nəşri-ənvar etməyə başlıyor... Cəmiyyətlərimiz də böylədir. Ötədə bir neçə zükur cəmiyyəti paydar olmayıb dağıldığı halda bəri də xeyirli-xeyirli nisvan cəmiyyətləri təşəkkül ediyor. "Şəfqət məclisi" bina olunuyor. Yaponlar ətfalə iki əl ilə də, həm sağ, həm sol əlilə yazmaq öyrədirlərmiş! Heyəti-milliyyəmiz nədən iki qanad ilə pərvaz etməyə çalışmasın? Rical bəşəriyyətin bir qanadı isə, nisvan da digər qanadıdır. Axır bu həqiqəti anlamış olmalıyız ki, qızlarımız məarifə həvəs, xanımlarımız cəmiyyət, komitet təşkilinə qeyrət etməyə başlıyorlar. Bakıda, Vladiqafqazda xanımlar tərəfindən ianə komitələri açılıb hər kəs həzrət Süleymanın qarıncası qədərincə bir hədiyyə gətirərək Qarabağ qəhətzədələrinə iki min manatdan ziyadə pul cəm etmələri və o yolda müsamireyi-xeyriyyələr verməleri şayani-diqqət və təhsindir.

İştə bunlar həp yaşıl işıqlardır. Əxirən peyda olan bu növ işıqların ən parlağı Bakıda irfanpərvər cavanlarımızın qeyrətilə təşəkkül edən "Nəşri-maarif cəmiyyəti" ilə Peterburqda bina olunan cameikəbirdir. Hacı Zeynalabdin Tağıyevin təhti-rəyasətində olan məzkur cəmiyyətin daha birinci ictimaında camaətimizin həmiyyəti sayəsində on səkkiz min manata qədər bir məbləğ yığıldığını zikr edərsək, bu cəmiyyətin qüdrət və əhəmiyyəti özlüyündən təzahür edər.

Zikr olunan məbləğ təzayid etmək üzrədir: yövmi-güşadından çox keçmədən bu cəmiyyətə Məşqətə əhlindən bir zati-möhtərəmlə əşrafi-bəldəmizdən Murtuza Muxtarov həzrətləri gözəl mülklər vəqf etdilər. Murtuza Muxtarovun vəqf etdiyi mülkünün qiyməti 18 min manat təxmin olunuyor. İştə bu cəmiyyətlər, bu nəqdlər, bu vəqflər həp yaşıl nur nəşr edəcək qəndillər, məşəllərdir. Ancaq bu günlərə qədər Rusiya müsəlmanları içində ötədə-bəridə mütəfərriqən iqad edilən bu növ qəndillərin arasında bir irtibat, həblülmətin vasitəsilə olan bir irtibat yox idi. Asari-ittihad məfqud idi, halbuki igirmi beş, otuz milyonluq bir camaəti birləşdirmək üçün bir üqdeyi-



mərkəziyyə lazım idi. Çox şükür ki, axirüləmr bu üqdeyi-mərkəziyyənin də nərədə və nə vasitə ilə olacağını anladıq. Peterburq Rusiya imperatorluğunun və binaənəleyh Ümumrusiya müsəlmanlarının dəxi mərkəzidir. Ən əvvəl yazılmış, hətta həzrəti-Osman (rəziallahu ənhu)-nun öz dəstxəttilə yazılıb bir rəvayətə görə xuni-şəhadətinə boyanmış bulunan Qurani-Kərimin müshəflərindən biri ələn bu şəhərdə bulunmaqda olub, vaxtilə türk cahangirlərindən Teymurləng tərəfindən Bağdaddan Səmərqəndə nəql edilmiş idi. İştə otuz milyon Rusiya müsəlmanları üçün böylə on üç əsrlik məshəfi-şərifdən daha gözəl, daha mətin maddi bir həbl, onun üzərində bina olunan camei kəbirdən daha mükəmməl, daha paydar bir üqdeyi-mərkəziyyə təsəvvür olunamaz. Ancaq lazımdır ki, o məbədi-müslimin, hifz edəcəyi bir gövhərin şərafəti, otuz milyonluq bir camaət ittihadının cəlaləti, Böyük Petro paytaxtının həşəmət və əzəməti nisbətində olsun...

Məlumdur ki, sənayei-nəfisədən müsəlmanlar beynində qədimdən bəri ən ziyadə tərəqqi edən sənət fənni-memari idi. Səbəbi bu idi ki, memarlığa haqqı ilə vaqif olan müsəlman ustadları cənabi-Həqqin hüsn və cəlal kibi iki sifəti-mənəviyyəsini xütuti-həndəseyi-memariyyənin ahəng və əzəmətindən ibarət bir növ rümuzati-cismaniyyə ilə mömininə ixtar etmək istəyirlərdi. Müsəlman aləminin məşhur məbədlərində, ələlxüsus Hinddə, Misirdə, Əndəlisdə, İstanbulda, Şamda, İsfahanda bina olunanlarda bu hal nümayandır.

İndi bu sənətimizi Peterburqda aləmə qarşı müşəşə bir surətdə göstərməyə qeyrət etməliyiz... Bu günlərdə Qafqaz canişini qraf Voronsov-Daşkov həzrətləri ilə Gürcüstan ekzarxının hüzurunda kəmali-dəbdəbə ilə Batum şəhərində müəzzəm bir kəlisanın rəsmi-güşadi icra olundu.

Ruslar bu kəlisayı vücuda gətirmək üçün milyonlar sərf etdilər. Çünki niyyətləri öz həmməzhəblərini Həzrəti-İsa (ə.s.)-nın mavi nurlarından müstəfid etməkdir... Otuz milyon qədər bir camaəti Həzrəti-Məhəmmədin yaşıl nurlarından feyziyab etmək üçün Peterburq məscidinin binasına hər birimiz bir manat, bir abbası, hətta bir qəpik versək, yenə milyonlar təraküm edər. Əsasən bu əmri-xeyrə də milyonlar lazımdır.

"Qotbe-cənubi-yo-şemalist del
Dər do tərəf hakim-o-valist del"[1].

[1] Tərcüməsi: "Cənubun, şimalın qütbüdür ürək,
İki tərəfdə hakim, validir ürək".

Ey Rusiya ölkəsində olan ümməti-Məhəmməd, ey Qafqaz qitəsində bulunan əhli-islam, ey Bakı şəhərinə yığılan müsəlmanlar! Qəlblərimizin qütbi-şimaliyə qədər təvəssö edə bildiyini, orada dəxi hakim olduğunu göstərməliyiz. İsbat etməliyiz! Hər birimiz öz qüdrətimizə görə bu binaya bir daş, bir kərpic, bir sütun, bir qübbə ehda etməliyiz. Qəflətimiz nəticəsi olaraq bu təşəbbüs bir müddətdən bəri geri qalmış idi. Əxirən işin xeyri-əncamə yetməsi üçün ana yeni bir gərmi verildi. Hətta bizləri dəxi keyfiyyətə agah etmək üçün bir-iki həftə əqdəm generali-əlidövlət Şeyx Əli ixtiyar zəhmət edib Peterburqdan şəhərimizə qədər gəlib burada bir neçə gün müsafirətdə bulundu. İndi də müşarileyh Peterburqdan teleqrafla bizlərə gözəl bir müjdə veriyor. Müşarileyhin və Peterburq teleqraf agentasının verdikləri teleqrafların məzmunu budur:

Bu aralıq Peterburqda müsafir bulunan Buxara əmiri həzrətləri, Rusiya təxti-səltənətinin varisi bulunan vəliəhd ilə ilk yövm mülaqatlarını təyid niyyətilə, Peterburqun mərkəz qismində olan bir ərəseyi-məzkur günün yadigarı olmaq üzrə müsəlman məscidinə vəqf etmək istədiklərini əlahəzrət padşah imperatora bəyan etdilər. Böylə bir arzuyi həşəmətməab imperator həzrətləri təqdir və təhsin buyurub əmir həzrətlərinə bəyani-təşəkkür etdilər. Məzkur yeri Əmir həzrətləri 250 min manata almışlardır. General Şeyx Əli bildiriyor ki, bu münasibətlə Peterburq müsəlmanları arasında fövqəladə bir şadimani hökmfərmadır. Lakin bu sürur və şadimaniyə bütün Rusiya müsəlmanlarının iştirak edəcəyinə, həm də fel və əməl ilə iştirak edəcəyinə şübhə yoxdur... Nasıl şad və məsrur olmıyalım ki, qütbi-şimalının bir nöqtəsində bir nur peyda olub onun yaşıl şüaları zülməti-həmradan müztərib olan otuz milyon qəlbi tənvir və ehya edəcək. Bu otuz milyon qəlb də həmahəngi-zərəban olub həblülmətin ilə bir nöqtədə ittihad edə biləcəkdir... İnşaallah Peterburq məscidinin Tiflisdəki və Bakıdakı əmsalı ilə bərabər qəribən hüsniəncamə yetdigini və eyni zamanda bir də bir məktəbi-ali-ruhaniyyə ciddən təşəbbüs edildiyini görməklə kamiyab oluruz...

Yaşasın yaşıl işıqlarımız, zümürrüdin sədalərımız, əxzər rayihələrimiz!..

*Ə.H.*

*"Füyuzat", 1906, №5*



## ŞİLLER

Bizim Qafqaz müsəlmanları arasında, tənviri-əfkarın vasitələrindən biri qəzetə olduğunu ilk əvvəl Həsən bəy Məlikov dərk etmiş bulunduğu kibi, təhzibi-əxlaqın da vasitələrindən biri teatr və darülbədaye olduğunu ən əvvəl mərhum Mirzə Fətəli Axundov anlamış idi. Bunların hər ikisi də öz məsləklərində böyük bir istedad, qabiliyyət göstərmiş olduqları halda təşəbbüs etdiklər iş paydar olamayıb tərk edildi. İki işığın ikisi də söndü, həm də bir xeyli müddət şölələnməmək üzrə söndü.

Səbəbi nə idi? Səbəbi bu idi ki, meydani-mücahidədə tək qalan adam qəhrəman olamaz. Bu kibi xeyirli işlərin paydar və qabilitərəqqi olması üçün münasib bir cəmaət və öylə bir cəmaətin ayıqlığı lazım idi. Bu ilk təşəbbüslərin üzərindən otuz-qırx sənə qədər bir zaman keçdi. Cəmaətimiz ayılmağa və yavaş-yavaş qəzetəyə olduğu kibi, teatra dəxi cüzi bir ehtiyac göstərməyə başladı. İbtida ancaq həvəskarlar füqəra və möhtacinə ianə niyyətilə ara-sıra müsamireyi-xeyriyyələr tərtib edərək səhneyi-tamaşaya ələ keçə bilən komediyalardan, faciələrdən vəz etməkdə ikən, əxirən bu işə dəxi yeni bir fəaliyyətlə təşəbbüs edilib, ortaya hər bir neçə teatr mühərrirləri, həm də binnisbə müntəzəm teatr kompaniyaları çıxdı. Bunların verdikləri ümidlər getdikcə kəsbi-qüvvət ediyor. Lakin mətəəssüf içimizdə Mirzə Fətəli kibi bir teatr mühərriri bir daha zühur etmədi. Çünki elə istedadi-fövqüladələr sadə bizdə deyil, sair əqvam arasında dəxi əsrlərdə bir-iki dəfə görünən şeylərdir. O halda nə etməliyiz? Yeni bir Mirzə Fətəlinin zühurunumu bəkləməliyiz?

Təbiidir ki, bu caiz olamaz. Şimdi bəkləmək, gözləmək zamanı deyildir.

Vaqiən, Nəcəf bəy Vəzirov, Nərimanov, Haqverdiyev, Qənizadə tərəfindən Azərbaycan şivəsində bu yolda bir neçə asar vücudə gətirilmişdir. Ancaq bunlar bugünkü ehtiyacımıza nisbətən azdır, nakafidirlər. Onun üçün naçar Avropa mühərrirlərinin asarını ələ alıb bunları bir-bir tərcüməyə, ya təhvilə qeyrət etməliyiz. Bir qism yeni gənc mühərrirlərimiz zatən belə münasib görüyorlar və böylə hərəkət ediyorlar: Keçənlərdə rus üdəbasından məşhur Qoqolun "Revizor", yəni "Müfəttiş" ünvanlı əsərini diş həkimi Məmmədəli bəy Səlimbəyov tərcümə edib Tağıyev teatrında səhneyi-tamaşaya vəz

etdirdi. Tərcümənin bəzi nöqsanlarına, lisanının ədəbi olmamasına rəğmən teatrı dolduran camaat məmnun və xoşnud qaldı. Həm aktyorlar, həm mütərcim özü dəfəatla alqışlandı, təhsin edildi. Şimdi də eşitdiyimizə görə bu yolda bir tərcümə də Mehdi bəy Hacınski vücuda gətirib səhnə üçün hazırlayor. Mumaileyhin tərcümə etdiyi əsər Germaniyanın ən böyük dühati-şüərasından olan Şillerin "Əşqiya", yaxud "Qaçaqlar" ünvanlı faciəsidir. Bu qədər ədəbi bir əsəri bizim qayət naqis olan Azərbaycan şivəmizə Mehdi bəy layiqi vəchlə nəqlə müvəffəq oldumu, olmadımı? Orasını qəribən teatrda anlarız. Eyni şairin "Vilhelm Tel" ünvanlı digər bir əsəri-nəfisini Abdulla Cövdət kibi müqtədir bir ədib və şair İstanbul şivəsi kibi mükəmməl bir türkcəyə tərcümə etmiş olduğu halda, yenə tərcüməsi təni-intiqaddan azad qalmadı. Doğrusu, Mehdi bəyin cürətinə təəccüb edəriz.

Fəqət indiki halda hər hansı surətlə olursa olsun teatra olan ehliyacımıza çarəsaz olmalıyız. Qüsurlu tərcümələr də məqbulumuzdur. Vaxt və zamanın o qüsurları düzəldəcəyinə şübhə yoxdur.

Avropanın ən məşhur faciə, hailə və məzhəkə yazanları Şekspir, Molyer, Şiller və İbsendir. Zatən indiki halda dilimizə ən ibtida tərcüməyə layiq və münasib olan bunların asarıdır. Bu asara həm mətbuatda, həm səhni-tamaşada aşina olmağa qeyrət etməliyiz.

Bu dəfə Mehdi bəy sayəsində "Qaçaqlar"ı teatrda seyr etmədən əqdəm bu əsərin mühərriri-əslisi haqqında bir nəbzə məlumat edəlim.

Şiller Gete ilə bərabər Almaniyanın ən böyük üdəba və şüərasından olub Almaniya teatrını o vaxta qədər eşidilməmiş bir dərəceyi-təkəmmülə isal etdiyi kibi, asarı ilə, ələlxüsus teatra aid asarı ilə də ümum German qövminə əfkari-hürriyyəti ilqa edib, bu sayədə vətənini mühəyyirül-üqul bir tərəqqiyə məzhər edənlərdən biridir.

Şiller sadə teatra məxsus əsərlər yazmaq ilə iktifa etməmişdir. Müşarileyh teatr haqqında dəxi ayrıca gözəl məqalələr yazıb, teatrın millətə nə dərəcələrdə mənfəətbəxş olacağını dəlaili-vazehə və qətiyyə ilə isbat eləmişdir. Rəvayətə görə Şiller öz millətini kəlisa vəz və nəsihətləri ilə təriqi-nicatə çıxarmaq üçün ibtida keşiş olmaq istəmişdi. Fəqət eyni nəticənin teatr səhnəsindən dəxi hasil olacağını anladığından bilaxərə bütün mücahidatını bu yola həsr etdi.

Bu xüsusda bir hekayə nəql edirlər: Şiller "Mariya Stüart" ünvanlı faciəsində kəlisayə məxsus bir ayini-ruhaniyi göstərmək istiyordi.



Bu əsəri səhneyi-tamaşaya qoyacaq da Gete idi. Bunu xəbər alan şəhərin baş rahibi Geteni görüb hiddətlə protesto edər. Gete isə etidalını əsla pozmayıb, baxınız nə cavab vermişdir:

"Gete rahibə deyir ki:

– Əfəndim, teatrın xadimi həqiqi bir vaizi-ruhani olduqca teatr məbədə münqəlib olacağı kibi, layiq bir xadimdən məhrum olan kəlisa da teatroya dönə bilir..."

Çünki "şərəfülməkan bilməkin"dir.

Şiller 1759 səneyi-miladiyyəsində Morbax qəsəbəsində təvəllüd edib, 1805 sənəsində Veymarda vəfat etmişdir. Ştutqart şəhərinin ümumi-aliyyə məktəbində hüquq və tibb elmlərini ikmal təhsil etdikdən sonra ibtida vətənində təbibi-əskəri sifətilə xidmət eləmişdir. İlk faciəsi olan "Əşqiya" üzündən hökmdarı olan Virtemberq doqası Hersoq Karlın hiddət və qeyzinə bais olmaqla, Ştutqardt şəhərindən fərarə məcbur olursa da, lakin qədirşünas olan sair alman hökmdarlarından iltifat görüyor. Manhaym şəhərində saray şairi ünvanını qazanıyor. Bir az sonra Yena darülfünunda tarix müəllimi oluyor. Elmi-tarixə dair mühüm və nafe kitablar yazıyor. Nəhayət, müəllimlikdən də əl çəkib, 1799 sənəsində Veymar şəhərinə Getenin yanına hicrət ediyor. Bundan sonra artıq ömrünün axırına qədər vaxtını ancaq ədəbiyyata həsr edərək, həm öz millətini, həm də bütün bəşəriyyəti müstəfid edəcək bədiələr vücuda gətiriyor ki, bunların ən məşhurları "Don Karlos", "Mariya Stüart", "Orlean qızı", "Valnşteyn" və Abdulla Cövdət tərəfindən tərcümə olunan "Vilhem Tel"dir. Biz bu asara dəfəatla rücu edib, hər fürsət düşdükcə Şiller haqqında mütaliatımızı tovsiə çalışacağımızdan şimdilik bu qədərcik məlumat verməklə iktifa ediyoruz.

***Ə.Hüseynzadə***
*"Füyuzat", 1906, №5*

## NİCAT MƏHƏBBƏTDƏDİR!..

*(24 dekabr)*

Ustade-kainat ke in karxane saxt,
Məqsud eşq bud, cahanra bəhanə saxt,
Ruzi ke, morğe-eşq bealəm qoşud bal,
Cayi nədid, dər dele-ma aşiyane saxt[1].

***Müslimi Şirazi***

1906 səneye-miladiyyəsi xitamə iriyor, Həzrət Məsihin (ə.) təvəllüdündən səneyi-şəmsiyyə hesabilə min doqquz yüz altı sənə keçiyor deməkdir. Yılın bu mövsimində, bu günlərində hicrəti-nəbəviyyədən yenə eyni hesabla 622 sənə əqdəm Fələstin qitəsinin (Beyti-ləhəm) adlı bir qəsəbəsində bir xurma ağacının altında (İncilə nəzərən bir axur yemligində) Həzrəti-Məryəmdən, cənab Haqqın hikmətilə və Cəbrailin nəfhilə hamil qalan Həzrəti-Məryəmdən dünyayə bir tifil gəldi ki, o tifil ənbiyayi-zişandan, cahanın bütpərəstliyinə, müşrikliyinə ilk dəfə əzəmətli bir sədəmə vuran Həzrəti-İsa idi... Peyğəmbər müşarileyh 33 sənə qədər imtidad edən müddət ömründə insanlara nəyi öyrətmək, təlqin etmək istiyordi?..

İsəviyyətin ilk ibtida intişar etdiyi məmləkətlərin birində, yəni Yunanıstanda gəzərkən kəndli, fəqir bir xristianın xanəsində rəsm yerinə müsəlman qaydasında divara asılı bir lövhə gördüm. "O lövhədə açıq-mavi rəngli bir atlas üzərində zərrin bir xətt ilə yunaniyülibarə olaraq bu sözlər yazılı idi: "İman", "ümmid", "məhəbbət", iştə o üç qüvvət ki, İsa onunla naciyi-kainatdır". Zənnimcə, üç kəlmənin üçünü də daha şümullu olan bir "məhəbbət" kəlməsilə ifadə etmək mümkün olduğu kibi, məhəbbət kəlməsini də kələmətullah ilə, yəni İsa namilə ifadə etmək olur: məhəbbət, yəni İsa, İsa, yəni məhəbbət!.. Bu o qüvvətdir ki, ona 7 əsr sonra xatəmülənbiya vəlmürsəlin tazə bir ruhaniyyət, tazə bir rövnəq, tazə bir nuraniyyət, ila yövmülqiyamə sönməyəcək bir rövnəq və nuraniyyət verdi...

---

[1] Tərcüməsi: Kainatın ustadı ki, bu karxananı düzəltdi.
Məqsədi eşq idi, dünyanı bəhanə etdi.
O gün ki eşq quşu dünyayə qanad açdı
Bir yer tapmadı, bizim ürəyimizdə yuva tutdu.



Məhəbbət nədir? Məhəbbət insanların haqq yolunda biri-birilərini və hər biri cümləyi sevmələridir. İslamın əzəmi-müctəhidindən olan imam Siyuti həzrətləri "İctihad"ın zikr etdiyi vəchlə diyor ki:

"İnsanlara məhəbbət, yeganə və həqiqi "hübbullahdır". ...Bu islamiyyətdə öylə bir həqiqətdir ki, onu qraf Tolstoy cənabları Yasnaya Polyanasında eşitsə, şimdiyə qədər bundan gözəl bir həqiqət kəşf edəmmədiyindən naşi çıldırır, dəli olurdu, zənn edərəm. Hər halda Tolstoyun və əmsalının bu həqiqəti alqışlayacaqlarına şübhə yoxdur... Lakin bəşəriyyət özü 13 əsr, yaxud 20 əsrdən bəri təcəlli edən bu həqiqəti alqışlayırmı?.. Heyhat?..

1907-ci səneyi-miladiyyə yenə bir çox əmsalı kimi al-qanlar içində qürub ediyor!.. Ah! Bu al-qanlar, bu qırmızı qaranlıqlar, bu şeş cəhətdən gələn "terror" alovları!.. Biz heç onlardan bəhs etmək istəməz idik, biz ancaq fikir və xəyalımızı nur, məhəbbət, hüsn, ahəng, nizam aləmlərində gəzdirmək, cahanın hər tərəfində ancaq bunların asarını görmək istərdik. Lakin nə fayda ki, məhəbbət və şəfqətdən bir əsər buraxmayan Stolıpin üsuli-idarəsilə buna müqabil yəs və alam içində hökmfərma olan terrorun nəticələri olaraq qurulan dar ağaclarının, məhbusların, mənfalərin mənzəreyi-kərihələri, dəhşətlə partlayan barıtın, dinamitin sədayi-mənfurları bizi bu növ səfalardan məhrum ediyor.

Biz bu növ hadisələri zikr və tedad etməkdən, qarelərimiz isə oxumaqdan yorulduq, bezdik. Bu gurultular, bu vəhşətlər, bu qanlar artıq əsabımıza, həvasimizə təsir etməz oldu. Lakin nə divani-ülfiəsgəri insanları asıb-kəsməkdən, həbs etməkdən, nə də inqilab terroristləri bomba atmaqdan, "Brauninq" sıxmaqdan yorulub usanmadılar. Rusiya vase bir qətlgaha döndü. İnsanlar məchul mövhum allahlara, bütlərə qurban ediliyorlar. Bu həftə məzkur divan gündə igirmi, otuz adam edam edəcək dərəcədə fəaliyyətini bir qat təzyid etdi. Lakin buna müqabil terror hadisatı da eyni nisbətdə çoxaldı, təşəddüd etdi. Hər tərəfdən ancaq bomba səsi gəliyor. "Hər gün bomba partlayor" demək azdır. Bir qəzetə mühərririnin dediyi kimi, hər gün bombalar vəhşiyanə rəqs ediyor...

Bu həftə içində Rusiyanın müxtəlif cəhətlərində hər gün kərrat ilə vaqe olan terror hadisələrinin ən mühümlərini zikr etmədən keçəməyiz:

Bu ayın doqquzunda, Tver şəhərində "quberniya zəmindarlıq məclisinin" müzakiratında iştirak edən, şurayi-dövlət əzasından qraf

Aleksey Pavloviç İqnatyev ictimaiyun, inqilabiyun firqəsinin göndərdiyi bir cavan adam tərəfindən qətl edildi. Müşarileyh sağ firqələrin ən fəal rəislərindən biri olub mühafizəkarlığı və mazipərəstliyi ilə məşhur bir zat idi. Ayın 15-də Omsk şəhərində Ağ Molla qubernatoru Litvinov küçədə gedərkən qətl olundu.

Bu qətllər hənuz unudulmadan, ayın 22-də Peterburqda bu şəhərin qradonaçalniki, yəni hakimi bulunan Fon Derlaunes vurulub qətl edildi. Vəqə şu yolda cərəyan etmişdir: Peterburqda tibb təcrübəvi müəssisəsi dairəsində əmrazi-cildiyyə, yəni dəri xəstəliklərinə məxsus bir şöbə bina edilmiş idi. Bunun rəsmi-güşadı münasibətilə məzkur dairəyə mülhəq kəlisada ayini-ruhani icra olunuyordu. Burada prins Oldenburqski tərəfindən dəvət edilmiş olan qradonaçalnik dəxi hazır idi. Ayinin xitamında kəlisadan çıxıb havlıya enərkən onun üzərinə bir cavan adam hücum edib bir neçə "Brauninq" gülləsilə vurub qətl etdikdən sonra öz-özünü dəxi vurub intihar edər... Burada şayani-diqqət bir cəhət vardır ki, o da vəqənin İsa məbədi ədd olunan kəlisa ilə Eskulap, yaxud Loğman məbədi olan darültib önündə cərəyan etməsidir. Kəlisa məhəbbət, üxüvvət və səlamət ruh mənşəi, məbədi-tibb isə şəfqət, insaniyyət və səhhəti-bədən mənbəi olmaq lazım gəlirkən, hər ikisi də zamanımızda hökmdən saqit olub təsirsiz bir hala gəlmişlərdir... Zatən bu anda kənisaların vəzifeyi-əsasiyyeyi-insaniyyətkariyi unutduqları, məkatibin, ələlxüsus məkatibi-aliyənin isə mənbəi-həyəcan və qələyanə döndükləri görülüyor. Üxüvvət və məhəbbətdən guya bir əsər qalmamışdır. Kəlisa önündə insanlar bir-birlərini öldürüyor. Məktəb içində insanlar bir-birini vuruyor. Bu haldan nərə azaddır? Heç bir yer!

Bomba isə əsla ehtiyat və tədbir bilmiyor, keyfincə "rəqs ediyor", istədiyi kibi atılıb-düşüyor, patlayor. Gah görə-görə, gah kor-koranə patlayor. Xarkov şəhərində vağzal, yəni mövqif ortasında partlayıb bigünah səfərçiləri, Kiyev şəhərində otel içində partlayıb bigünah müsafirləri, mehmanları, Varşava şəhərində fırına gətirilən xamur içindən çıxıb biçarə çörəkçini, bilməm nərədə əkin torpağını qüvvətləndirmək üçün gətirilən gübrədən çıxıb fəqir əkinçiyi, Tiflis kibi bir çox şəhərlərin küçələrində, meydanlarında, xanələrində patlayıb heç bir şeydən xəbəri olmayan gəlib-keçənləri, qonşuları tələf ediyor. Fəqət əksəriyyən hədəf olanlar hökumət məmurları oluyorlar...

Bütün bu əhvalın səbəbi nədir, bilirmisiniz? Səbəbi Həzrəti-İsa ilə Həzrət Məhəmmədin yüzlərcə əsrlərdən bəri bəşəriyyətə təlqin



etmək istədikləri məhəbbəti-mütəqabilənin nöqsan və məfqudiyyətidir!.. Rusiyada mühafizəkaran ilə inqilabpərvəranın, camaatla bürokratiyanın, zəngin siniflərlə fəqirlərin, füqərayi-kasibənin arasında məhəbbət qalmamışdır. Sadə Rusiyada və xristian aləmində deyil, müsəlman aləminin bir çox yerlərində də hal və keyfiyyət bu mərkəzdədir. Fas ölkəsində Rəsuli firqəsilə Molla Əbdüləziz tərəfdarlarının və Molla Əbdüləzizə müavinət bəhanəsilə Fasa yerləşmək istəyən avropalıların arasında qətiyyən məhəbbət yoxdur. Məhəbbət olmadığı üçün bu günlərdə gələn teleqrafa görə Arsilada qoşunlar arasında müsadimə gözləniyor. Sinat (Serğat) qəsəbəsi isə topa tutulub yanıyor. Topun və bombaların səsi Təncə şəhərindən eşidiliyormuş...

Məğribi-əqsadə bu münaziənin, bu ədəmi-məhəbbətin əsbabı hənuz layiqilə anlaşılmadığı halda Afrikanın bəri başında, yəni Misir ölkəsində ingilislərlə müsəlmanların arasında başlayan münafirətin, füqdani-məhəbbətin səbəbi bir dərəcəyə qədər aşikardır. Bu da Misir əhalisi arasında hissiyyati-vətənpərvəranə və hürriyyətpərəstanənin oyanmasından ibarətdir. Misir qitəsində "Əl-misr lil-misriyin" tərazi getdikcə əvamünnas arasında tərəqqi etməkdədir. İngilislər əleyhinə olan bu hərəkatın riyasətində "Əlliva" qəzetəsinin sahibi Mustafa Kamal Paşa bulunuyor... "Əlcamiətülmisriyyə" adı ilə milli bir darülfünun bina edib, bu bina üçün 7435 lirə cəm etmələri misirlilərin oyanmasına dəlalət edər...

Misirdən Hindistana keçəcək olursaq, burada hal və keyfiyyətin bir az başqa dürlü olduğunu görürüz. Burada müsəlmanlar bir dərəcəyə qədər bitərəflik göstərdikləri halda biləks ingilislərlə yerli qeyri-müslimlər arasında, ədəmi-məhəbbətin, xüsumətin gündən-günə kəsbi-şiddət etdiyi görülüyor. Budda və Brəhmən məzhəbində olan hindular əhvali-ictimaiyyə, siyasiyyə və milliyyələrini islah üçün Kəlküttə şəhərində böyük bir konqre tərtib edib ingilis ziddinə olan əfkar və hissiyyatlarını aşikar bir surətdə bəyan etməkdədirlər. Bu da öz tərəqqiləri ilə yapon mədəniyyəti təsirinin nəticəsi olsa gərəkdir. Bu hərəkətin Mustafa Kamil Paşası Nabxayi Nauruci adlı bir hindu olub konqredə ingilis əleyhinə qayət atəşin nitqlər irad etmişdir...

Hindin qeyri-müslimləri hürriyyət və tərəqqiyə doğru böylə addımlar atmaqda ikən hər nədənsə bu aralıq Hindin 70 milyon nüfusdan ibarət müsəlmanları qonşularının xilafına olaraq ingilislərə münafirət deyil, bir meyil və məhəbbət göstərmək istiyorlar... Bu niyyətlə benqalalıların Kəlküttədəki konqrelərinə qarşı Hindustanın böyük

mərkəzlərindən birində, ehtimal Loknau şəhərində bir müsəlman konqresi tərtib etmək üzrədirlər. Görünüyor ki, bu qitədə də dəxi ixtilaf və ədəmi-məhəbbət hökmfərmadır. Ancaq bu ədəmi-məhəbbət ingilislə müsəlman arasında olmayıb, "müsəlmanla məcus" və "məcus ilə ingilis" arasındadır...

Dağınıq və pərakəndə olan müsəlmanların halı ötədə-bəridə bu yolda ikən bu xalqın rəisi-mənəvisi ədd olunan zat, əcəba nə ilə məşğuldur? Bunu bilmək istəyən "Molla Nəsrəddin" məcmuəsində Fas səltənətinin halını təsvir edən bir rəsmə müraciət edə bilir... Lakin orada təbəssümdən başqa bir şey görəməzsiniz. Halbuki müşarileyhin iştiğalatı çoxdur: tərəqqipərvəranə və ələlümum əhaliyə nəfəs aldırmıyor, almanlara tənəffüs üçün bol-bol imtiyaz məhəlləri göstəriyor. Məclisi-məbusanın qapılarına yeni-yeni kilidlər vuruyor və təxti-səltənəti də haqqı olmayan, fəqət bürokratlara bir çox haq verəcək olan bir növcavan üçün hazırlamağa çalışıyor... Hər halda bu qədər məşğuliyyətilə bərabər bütün məmləkətində camaatla hökuməti yekdigərinə bağlayacaq bir rabiteyi-məhəbbət məfquddur...

Yuxarıdan bəri məqaləmizdə bir məhəbbət, bir rabiteyi-məhəbbət kəlməsi gediyor. Əcəba insanlar arasında istər Rusiyada, istər Avropada, istər məmaliki-islamiyyədə İsa və Məhəmmədin arzu və tələb etdikləri bu məhəbbəti nə ilə və nə vasitə ilə təmin etmək olur?.. O vasitəni bəşəriyyət kəşf edə bilmişmidir? Şübhəsiz etmişdir. O nədir?.. Hürriyyət və ədaləti-kamilə!..

Bunu Ərdəbil şəhərinin "nemət"ləri ilə "heydəri"ləri hənuz anlamayıb yekdigərlərinə qarşı bimənə və cahilanə bir ədavət bağlamaqda davam edirlərsə də, lakin məəlməmnuniyyə ələlümum İran hökumətilə əhalisi anlamışdır. Anladıqları üçün hürriyyət və ədalətin müqəddəs yollarını təmin üçün məclisi-milliyi-güşad etdilər. Bu son günlərdə Tehrandan gələn teleqraflar olduqca təsəllibəxşadır. Vaqiən şah həzrətlərinin xəstəlikləri davam ediyor. Məmafiə şah, vəliəhdi Məhəmmədəli Mirzə ilə bərabər qanuni-əsasiyi surəti-qətiyyədə imzaladılar. Bu münasibətlə Tehranda fişəngbazlıq və çiraqbanlıq oldu. Bundan başqa vəliəhd həzrətləri məclisi-milliyi iki sənə qədər tətil etməyəcəyini qətiyyən təəhhüd edib, o yolda bir əhdnaməyə vəz-imza etmişdir. Ancaq bu müddət keçdikdən sonra məclisin tənzim etdiyi qanun layihəsi senat tərəfindən iki dəfə rədd olunursa, şah məbusları təbdil üçün məclisi dağıda bilir. Doğrusu, əvvəlcə haqqında dövran edən şayiələrə rəğmən İran vəliəhdi qanuni-əsasi və islahati-cədidəyə tərəfdar olub bu xüsusdakı əfkarını məbuslara söylədiyi bir nitqdə izhar etdi. Şimdiyə qədər məclisi-milli əzasının mücahidəsilə bir xeyli nafe nizam və qanunlar vücuda gəldi. Bu nizamata görə məclisi-məbusan xəzineyi-maliyyəyə kontrol haqqına malik oluyor. Məclisi-məbusanın müsaidəsi olmaqsızın dövlət nə bir tərəfdən aqça istiqraz edə bilir, nə də dəmir yol təmdidi üçün kimsəyə bir imtiyaz verə bilir. Heyəti-vüzəra məsul tutuluyor, irad edilən suallara cavab verməyə məcburdurlar. Məclisin bilavasitə şaha ərizə təqdim etməyə haqqı vardır. Bir də məbusların yəminə sədaqətləri hökumətin qanuni-əsasiyə riayətinə qədərdir...

İran qanuni-əsasisi heyəti-ümumiyyəsi etibarilə ehtimal Belçika qanuni-əsasinə şəbeh olacaq. Məclisi-məbusan 162 əzadən ibarət bulunacaqdır. Məclisi-millinin məmnun olmadığı bir məsələ varsa da, o da hökumətin, məclisi-məbusandan başqa bir də məclisi-əyan namilə bir ikinci məclis təsis etmək istəməsidir. Məzkur məclis bir rəvayətə görə guya nisfi intixabat ilə, nisfi də şah tərəfindən təyin olunan əzadan mürəkkəb bulunacaqmış...

Hər nə hal isə İranda hürriyyət və ədalətə doğru böyük təşəbbüslər görünüyor ki, etiqadımızca bəni-növi bəşər arasında da ahəng və məhəbbəti təmin edəcək vasitələr başlıca bu iki nemətdən ibarətdir.

Fəxri-kainat əfəndimiz buyurmuşdur ki, zəlaləti-küfrdə bulunan bir məmləkət ədl ilə baqi qalacağı kibi, ədl olmayan bir ölkə islam namını hamil olsa da bəqapəzir olamaz...

Ədl olursa hürriyyət də olur, hürriyyət olursa məhəbbət və məvəddət də olur. Həzrəti-İsanın da, Həzrəti-Məhəmmədin də şər və qanunları bu həqiqətə müncərdir...

İştə yeni mücahidini-ictimaiyyətimizin də məqsudu bu həqiqətdir. Hətta bu axır zamanda zühur edən bizim balaca Mehdinin böyük təkamülü də bu həqiqəti təlqinə çalışmaqdadır. İnşallah müvəffəq olur...

*Ə.Hüseynzadə*
*"Füyuzat", 1906, №6*

## MÜZƏFFƏRƏDDİN

Yadındamı doğduğun zamanlar,
Sən ağlar idin, gülərdi aləm.
Bir öylə ömür keçir ki, olsun
Mövtün sənə xəndə, xalqa matəm...

Müzəffərəddin şah vəfat etdi... Lakin elə bir qibtəbəxşa bir surətdə vəfat etdi ki, heç bir şairin xatir və xəyalına o yolda bir vəfat gəlməmişdir. Müzəffərəddin şahın vəfatı şairin arzu və təsəvvür etdiyi mövtün mafövqündədir: o mövt xəndədən də gözəl bir şey idi. O xalq matəmdən müəssir bir hal içində idi... Müzəffərəddin şah vəfat etdi. İranın, məmaliki-islamiyyənin, cahan mədəniyyətinin, bütün bəşəriyyətin hər tərəfdən üzərinə ovuc-ovuc, dəstə-dəstə, dəmət-dəmət atdıqları, yağdırdıqları güllərin, şükufələrin içində vəfat etdi... Müzəffərəddin şah vəfat etdi. Çünki millətini ehya edərək dünyada olan vəzifeyi-insaniyyəsini tamam elədi... Bir padşah üçün həyati-tazə bulan bir millətin eyadiyi-şükran və ehtiramı üzərində vəfat etməkdən böyük bir səadət olamaz!..

İnsanlar vardır ki, onların vəfatından qəlblər xəndan olduğu halda, çöhrələr giryan kimi görünmək istər, lakin Müzəffərəddin şahın vəfatında bütün qəlblər giryan olduğu halda çöhrələr xəndan, əmin, parlaq bir istiqbala qarşı xəndan idi. Çöhrələrin süruri-hürriyyəti üzərinə gözlərdən əşki-iftiraq axıyordu. Cəmşidin, Firidunun, Keykavusun, Keyxosrovun, Bəhramın, Nuşirəvanın, Soltan Mahmudun, Məlikşahın, Şah İsmayılın, Şah Abbasın dövrlərində yaşamış iranilərə qibtə edər idim. Lakin artıq etmiyoram. Müzəffərəddin şah dövründə yaşamış olduğuma fəxr edərəm. Mərhum müşarileyhi mən də görmüş idim. Fəqət ələlümum bir cəmaətin bir hökmdarı görə biləcəyi surətdə görmüş idim: bu nailiyyəti – didar ancaq bir neçə saniyədən ibarət olsa da, onu tərif və hekayə etmək istərəm. Çünki o an zərfində hasil etdiyim hissiyyat və əfkarım bütün məsmuatıma dəgər.

Dörd-beş sənə əqdəm mən İstanbulda idim, Müzəffərəddin şah da o zaman Avropaya səfər edərkən, İstanbulu dəxi ziyarət edib Sultan Həmid həzrətlərinə bir neçə gün müsafir oldu. Bütün İstanbul cəmaəti şahı görməyə fövqəladə həvəs ediyor idilər. Həm osmanlı, həm iranlı, cümlə müsəlmanlar Müzəffərəddin şahdan nəhayət dərəcə məmnun və razı idilər. Çünki şahi-məğfurun Avropaya səfəri məarifi-



qərbiyyədən Şərqin xəbərdar olmasına bir vasitə olduğu kibi, İstanbula da səyahəti ittihadi-islamə böyük bir cığır hazırlayordı. Əvət, bilaxərə millətinə babi-hürriyyəti güşad edən o padşah ibtidadan Qərbin ənvari-məarifinə bir rövzən açıyor və islamın ittihadına bir təməl daşı atıyordı!.. Məarif, ittihad, hürriyyət! Nə qədər gözəl nemətlər! Bunları unutmayalım. Çünki əsil nicat bu üç qüvvətdədir.

İştə böylə bir şahın didarına müştaq olan İstanbul xalqı müşarileyhin güzərgahlarına axın-axın, fövc-fövc yığılıb anı çar çeşm ilə gözliyordilər. Bir gün Müzəffərəddin şah "Yıldız" sarayından qalxıb İstanbuldakı İran səfarətxanasını təşrif və o vaxt səfir bulunan Əlalülmülk Mirzə Mahmud xanı bəxtiyar etdi. Bu münasibətlə güzərgahı İstanbulun ən mötəbər küçələrindən olan Babi-Ali caddəsinə rast gəldi. Şahın eyni təriq ilə saraya övdət edəcəyini xəbər aldığımızdan biz də bir neçə yoldaşla oraya getdik.

Məzkur caddədə elə bir insan qələbəliyi var idi ki, orada ən cüzi bir hərəkət dəxi əsir idi. Qələbəlikdən caddənin ortasında şahın belə gərdunəsi çətinliklə keçə biləcək ancaq dar bir yol qalmış idi. Cəmaətin qismi-əzəmini osmanlılar ilə İran türkləri təşkil ediyordi. Müzəffərəddin şah haqqında bu cəmaət tərəfindən ifadə ediləcək hissiyyat və əfkarın bizcə əhəmiyyəti var idi. Çünki o əfkar və hissiyyat bir dərəcəyə qədər hürr və sərbəst idi. İstanbuldakı iranilər kimsədən qorxmuyorlardı. Çünki İran xaricində, əcnəbi bir ölkədə fərraşların dəyənəyindən məsun bulunuyorlardı. Osmanlılar da kimsədən, hətta heç bir xəfiyyə məmurundan qorxmuyorlar idi. Çünki şahın təbəəsi deyildilər.

Qolalı bir kömlək üzərinə siyah bir sitrə geyinmiş Avropa qiyafətli bir osmanlı yanında bulunan uzun libaslı bir iranlıya diyordi ki:

– Əfəndim, şahınız iyi bir adama bənziyor. İran məsud və bəxtiyar bir məmləkət olacaqsa, bunun dövründə olacaqdır.

Yaponu yapon edən Mikado oldu, İranı da İran edəcək bu şahınızdır. Bu səyahətdən iranlılar çox istifadə edəcəklərdir.

İranlı isə osmanlıya diyordi ki:

– Əfəndim, İranla osmanlıya hər şeydən əqdəm ittihad və ittifaq lazımdır. Bu iki dövlət arasında qəvi bir ittihad olursa, İran da, osmanlı da və bütün aləmi-islam da tərəqqi edər. Yoxsa avropalılar tərəqqimizə mane ola bilirlər. Şahımızdan biz nəhayət razıyız. Çünki buraya ittihad niyyətilə gəlmişdir...

Osmanlı:

– Şübhəsiz, əfəndim, şübhəsiz! Bizə hər şeydən əqdəm ittihad lazımdır. Çünki cümləmiz islamız, islam qardaşlarız.

İştə Babi-Ali caddəsinə yığılan cəmi qəfirin əfradı bir-birləri ilə bu yolda mükaliməə edərkən birdən-birə "Şah gəliyor, şah gəliyor!" sözləri hər tərəfdən təninəndaz oldu. Cəmaət dalğalandı. Hər kəs yüksəlməyə, irəliyə doğru sövqi-nəzər etməyə qeyrət etdi. Mənim yoldaşlarım da o anda bir sədd üzərinə çıxdılar.

Yoldaşlarımın biri asari-ədibanəsilə məşhur, bir məktəbi-ali müəllimi idi. Digəri bir təbibi-haziq. Üçüncüsü isə bir əsgər zabiti. Dördüncüsü də bir xacə idi.

Müəllim təbibə dedi:

– Əzizim, deyirsən ki, bən xəstələrimin xəstəliyini əksəriyyən ilk nəzərdə simalarından, nasiyələrindən anlaram. Müayinəyə-filana hacət görməm, iştə şah gəliyor... Onun xəstəliyini bilmək hünər deyildir... Orası zatən məlum; nəqrisdən, kəbəd və külyədən müztəribdir, diyorlar. Sən onun nasiyəsindən ruhuna, mənəviyyatına hökm edib nasıl bir adam, nasıl bir hökmdar olduğunu anlaya bilərmisən?

Təbibin cavabına fürsət vermədən xacə əfəndi ortaya atılıb dedi:

– Doktor əfəndi anlamasa da, mən anlaya bilirəm. Çünki "Elmi-qiyafə"tə bir az vüqufum vardır...

Müəllim:

– O halda siz "Elmi-qiyafə", doktor bəy "Elmi-əmraz", zabit əfəndi əsgərlik, mən də mühərrirlik gözü ilə şahın çöhrəsinə diqqətlə baxıb, sonra öz əfkar və hissiyyatımızı bəyan edəlim...

Bu əsnada Müzəffərəddin şahın süvar bulunduğu sərayi-hümayun gərdunəsi həzamıza yetişib ağır-ağır önümüzdən keçdi. Şah buğdayi bənizli, iri qara gözlü, uzun bığlı bir zat idi.

Müəllim:

– Əfəndilər, nə diyorsınız?

Zabit:

– Heç bir şey görəmədim. Allah bəlasını verməsin şu qocaman sarıqlı uzun boylu hərifin, tam şahı görəcəyim sırada önümə bir divar kibi tikilib hayil oldu. Şahın əlindən başqa bir şey görmədim. "Şiromansi" elmi də bilmirəm ki, bir yədin şəklindən mənalar çıxarayım.

Müəllim:

– Xacə əfəndi, siz nə diyorsınız?

Xacə əfəndi:



– Əfəndim, bən də ancaq yandan görə bildiyim üçün bənim "Elmi-qiyafə"m bənə pək də yardım etməyəcəkdir. Lakin zənnimə görə şah saf və təmiz ürəkli, xeyirxah bir zatə bənziyor.

Doktor:

– Bən olduqca iyi görə bildim. Şah xeyirxah və saf ürəkli olsa da, lakin qüvveyi-iradəsi zəif bir adama bənziyor. Bu da ola bilər ki, düçar bulunduğu xəstəliyin təsirindən iləri gəliyor.

Müəllim:

– Bən şahı pək iyi gördüm. Fikrinizə iştirak edərək bir qaç şey də bən əlavə edəyim: şahı nə Mikadoya, nə də keçənlərdə gördüyümüz Almaniya imperatoru Kilyuma qiyas edə biləriz. Şah nə dahidir, nə də bir istedad və zəkayi-fövqəladə sahibidir. Lakin hər halda səlim bir ağıl ilə buyurduğunuz kibi müşfiq və mülayim bir qəlbə malikdir.

Doktor:

– Əfəndim, hökmdarlara nə düha və nə də bir istedadi-fövqəladə lazımdır. Əl verir ki, səlim və həqiqətbin bir ağıl ilə nəcib və pak bir qəlbə malik olsunlar... Belə olursa, məmləkətlərini təriqi-mədəniyyət və tərəqqiyə isal ilə məsud və bəxtiyar edə bilirlər...

Müəllim:

– Doğru, amma o halda lazımdır ki, məiyyətindəki adamlar elmə aşina, müstəid və ğoyur bulunsunlar... Arxadan gələn faytonlardakı şahın məiyyəti, vükəla və vüzərası haqqında nə əfkar hasil edə bildiniz?

Bu suala qarşı yoldaşlarımın cavabı bir oldu: müttəfiqən bəyan etdilər ki, nasiyələrinə baxılırsa şahın məiyyətində ləyaqətli adamlar yoxdur. Hətta bir neçəsinin üzündən hiylə və təbəsbüs asarı yağıyor...

* * *

İştə İstanbulda Babi-Ali caddəsində Müzəffərəddin şahın güzərgahına yığılan cəmaətin əfkarı təxminən bu mərkəzdə idi. Bu əfkarın nə qədər müsib olduğunu İranda hürriyyət yolunda cərəyan edən vəqayeyi-əxirə bir dərəcəyə qədər isbat etdi. Məşrutiyyətə, hürriyyətə, qanuni-əsasiyəyə, məclisi-millinin vücuda gəlməsinə mane olanlar şahın məiyyətində bulunan Eynədüddövlələr, Əmir Bahadurlar, Hacibüddövlələr, Şüaüssəltənələr idi. Bunlar şahın mərəzindən, zəfi-iradəsindən istifadə edib, öz məqasidi-mənfəətcuyanələrini tərvicə çalışırlardı.

Bunların nəzərlərində millətin, vətənin, şan və etilayi-vətənin zərrə qədər əhəmiyyəti yox idi. Bunların məmuriyyət başına keçmələri bir tacirin pul qazanmaq həvəsilə dükan açması qəbilindən bir şey idi. Ancaq dükan açmaq nə qədər məmduh isə, dövlət divanxanələrini dükana bənzətmək də o qədər mənfurdur. Tehran küçələrində ortaya məsum qanlar tökülüyordu. Zikr olunan zəvat və əmsalı isə bunu min bəhanə ilə şahdan gizliyorlardı. Halbuki şahın şəfqət və səfvəti-qəlbiyyəsi əsla bu qan mənzərələrinə tabavər və razı olamaz idi. Vaqiən Müzəffərəddin şahda öz fikri ilə, öz tədbirilə, öz müstəqil təşəbbüsü ilə millətini hürriyyət və məşrutiyyət ilə təriqi-haqq və səadətə sövq edəcək nə bir düha, nə bir qüvveyiiradə, nə bir elm və vüqufi-kafi, nə də bir tərbiyeyi-mənasə yox idi. Çünki nazi-darat və şükuh ilə böyüdülmüş, hökmi-mütləq ilə, mütləqiyyət ilə ülfət etmiş idi. O sində də mütləqiyyətdən əl çəkmək çətin və düşvar idi.

Lakin mərhum müşarileyhin qəlbində, cüzi bir qan mənzərəsindən dərhal iqaz edilib, şöləpaş olacaq qədər mərhəmət, səfvət və nəcabət olduğu kimi, əqlində də gördüyü Avropanın mədəniyyəti, eşitdiyi Yaponun tərəqqiyyatı, qonşusu Rusiyanın vəlvəleyi-inqilab və qiyaməti, aləmi-islamın tədənni və məzlumiyyəti nədən iləri gəldiyini bir-iki ixtarat ilə dərk və kəşf edəcək qədər səlamət və mətanət var idi.

İştə İranda inqilabın asanlıqla vüqua gəlməsinin bir səbəbi şahimərhumun bu halı idi, sair səbəblərə gəlincə, bunların bəzisi "Füyuzat"ın ikinci nömrəsində zikr olunub, bəzisini də burada tedad edə biləriz.

Şahi-İranın hökmdari-mütləq olması ilə bərabər istibdad deyilən dahiyə bu ölkədə Osmanlıda olduğu qədər dərin köklər atmamış idi. İranda Rusiya və Türkiyəninkinə şəbih və möhkəm sipərlər arxasında gizlənmiş və müntəzəm bir bürokratiya və nə də o bürokratiyaya alət olacaq nizam və kəsrətə malik bir əsgər, bir polis, bir jandarma yox idi. Bu hala müqabil İranda iki sinif əhali hökumətə qarşı öz etibar və istiqlallarını qədimdən bəri mühafizə edə bilmişlər idi. Bu da zümreyi-üləma ilə zümreyi-əsnaf və tüccardır. Osmanlıda babi-ictihadın bağlı və Sultan Səlimi-əvvəldən sonra xilafətlə səltənətin bir əldə cəm olunub bilaxərə sonra mədrəsəyi-ruhaniyyələrin də pərişan bir hala gəlməsilə zümreyi-ruhaniyyə get-gedə hökuməti-mütləqənin pəncəsində əsir oldu. Rusiyada isə batraklığın ləğvilə



güruhi-ruhani məruri-zamanla bürokratiyanın bir qismini təşkil etdi. İrana gəlincə, müctəhidlər müstəqil olmaqla əhalinin bunlara etibar və mərbutiyyətləri qət olunmamışdır. İran üləması Avropanın şəşəeyi-mədəniyyətindən mütəəssir olmadılarsa da, lakin Yaponun vəlvəleyi-tərəqqiyyatından istər-istəməz oyandılar. Bunların arasında Əli Süavilər, Qaponlar bir-bir deyil, yüz-yüz zühur etdi. Bunların çoxu bizim bəzi axundlarımızın rəyinə rəğmən elmül-əbdanın lüzumunu dəxi dərk etdilər. Müctəhid Ağa Seyid Məhəmməd kibi zəvati-kiram açdıqları məktəblərdə fransızcanın dəxi təhsilini məcburi qıldılar. Məhərrəm və təziyyəti-imam Hüseyn münasibətilə hər zaman və hər yerdə kəsrətlə yığılan cəmiyyətlər, nəşri-əfkari-əhrarənə etmək üçün bunlara böyük bir meydan oldu. Digər tərəfdən hökumətin təərrüzündən məsun olub bəstə girmək üçün də icabında gözəl yerlər bulunuyordu... Ticarət və sənaətə gəlincə bunlar İran müsəlmanlarının öz əllərində olmaqla, Türkiyə ziraət və maarifcə İrana faiq bulunduğu halda, İranın əsnaf və tüccarı osmanlınınkından pək ziyadədir. Üləma və hürriyyətpərvəranın təşviqilə Rusiya inqilabına təqlidən bunların ikidə-birdə dükan-bazarı bağlayıb tətil etmələri, İran inqilabçıyanı əlində böyük bir qüvvət oldu. Vaqiən İranda maarifi-cədidə əshabı Türkiyəyə nisbətən pək azdır. Lakin İran əhlinin ticarət və kəsbü kar niyyətilə məmaliki-əcnəbiyyədə bulunmaları bunların gözlərini xeyli açmışdır. Buraya iranlıların fitri olan istedad və zəkavətləri ilə tarix və ədəbiyyati-qədimələrinin də təsirini əlavə etməli...

İştə belə bir cəmaətin qüvvətilə idi ki, mərhum Müzəffərəddin şah həzrətləri həm özünü, həm xanədanını, həm də millətini istibdadın, məiyyət və bürokratiya istibdadının əlindən xilas edib hökmdar ilə millət arasındakı haili qismən rəf edə bildi. Bu surətlə Müzəffərəddin şah böyük bir şan və şərəf qazanıb dünyadan öylə getdi. Bunun üçündür ki, müşarileyhin təsvir və tərcümeyi-halı ilə "Füyuzat"ın sütunlarını təzyin etmək istiyoruz. Ancaq Müzəffərəddin namı məşrutiyyət, qanuni-əsasi və məclisi-milli kimi fövqəladə mühüm hürriyyət və ədalət nemətlərinə mərbut olan ilk nam bulunmaqla deyil, sadə Qacar sülaləsi tarixinə, bəlkə bütün İran tarixinə şərəfbəxşa olduğu üçün mərhumun tərcümeyi-halına girişməzdən əqdəm yuxarıdan aşağı İran tarixinə səri bir göz gəzd edərim.

İran tarixi guya Pişdadiyan sülaləsi ilə başlıyor. Lakin bunun əsli və əsası yoxdur. Çünki Pişdadiyan tarixi İran tarixi olmayıb, bəlkə

bütün bəşəriyyətin ibtidayi-təməddününün tarixidir. Kəyumərs zənd dilində ləfzən "Böyük adam" demək olub, Həzrəti-Adəmə dolalət etdiyi kimi, Firidunun da hekayəsi Nuh Əleyhüssəlamın hekayəsini anladır. Bu hekayələr biləxərə Hindistandan tərd olunan Zərdüşt tərəfindən İrana gətirildiyi zənn olunuyor. Çünki Pişdadiyan əsatiri hökmdarlarının adları daha əvvəl hindi – qədim tarixində keçiyor. Hind xurafatında Cəmşid yerinə Came-Şıda namilə bir şəms məbudu, Zöhhak yerinə Azi-Zöhakə namilə bir əjdərha və Firidun yerinə Fəritun namilə bir mələk zikr olunur. Digər tərəfdən kəşfiyyati-cədidəyə nəzərən İranın özündə Pişdadiyan yerinə dörd-beş ayrı sülalələr keçmiş olduğu anlaşılmışdır. Bu sülalələrdən sonra Kəyaniyan sülaləsi başlayor. Ancaq bu sülalənin tarixi İranın bilaxərə yazılan kitablarında, ələlxüsus ədibi-əzəm Firdovsinin "Şahnamə"sində şairanə mübaliğələrə boğulduğu halda eyni tarix məzkur sülalə ilə həməsr olan yunan müvərrixləri tərəfindən daha təbii bir surətdə zəbt olunmuşdur. Bunların asarını bugünkü İran mühərrirləri tərcüməyə qeyrət etməlidirlər. İranın Keyqubadını, Keykavusunu, Səyavuşunu və Keyxosrovunu yunan müvərrixləri Kirus və Kambis namları ilə zikr ediyorlar. Ancaq Kirus Keykavusamı, yoxsa Keyxosrovamı və Kambis Keykavusamı, yoxsa Keyqubadamı dəlalət etdiyi kəsdiriləmiyor. Lakin bəzi vəqayein və adların müşabihətinə görə Kambisin Keykavus və Kirusun Keyxosrov və Astiyaqın Əfrasiyab və Dariyus Həstasbin İsfəndiyar ibn Gəştasib və Dariyus Qodomanın Dara olduğu anlaşılıyor. Zərdüşt məzhəbinin intişarı Gəştasib zamanında başladı. Bu sülalə İskəndərin zühuru ilə xitam buluyor.

Bir müddət sonra Əşkaniyan sülaləsi başlıyor. Bunların tarixi hər nədənsə yaxşı məzbut deyildir. Bu sülalədən birinci Xosrovun zamanında Həzrəti-İsa (Əleyhüssəlam) təvəllüd etmişdir. Əşkaniyandan sonra Sasaniyan sülaləsi başlıyor. Bu sülalədən Şapur zamanında Manike, yəni Maniyi-nəqqaşın məzhəbi zühur etmiş idi. Peyğəmbərimiz Həzrəti-Məhəmmədin (s.) təvəllüdü də yenə bu sülalədən olan böyük Kəsranın, yəni Nuşirəvani-adilin dövri-səltənətinə müsadif bulunduğu məlumdur. Bu sülalə Yəzdigürdi-salis ilə xitam bulub, bundan sonra İranda Həzrəti-Ömər (Rəziullahi ənhu)nun qeyrətilə dini-mübini-islam intişara başlıyor. Sasaniyandan sonra gələn hökmdarlar və sülalələr dövründə İran tarixi pək qarışıq olmaqla zehnimizi yormamaq üçün əhəmiyyətcə ikinci dərəcə sülalələrdən sərfi-nəzər edib, mühümlərini tedad ilə iktifa edəlim.



...Samaniyan ki zamanlarında farsi lisanı ərəbi hürufat ilə yazılmağa və ədəbiyyati-farsiyyə yenidən rəvac bulmağa başlamışdır; bundan sonra gələn sülalələr əksəriyyən türk nəslindəndirlər: Ali-Səbüktəkin Firdovsi kibi həkim və şairləri himayə və Hinddə nəşri-islam edən Sultan Mahmud Qəznəvi bu sülalənin birinci hökmdarıdır; Səlcuqiyan Cəlaləddin Məlik şah Adil bunlardandır.

...Elxaniyan, yəni Çingiz və Hülaku sülaləsi... Teymurləng sülaləsi Şahrux ibn Teymur bunlardan birinci hökmdardır... Səfəviyyə sülaləsi (məşhurları Şah İsmayıl ilə Şah Abbas kəbirdir)...

Nadir sülaləsi... ən nəhayət 1210 tarixində Qacar sülaləsi hökumətə başlayıb, bu sülalədən bu günə qədər gələn hökmdarların ismləri sırası ilə bərvəchi atidir: Ağa Məhəmməd xan, Fətəli şah, Məhəmməd şah, Nəsrəddin şah, Müzəffərəddin şah. Bu günlərdə təxti-İrana cülus edən Məhəmmədəli şah.

Mərhum Müzəffərəddin şah Nəsrəddin şahın ikinci oğlu olub, 1853 səneyi-şəmsiyyə martın 5-də təvəllüd etmiş və validə tərəfindən dəxi Qacar xanədanına mənsub olmaqla böyük bəradəri Zillisultan Məsud Mirzəyə tərcihən vəliəhd elan edilmiş idi. Vəliəhd olan Müzəffərəddinin tərbiyəsi Qərbin məarifi-cədidəsinə dəxi aşina Mirzə Nizama həvalə olundu. Bu müəllimin rəhbərliyilə şah Şərq və Qərb ədəbiyyatına meyil və həvəs edib bu xüsusda kəsbi-kəmal etdiyi kimi, fransız lisanına da mükəmmələn aşina oldu.

Müzəffərəddin şahın ədəbiyyata olan rəğbəti sayəsində idi ki, dövründə firəngcədən, almancadan, ingiliscə və ruscadan bir xeyli asarı farsiyə tərcümə olundu. Elm və məarifin qədrini bilən Müzəffərəddin şahın Azərbaycandakı canişinliyi zamanı bir çox icraati-nafiədən xali qalmadı. Qərbin əfkari-tərəqqi və mədəniyyətini İranda nəşr üçün Təbrizdə "Nasiri" namilə bir ceridə çıxmağa başladı. Avropa üsulunda mütəfənnin zabitlər yetişdirmək üçün yenə eyni şəhərdə "Müzəffəriyyə" namilə bir məktəbi-ali bina olunub, bunun üçün Avropadan Vaqner xan kimi xüsusi müəllimlər dəvət edildi. Bu sayədə ümuri-əskəriyyədə bir xeyli islahat və tənzimat vücuda gəldi. Mərhum hər yerdə Azərbaycan əhalisinin imdadına yetişməyə qeyrət ediyordi. Qəht və qala əsnalarında daima onun tədbiri ilə əhaliyə ucuz buğda və nan tədarük edilə bilmişdir. 1896 sənəsi aprelin 19-da Mirzə Rza adlı bir adamın məcnunanə hərəkətilə Nəsrəddin şahın facianə vəfatında Müzəffərəddin Mirzənin şahlığı elan edilib mayis ayının 5-də şahi-mərhum İran taxtına cülus etdi. 1900 sənəs

sində Müzəffərəddin şahın tədbirilə ilk dəfə bir istiqrazi-xariciyə müraciət olundu. Bu münasibətlə nəşr edilən fərmanda İranın üsuli-idariyyə, maliyyə və iqtisadiyyəsində olan qüsurlar bir-bir zikr edilib vəd olunan islahat şahın hüsni-niyyətinə dəlalət edirdisə də, lakin çe fayda ki, bu islahati – İran, vükəla və məmurinin fəsadi-əxlaqı və zülməti-əfkarı üzündən qüvvədən felə çıxmayıb, istiqraz edilən milyonlar da badi-həvayə getdi. Badi-həvayə getdi, amma İran cəmaətini iqaz edən səbəblərin biri də bu oldu. Tərəqqi və islahatə ziddi və istibdad və fəsad tərəfdarı olan mənfur bürokratizmənin axır nəfəsi yaqlaşıb, yavaş-yavaş təcəddüd və inqilab əmarələri zühura başladı. Hərəkati-hürriyyət-karanənin ilk müqəddiməsini 1903 sənəsində Nəcəfi-əşrəfdən dörd böyük müctəhidin Atabəyi-əzəm Mirzə Əli Əsgər xan əleyhinə yazdıqları şədidül-mal bir məktub təşkil etdi. Bundan sonra İranda mütəəddid hürriyyət mücahidləri zühur ediyor. Müctəhid Ağa Seyid Məhəmməd Təbatəbai, Tehran müctəhidi Seyid Abdulla, Həmədan hakimi Zəhirüddövlə bu zümrədəndirlər... Bu mücahidata mərhum şahın özü dəxi iştirak edib.

İbtida ədalətxana təşkilinə dair bir dəstxətt nəşr buyurdu. Bir az müddətdən sonra bu ədalətxana dəstxətti kafi görülməməklə həqiqi bir qanuni-əsasi üsulunda məclisi-şurayi-milli təsisinə dair yeni bir dəstxətti-hümayun şərəfi-sadir buyuruldu ki, iştə şahi-firdövs-aşiyanın namini İran zəminində və cahani-mədəniyyətdə ilələbəd ibqa və rəhkətlə yad etdirəcək də bu dəstxəttdir. Rəhmətullahu əleyhə, rəhmətən-vaseətən!

*Ə.Hüseynzadə*
*"Füyuzat", 1906, №7*

## NOVRUZİ-İNQİLAB

Ruzi-novruz ilə qarelərimi təbrik edərək əlimə qələm alıb həm novruz münasibətilə bir-iki söz demək, həm də əhvali-aləmdən qarelərimi xəbərdar etmək istiyoram. Lakin heç bilmirəm ki, mətləbi nərədən başlayıb, nərədə tamam edəyim. Hadisat və vüquati-aləm bu günlərdə o qədər kəsrət və sürətlə bir-birini vəli və təqib ediyor... Bir tərəfdən Peterburqda məclisi-məbusan dairəsi olan Tavrid sarayının səqfi yıxılıyor, digər tərəfdən araya novruz girir, bir tərəfdən



Stolıpin məbusanə xitabən heyəti-vüzəranın təqib edəcəyi proqrama dair bəyannaməsini oxuyor, digər tərəfdən Zillisultan İsfahandan cəmaətin və məclisi-millinin tələb və israrı üzərinə əzl və təbid olunuyor. Sədri-əzəm Nəsrulla xanın istefası ilə sədri-sabiq Atabəyin övdəti xəbəri şiyu buluyor. Bir tərəfdən Rusiyanın müxtəlif şəhərlərində bomba səsi əskik olmuyor, digər tərəfdən İran şəhərlərində cəmaətin qeyz və qələyanı getdikcə artıyor. Bir tərəfdən osmanlı əsgərləri üsuli-idareyi-səqimədən bizar olub aləti-istibdad olan paşaları qətl ediyorlar. Osmanlı türk mücahidini-hürriyyəti eyni istibdadın əleyhinə fəryadlar, vaveylalar qoparıyorlar, digər tərəfdən şəkili vətəndaşlarımız bu yoldakı həqiqətlərin həmuz yüzdə birini deməmiş olan Əhməd bəyin əleyhinə italeyi-lisandan çəkinmiyorlar. Bir tərəfdən yaponlar mədəniyyətin ən büləndd mövqelərinə süud niyyətilə təhsili-məarif uğrunda amerikalılarla qovğayə hazırlanıyorlar. Digər tərəfdən müsəlman "filankəs"ləri islam arasında müşahidə etdikləri quyuların önündə aciz qalub bilmiyorlar ki, buna nə tədbir etsinlər: ətrafındanmı dolaşsınlar, üzərindən körpümü yapsınlar, yoxsa *asanlıqla keçə bilmək üçün bu quyuları doldursunlarmı*?..

Bu qədər vüquatın, bu qədər qilü-qalların müvacihəsində başım donur, məst və sərsəm kibi oluyoram, hail bir girdabə tutulmuşa bənziyoram. Özümü həqiqətən yunani-qədimin hatifi-qeybi olan Pitiya kibi müdhiş bir uçurumun, ya "filankəs" kibi dərin bir cahın kənarında görüyoram... Ancaq quyunu keçmək üçün filankəsin təklif etdiyi tədbirlərdən heç birini bəgənmiyoram. Dolaşmaq mümkün degil, çünki ətraf naqabil mürur dağlardan ibarət olub, cümləsi şir və pələng, əjdərha və nəhəng yatağıdır. Körpü yapılmaz. Bu uçurum quyunun ağzı pək geniş olub üzərindən körpü bina etmək imdiki memar və mühəndislərimizin daireyi-iqtidarından xaricdir. Bu quyu doldurulacaq kibi də deyildir. Çünki həm çox dərindir, həm də onu imlaya vəsaitimiz yoxdur. Nə etməlidir? Çarəmiz nə olmalıdır?

Burada xatirimə bir tədbir gəlir ki, onu da Fransa inqilabından sonra millətini təriqi-nicat və səlamətə çıxarmış olan böyük Napolyon kəşf etmişdi. Napolyon çox dəfə əsnayi-müharibədə dərin uçurumlara rast gəldiyi zaman, əvvəlcə o uçurumları öndə gedən mübarizlərin bədənləri ilə doldurub geridən gələnləri onların üzərindən keçirirdi... İştə bizə qalırsa, cəmaətimizə səadət yolu açılmaq üçün mərdanə və fədakaranə surətdə bu quyulara atılmaqdan başqa çarə yoxdur. Bu son Osmanlı və Yunan müharibəsi əsnasında Milona

keçidində Əbdüləzəl paşa mücahidlərinə xitabən dedi ki, "Mən burada özümü cahi-ədəmə atıram. Siz öz ayaqlarınızla bənim üzərimə basıb irəliyə keçməyə qeyrət ediniz!" İndi əzizim, "filankəs", özünü quyunun içinə ata bilərmisən?..

Mütərəddidanə, kənarında durub uzun-uzun düşünməkdən fayda hasil olmaz!.. İştə, islam arasındakı quyuların biri də bu novruz bayramıdır. Bu xüsusdakı fikrin nədir? Bənim isə bu quyuya atılmağa cəsarətim yoxsa da, lakin bunun qərinə ehtiyat ipi ilə olsun enib, bir az tədqiqatda bulunmaq istərəm.

Müsəlmanların bir qismi, daha doğrusu, qismi-əzəmi deyir ki, islamda bu bayram yoxdur. Digər qismi isə, yəni qismi-əqəli deyir ki, xeyr, bu bir böyük müsəlman bayramıdır. Burada bir köprü yap baxalım! Mənə qalırsa, hər iki tərəf bu xüsusda səhv edir. Çünki bu bayram əsasən şiə bayramı olmayıb sünnü bayramıdır. Dəlilmi istərsiniz! Tarixə müraciət edəlim: bu bayramın təsisini İrani-qədimə və bilxassə Cəmşidə ətf edirlər. Bu isə doğru degildir. Əvvəla, baharın ibtidasını bayram etmək İrana məxsus olmayıb, qeyri-müvəhhid olan cəmi əqvam, ələlxüsus atəşpərəstlər və əz cümlə türk atəşpərəstləri dəxi bunu bayram edirdilər. Saniyən, degil Cəmşid özü, hətta bütün Pişdadiyan sülaləsi yerli-dibli mövcud olmayıb, hindi-qədimin əsatir və xurafati-mövhuməsindən ibarətdir. İran tarixindən çox əqdəm hindilərin kütubi-diniyyəsində "Çamaşida" (ki mənası hindcə "şah Xurşid" deməkdir) bir məbud, "Sriton" namilə bir firiştə və "Azi Dəhaqə" namində bir əjdaha zikr olunur. Brəhmənlər tərəfindən Hinddən tərd olunan Zərdüşt bu xurafatı oradan İrana gətirib müşrik olmadığı üçün Cəmşid, Firidun və Zöhhak namilə mövhum padşahlardan bəhs edərək, xalqın zehnini bu surətlə zəlaləti-şirkdən xilasə çalışmışdır. Demək ki, İranda Cəmşid adlı bir padşah olmamışdır ki, bir də novruz icad etmiş olsun. Digər tərəfdən o zamanlar ülumi-riyaziyyə və heyət o qədər tərəqqi etməmiş idi ki, mükəmməl bir təqvim vücuda gətirilib etidali-rəbiin yövmi – həqiqisi bayram ittixaz edilə bilsin. Bu qədər mükəmməl bir təqvimi vücuda gətirmək şərəfi Səlcuqi türklərindən Məlikşaha və onun dövrü-üləmasına aiddir.

Məlikşah, vəziri Nizamülmülk və bütün Səlcuqilər üləmaları ilə bərabər sünni məzhəb olub, çoxu da türk idi. Bir nəbzə novruzun həqiqi banisi adlanan bu padşahdan bəhs edəlim. Əs-Sultani-adil ləqəbini qazanan Əbülfəth Cəlaləddin Məlikşah İran sülaleyi-Səlcuqiyyəsinin üçüncü və ən böyük hökmdarı olub tarixində təxti-



səltənətə cülus etmişdir. Bu zat məmalikini Altay dağlarından Ağ dənizə və Qafqaz cibalından bəhri-Əhmər və ümmani-Hində qədər tovsi etməklə Məvəraünnəhr, Xarəzm, Şam, Misir və Anadolu kimi qitələri zəbt edib aləmi-islamın qismi-əzəminə hökmran idi. Demək istəriz ki, Məlikşah İran padşahı olmayıb, zamanında aləmi-islamın ən böyük hökmdarı idi. Hətta Bağdadda bulunan xəlifə dəxi onun yədi-ixtiyar və idarəsi altında idi. Məlikşahın məmaliki bu qədər vase olmaqla bərabər onun və Nizamülmülkün hüsni-tədbir və idarəsilə dəxi fövqüladə kəsbi-ümran və abadi etmiş idi.

Bu sultanın tədabiri-hüsni-idariyyəsindən bəhsə girişsək sədəddən ayrılmış olacağımızdan əsil məqsədə rücui tərcih ediyoruz. Müşarileyh hər xüsusda qayət nizampərvər olduğu üçün zamanındakı təqvimlərin qüsurlu və qarışıq olduğunu görürdü, anlayırdı ki, ümuri siyasiyyə və mülkiyyədə, ələlxüsus ümuri-maliyyə üçün tarixi-qəməri münasib olamayıb, səhih və mükəmməl bir təqvimi-şəmsi vücuda gətirməkdən başqa çarə yoxdur. Bu niyyətlə başına əsrinin Ömər Xəyyam kimi ən alim heyətşünaslarını cəm edib, bunların müavinətilə bu gün cahan təqvimlərinin əkməl və əsəhi olan və naminə izafətən Cəlali deyilən təqvimi-şəmsini tərtibə müvəffəq olmuşdur. İştə bu təqvimə görə leyl və nəharın müsavi olduğu və şəmsin xətti-istivadan şimala keçdiyi və baharın ibtidayi-həqiqisi bulunduğu gün sənə başı günü, yəni novruz ittixaz edilib, buna dəxi müşarileyh sultanın şərəfinə "Sultani" deyilmişdir. İştə görülür ki, bu bayram o vaxt ümumi müsəlmanların bir eydi-siyasisi olmuş idi. Hər nədənsə səlcuqlardan sonra İranda gələn sülalələr bu bayrama riayət etdikləri halda Anadolu səlcuqilərından sonra zühur edən Osmanlı sülaləsi buna əhəmiyyət verməmişdir. Anadoluda sakin əhali arasında isə bu eyd hala xatırlanmaqdadır. Demək ki, Osmanlı hökuməti ilə cəmaətinin adəti arasında bir ixtilaf vardır. Bu ixtilaf isə Osmanlı hökumətinin təqvimi-Cəlali kimi mükəmməl və müntəzəm bir islam təqvimi-şəmsisindən əl çəkib, qarmaqarışıq təqvimlərlə idareyi-ümurda israr göstərməsindən iləri gəlir. Osmanlı üdəbasından bir çoxları bir vaxtlar bu təqvimin ehyasını əz dilü can arzu etdilərsə də, hər şeydə pərişanlığa məyyal Osmanlı hökuməti-hazirəsinə qəbul etdirəmədilər.

Zənn edilməsin ki, səlcuqilərdən sonra əhəmiyyətini Türkiyədə qaib etmiş olan təqvimi-Cəlalinin İranda qədri biliniyordi. Xeyr, İranın özündə də bu qoca təqvimdən bir novruz bayramından başqa bir şey qalmamışdı. Şah Abbas dövrü müstəsna olmaq şərtilə Məlik-

şah zamanındakı ümrani-mülk və hüsni-idarə və intizamdan İranda bir əsər qalmadı ki, bir də müntəzəm bir təqvimə ehtiyac hiss edilsin. Belə təqvimlər müamilati-maliyyə və sərrafiyyəsi mükəmməl və ticarəti yolunda olan və məmurini-mülkiyyə və əsgəriyyəsinin maaşını müntəzəmən verən dövlətlərə yaraşıyor. İran isə ehtimal belə bir intizam və tərəqqi yoluna təcəddüd və inqilab dövrü olan bu sənədən etibarən sülük edə biləcəkdir. Binaənaleyh bu novruz deyil, təbiətin, bəlkə mənən dəxi bütün İran tarixinin bir Novruzi-inqilabıdır. Bu günlərdə İranda cərəyan edən vüquata bir nəzəri-iman ilə baxanlar bu sözü təsdiq edə bilirlər. İranın hər tərəfində camaat arasında məmləkətin intizam və tərəqqisi yolunda şimdiyə qədər eşidilməmiş bir cəhd və fəaliyyət müşahidə olunmaqdadır. İrandan gələn teleqraflara görə Təbrizdə dükan, bazar bağlanıb, tətillər ediliyor. Camaat cümlə vəzirlərinin istefasını tələb ediyor. Tehranda küçələrdə, meydanlarda şiddətli xitabnamələr dağıdılaraq, xalq sədrisabiq Atabəy Əmin Sultan kibi bir istibdadpərvərin yenidən İran torpağına övdəti əleyhində bulunuyor. İsfahanda camaat qələyanə gəlib ingilis tərəfdarlığı ilə bərabər üsuli-idareyi-keyfiyyədən ayrılmayan Zillisultan ilə oğullarının şəhərdən əzl və təbidini tələb ediyor. Tehrandakı Məclisi-milli dəxi İsfahan əhlinə tərəf çıxmaqla şah həzrətləri Zillisultanı İsfahandan çağırıb yerinə Təbrizdə özünə müinlik etmiş olan Nazimüssəltənəni təyin ediyor. Bu üzdən şahın və məclisin etibarı əhali nəzərində bir qat daha təzaüd ediyor. Eyni zamanda İranın Rusiyadakı səfiri Mirzə Həsən xanın pədəri bulunan sədriəzəm Nəsrulla xan Müşirüddövlə istefa ediyor. Bu istefanın səbəbi hənuz layiqilə anlaşılmadı. Müşirüddövlə məğfur Müzəffərəddin şahın islahat və təcdidati-hürriyyətpərvəranəsinə iştirak etmiş bir zatdır. İrandakı bu növ vüquatdan şübhə və vəsvəsəyə düşən bəzi dövlətlər, əz cümlə Rusiya və Hindistan hökumətləri səfarət və konsulxanaları mühafizə üçün İrana bir miqdar əsgər göndərirlər. Əfqan hökuməti İran sərhəddinə qoşun cəm edir. Bu qədər həyəcan və qələyanın içində İran novruzi-təcəddüdinin gözəl bir qönçəsi olan məclisi-milli səbat və mətanətini qayib etməyib, mücahidativətənpərvəranəsinə davam ilə müəyyən bir məqsədi-müqəddəsə doğru irəliləyib getməkdədir. İran hürriyyətilə Rusiya hərəkathürriyyətpərvəranəsi arasında olan irtibatın əhəmiyyətini dərk etmiş olmalıdır ki, Tehrandakı məclisi-milli Peterburqdakı dövlət dumasının güşadanı qayət səmimi bir surətdə təbrik etdi. Təbriknamədə məclis dumanı böyük bacı deyə adlandırır. Lakin bu iki bacının bir



üçüncü bacısı daha vardır ki, o bacı hənuz özü zindannişini-əsarət olduğu halda, digər bacılarının xeyirxahi-səadəti olub guşeyi-məzlumundan onları təbrikdən geri durmiyor. Məqaləmizin nəhayətində Osmanlı qanuni-əsasinin mücahidi-əkbəri məşhur Midhət paşanın oğlu Əliheydər bəyin İran məclisi-millisini təbrik məktubunu kəmaliməmnuniyyətlə dərc ediriz. Lakin məktubu qiraətdən əvvəl bir də məclisi-millinin böyük bacısının əhvalına bir nəzər edəlim:

Böyük bacı Peterburqda böyük Yekaterinanın yapdırmış olduğu Tavrid sarayına daxil olub, övladları ilə ümuri-vətən haqqında müzakirata hənuz başlamışdı ki, sarayın səqfi martın 2-də ələssabah saat altı radələrində bir gurultu ilə yıxıldı. O əsnada sarayın içində kimsə bulunmadığından məatəşəkkür insanca bir tələfat olmadı.

Məlumdur ki, I Dumanın rəsmi-güşadi bizim burada ilk dəfə müttəhidən bayram etdiyimiz mövludi-Nəbiyə müsadif olunmuş idi. O zaman "Həyat" qəzetəsində Feyzi Azərbaycaninin İstanbuldan göndərdiyi bir mövludiyyə mündərc idi. Şair diyordi ki:

Bu gün töküldü yerə bami-Kəbədən əsnam.
Şikəst buldu bu gün taqi-şövkəti-Kəsra.
Təsəllütündən iraq oldu inzibatü nizam...
Bu yövmi-məsədətəfzada söndü atəşi-fürs.
Bu gün oyandı çiraqi-müşəşəi-İslam.
Bu gün qırıldı şəttin cisiri-ahənini dəxi,
Gəlincə cuşü-xüruşa o nəhri-xunaşam...

Xatirələrdədir ki, bu mənzumənin təhtində biz dəxi bir məqalə yazıb şairin zikr etdiyi möcüzələrin eyni gündə qütbi-şümalidə dəxi vüqua gəldiyini işarət etmişdik.

"Şikəst buldu bu gün taqi-şövkəti-Kəsra". Əvət, Şimal Kəsrası olub ədaləti ilə məşhur böyük Yekaterinanın taqi-şövkəti o gün şikəst bulmuş idi.

Məsnəvi sahibi Mövlana həzrətlərinin bir hekayəsi yadıma gəliyor:

Birisi yapdırmış olduğu evə xitabən dedi ki, "Ay ev, yıxılacağın zaman mənə xəbər ver! Lakin divarlar çatladıqca, sahibi-xanə bunları yamayıb qapayordı. Bir gün ev yıxıldı. İnqazı altında qalan ev sahibi deyirdi ki, ey vəfasız, sənə etdiyim ricanı unutdunmu? Niyə xəbər vermədin? Xanə lisanə gəlib dedi ki, sənə xəbər vermək üçün bir neçə dəfə ağzımı açdıqca, sən onu yumurdun!.."

Bizim Tavrid sarayı dəxi I Duma əsnasında çatlayıb ağzını açmış idi və bən yıxılacağam demək istiyordi. Ancaq bürokratiya təmirə bir milyon manat sərf edib biçarənin ağzını bağladılar...

Bir milyon məsarif ilə bina təmir edildiyi halda yenə səqfinin yıxılması əcayibatdan başqa bir şey degildir. O əcayibatdan ki, ancaq bürokratizmə üsuli-idarəsi daxilində mümkündür.

Hər nə hal isə duma əzası əsla bundan fütur gətirməyib, kəmakan mücahidatlarında davam etdilər. Martın 6-da əsil zadəgan məclisin zalında ictimai edib müzakirəyə başladılar. Bu əsnada ən mühüm vəqəə baş vəzir Stolıpin cənablarının kürsiyi-xitabətə çıxıb heyəti-vüzəra tərəfindən tənzim olunan deklarasiyayı, yəni bəyannaməyi oxumasıdır. Bu bəyannamə tənzim edilən qəvanin və ləvayihi-qanuniyyədən bahisdir. Bəyannamədə deyilir ki, vəzarət tərəfindən dumaya təklif olunan ləvayihi-qanuniyyə hökumətin əsasındakı fikri-ümumiyi-ictimai, zamani-əxirin islahat və tənsiqatından nəşət edən hüququ istinadən bir intizami-maddi vücuda gətirməkdir. İmperatorun iradəsi mövcibincə Rusiya ölkəsi bir hökuməti-hüquqiyyəyə münqəlib olduğundan, mühərir və məzbut qanunlar vasitəsilə hüququ ayrı-ayrı şəxslərin təfsiri-keyfilərindən xilas etmək lazım gəliyor. Layihələrdən əqdəm bəzi tənzim olunmuş hazır qanunlardan bəhs oluniyor. Bunların bir qismi kəndlilərin rifah halını yer və torpaqla təmin məsələsinə aiddir. Padşahın fərmanına görə kəndlilərə udel və kabinet yerləri tərk olunuyor. Yer xüsusunda sair bəzi sühulətlər dəxi göstəriliyor. Deniliyor ki, bu qanunlar naqabili-təxir bulunduqlarından hökmləri bu anda cari olmağa başlayor. Bundan sonra bir çox ümuri-daxiliyyəyə aid qanunlar gəliyor. Bunlar 17 oktyabr manifesti ilə elan olunan hüquqi-əsasiyyeyi insaniyyəyi qanun və nizam dairəsində qüvvədən felə çıxarmaq niyyətilə tənzim olunmuşdur. Hürriyyəti-vicdan və məzahibə dair qanun layihələrindən bəhs olunarkən deyilir ki, ortodoks məzhəbi hökumətin məzhəbi-rəsmisi bulunmaq və digər məzhəblərə faiq tanınmaq şərtilə bunlara hürriyyət verilə bilir. Bəyannaməyə görə hökumət ortodoksluğun hüquqi-təfəvvüqiyyəsini himayə edirsə də, lakin bu hüquqi-təfəvvüqiyyə sair ədyan və məzahibin hüququnu xələldar edə bilməməlidir. Bu əsas üzərinə bir çox qəvanin və nizamat tənzim olunuyor... Hürriyyəti-şəxsiyyə məsələsinə gəlincə məhkəmənin hökmü olmaqsızın kimsənin şəxsinə, malına və canına təcavüz olunamaz. Bədə məişəti-məhəlliyeyi-müstəqilədən bəhs olunuyor. Bu xüsusda tənzim olunan layihə zəmindarlıq və şəhər idareyi-müstəqiləleri ilə administrasiya və polis ümuruna dairdir. Zemski naçalnik vəzifəsi ləğv ediliyor. Jandarma və ümumi polis ümuru birləşdirilib yeni üsul bir zəbtəyə tənzim olunuyor. Jandarmların təhqiqat və istintaqati-siyasiyyəyə haqqı olmur.



Mühakime-ədliyeyi-məhəlliyyə nizamati təbdil ediliyor. Bu xüsus intixab qaydası üzərinə müəssis olaraq, hökm heyəti və mirovoy sudyalar cəmaətin öz aralarından seçdikləri zəvatdan mürəkkəb olacaq. Bəyannamədə rəncbər və fəhlə cəmaətinin mənafeini təmin edən nizamatdan dəxi bəhs olunur. Sərmayədarlarla fəhlə münasibatına administratsiyanın müdaxiləsi təhdid olunuyor. Bu xüsus sənaye orqanizasiyalarının öhdəsinə həvalə olunaraq bir tərəfdən bunların icraatına, digər tərəfdən də fəhlənin iqtisadi olan tətillərinə hürriyyət veriliyor. Bəyannamədə əhali üçün məarifin məccani olması, vergi üsulunun təbdili kimi məsələlər də unudulmamışdır.

Stolıpin bəyannamənin qiraətinə xitam verdikdən sonra duma məclisi əsla etidalını pozmayıb kəmali-sükut və ciddiyyətlə məşğul bulunduğu ümurun müzakirəsinə rücu etmişsə də, ancaq sosial-demokratlar baş vəzirə qarşı əfkar və hissiyyatlarını ifadədən geri durmamışlardır. Bunlardan Kutaisdən gedən gürcü vəkili Sereteli cənabları bəyannamə əleyhində bir nitq irad edib dedi ki: "Biz deklarasiyanı sükut ilə qarşıladıq. Bu sükut bizim protestomuzdur. Burada aclara məxsus pulları sui-istemal edən xalqı divani-ürfiyi-əsgəri ilə mühakimə edən hökumət iləridə nələr icra edəcəyindən bəhs ediyor. Biz isə nələr icra etdi, deyəlim: "Bu hökumət I Dumanı qovdu. İki duma arasındakı müddət zərfində etdiyi işlərlə və dediyi sözlərlə hökuməti-mütləqənin bir ovuc əsarətpərvər mülkədarlarla irtibatda bulunduğunu korlara belə göstərmiş oldu. O mülkədarlarla ki, milyonlarca fəqir kəndlilərin məsarifi ilə yaşayorlar". Bu nöqtədə sağ tərəfdən bəzi əzalar xətibin nitqinə mane olmaq istəyirlərsə də, məclisi-məbusan rəisi Qolovin cənabları bunlara etiraz edib deyor ki, "Xətibin sözlərində mümaniət ediləcək öylə bir şey yoxdur..."

Biz isə bu fikirdəyiz ki, müsadimeyi-əfkardan bariqeyi-həqiqət parlar. Cəmaət vükəlası ilə hökumət vükəlasının müsadimeyi-əfkarından novruzi-bahara məxsus bir "əbri-şərərbar" vücuda gəlib barani-feyzpərvər ilə vətənin hər guşəsini əzhar və əsmar ilə təzyin edəcəyi məmuldur.

*Ə.Hüseynzadə*

*"Füyuzat", 1907, №12*

# CİLVƏGAHİ-HÜQUQ

*"Xalqın sədası haqqın nidasıdır"*

Haqqın nidasını eşitməkdə olan zövq və səfa heç bir şeydə olamaz. Öylə bir zövqi-ruhaninin təsiriledi ki, Həzrət Musa, Mövlana Cəlaləddin Ruminin təbiri-vəchlə:

"Cənd bixod gəşt, çənd aməd bexod,
Çənd pərid əz əzəl suye əbəd".

Lakin qəribə burasıdır ki, cahanın böyük bir qismi haqqın nidasını eşitməkdən qorxuyor, təvəhhüş ediyordi. İstanbul, məsələ, ələn da təvəhhüş ediyor, bir dərəcədə ki, o nidayı degil yaxında, öz qəlbgahında, hətta uzaqda – Nevanın sahilində, ya Dəmavəndin ətəklərində olsa da eşitmək istəmiyor. İstəmədiyi üçün o nidadan nə bir hərfin osmanlı mətbuatına əks etməsinə müsaidə ediyor, nə də nidanəvisi-haq olan mətbuati-xariciyyənin Türkiyəyə düxuluna yol veriyor!..

Varsun o bələdə nidayi-haqqı eşitməsin, nə bəs var? Bizim onlarla nə işimiz? Biz öz keyfimizə, öz zövq və səfamıza bakalım! Biz nidayi-haqqı iki tərəfdən də eşidiyoruz ya! Əl verir!

Nidayi-haqqı eşitmək nərədə mümkün olur? Sədayi-xalqın rədəndaz olduğu yerdə! Xalqın sədası nərədə rədəndaz oluyor? İran məclisi ilə Rusiyanın dövlət dumasında!

Mən istərdim ki, "Füyuzat"ın qareləri bu sədayi-haqqın rəd və bərqini öz qulaqları ilə eşidib görsünlər.

İnsan üçün əsil zövq o rədi öz qulağı ilə istima və o bərqi öz gözü ilə röyət etməkdədir... Bu isə tərəqqiyati-maddiyyətimizin indiki halında mümkün degildir. Fəqət ehtimal qəribən mümkün olacaqdır. Fransanın məşhur ədiblərindən Jül Vern "Min il bundan sonra nə olacaq" ünvanlı bir hekayətdə telefon və telefon kibi növ-növ xariqəladə ixtiraat sayəsində cəmiyyəti-bəşəriyyənin həyat və məişətində nasıl təbəddülat vüqua gələcəyindən bəhs eliyor. Lakin hənuz min sonə keçmədən bu təbəddülatın vüququnu müşahidə ediyoruz. Edison, bu gün telefon, yəni tel vasitəsilə uzağı göstərən aləti ki, adına durnəma deyə biliriz ikmal eyliyor. Münxen darülfünunu müəllimlərindən Quren telefotoqraf (durnəvispərto) denilən bir alət ixtira etdi ki, bu sayədə tel vasitəsilə uzaqdan fotoqraf alıyor. Digər tərəfdən italiyalı Marqoninin telsiz teleqraf icad etdiyini də biliyoruz. İndi burada xatirə gəliyor ki, madam ki, teleqraf telsiz də mümkün imiş, o halda qəribən telsiz telefon və telsiz telefot da mümkün olacaqdır... İştə fərz edəlim ki, bunlar da meydana çıxdı. Bundan nə yolda istifadə edə biliriz?

İstifadəmiz bu olur ki, Məclisi-milli ilə dövlət dumasında cilvənüma olan haqqı görmək üçün nə Tehrana, nə də Peterburqa getməyə ehtiyacımız olmaz. Hər gün oturub qalxdığımız odaya bir telsiz telefon ilə bir telsiz telefot cihazı vəz edir və istədiyimiz zaman dövlət dumasında və məclisi-millidəki məbusların, xətiblərin övza və hərəkatlarını tamaşa, müzakirat və mübahisatlarını istima edəriz. O cihazlara bu gün malik olsa idik, şübhə yoxdur ki, irticapəsəndlərin, köhnəpərəstlərin, "həqiqi ruslar"ın sərkərdəsi olan Puruşkeviç cənablarının duma məclisindən nasıl qovulduğunu böyük bir ləzzətlə tamaşa edə bilərdik. Lakin hənuz böylə bir tamaşadan məhrum olduğumuz üçün çar-naçar gözlərimizi yorub Dumaya dair olan həvadisi qəzetələrdən cəm etməyə məcbur oluyoruz.

Keçənki nömrələrimizin birində Stolıpinin bəyannaməsindən bir nəbzə bəhs etmiş idik. Məclis bəyannaməyi əmiq bir sükut ilə qarşıladı. O vaxtdan bəri məclis qayət mühüm məsələlərin müzakirati-həlli ilə məşğuldur. Bu müzakirat əsnasında cərəyan edən əhval gah məmnuniyyətbəxş olub ümidləri təzyiq ediyor, gah biləks mövcibiyəs oluyor. Qəlblərə vəsvəsə və əndişə ilqa ediyor. Qəhtzadəganə müavinət xüsusunda kadet firqəsinə mənsub Radiçev tərəfindən edilən təklifin baş vəzir Stolıpinin tərəfindən qəbul olunması və bu surətlə heyəti-vüzəranın mərkəzi məclisə məyyal olması, hər kəsə II Dumanın bəqası, əhəmiyyət mücahidatı haqqında böyük ümidlər verdi. Vüzəranın kadetlərlə, daha dünən əfkarları məqbul görünməyən kadetlərdə həmrəy olması Dumanın bəqa və mövcudiyyətinə bir zəmani-qəvi oluyordi. Radiçevin təklifi isə qəhtzadəganə müavinət xüsusunda hökumətin icraatını kontrol edə bilən bir komissiya təşkilindən ibarətdir. Bu kontrolu kadetlər nə surətdə anlayorlar?

Stolıpin bir nitqinin xitamında məclisə, bilxassə məclisin sol firqələrinə xitabən dedi ki:

Siz hökuməti qəsb və qarət etmək üçün bizə "əlinizi yuxarı qaldırınız demək istiyorsunuz. Lakin bizi böylə ekspropriyator təbirilə qorxudamazsınız. Stolıpinin bu sözlərinə cavab olaraq Gizvetter dedi ki, "xeyr, sizə əlinizi yuxarı qaldırınız" demiyoruz. Biz deyoruz ki,

füqərayi-əhalinin pulunu sui-istemal və qarət etməkdən "əl çokiniz!.." iştə kontrol demək, hökumətə Qorqo Lidval, sui-istemalatından əl çəkdirmək üçün məmurlarını təhti-məraqibədə bulundurmaq deməkdir...

Lakin kadetlərin təklifinə ruyi-müvafiqət göstərib bu yoldakı sui-istemalatdan hökumətin əl çəkmək istəməsindən hasil olan sürur və şadimanı çox sürmədi. Ara yerə ayrı-ayrı məsələlər gəlib vəkaləti-milliyyə üfüqündə qara bulutlar nümayan olmağa başladı. Millət vükəlasilə hökumət vükəlasının arasında ilk müsadimeyi-ciddiyyəyə bais olan maddə divani-ürfiye əsgərinin lüzumi-ləğvi məsələsi oldu. Qanuni-əsasiyi-məşrutiyyətdən dəm vuran Stolıpinin deklarasiyasında divani-ürfiye əsgəriyyəyə dair hərfi-vahid belə yox idi. Məclis isə bəyannaməyi bir tərəfə atıb mücahidata ədalət və məşrutiyyətlə külliyyən naqabili-təlif olan bu məhkəmeyi-keyfiyyənin çareyi-ləğvini aramaqla başladı. Məsələ 19 üzvdən mürəkkəb bir komissiyaya həvalə olundu. Bu xüsusda məbuslardan Gessen, Maklakov, Teselenko, keşiş Tixvinski, əfsər Bardiş, Don qazağı Petrovski tərəfindən irad olunan nitqlər daşları, qayaları əridəcək dərəcədə atəşin və müəssir olduğu halda zəhri-mütləqiyyətlə pərvərşiyab olmuş səngdillərə təsir etmədi. Məzkur nitqlərə verdiyi cavabda baş vəzir milləti bir xəstəyə və özünü cərrah bir təbibə bənzətmək istəyib anlatdı ki, bəzi təhlükəli hallarda xəstədən qan almaq zəruridir. Stolıpin cənabları burasını bilmiyor ki, tibbi-cədid xəstəliyə qan almaqla müalicə üsulunu çoxdan tərk etmişdir. Köhnə siyasətin məluf və tiryakisi olan bürokratların zehni hala təbabəti-qədimədən ayrılamiyor. Ancaq buna şükür olunur ki, divani-ürfiye-əsgərinin müddəti-hökmü bu ayın içində özlüyündən xitam bulub istər-istəməz xalqı kabusi-istibdadından xilas eyləyəcəkdir.

Bu dəfəki Dumada vəzirlərdə nitq və xitabətə böyük bir həvəs görünüyor. Cümləsi dürərbari-bəlağət olmağa çalışıyorlar. Ehtimal yeddi aydan bəri çalışıyorlardı. Yapon tələbələri bilaxərə, Tokiyo məclisi-məbusanında bəlağət və fəsahətlə natiqəpərdazlıq edə bilmək üçün Vaseda darülfünunda bir tamaşaxana tərtib edib, bu tamaşaxanada indiki məclisi-məbusan mübahisatının təqlidini yapıyorlar. Yunan xətiblərindən məşhur Demosfen xətibliyə hazırlanmaq üçün ağzına bir daş parçası alıb zəxxar bir dənizin kənarında əmvacın gurultusuna qarşı tənha olduğu halda bağırıb təlaqət və səlasətlə nitq söyləməyi təcrübə və təlim edirdi. Bizim Rusiya vəzirləri isə daşı



ağızlarına deyil, bəlkə qəlblərinə aldıqları və dəniz sahilində deyil, bəlkə qan selləri kənarında bulunduqları halda xətiblik öyrənmişlərdir... İştə bunlar bu surətlə mühüm, qeyri-mühüm məsələlərdə birər-birər kürsiyi-xitabətə çıxıb bəyani-əfkar edirlər. Stolıpindən başqa vəkaləti-milliyyə məclisinin kürsiyi-xitabətində ticarət və nafiə naziri Filosofovu, ədliyyə naziri Şçeqlovitovu və maliyyə naziri Kokovsefi dəxi gördük.

Qəhtü qəladən müztərib olan aclara ianə maddəsi müzakirə olunurkən məclisdə ortaya bir də böhrani-sənaidən naşi işsiz qalan əmələ və fəhlə məsələsi çıxdı. Martın 15-dəki ictimai-məclis bu xüsus üçün idi.

Əzayi-məclis böhrani-sənainin əsbabını təşəkkülati-ictimaiyyəmizin səqamətində görərək işsiz qalanları məsum və məzlum bulunduqları halda Filosofov tətilçilərin və işsiz qalanların inqilab müşəvviqlərinin iğfalatına qapıldıqlarına zahib oluyor... hər nə hal isə bu mübahisat işsiz qalanlara müavinət yolunda camaatə nafe-ümumi işlər tərtibilə bu xüsus üçün yeddi milyon manat pul istiqrazına qərar verməklə nəticələndi...

Ədliyyə naziri Şçeqlovitov isə başlıca iki məsələdə məbusan ilə mübahisata girişdi. Bunlardan birisi, məbusluq sifətilə hər növ təcavüzatdan məsun bulundurulması lazım gələn Siqov ilə Yerşovun Krasnoufimski şəhərində zabitə məmurları tərəfindən döyülməsi məsələsidir. Bu xüsusda dumanın dəstrəs olduğu vəsaiqlə ədliyyə nazirinin verdiyi məlumat arasında təzad və mübayinət var. İş təhti-təhqiqatdadır. Bakalım, nə nəticə hasil olacaq. Duma ilə ədliyyə nəzarəti əfkarı arasında qayət şiddətli müsadimələrə bais olan bir məsələ daha zühur etdi ki, o, birincidən də mühümdür. Bu məsələ məclisi-məbusan əzasından üç kişinin nə surətlə təhti-mühakiməyə alına bilməsinə aiddir. Məlumdur ki, Avropa məmləkətlərində vazei-qəvanin olan parlamentonun müsaidəsi olmaqsızın məbusandan heç bir kimsə müddəti-vəkalətləri xitam bulmayınca ədliyyə məhkəmələri tərəfindən təhti-mühakiməyə alınamazlar. Bu məsələdə ədliyyə nazirinə məntiq və hüquq dairəsində şiddətlə etiraz edənlər başlıca Gessen ilə Teselenko oldu. Gessen diyor ki, əgər məhkəmə hökmü ilə üç kişiyi mühakimə üçün müvəqqətən Duma mücahidatına iştirakdan mən etmək mümkün isə, o halda məhkəmələrin bütün Dumayı dəxi dağıtmağa haqqı olur. Əl verir ki, məhkəmeyi-ədliyyə dumanın nisfini ittiham etsin... Bir də bu natiqlərin rəyinə görə 64 sənəsi

nizamnameyi-ədliyyəsindən təhrifati-keyfiyyə üzündən həman quru bir cilddən başqa bir şey qalmadığı üçün məhkəmələrin hökmü adətən bir hökmi-ürfidir... Bir xeyli qiylü qalə bais olan bu məsələnin nə surətlə həll olunacağı hənuz məlum deyildir. Bu kimi maddələr, hüquq və qəvanin nöqteyi-nəzərindən əhəmiyyətləri dərkar olmaqla bərabər yenə təsadüfi və arizi məsələlərdən sayılmalıdırlar. Dumanın mücahidati-əsasiyyəsinə o qədər dəxli yoxdur. Dumanın bu günə qədər məşğul olduğu məsələlərin ən əsaslı və əhəmiyyətliləri əraziyi-ziraəyyə ilə büdcə məsələləridir. Əraziyi-ziraəyyə qanun layihələrini təhqiqi-əmri-xüsusi ziraə komissiyasına həvalə olunmuşdur. Məsələ qayət mühüm olmaqla bu bəhsi ayrı bir məqaləyə tərk edib burada büdcə müzakiratına dair bir nəbzə məlumat edinəlim.

Məşrutiyyət və qanuni-əsasinin ən mühüm şərtlərindən biri millətin büdcəyi kontrol ilə, yəni təftiş və müraqibə ilə təsdiq edib-etməmək haqqını haiz bulunmasıdır. Şərq və islam məmləkətlərində cari olan mütləqiyyət və üsuli-idareyi-keyfiyyə, büdcəni daima əhalidən gizli tutub vergi və rüsumat şəklində cəmaətdən, millətdən yığdığı pulları istədiyi kibi sərf eylər. Lakin məşrutiyyət və vəkaləti-milliyyə üsulu ilə idarə olunan məmləkətlərdə hökumət aldığı pulların qəpiyinə qədər cəmaətə haqqı-hesab göstərməyə borcludur. Büdcə nədir? Büdcə dövlətin bir sənəlik varidat və məsarifatının, yəni mədaxil və məxaricinin dəftəri-müvazinəsidir.

Mənbəi-varidat adilanə və məhəlli-məsarif ilə millət və dövlətin xeyr və mənfəəti, ehtiyacati-zəruriyyəsi dairəsində olmalıdır. Digər tərəfdən də məsarifat varidatı keçməməlidir.

Bu ümur elə iştiğal maliyyə nəzarətinin vəzifəsidir.

Mart ayının 21-də maliyyə naziri Kokofsev cənabları Rusiyada ilk dəfə olmaq üzrə Dövlət Dumasında 1907 sənəsi üçün tənzim etdiyi müvazineyi-maliyyə layihəsini bir təfsili-qiraət etdi. Bu layihəyə görə 1907 sənəsi üçün adi və fövqəladə məsarifin yekunu 2471 milyon manata baliğ oluyor ki, 1906 sənəsinə nisbətən 39 milyon qədər əskikdir. Kokofsevin fikrincə budcədə bir açıq, yəni müvazinədə, daha doğrusu varidatda bir nöqsan var isə, o da fövqəladə olan məsarifə qarşı imiş, fövqəladə məsarif isə 190 milyon manat miqdarındadır. Kokofsevin layiheyi-müvazinəsini mütaliə və tənqid edə bilmək əriz və əmiq ülumi-maliyyə və iqtisadiyyəyə vaqif olmağa mütəvvəqifdir. Kokofsev nitqinin ibtidasında dedi ki: "Duma büdcə sənətində sahibi-təcrübə və mümarisə deyildir. Bu xüsusda ülumi-mücərrədə dəxi



kömək etməz. Bu qədər müşkül və mürəkkəb bir əmrin öhdəsindən gələ bilmək üçün azman və mələkə lazımdır". Maliyyə nazirinin bu sözləri ola bilir ki, dumanın sağ və sol firqələrinə racc olsun. Çünki sağlar heç ağız açamadılar, sollar isə məsələyi tədqiqdən isə baltayı kökdən vuraraq "biz bu büdcəyi qəbul edəməyiz" sözlərilə iktifa etmək istədilər. Lakin I Dumada olduğu kimi, bu Dumada dəxi elm və mərifət əshabı mərkəzdə, ələlxüsus kadet firqəsində bulunduğu üçün müvazinə layihəsini elm və məntiq dairəsində tənqid və mütaliə edənlər başlıca bunların içindən çıxdı. Bu xüsusda Kokofsevə etiraz edən Kotlerin nitqi-müfəssəli qayət müfid və mənidardır.

Kotlerin nitqində dərmiyan olunan rəddiyyə və etirazları birər-birər mütaliəyə "Füyuzat" sütunları müsaid olmadığından biz ancaq bir-iki mühüm nöqtəsinin zikri ilə iktifa ediyoruz.

Kotler diyor ki, büdcədə varidati-dövlət 61-ci səneye-miladiyyəsindən bəri zahirən bir dərəcə təhti-intizama alındığı halda məsarif xüsusunda bu günə qədər bir hərcü-mərc hökmfərma olduğu görülüyor. Kotler bir çox nabəməhəl məsrəflər zikr ediyor. Senzor ləğv olunduqdan sonra idareyi-mərkəziyyəyi-mətbuat rəisi ilə müavinlərinin əlavətən təzyidi-maaşlarını bu cümləyə daxil ediyor. Bu nöqteyi baş vəzir Stolıpin rəddə məcbur oldu... Mənbəi-varidata gəlincə burada Kotler iki böyük qüsur buluyor. Qüsurların biri budur ki, varidatın yüzdə on birini (II prosentini) bilavasitə vergilər təşkil etdiyi halda bütün qalan qismi bilavasitə vergi və rüsumdan ibarətdir. Bu qisim vergilər spiçka, neft, şəkər kimi ümumi-əhalinin ən ziyadə möhtac bulunduğu məvaddan əxz edildiyinə mənba başlıca fəqir-*füqəranın cibindən çıxıyor deməkdir. Zənginlər isə vergi xüsusunda* fəqir və kasıblardan nisbət qəbul etməyəcək dərəcədə bəxtiyardırlar. İkinci qüsur ilə hökumətin müskirat və mükəyyifatdan mədaxil hasil etməsidir. Məlumdur ki, hökumət məşrubati-müskireyi özünə məxsus bir inhisar təhtinə almışdır. Müskiratı hökumət özü emal ediyor. Bu emalatdan hasil olan varidat 700 milyon manat radəsində olub bütün büdcə varidatının həman sülsünü təşkil ediyor. Bu isə maliyyə nöqteyi-nəzərindən şayani-məmnuniyyət görünsə də, hüsni-əxlaq və elmi-iqtisad nöqteyi-nəzərindən qayət müzür və mənfurdur. Burada Kotler cənablarına kömək üçün biz də bir-iki söz deyəlim:

"Füyuzat" qarelərinə məlum olduğu üzrə ədibi-əzəm qraf Tolstoy fəryad ediyor ki, ay cəmaət, içməyiniz, işrət etməyiniz, işrət üzündən əxlaqımız, sərvəti-milliyyəmiz, bütün məmləkətimiz bərbad oluyor.

Hökumət isə 700 milyon varidatı bir az daha təzyid etmək üçün səy ediyor ki, əhali müskirata daha ziyadə meyil və rəğbət göstərsin. Hətta İqnatiyevlər müsəlmanların, işrətdən ictinab ilə dövlətin varidatını xələldar etdiklərindən naşi hüquqi-müsavata layiq olmadıqlarını iddia eliyorlar idi. İndi haqq nərədə təcəlli ediyor? Dövlət Dumasının zalındamı, yoxsa vüzəranın kabinəsindəmi? Bunu cavabını qarelərimizin vicdanına həvalə ediyoruz... Kotlerin nitqi bu sözlər ilə xitam bulmuş idi: "Rusiyada vəkaləti-milliyyə mövcud olub-olmamaq məsələsi bizim büdcəyə dair mücahidatımızın nəticəsinə bağlıdır".

Gələcək məqaləmizdə əfvi-ümumi və əraziyi-ziraəyyə məsələsilə dumadakı müsəlman fraksiyasının mücahidatından bəhs etməyə qeyrət edəriz.

*Ə.Hüseynzadə*
*"Füyuzat", 1907, №14*

## MƏCNUN VƏ LEYLAYİ-İSLAM[1]

Təcənnümə müstəid bəzi əsəbiyül-məzac insanlar fikirlərini müəyyən bir maddəyə həsr edə-edə nəhayət şüurlarına xiffət gəlib bir növ cənnətə mübtəla olurlar ki, o cənnətə lisani-tibdə "cənnəti-vahidə" təbir olunur. Bən İstanbulda ikən rüfəqamdan bir türk təbibi bu cənnəti-vahidə mərəzi-əqlisinə mübtəla oldu. Düçar olduğu mərəzin əlamətləri daha məktəbdə ikən sezilmiş olmalı ki, yoldaşları ona "islam həkimi" ləqəbini verrmişlərdi. İslam həkiminin mərəzi-əqlisi bilaxərə tamamilə təhəqqüq edincə onu Üsküdar tərəfində Toptaşı məhəllində kain timarxanəyə yatırdılar. "Timarxanə" bimarxanə kəlməsindən qələt olub İstanbulda darülşəfayə, yəni məccanin xəstəxanasinə deyərlər. Biçarənin cənnəti-vahidəsi aləmi-islamın dərdini kəşf etmək olmuş idi. Məzkur xəstəxanədə islam həkimini Osmanlı məcanin ətibbasından məşhur Helmi bəy tədavi ediyordu. Helmi bəy məsləkdaşının şəfayab olması üçün əlindən gəldiyi qədər qeyrət etdisə də lakin müvəffəq olamadı, islam həkimi günün birində vəfat etdi. Zənn ediyoram şimdi Qaraca Əhməd məzarıstanında mədfundur...

[1] Bu kitaba daxil edilən "Məcnun və Leylayi-İslam", "Mövludi-Nəbi", "Pərdə eniyor" məqalələri Rasim Kamaloğlu və Şamil Vəliyev tərəfindən transliterasiya edilib.



* * *

Vaqiənin üzərindən bir neçə ay keçdi. Bir gün bənim nəzdimə bir qadın gəldi. Bu qadın islam həkiminin validəsi idi. Qoltuğunda bir məndil içində bir yığın kağızlar gətirmiş idi. Qadıncığaz dedi ki, bu övraqı mərhum oğlum yazmış idi. Bən yazmaq, oxumaq bilmiyoram... Zənnimcə həkimliyə dair olmalı, bəlkə içində istifadəli bir şeylər olur deyə sənə gətirdim. Oğlumdan bir yadigar olsun. Qadına təşəkkür edib gətirdiyi töhfəyi aldım, mütaliəyə başladım. Təəssüf ediyoram ki, bir gün "Yıldız" xəfiyyələri gəlib bütün övrağımı zəbt etdikləri üçün islam həkiminin yazdıqları şeylər də o miyanda qayib olub getdi. Bunların arasında qayət şayani-diqqət bir məqalə var idi. Xatirimdə qaldığı kibi əzbər yazıb qarelərimə təqdim ediyoram.

Ancaq bunun bir dəli xəyalının məhsulu olduğunu unutmamalıdır.

* * *

İslam həkimi yazmış idi ki:

"Bir axşam evdə kimsə yox idi, mən də tənha odamda oturub siğara içiyordum... Şəms qürub etdi. Ortalıq yavaş-yavaş qaraldı. Bən dərin-dərin əfkarə dalmış idim, lakin nə fikir etdiyimi, nə düşündüyümü xatırlamıyoram. Ancaq yadımdadır ki, fikrim nə yerdə idi, nə də göydə... Fikrim bənim bir ədəmabadda gəzib dolaşıyordu, gahgah o ədəmabadın uçurumlarına düşüyor, müdhiş girdablarına tutulub dərinliklərinə doğru eniyordu. Orada çapalıyordu. Xilas olmağa çalışıyordu. Girdablarla, uçurumlarla mübarizədən, mübarizəyi-fikriyyədən o qədər yoruldum ki, nəhayət bitab səndəliyəmin üzərinə düşüb bir cismi-camid kibi hər növ hərəkətdən məhrum oldum. Gözlərim odamın bir nöqtəsinə dikilib o nöqtədən ayrılamıyordu. İbtida qaranlığa qarışan cıqaramın dumanlarından başqa bir şey görəmiyordum. Nagah qaranlığın, dumanın içində yaşıl rəngli bir şərarə peyda oldu. Şərarə getdikcə nurlandı, nur getdikcə böyüdü, nəhayət, odamı tərifi-naqabil, qayət gözəl, yaşıl rəngli, zümrüdin bir işıq imla etdi. İşığın bana bəxş etdiyi zövqi-ruhani ilə bir müddət bihuş oldum. Sonra ayılub ətrafa diqqət edincə gördüm ki, qarşımda o nurlara bürünmüş qayət hüsna bir qız duruyor.

Qızın əlbisəsi pək qərib idi; başında osmanlı bayrağına bənzər, ay-yıldızla müzəyyən bir qırmızı örtü var idi. Geyindiyi ruba isə yaşıl

olub köksündə sıyırma ilə işlənmə bir şiri-xurşid əlaməti görünüyordu. Belinə bağladığı Lahor, ya Kəşmir şalı ayaqlarına qədər eniyordu... Dedim kimsiniz? Buraya nə üçün gəldiniz? Dedi ki, bən islaməm, dərdimə, xəstəliyimə dərman aramaq üçün buraya gəldim... haziq bir təbib olduğunuzu bana xəbər verdilər... Xəstəligimi təşxis edib bana müdavat ediniz!..

Bən. Nə qərib sözlər! Heç islam xəstə olurmu? İslam hər növ şaibədən, qüsurdan, xəstəlikdən, əsqam və iləldən mübərra deyilmi?

Qız. Məni anlamadınız, bən İslam dini deyiləm, bən islami-siyasi, daha doğrusu, islami-coğrafiyəm. İslam dininin burada, İstanbulda nə işi var? Onun bulunub ayrılmadığı yerlər Məkkə, Mədinə, Nəcəf, Kərbəla, Məşhəddir...

Bən. Bu ayrı mətləb... həqiqətən islami-coğrafi xəstə ola bilir, nasıl ki, xəstədir də! Mən bunu çoxdan eşitmişdim. Bu gün o xəstəliyi tədqiqə fürsət bulduğuma çox məmnun oldum. Buyurunuz, oturunuz, sizi başdan-ayağa qədər müayinə edəyim.

İslamı bir kanapa üzərinə oturtdum. Çöhrəsi pək soluq idi, göz qapaqlarının iç təbəqəsinə diqqət etdim. Əmiq bir fəqrüd dəmə dəlalət ediyordu. Lisanına baxdım. Suyi-həzm əlaməti aşkar idi. Lakin ən maraq etdiyim üzv dimaq olduğundan ibtida bu üzvün müayinəsindən başladım. Bunun üçün kəhhali-şəhir Əsəd bəyin çeşmbin alətinə müraciət etdim. Bən bunu Helmqolçun və sairənin çeşmbinlərinə tərcih edərəm. Çünki öz türk təbibimizin ixtirakərdəsidir. Zatən avropalıların da ən ziyadə istemal etdikləri çeşmbin oftalmoskopi-Əsəd bəydir. İştə bu çeşmbin ilə islamın qəri-eynini və oradan da əsəbi-bəsəri təriqilə əhvali-mərəziyeyi-dimağını müayinə etdim. İbtida Avropa müşərrihlərinin (yəni elmi-təşrihi-bəşər üləmasının) əhəmm bir xətasını təshihə məcburam. Cümcümə deniləh baş kasası üzamının qaidəsində tam ortada bir yer var ki, ona avropalılar "Sərci-türki" (*sella turcica*) yəni "türk əgəri" derlər. Halbuki islamın beynini çeşmbin ilə müayinə edərkən bunun "türk əgri" olmayub, "türk taxtı" olduğunu kəşf etdim. Taxt qayət müsənnə və mürəssə idi. Xəlifeyi – "Vərdi" bulunan sultan kəndisi də üzərində oturuyordu. Ruh dimağın mərkəzində bulunmaq icab etdigindən anladım ki müşahidə etməkdə olduğum zat bədəni-islamın ruhudur.

Əhvali-ruhiyyə ilə əhvali-cismaniyə yekdigərinə tabedirlər. Ruh əsab vasitəsilə bədənə hökm edər və hər tərəfdən məlumat alır, bədən də şərayin və qan vasitəsilə ruhu bəslər. Bədən xəstələnirsə, ruhu müztərib edər. Ruhun bulunduğu dəmağ xəstələnirsə, bədənin hər tərəfində bir hərcü mərc peyda olur. Binaonəleyh təxti-Türkiyə rast gələn üzvi gözəlcə tədqiq etmək lazımdır. Sultan pək rahətsiz olub, böyük bir təlaş içində idi. Vaqiən ətrafına şərayin vasitəsilə qan selinin isal etdiyi lira və məcidiyyə şəklində bir xeyli kərbüvatidəməviyyeyi-həmra və beyza cəm olunmuş idi. Ancaq bunlar "aorta" vasitəsilə əsla bədənə övdət edəməyib Sultanın ətrafına yığılmış bir sürü kazib curnallar tənzim edən xəfiyyə həşəratı, baxüsus Əbu əl-hüdalar, Ərəb-İzzətlər, Təhsin paşalar tərəfindən bəl olunuyordu, qalan qismini də bankirləri ilə qonsesyonçuları torba-torba daşıyıb götürüyorlardı. Bunların içində ən böyük rol oynayanlar almanlar idi... Sultan əsab vasitəsilə nə bir tərəfə hökm edə biliyordu, nə də bir tərəfdən məlumati-səhihəyə dəstrəs oluyordu. Burada doğru həvadis verən, ələlxüsus xaricdən gələn qəzetələrin, məcmuələrin, kitabların heç biri görünmüyordu, dəmağın uzaq bir guşəsində cümləsi bürokratlar tərəfindən ehraq ediliyordu.

Sultanın hökmü də heç bir tərəfə yetişəmiyordu, çünki onun ətrafına cəm olan əcaib və qəraib bir tağım məxluqat bütün türüqiəsəbiyyeəyi sədd etmişlər idi. Bunları tədqiq edəlim: ön səfdə, sağ tərəfdə duranlar vüzəra və vükəla ünvanını haiz olub əksəri atil, cahil, rüşvətxor vətən xainlərindən ibarət idi. Bunlardan səs-səda çıxmıyordu. Bağırıb çağıranlar, atılıb düşənlər, hətta rəqs edənlər, sol tərəfdə düvəli-əcnəbiyənin səfirləri ilə konsulları idi. Sultanı ən ziyadə rahətsiz edən də bunlar idi. Bunlar gah birər-birər, ağır-ağır tələbatda bulunuyorlar, gah şədidülmal müştərək notalarla təhdid ediyorlar idi. Millətin mənafeyi diyordu ki, gömrük rüsumatını təzyid edəlim. Bunlar bağırıyorlardı: Olmaz! Millətin mənafeyi diyordu ki, əcnəbi postalarını, qapitolasyon üsulunu ləğv edəlim. Bunlar bağırıyorlardı ki: Bu heç olmaz!.. Sultan iztirab içində ətrafına baxıyor, bunlara cavab verəcək, bunlara hədlərini bildirəcək, bunlara qarşı millətin haqqını müdafiə edəcək adam arayordu. Lakin kimsə bulamıyordu. Vüzəra və vükəlayə, bürokratlara tərəfi-nəzər ediyordu. Bunlardan səs çıxmıyordu, çünki, düvəli-əcnəbiyyədən təxsisatları var idi... Həqiqətən millətin mənafeyi və hüququnu müdafiə edəcək ortada bir kimsə yox idi... Çeşmbin aləti ilə dimağın uzaq nöqtələrini tədqiqə başladım... Bir çox məhbəslər, mənfalər, qürbətlər gördüm. Burada hədsiz-hesabsız adamlar inliyor, ah və vah edi-

yor idi. Əksəri "Məşrutiyyət! Qanuni-əsasi" – deyə fəryad ediyordu. Bunlar miyanında Səid bəyləri, Ziya Mollaları, İsmayıl Səfaları, Əbüzziya Tofiqləri, İsmayıl Kamalları, Səzailəri, Əhməd Rzaları, Übeydullaları gördüm. Həsrətkeş bulunduqları qanunun vazeləri, fədakarları Midhətlər, Süavilər "Şirpənceyi" – istibdad ilə şəhid edilmiş idi. Məşrutiyyətə, məclisi-məbusanə gəlincə, "Yellər əsiyor o yerdə", yaxud... "daşlar duruyor onun yerində!" Mənfələrin, məhbəslərin xaricində Amerikanın, Avropanın, ələlxüsus fransızların xristian missionerlərini gördüm ki, kəmali-hürriyyətlə icrai-ehkam edərək rumları, erməniləri və ələlümum xristianları qiyama təşviq ediyorlar idi. Təxti-türkinin qərbində bir kaç müqtədir və kamil adamlar var idi, lakin ağızlarına o qədər qızıl, altun doldurulmuş idi ki, səsləri çıxmıyordu. Çeşmbini təxtin arxa tərəfinə tövcih etdim. Burada bir sürü qadınlar gördüm ki, əsarət barı altında inliyor idi. Onların mühafizi olan siyah çobanlar isə özləri dəxi əsarətin ən mənfur, ən çirkin pəncəsinə giriftar olub, qanlı əməliyyatlarla rəcüliyyətdən məhrum edilmişlər idi... Ən ziyadə bu nöqtəyə təəccüb etdim. Anlamıyordum ki, küreyi-ərzin hər tərəfində, hətta Türkiyənin özündə əsirçilik ləğv edilmiş olduğu halda bu xadim ağalarını nərədən tədarük ediyorlardı. Əgər bunlar tənasül təriqilə əvvəlki xadimlərdən vücuda gəliyorsa, bu mümkün degil idi, çünki dediyim vəchlə bunlar rəcüliyyətdən məhrumdurlar... Anlayordum ki, burada islamiyyət və məsturiyyəti-nisvaniyə naminə taqəti-bəşəriyyə fövqündə bir zülmi-cansuz, bir cinayəti-müdhişə xəfiyyən icra ediliyor!.. Bu qadınların, bu xadimlərin, bu xəfiyyələrin, bu elçilərin, bu əcnəbi mültəzimlərinin qiylü qallarından, bağırıb-çığırmalarından dəmağda bir vəlvələyi-saməə-xəraş gurluyordu... Buna artıq təhəmmül edəməyib, Əsəd bəyin çeşmbinini bir tərəfə fırlatdım. İslama sordum ki:

– Əfəndim, başınızda bir şey hiss etmiyorsunuz?

İ s l a m. Əvət, başım çox ağrıyor, donuyor, qulaqlarım uğuldiyor... Gecələri əsla uyuyamıyoram... anladım ki, xəstəm əlaimi-mərəziyyədən südaə və səhərə mübtəladır.

İ s l a m. Nə anladınız, xəstəliyimi təşxis edə bildinizmi?

B ə n. Bu xüsusda bir hökm verə bilmək üçün bədəninizin sairə əchəzə və əzalarını dəxi müayinə etmək lazımdır. Ancaq şimdilik şunu anlaya bildim ki, beyniniz, dimağınız müzmin və münnid bir südai-istibdad və əsarətə mübtəladır!..



* * *

Bu mükalimədən sonra islamın köksünü "qər" və "isğa" etdim. Şirü xurşid əlamətinin fövqündə bir az solda kəlmeyi-şəhadət yazılı idi. Burası nahiyəyi-qəlb idi. Dedim ki, xanım əfəndi, qəlbinizin burada bulunduğunu bilirmisiniz, dedi ki, göstərdiyiniz yer hərəmeyni-şərifeynin bulunduğu Hicaz və Ərəbistan qitəsidir. Anladım ki, islamın təşrih topoqrafiyasında qəlbə Ərəbistan deyilir ki, onun üqdi-əsəbiyyəsi də Kəbeyi-şərifə ilə rövzeyi-mütəhhərədir. Əmrazi-daxiliyyə müəllimi Feyzi paşanın vaxtilə bizə öyrətmiş olduğu vəchlə sol əlimi sədri-islamın sol cəhətinə tətbiq edib sağ əlimin işarət və orta barmağı ilə nahiyeyi-qəlbiyəni kəmali-diqqətlə qər etdim, fəqət bu əməliyyatın nəticəsində fövqəladə bir heyrətə düçar oldum: islamın qəlbi kiçilmiş, zümur peyda etmiş idi. Turi-sina və Süveyş kanalı civarında olan Əqəbədən başlayıb Babülməndəb və Ümmandən keçərək, Bəsrə körfəzindəki Bəhreyin adaları ilə Küveytə qədər qəlbi-islamın, yəni Ərəbistanın bütün mühiti məfqud idi. Ətrafında əsmiyyəti-qəlbiyə yerinə qər ilə sədayi-cövhi hasil oluyordu. Bu hal, ələlxüsus Ədən şəhri civarında vazeh idi. Aşkar idi ki, qəlbi-islam bir "zümuri-mütərəqqi"yə düçardır. Bunun səbəbini anlamaq lazım idi. Zehnimdə zümura bais ola biləcək bütün mikrobları yoxlamağa çalışdım. Xatirimə ingilis mikrobları gəldi. Lakin bu mikroblar qəlbi-islamə nə surətlə tari ola bilmişlər? Bunu dərk edə bilmək üçün firənglərin "stetoskop" və bizim "müsəmme" dedigimiz ələti-isğayə müraciət etdim. Müsəmmein bir ucunu islamın nahiyeyi-qəlbiyəsinə, bir ucunu da öz qulağıma tətbiq edib "zəiran" və "ğəmağəm"i-qəlbiyyəni istima etməyə çalışdım! Heyrət! Salim qəlblərin zərbanından hasil olan əsvati-təbiyyeyi-müntəzəmədən nə "tıq" və nə də "taq" eşidilmiyordu.

Əsvati-təbiyyədən baqi qalan ancaq Zəmzəmin zümzüməsi ilə hüccacın vəlvələsi idi. Fəqət "tıq" yerinə bir "tənini-mədəni" və "taq" yerinə də bir "zəiri-nəfxi" eşidiliyordu ki, bu sövtlərin hər ikisi də qayət əhəmiyyətli əlaimi-mərəziyədən mədududdur. Müsəmme vasitəsilə tənin-mədəninin səbəbini anlamaq olmuyordu. Fəqət "zəiri-nəfxi" gözəl təhlil oluna biliyordu. Nəfxə, qeyri-müntəzəm və daimi bir gurultu ilə bir də mütəqatе bir fısıltıdan ibarət idi. Əvvəla bu fısıltı marağımı cəlb etdi. İyicə diqqət edincə bunun şərifin xanəsində iki kişi arasında cərəyan edən bir mükalimədən ibarət oldu-

ğunu sezdim. Mükalimə edənlərin biri ümoradan olub əmrlər veriyor, biri də bədəvi bir ərəb olub "baş üstünə, baş üstünə" diyordi.

Amir diyordi ki:

– Əlimizə böyük bir fürsət keçiyor, Yənbu təriqilə Mədinəyə Rusiyadan qayət zəngin hacılar gəlməkdədir. Rəfaqətlərində türk əsgəri bulunmayacağını xəbər aldım... Dağ keçidində keçidin adını eşidəmədim, bunları mühasirə edib cümləsini qətl ilə paralarını, əmval və əşyalarını zəbt etməlisiniz... Bu işi mümkün mərtəbə sürətlə yapınız...

Burada qulağımı müsəmmein üzərinə ziyadə tətbiq etdim, anlamaq istiyordum ki, bu əmri verən şərifin özümü idi, yoxsa övnəsindən birimi idi. Nə faidə ki, müsəmme çeşmbin qədər mükəmməl olmadığından burası mənə məchul qaldı... Zeyri-nəfxini tərtib edən gurultulara gəlincə bunlar Ərəbistanda, Yəməndə, ələlxüsus Səna cəhətlərində Türkiyəyə qarşı üsyan edən bədəvilərlə şeyxlərinin bağırıb-çağırmalarından və bunlarla sıcaq qum çöllərində ac və susuz müharibə edərək bihudə yerə təlef olan osmanlı əsgərlərinin ah və ənînindən hasil oluyordu. Bu üsyanın, bu ixtilalın başlıca səbəbi qəlbi-dimağə rəbt edən "əsəbi-müştərəki-kəbir" yollarının düçari-fəlc olması idi. Dəmağ hərəkati-qəlbiyəni tənzim və idarə edəmiyordu. Qəlb ilə dəmağın əlaqəsi müxtəl olduğundan Hicaz və Yəməndə bulunan bürokratlar biçarə bədəviləri öz keflərincə soyub yeyirlərdi. Ərəblər buna artıq təhəmmül edəməyib ardı-arxası kəsilməyən şurişlər, ixtilalar çıxarıyorlardı... Bu haldan ingilis mikrobları külliyyətlə istifadə edərək nahiyeyi-qəlbi tədricən istila eyliyorlar idi... Mikroblara qarşı məzaddi-əfən olaraq kafi miqdarda nə ədalət, nə barıt və nə axça var idi. Vaqiən istima etdiyim tənini-mədəni ortada bir axça taqqırdısına dəlalət edər kibi idi. Ancaq bu taqqırtı əsnai-işğadə çox da vazeh olmadığından bunun mahiyyətini anlamaq üçün yeni kəşf olunan rentgen şüaətinə müraciət etdim. Məlumdur ki, bu şüai-xariqüladə vasitəsilə əxşayi-daxiliyyənin və əxşada peyda olan zayeat və tənəbbütati-məreziyyənin rəsmini fotoqrafla almaq mümkün oluyor. İslamı rentgen cihazının qarşısına oturdub qəfəsi-sədri daxilindəki, əxşanın, yəni qəlb ilə riyəteynin fotoqrafını aldım...

Fotoqrafa diqqət etdim... Xəstəm qorxur deyə fotoqrafı ona göstərmədim. Orada qayət qorxunc bir lövhə var idi. Bir tərəfdə "həmçu əjdərha kuşadə-səd dəhan" yüzbaşlı yılana bənzər uzun vücudlu mühib bir heyvan rəsmi görünüyordu. Bu qəfəsi-sədrin sağına rast



gələn şəryani-şizən, qəsəbati-hüveysilatdan ibarət rəyiyəminin, yəni ağ ciyərin sağ parçasının rəsmi idi ki, şirü xurşidin taxtına isabət ediyordu. Burası İran ölkəsi dəmək olduğundan mütaliəsini atiyə buraxıyoram. Burada tənini-mədəniyə dəlalət edər bir şey görünmüyordu. Lakin əjdərhanın solunda bir rəsm var idi ki, bu rəsmdə dəvərani-dəmin intizamına xidmət etməsi lazım gələn qəlbini iki üzeyn, (Yənbu və Ciddə) ilə iki bəteyn, (Məkkə və Mədinə)dən ibarət dörd cövfi və bütün bədəndən qanı qəlbə isal edən "vərid"lərlə, buradan təkrar onu bədənin hər tərəfinə sövq edən şərəyanlar aşikar görünüyordu. Dövran və cövlani-dəmlə tərəfdən gələn hücum axınaxın bətinlərə daxil olaraq Kəbə və rövzeyi-mütəhhəreyi-dili təvaf etdikdən sonra yenə yerlərinə övdət ediyorlardı. Əcəba bunlar zülali-Zəmzəmlə qidayi-ruh və bədən olan məarifi-islamiyyəni buradan hər tərəfə isal ediyorlarmı idi?.. Heyhat!.. Qahirədə, Nəcəfdə, Kərbəlada pərişan bir halda olsa da heç olmazsa mövcud olan mədaris və darülfünuni-islamiyədən buralarda, həkimi-dilagah Murad bəyin vaxtı ilə etdiyi dadü fəryadlara rəğmən, nə bir nişanə, nə də bir əsər var idi...

Bəteynlərin qürbündə bir lövhə görünüyordu ki, "tənini-mədəni"-nin nədən nəşət etdiyini mükəmmələn göstəriyordu; ingilis şapkalı bir hərif bacağı-bacağının üzərində bir sandaliyə üzərində oturmuş idi. Bunun ətrafında başları çalmalı bir çox ərəb şeyxləri yerdə bardaş qurmuşlardı. İngilis əlindəki böyük bir torbadan ovuc-ovuc ingilis lirələri çıxarıb bu şeyxlərin qarşısına atıyordu ki, tənini-mədəni də bu lirələrin yerə çarpmasından hasil oluyordu... Əsasən Ərəbistanın üsyan gurultularına bir cəhətlə bais olan da yenə bu lirələr idi... İslamə sordum ki, sol böyrünüzdə nə hiss ediyorsunuz, dedi ki:

– Ürəyimdə hər vəqt bir çırpıntı var. Ara-sıra guya içəridən qabırğalarımın həzasından bir xəncər saplanıyor kibi bir taqım ağrılar duyuram. Əcəba, məndə də "mərəzi-üzviyyeyi-qəlb" dedikləri xəstəlikmi var?

B ə n (*xəstəyə təsəlli üçün*). Xeyr, əfəndim, əhəmiyyətsiz bir şeydir, dəmağınız düzəlirsə, qəlbinizdəki alam və övca da keçər gedər...

Hər halda bütün əzanız başdan-başa müayinə edilmədikcə təşxisi-mərəzə dair əsasən bir hökm veriləməz, şimdi şu səndaliyə üzərinə oturunuz da ciyərlərinizi mütaliə edəyim...

Ancaq şirü-xurşidi çıxarınız, çünki istima və işğayə mane oluyor.

İslam şirü-xurşidi çıxarub bir tərəfə ataraq köksünü açdı... Şu dilbəri-simintənin yasəmindən bəyaz, nəsrindən lətif olan köksü o qədər gözəl, o qədər rəna idi ki, təbib olacaq yerdə şair buluna idim, mütləq o sinəni, bunca şüəra və üdəba bəsləmiş olan o sinəyi nəzmən tərifə məcbur olurdum. Lakin təbiblər ələlümum lətafəti-zahiriyyədən ziyadə səlaməti-batiniyyəyə diqqət edərlər... Əsnayi-işğada duyduğum zəiraati-tənəffüsiyyədən xuraxuri-səfiriyyə, qətitə və təhti-fərqəiyyeyi tərifdən əvvəl, rentgen şüası ilə aldığım fotoqrafdakı yüzbaşlı əjdərhanın rəsminə dair bir az izahat verəyim: qəribədir, islam sinəsi üzərində şirü xurşid əlamətini hamil bulunduğu halda dəruni-sinədə nə arslan və nə də günəşdən bir nişanə görünmiyordi. Bunların yerində zürrüusi-kəsirə bir əjdərha ilə, bir də bunun ağızlarından fəvvarən edən bir ataş nümayan oluyordu.

Bu əjdərhanın, türuqi-tənəfüssiyyədən şəriyani-şiddətlə şüəbatı bulunan qəsəbatın istihaleyi-mərəziyyəsindən hasil olması möhtəməldir. Avropa kütübi-tibbiyyəsində qəsəbatür-riənin bu yolda bir istihaləyə uğramasına və ya uğramaq imkanına dair əsla məlumat verilmiyor. Hətta qeysərilər paytaxtı qədim Romada yetişən latın şüərasından məşhur Ovidin “Metamarfoza”, yəni “İstehalat” ünvanlı əsəri-güzidəsində belə bunun əmsalına rast gəlmədim. Vaqiən bu kitabda insanların mar və əjdərhalara təhəvvül etdikləri hekayə olunuyor. Lakin insan ciyərlərini bittəğyür əjdərhayə döndüyünə dair hərfi vahid belə yoxdur. Tibb kitablarında olan belə qüsurun başlıca səbəbi latın və Avropayi-cədid üləmasının İranın təbabətindən, tarixi-təbabətindən qafil və bixəbər bulunmalarıdır. İran tarixinə aşina olanlara məlumdur ki, hökuməti-müstəbidənin timsali-mücəssəmi olan Zöhhakın hinduca “Azidahakanın” umuzlarında iki əjdərha peyda olmuş idi. Ətibbaye-qədimeyi-İran əməliyyati-cərrahiyyə ilə bu əjdərhaları dəfaat ilə kəsib atmışlar idisə də fəqət yenə mərəzi-istibdada çarəsaz olamamışlar idi.

Rəvayətə görə guya bu dərdin öhdəsindən Gaveyi-ahəngər gələ bilmiş idi. Lakin bu rəvayət doğru deyildir. Çünki Gavə ancaq Zöhhaki-zalimin qətli ilə iktifa edərək kəndisindən əvvəl əttibanın kəsib atdıqları əjdərha başlarını yığıb ehraqi-binnar, yaxud bir surətlə məhv və nabud etməyi unutmuşdur. Halbuki, əttibayi-İran böyük bir ehtiyatsızlıqda bulunub bu başları kəsdikcə torpağa gömərək məvadi məzadi-üfuniyyə heç istemal etmiyorlardı. İşdə mürur zamanla yüzlərcə olan bu əjdərha başları birləşib islamın ciyərindəki məcariyi-tənəffüsiyyənin, yəni qəsəbat və həvisilatın çoxunu sədd etmişlərdi.



Rentgen şüası ilə aldığım fotoqraf bunu mükəmməlon isbat ediyor. Bundan anlaşılır ki, Türkiyə istibdadı birbaşlı olduğu halda, İran istibdadı yüzbaşlıdır. Türkiyədə bir müstəbid olub, onun hökmü-mütləqi də İstanbuldakı Yıldız sarayından südur edir. İranda isə hökumət surətən Tehrana məxsus ikən həqiqət halda hər bir şəhərin, hər bir vilayətin valisi xalqın başına bir hakimi-mütləq kəsilir. Bunların maaşları Tehrandan gəlməyir. Bunlar müstəqillən əhalidən “vergi” namı ilə soyub qopardıqları varidat ilə keçinirlər. Türkiyədə dərəbəyliyin kökü çoxdan qazılmış olub, aristokratiya deyilən nücəba və zadəgan güruhu yoxdur: burada nə bəy və nə də xan var. İranda isə hər başını qaldıran qolayılığla bəy, xan və hətta prins olur.

Rusiyada 1864-cü səneyi-miladiyyədə kənd əhli mülkədarların əsarətindən xilas edildikləri halda İranda olan kəndlər cəmaətlari ilə bərabər mülkədarlarının malı, qulu, əsiridirlər. Əjdərhayi-istibdadın başları sadə bunlardan ibarət deyildir. Türkiyədə xan, mərsiyəxan və müctəhid sinfi olmadığı kimi, mollaların, xacələrin, seyyidlərin də əhali üzərində əslən bir nüfuzları yoxdur. İranda isə bürokratiyadan başqa bir də ayrı-ayrı molla, müctəhid, seyyid və s. hökumətləri vardır ki, bunlar çox kərrə kamali-müvəffəqiyyətlə bürokratiya hökumətinə, daha doğrusu, hökumətlərinə qarşı dururlar!.. Bu növ hökumətitaliyyənin İran üçün ən təhlükəlisi seyyid və molla hökumətidir. Osmanlı türkləri ələlümum qədimdən bəri tutduqları din və məzhəbdən ayrılmadıqları halda, İran mollaları iki də, bir də yeni məzhəblər ixtiraına qalxışaraq molla hökumətinin dəxi təəddüdünə çalışırlar... Mollaların böylə yeni-yeni məzahib ixtira etmələrinə gəlincə bunun başlıca baisi əjdərhanın ağzından fəvvəran edən atəşdir. Zərdüştin azərkədəsi İranda hənuz sönməmişdir. İran torpağını hər nərədə qazsanız, altından atəşpərəstlərin külü ilə əxkəri zühur edər. Binaənələyh ənasüri-islamiyyə qəlbgah olan Hicazdan bəda ilə gəlib İran deyilən ciyərdəki bu rəmmadi zərdüştiyə təmas etdikcə bir təğyirə uğramadan keçəməz!..

Qorxuram ki, fiziologiya elminə aşina olmayan qarelər bu nöqtələri anlamayıb mənə etiraz edələr. Bina bərin burada müəllim Şakir bəyin elmi – “Mənafeül-əza” dediyi fiziologiyanın ciyərə aid bəhsindən bir nəbzə məlumat verməyə lüzum görürəm. Təfsilat almaq istəyənlər Şakir bəyin elmi “Mənafeül-əza” ünvanlı kitabına müra-

ciət edə bilərlər. Bir isabət olaraq Şakir bəyin İranda zühur edən əmrazi tədqiq üçün hökuməti-Osmaniyyə tərəfindən oraya ezam olundu[1].

Şübhəsiz nəticeyi-tədqiqatı bizim mütaliatımızı təsdiq edəcəkdir: məlumdur ki, qanın bədəndə dönüb dolaşması iki dövrandan ibarətdir ki, birinə dəvərani-səğir, digərinə də dəvərani-kəbir təbir olunur. Təmiz və qırmızı bir qan qəlbdən başlayıb, bütün bədəni dolaşdıqdan sonra hamizi-fəhm ilə məhmul olub rəngi siyahlaşdığı halda təkrar qəlbə övdət edər (dəvərani-kəbir). Sonra bu siyah qan qəlbdən cigərlərə sövq olunur. Bu üzvi dolaşıb hamizi-fəhmi türüqi-tənəffüsiyədən zəfir vasitəsi ilə rədd edər və bunun yerinə şəhiq vasitəsilə gələn müvəllüdül-həmuzə ilə birləşərək yerinə qırmızı rəngini əğz ilə təkrar qəlbə övdət edər (dəvərani-səğir). Bu surətlə dəvərani-kəbir ilə dəvərani-səğir daima yekdigərini voli edir. İştə qanın əsnayi-şəhiqdə havanın müvəllüdül-həmuzəsi ilə imtizaçı ciyərin başlıca vəzifəsidir. Zatən yanmaq ümum əcsamın müvəllüdül-həmuzeylə birləşməsindən ibarət bulunduğu üçün Fransanın məşhur kimyagərindən Lavuaze "tənəffüs əsasən bir ehtiraqi-bətidir" demiş idi. İştə azərgədeyi-əzimeyi-İran da aləmin ortasında bir ciyər hökmündə bulunduğu üçün ənasiri-mədəniyyənin heç biri bu mehraqda bir təğyirə, bir ehtirağa uğramadan nə Şərqdən Qərbə və nə də Qərbdən Şərqə keçəməz; Hinddən gələn Brəhmən və Budda məzhəbləri burada ayin zərdüştiyə münqəlib oldu. Yunanın cümhur mədəniyyəti ilə pərvərişyab olan İskəndər İranda Daralar kibi bir hökmdari-mütləq kəsildi. Roma cümhuriyyəti İranla təmasdan sonra hökuməti mütləqiyyəyi-qeysəriyyəyə təbəddül etdi. Dini – İsa İrana nüfuz edərkən, Manike Maniyi-nəqqaş məzhəbi şəklinə girdi.

Məşrutiyyətçi bədəvi ərəblər İrana təqərrüb edər-etməz "şireşotor və susmar"[2] yeyəcək yerdə "tace-kəyani" arzu edəcək oldular. Bilməyioram ki, Firdovsi kimi "Tofu, bər to ey çərxi-gərdan, tofu!!!"[3] demək caizmidir?! Əsasən, Firdovsinin "Şahnamə"si Darati-mütləqiyyətin mədh və sənasından başqa bir şey deyildir. Bunu Fransa

[1] Cünuna mübtəla olmuş olan "İslam həkimi"nin bu sözləri qismən doğrudur, bundan 10-12 il əvvəl darülfünunun tibb müəllimlərindən Şakir bəy İrana ezam olundusa da, bəzi maneələrin zühuri ilə Ərzurumdan irəli gedə bilmədi. Şakir bəy məşhur fizioloçist Klod Bernarın şagirdlərindəndir (*Ə.H.*).

[2] Tərcüməsi: "Dəvə südü içən, kərtənkələ yeyən".

[3] Tərcüməsi: "Tfu sənə, ey zamanə, tfu!"



məşrutiyyət və cümhuriyyətini pamal edən III Napoleon gözəl anlamışdı. Anladığı üçün "Şahnamə"ni fransızcaya tərcümə edən Jül Mola əlindən gələn müavinəti-nəqdiyyəni diriğ etməmişdi. Ancaq Jül Mol ilə Napoleonun nöqteyi-nəzərləri ayrı-ayrı idi. Jül Mol "Şahnamə"ni məzayeyi-şeriyyəsindən naşi tərcümə ediyordi. Napoleon isə fransızlara bir mütləqiyyət mədh və sənası eşitdirmək istiyordi. Hər nə isə sədəddən ayrılmayalım... Dini-islam dəxi bu ölkədən təğyirə düçar olmadan keçəməyib olan o təğyiratında davam etməkdədir. Şimdi bu ciyərgah islamda davam edən ehtiraq vəzaifi-fiziolociyayi-tənəffüssiyədənmi, yoxsa əlaimi-mərəziyyeyi-həməviyyədənmi ədd etməlidir. Lavuazye diyor ki, "tənəffüs bir ehtiraqi-bətidir". Bu doğru! Ancaq bu ehtiraq xaricdən gələn saf və təmiz bir hava sayəsində oluyor.

İrandakı ehtiraq isə xaricdən gələn nəsim hava sayəsində olmayıb, İranın öz daxilindəki pozulmuş, fəsada uğramış badi-atəşini – Zərdüşti vasitəsilə vüqua gəliyor. Fikrimizi izah edəlim. İranın türuqitənəffüssiyyəsi hər tərəfdən qapanmışdır. Dəmir yol şöylə dursun, bu ölkədə heç adi yollar da yoxdur. Şah Abbas dövründən qalma yollar bütün xarab olmuşdur. Ciyərə hava ibtida boğazdakı həncərədən daxil olur. İranın xaricdən saf dəniz havası alacaq həncərəsi bilkülliyyə qapanmışdır. Xəlici-farsi Omana rəbt edən Hörmüz boğazına "kəşim" adı ilə bir ingilis müstəmləkəsi vərəmi çıxıb bu mənfəzi sədd etmişdir. Bu xüsusda vaxtı ilə Cəlaləddin Əfqaninin bağırıb çağırması kar etmədi. Şimalda isə Kaspi dənizində İranın bir gəmi işlətməyə haqqı yoxdur, çünki Fətəli şaha "şor su lazım degil" idi.

Əsasən, İrandan məzhəb iqtizası olaraq heç bir fərdin Avropada və s. biladi-mütəmədinədə təhsili-elmə getməyə haqqı yoxdur. Çünki Zərdüştün "pak və napak" nəzəriyyəsi bu gün mübaliğəyə uğrayaraq, bu nəzəriyyəyə görə bir kaç milyon müsəlmandan başqa məxluqüllah olan bir milyard yarım bəşəriyyətin kaffəsi əhli-kitabda daxil olduğu halda murdardır. Bakteriologiya elminin "asepsi və antisepsi" nəzəriyyələrindən bixəbər olan İranın "pak və napak" fərziyyəsi şayani heyrətdir. Bu fərziyyəyə görə qırx-əlli üyüzün kəlin, qoturun, keçəlin girib çıxdığı hovuzun suyu pak ədd olunduğu halda, təqdirxananın o mikrobsuz, rüsubsuz bərraq suları napak və murdar hesab olunuyor. İranın, yəni riəyi-islamın əhvalına mükəmməlin aşina olan böyük bir fazil ən məşhur kitabının başında diyor ki: "Hər nəfəsi ke foru mirəvəd mommedde-həyat və çun bər miyayəd mofər-

rehe-hizat əst. Pəs dər hər nəfəs do nemət mövcud və hər nemət ra şokri vacib"[1].

Sədi burada ciyərin əfali-fiziologiyasından olan zəfir ilə şəhiqin əhəmiyyətindən bəhs ediyor. Ehtimal, Atabəy Sədi bin-Zəngi dövründə aləmi-islam İran vasitəsilə bir az nəfəs ala bilirdi və binaənəleyh böylə bir nemət üçün şükr etməyə də borclu idi. Lakin şimdi bu növ mülahizat ilə islamın köksündə isğa və istima edəcəyim əsvatın ğayətlə şayan diqqət olacağını anladım. Məsməiin bir ucunu qulağıma, bir ucunu da islamın köksünə tətbiq etdim. Eşitdim ki, zəirat "Xəraxəri qətitə, səfiriyyə və təhti-fərqiyyə"dən ibarət idi. Xəraxəri ğətitə, vadiyi-cəhalətdə puyan olan əksəriyyəti-əhalinin dərin uyğuya dalıb xoruldamasından, xəraxəri-səfiriyyə, bürokratiya xanəndə və sazəndələrinin kef edərək çalıb-çağırmalarından, xəraxər-təhtifərqiyyədə əkinçi və əhli-kəsbü karın ah və zarı ilə ağlayıb göz yaşları tökmələrindən hasil oluyordu.

Xanım əfəndini bir az öskürtdüm. Bəlğəmindən bir miqdar alıb mikroskop deyilən xırdabin ilə müayinə etdim. Kox basillərindən bir əsər bulamadım. Deməк ki, islam sillürröyə mübtəla degil idi. Bütün bu əlamətlər bir daül-bəhrə bir zeyqi-nəfsə dəlalət ediyordi. Bu hala məmnun oldum. Çünki daül-bəhr sillürö kibi təhlükəli olmayub qabili-şəfa bir ərəzdir.

Bən. Əfəndim, köksünüzdə nə duyarsınız?

İslam. Ara-sıra uzun bir öskürək ilə boğulur kibi oluyoram. Nəfəs alamıyoram. Köksümdə bir tağım xırıltılar, ağrılar duyarım... Bilmiyoram vərəmmiyəm, nəyəm?

Bən. Xeyr, əfəndim, vərəm deyilsiniz. Düçar olduğunuz zeyqinəfəs ümumi bir xəstəliyin erazındandır ki, o ümumi xəstəlik keçərsə, öskürəyiniz və nəfəsdarlığınız da keçər.

İslam. Ümumi dediyiniz xəstəlik nə xəstəliyidir? Adı nədir?

Bən. Bunu deyə bilmək üçün əhşayi-bətniyyənizi dəxi müayinə etməliyəm...

*Ə.Hüseynzadə*
*"Füyuzat", 1907, №17, 18, 20*

[1] Tərcüməsi: "Hər nəfəs ki, içəri gedib bu həyatın davamıdır. Əgər çıxırsa, insana ləzzət verir. Deməк, hər nəfəsdə iki nemət mövcuddur və hər iki nemətə də şükr etmək vacibdir".



## MÖVLUDİ-NƏBİ

Bu sənə mövludi-Nəbi münasibətilə Bakı əhli ikinci dəfə olaraq bilafərqi-məzhəb müttəhidən bayram eliyor və ittihadın binasına müəyyən bir təməl daşı atıyor. Keçən sənəki ilk xütveyi-ittahadımız, 14 əsr əvvəl viladəti – Nəbiyə rast gələn hadisati-əziməyə müşabeh vəqaye içində vüqu buldu ki, "Həyat" bunu vəqtilə zikr etmiş idi. Burada şayani-diqqət bir şey daha varsa, o da bu illər peyğəmbərin təvəllüd etdiyi tarixi – şəmsi ayı ilə tarixi-qəməri ayının yekdigərə təvafüq etməsidir. Bu da əmri-ittihadın ibtidası üçün ayrıca bir falixeyrədd olunsa səzadır. Məlumdur ki, peyğəmbərin viladəti həm rəbiüləvvəl, həm də nisan ayının ortalarında vüqu buldu. Peyğəmbərimiz asimandan barani-rəhmətin yağdığı və dənizlərdə dürlərin təkəvvün etdiyi bir zamanda dünyaya bir dürri-yetim olaraq gəldi. Qövli-səhihə görə, fəxri-kainat həzrəti-Məhəmməd miladi-İsanın 569-cu sənəsində "hicrətdən 53 sənə əvvəl fil vəqəsi salında Nuşirəvani-adil hökumətinin qırx – ikinci sənəsində rəbiüləvvəlin on ikinci bazar ertəsi günü tülui – şəmsdən əvvəl" Məkkəyi-Mükərrəmədə təvəllüd eyləmişdir. Pədərləri nəsli-bəni-Haşimdən Abdullah ibn Əbdül-Mütəllib, validələri Aminə binti-Vəhab və süd anaları bəni-Səd qəbiləsindən Həlimə binti-Əbi Züeybdir. Peyğəmbər öz fəsahəti-lisanının əsbabını bildirmək üçün bir hədisi-şərif buyurmuşdur ki, o hədis müşarileyhin məbdə və mənşəyini dəxi göstəriyor: Buyuruyorlar ki:

"Ənə əfsəhül ərəb məbdəi-min Qüreyş və nəşəti-fi bəni-Səd bin-Bəkr"[1].

* * *

Fəxri-kainat əfəndimizin viladəti haqqında bu qədər məlumat verməklə iktifa ediyoruz. O cənabın tərcümeyi-halından, övsaf və məzayasından bəhs etmək lazım gəlsə, cildlərlə kitablar yazmaq icab edər ki, bu həm bizim həddimizin xaricində, həm də ərbabına məxsus bir vəzifədir. Biz burada mövludi-Nəbi münasibətilə bir nəbzə ittihaddan bəhs etmək istəriz: bizə öylə gəliyor ki, ittihadın mənai-

[1] Tərcüməsi: "Mən ərəblərin ən fəsihiyəm, törənişim Qürreyşdəndir və Səd ibn-Bəkr soyuqdan nəşət etmişəm"

həqiqisini anlayanlar hənuz içimizdə çox azdır. Hər kəs ittihada bir növ məna veriyor və hər kəs ittihada verilən mənadan bir növ ilə məmnun, ya dilgir oluyor.

Bizə qalırsa, ittihadı həqqilə anlamaq üçün əvvəl əmrdə 17 Oktyabr Manifesti ilə elan olunan hürriyyətlərdən "hürriyyəti-vicdan" ilə "hürriyyəti-kəlamı" layiqi-vəchlə dərk və təqdir etmək lazımdır. "Hürriyyəti-vicdan"ın mənası budur ki, hər kəs hər hansı etiqad və əfkarda, vicdanən qənaət hasil etdiyi etiqad və əfkarda bulunmaqda hürr və azaddır. Kimsənin, nə hökumətin və nə də bir fərdin, etiqad və əfkarından naşi kimsəyə təcavüz etməyə həqqi yoxdur. Hürriyyəti-kəlama gəlincə, hər kəs etiqad və əfkarını aşkar surətdə söyləyib yazmaqda muxtardır. Bu yüzdən kimsə kimsəyi cəbr və təzyiq edəməz. Bunun ən birinci faidəsi budur ki, bu hürriyyətlər sayəsində insanlar riyakarlıqdan xilas edilmiş olurlar. İndi insan istər sünni, istər şiə, istər yeni çıxma mütəvəssit məzhəb olsun, əfkar və etiqadını aşkar surətdə söyləyib nəşr etməkdə muxtardır. İttihadın mənası bu deyildir ki, şiələr öz etiqadi-batinlərini gizləyib sünni və sünnilər öz etiqadlarından əl çəkib şiə, yaxud hər iki tərəf "Əz inca mande və əz anca randə"[1] olub mütəvəssit məzhəb olsunlar, xeyr, ittihadın mənası bu deyildir. İttihadın mənası hər bir fərdin öz həmcinsləri hansı məzhəbdə olurlarsa olsunlar, cümləsinə hörmət və riayət edib cümləsini qardaş tanımaqdır və etiqadlarından, ata-babadan gördükləri, ana südü ilə əmdikləri, yaxud biləxərə hasil etdikləri etiqadlarından naşi tən və sərzəniş etməmək və hər kəsi öz məzhəbinə sülukda və öz əfkarını nəşr və təmimdə sərbəst və muxtar buraxmaqdır. İttihadın mənası ümuri-maddiyeyi-ictimaiyyədə xəlqin mənafei uyğurunda əlbirliyi ilə iş görməkdir...

* * *

İttihadın mütəvəssit bir təriq ilə hüsuluna gəlincə, burası mühal və fövqəladə müşkül bir əmrdir. Bu xüsusda tərəfindən heç biri əimmə və müctəhidinin əqvalından əl çəkəməzlər. Əl çəkiləcək bir şey varsa, o da siyasəti-hökumət ilə məzhəbləri yekdigərindən təbid edən və bilaxirə hasil olan təbəqatdır ki, bundan xilas olmağa çalışmaq lazımdır. Əqvamın vadiyi-cəhalətdə puyan olduqları zaman

[1] Tərcüməsi: "Burdan qalmış və oradan qovulmuş".



hökumətlər istədikləri kibi onları öz amali-xəfiyyələrinə xadim etmişlərdi. Bu qəbahət ələlxüsus Şah İsmayıl ilə Sultan Səlim dövrlərinə racedir. İndi cəmaətlər yavaş-yavaş ayılıyorlar, binaənəleyh hökumətlərə baziçeyi-amal olamayacaqlar. Zatən o dövrlər çoxdan keçdi. İndi hökuməti-islamiyyə dəxi nicatın daireyi-ittihadda olduğunu dərk etdilər. Bu nöqtəyi izah üçün qarelərimi bər vəchi-ati hekayə olunan vaqiədən xəbərdar etmək istiyoram.

* * *

Bu günlərdə övraqi-pərişanımı qarışdırırkən aralarında 12 sənə əqdəm, İstanbulda məktəbi-tibbiyyeyi-əsgəriyyədə təhsildə bulunmuş olan "Turani" tərəfindən o vaxtlar yazılmış bir məktub buldum ki, mündəricatı qayət mühümdür. Dostum yazır ki: "Əfəndim, ...məktəbimizdə məzhəb xüsusunda nəticəsi qayət xeyirli olan bir hadisə vüqu buldu. Bazar günü xristian yoldaşlarımız dərsdən azad olub bunların tibb dərslərində müsəlmanlardan geri qalmaması üçün nəzarətcə qərar verildi ki, müsəlman tələbə bazar günləri ancaq ülumi-diniyyə ilə məşğul olsunlar və caməə yığılıb vəz dinləsinlər. Müsəlman tələbənin kaffəsi bilafərqi-məzhəb caməə gedib elmi-ilahi və şəriət təliminə təyin olunan xacənin dərslərini istimaə məcbur oldular. Bir bazar günü xacə dörd məzhəbin: (hənəfi, şafei, maliki, hənbəli məzhəbinin) həqq olduğundan bəhs edib beşinci məzhəbi zikr etməyi unutdu. Bu səbəbdən altındakı bazar günü şiə olan tələbə: "Məzhəbimiz həqq olaraq zikr olunmuyor", – deyə müttəfiqən caməə getməkdən istinkaf etdilər. Bu isə heyəti-nəzarətin təlaşını mövcib oldusa da, yenə müsəlmanlar üçün istisna olamaz bəhanəsilə tələbənin kaffəsini məscidə getməgə məcbur etdi. Tələbə əmrə itaət eylədi. Lakin camedən çıxdıqdan sonra lazım gələn məqamata şikayətə lüzum gördü. Keyfiyyəti-məqam müəllayi-xilafətə, "Yıldız" sarayına qədər əks etdi. Məsələ də qayət asan bir surətdə həll olundu: İskəndəri-Kəbirin cahangir olmaq üçün Qordi üqdəsini bir qılınc zərbəsilə kəsib atdığı məlumdur.

İştə şövkətməab Sultan Əbdülhəmid əfəndimiz də məsələyi-İskəndəranə bir surətdə həll etdi. Müşarileyh tərəfindən xacə əfəndiyə bir təkdir gəlib beşinci olan Cəfəri məzhəbin dəxi həqq olduğunu bəyan üçün surəti-qətiyyədə mumiəleyhə əmr və fərman buyuruldu.

İştə xəlifənin bu əmrindən sonra şiə tələbə dəxi sair dindaşları ilə camee davama başladı. Xacə əfəndi isə əleyhində məqami-aliyə şikayət olunduğu üçün tələbəyə bir az dilgirlik göstərib dedi ki: "Keçənki dərslərdə beşinci məzhəbi hənuz zikr etmədigim üçün mənim və ya ələlümum sünni xacələrinin cəfəri məzhəbini guya həqq tanımadığımıza zahib olub bihudə yerə şikayət etmişsiniz. Bizim daima etiqadımız budur ki, beş məzhəb həqdir". Bu sözlərdən sonra xacə əfəndi İmam Cəfəri-Sadiq Əleyhissəlam haqqında bir təfsil məlumat verdi və dedi ki, imam-əzəm Əbu Hənifə həzrətləri o cənabın şagirdlərindən olub həlqeyi-tədris və təlimlərində bulunmuşlardı və ancaq məhəbbəti-fövqəladə ilə mərbut bulunduqları o imamın sayəsində kəsbi-füyuzi-mənəviyyə etməklə məqami-ictihada çatmışlar idi. İmami-əzəmin tutduğu təriq İmam Cəfəri-Sadiqin göstərdiyi yoldan başqa bir şey deyildir..."

İştə məqami-xilafət bulunan İstanbulda hal və keyfiyyət bu mərkəzdə olduğu halda, bizlərə ittihad üçün ayrı bir təriq aramaq əbəsdir, zənn edəriz...[1]

*Ə.H.*
*"Füyuzat", 1907, №15*

## "ƏHVALİ-ALƏM VƏ DİRİ MÜSTƏHASƏLƏR"

"Dünya haçan ki, təzələnib növbahar olur"
Qanlu yaşımla yer yüzü həp laləzar olur".

Dünyada nə qədər gurultu, patırtı, vəlvəleyi-cəngü cidal, hay-huy, inqilab və ixtilal olursa olsun, hər bir fərdin bu keşməkeşlər arasında aradığı, cüstucu etdiyi bir şey varsa, o da təbiri-ümumilə, məsud ola bilməkdir...

[1] Mövlud cəmiyyəti, mövludiyyə rəsmi-qiraəti İstanbulda və ələlümum Türkiyədə bir gunə məxsus degildir. Məsələn, dövlətin məkatibi-rəsmiyyəsindən hər biri üçün növbətilə ayrı bir cümə günü təyin olunuyor. Bu məclislərdə xanəndəgani-xoşəlhan tərəfindən oxunan mövludiyyə yeni şeylər olmayıb daima övliyayi-salifədən Süleyman dədənin mövludiyyəsidir ki:

Allah adın zikr edəlim övla,
Vacib oldur cümlə işdə hər qovla –

misrası ilə başlıyor. Mövludiyyə münasibətilə hüzzara şərbət və kağız "külah"lar içində "şəkər" (şirniyyat) paylamaq dəbdir.



Ancaq məsudiyyətin mütəəddid şəraiti vardır: Bunların birisi də sinndir diyorlar. Əcəba hansı sinndə insan daha məsuddur? İştə bir məsələ ki, haqqında bir çox üləma və üdəba zehinlərini yormuşlardır. Qədim Roma cümhuriyyətinin yetişdirdiyi ən məşhur ədib və xətiblərdən Çiçero bu xüsusda latınca bir risalə yazıb isbat ediyordu ki, insanın ən məsud zamanı sinni-şeyxuxət, yəni ixtiyarlıq, qocalıqdır. Zira bu sinndə hər növ təmayülat və hissiyyat, nəfsaniyyə zayil, hər növ həvavü həvəs atəşləri müntəfi olub insan sırf soyuq bir ağıl və məntiqin hökmünə tabe olaraq ancaq həqayiqi-elmiyyə və fənniyyədən zövqiyab olur... Fransa inqilabi-kəbirindən əqdəm gəlib, o inqilabi hazırlayanlardan biri bulunan məşhur Jan-Jak Russo bunun təmamilə əksini iddia ediyordi. Bu ədibə görə insanın ən məsud zamanı sinni-tüfuliyyət, yəni çocuqluqdur. Çünki ətfal heç bir şeydən xəbərdar olmayıb həyatın hər növ əndişə və qüyudundan azad bulunuyorlar... Rus üdəbasından müvərrix Karamzin isə bu iki fikrin heç birini bəyənməyib diyordi ki, insanın ən məsud zamanı sinni-kamal olan kühulətdir. Bizim Şərq şairlərindən çoxunun, sinni-şəbabın gəlib keçməsindən hasil olan təəssür və iştikalərinə, əz cümlə Qarabağlı Vaqifin: "Otuzdan iki-üç keçmişdi güzgüyə baxdım, gördüm yoxa çıxmış yenə xal-xal ağarıbdır" və ilax. kimi sözlərinə baxılırsa, bunların məsudiyyəti sinni-büluğ və şəbabda gördükləri anlaşılır...

Bizə qalırsa, bu fikirlərin heç biri doğru deyildir. Çünki insanları məsud və ya qeyri məsud edən sinin olmayıb, sinnin rast gəldiyi dövrdür. İnsanlar hər sinndə məsud ola bilirlər, ancaq lazımdır ki, dövr və zaman bulunduqları sinnə müsaid olsun.

Hafiz deyir ki:

"Dovure-gərdun gər do ruzi bər murade-ma nəgəşt
Daema yeksan nəbaşəd hale-dövran qəm məxor!"[1]

İnsan hansı sinndə olursa olsun hali-dövran iki, üç gün muradına təfavüq etdikcə məsud olur. Bizim bu keşməkeşli dövri-inqilabımızda ehtimal ki, çocuqlar bəxtiyardırlar. Çünki Russonun dediyi kimi, bunlar şimdiki halda hər şeydən bixəbər bulunduqları kimi iləridə də kendilərini inqilabat nəticəsi olacaq bir dövri-səadət gözləməkdədir. Saçları, saqqalları ağarmış qocalarımız da bəlkə bəxtiyardırlar.

[1] Tərcüməsi: "Dövranın gərdişi iki gün də bizim muradımızla dolanmadı. Dövranın halı həmişə eyni qalmaz, qəm yemə".

Zira ömürlərinin qismi-əzəmini inqilaba təqəddüm edən bir dövrü-sükunət və qəflətdə keçirib, şimdi də Çiçeronun iddiasına rəğmən, ağıl və məntiq hökmünə tabe olmayıb bəlkə ixtiyarlığa məxsus bir tüfuliyyəyə rücu etdiklərindən əhvali-aləmdən bixəbər kibidirlər. Bu dövrdə məsud olmayan bir sinn var isə, o da sinni-şəbab və kühulət olmaq lazım gəlir. İştə bu gün inqilabi-aləmin ən müdhiş girdablarına tutulub bütün ünfüvan şəbabətlərini, qüvaye-əqliyyələrini, elm və kamallarını mübarizati-inqilabiyyəyə həsrə məcbur olanlar, bu sinnlərdə bulunanlardır... Əgər evolyusyonist (təkamülyon) filosofların iddia etdikləri vəchlə həyatdan məqsəd mübarizə və ləzzətlərin də ən böyüyü mübarizədə isə, o halda yuxarıdakı fikrin bütlanı ilə şəbani-dövrümüzün özlərini hər ayrı bir sinndə bulunanlardan daha bəxtiyarədd etmələri icab edər...

Küreyi-ərz ibtidayi-təşəkkülündən bəri vaxt-vaxt inqilabata düçar olmuşdur. İbtida bu inqilabat tufan, bürkan, zəlzələ şəklində olaraq kürämizin təbəqatına məxsus ikən bilaxərə ədvari-tarixiyyədə təbəqati-fikriyyeyi-bəşərdə nümayan olmağa başlamışdır. Məlumdur ki, küreyi-ərzin qişri soğan zarları kibi bir-biri üzərinə vəz edilmiş təbəqat denilən qabıqlardan ibarətdir. Bu təbəqələrdən hər birinin daxilində bir çox təhəccür etmiş, yəni müruri-zəman ilə daş halına girmiş nəbatat və heyvanata təsadüf olunuyor ki, bunlara müstəhasə təbir olunur. Ancaq hər bir təbəqədəki nəbatat və heyvanat ayrı cinsdən olub, üstündəki təbəqələrdə onlara rast gəlinmiyor. Məsələn: İxtisavros ya mamut kimi heyvanlar bu qəbildən olub cinsləri üzərində yaşadığımız şimdiki təbəqədə bilkülliyyə məfquddur.

Burada şayani-diqqət bir nöqtə daha vardır ki, o da hər bir üst təbəqədəki məxluqatın altındakılardan təşəkküllati-bədəniyyəcə daha mükəmməl olmasıdır. Bu təbəqat və müstəhasat maddəsi müxtəlif surətlərdə izah olunuyor. Fransanın məşhur elmi-heyvanat müəllimi Küvye şöylə izah ediyordu:

Küreyi-ərzin qəşrində vaxt-vaxt ümumi və dəhşətli inqilablar vüqu bülub cəmi zihəyat ənqaz altında qalıyordu. Sonra bu ənqaz üzərində yeni bir xilqət nəticəsində əvvəlkindən daha mükəmməl heyvanat və nəbatat törəyirdi. Təkamülyona görə hal və keyfiyyət böylə olmayıb, təbəqati-cədidə tədricən təşəkkül etdikcə mühit və şəraiti-həyatiyyə nisbətində də əvvəlki məxluqat dərəcə-dərəcə, bətin-bətin, nəsilbənəsil təbəddülata uğrayaraq nəhayət, bugünkü şəkillərinə vasil olmuşlar. Bu iki nəzəriyyənin ikisini də bir araya



gətirmək olur: küreyi-ərz və üzərindəki məxluqat gah inqilab, gah təkamül təriqilə təbəddülata uğramışdır. Eyni əhval bəşərin əfkar və məişətində də zahirdir. Bəşəriyyət gah təkamüli-tədrici ilə, gah inqilab ilə tərəqqi ediyor. Bəşəriyyətin tarixi-cədidində iki böyük inqilab görülmüşdür ki, bunların biri dini olub xristianlıqda protestantlığın, digəri də inqilabi-siyasi olub 1789-da Fransada hüququbəşərin elanı ilə başladı.

Aləmi-islam bu iki inqilabın heç birindən mütəəssir olmuyub, hali-sabiqində davam edib durdu. Vaqiən islam məmləkətlərində ara-sıra yeni-yeni məzhəblər törədi. Lakin bu məzhəblərin törəməsi islam üçün əslən və qətən inqilab sayılamaz. Çünki inqilabi-dini, yeni məzhəb çıxarmaqda deyil, bəlkə həqayiqi-əvvəliyyeyi-diniyyəyi əqəliyyətin əlindən xilas edib ümumin, külliyyəti-əhalinin mali etməklə olur. Protestantlıq böylə yapdı. Protestantlıq yeni məzhəb degildir. Onun banilərindən biri olan Lüter nə peyğəmbərlik, nə övliyalıq və nə də müqəddəslik iddiasında bulunmadı. O zat İncili hər bir millətin anlayacağı dillərə tərcümə etdirib hər kəsi oxuyub anlamaqda hürr və azad buraxdı. Bu gün İsveç, Germaniya, Hollanda kimi protestant məmləkətlərində bir fərd yoxdur ki, İncili oxuyub anlamasın. Bu əqvamın, öz Quranlarının mənasından bixəbər qalan müsəlmanlara əxlaq və məişətcə təfəvvüqləri əsbabından biri budur... Keçəlim! Aləmi-islam Avropanın inqilabati-siyasiyyəsindən də mütəəssir olmadı. Midhət paşanın qanuni-əsasisi inqilab tərzində vücuda gəlmədi. Bu bir kiçik firqənin əfkarca məzhəri-təkamül olmasının nəticəsi idi. Zatən nə Türkiyə inqilab məmləkətidir və nə də türklərin təbiəti inqilabati-daxiliyyəyə müsaiddir. Türklər ingilislər kibi təkamül təriqi ilə tərəqqi edən bir qövmdir. İnqilabatın aləmi-islamda qədimdən bəri yuvası Asiya Fransası olan İrandır. Ancaq Fransa inqilab siyasisi əsnasında İran öylə bir dərin uyğuya dalmış idi ki, bu inqilabın vəlvələsini əsla eşitmədi belə İranı oyandıran, şimdi yanı başında Avropanın dəhşətli gurlayaraq ictimai bir rəng alan üçüncü inqilabı oluyor. İran camaatı bir-iki əsrdən bəri təkamül təriqində bir addım belə atmamış olduqlarından bu gün bəşəriyyətin ən geridə qalan bir üzvü bulunurlar. Şimdi ayılıb özlərini hər tərəfdən "qayət hail dalğalara, girdablara" məruz görüncə süləmi-təkamüli tədricən çıxmaqdan isə inqilab sıçrayişilə nicat yolu aramağa məcbur oldular. Zatən, inqilabdan başqa da çarələri yoxdur. Çünki təkamül yolunu tutmaq artıq gecdir. İran mükəmməl bir inqilaba

müvəffəq olmazsa, məhv olduğu gündür. Bunu anlamalıdır. Bu inqilab nə rəng alacaq? Yaxud almaq iqtiza edər? Avropa inqilablarının dörd-beş əsrdən bəri dərəcə-dərəcə almış olduğu rənglərin İran inqilabında cəm olması möhtəməldir. İran inqilabının həm dini, həm siyasi, həm də ictimai olması lazım gəliyor. Dini diyoruz, çünki İranda hökmfərma olan məzahibin Qurani-Məhəmmədiyi əsas tutaraq ittihadi-islama müsaid bir qəlibə girməsi icab edər. Zatən inqilabdan məqsəd nədir? Nicat yolu aramaq deyilmidir? Nicat yollarının biri də ittihadda olduğuna şübhəmi var?.. İran inqilabı siyasi bir inqilab oluyor, çünki idareyi-keyfiyyə, mütləqiyyət və əsarət yerinə qanuni-əsasi məşrutiyyət və hürriyyət qaim etməyə çalışıyor. İran inqilabı Rusiya inqilabına imtisalən bir rəngi-ictimai dəxi alıyor, çünki bu inqilab başlıca sərmayədarlar, mülkədarlar və ələlxüsus buğdanı inhisar təhtinə alıb anbarlara doldurmağı etiyad edilmiş tüccarlarla mübarizəyə girişiyor. Ancaq Rusiya inqilabı ilə İran inqilabı arasında fövqəladə mühüm və şayani-diqqət bir fərq vardır. Rusiya inqilabına bir dövri-təkamül təqəddüm edib, bu təkamül şimdi cərəyan edən hadisata dəxi hakim olduğu halda, İran inqilabı ansızın və bilatəkamül vüqua gəlməkdədir. İştə Rusiya inqilabındakı intizam və ətradın və İran inqilabında görünən tərəddüdün, nizamsızlığın başlıca səbəbi budur. Bu hal isə şübhəsiz İran inqilabı üçün bir müxatirə, bir təhlükə təşkil ediyor. Bu nöqteyi-nəzərdən hər iki məmləkətin əhvalını bilqiyas mütaliə etmək faidədən xali deyildir, zənn edəriz.

* * *

Rusiya mədəniyyəti təhlil edilirsə, bunun iki ünsürdən ibarət bulunduğu görülür. Bu mədəniyyət asiyalığın, Asiya məişətinin tədricən Avropa mədəniyyətilə imtizacından hasil oldu. Bu imtizac Böyük Petrodan və daha ziyadə Böyük Katerina zamanından başlıyor. Avropa mədəniyyəti isə Katerina dövrünə rast gələn Fransa inqilabi-kəbirindən sonra sərmayədarlıq və mülkədarlıq tərəqiyyatı rəngini alan bir mədəniyyət olub bu günə qədər davam edə bildi. İctimai bir inqilaba düçar olmayaraq davam edə bildi. Çünki qəflət və cəhalət içində puyan olan Asiya, avropalılar üçün geniş-geniş müstəmləkələr halına girdikcə Avropa sərmayədarları üçün qorxu və müxatirə məhəli qalmiyordı. Lakin şimdi Asiyanın oyanması ilə bu hala xatimə çəkiliyor.



Asiyanın oyanması Yapondan başladı. Fransa üdəbasından Emil Zola "Roma" ünvanlı əsərində mədəniyyətin Şərqdən Qərbə doğru tədricən hərəkət və intiqal etdiyini gözəl tərif ediyor. Zola deyir ki, mədəniyyət Çindən başlayıb oradan Hində, Hinddən Fərat və Dəclə vadilərinə, buradan Misri-qədimə, Misirdən Yunana, Yunandan Romaya, Romadan Avropanın sair qitələrinə, Avropadan da Amerikaya keçmişdir. Mədəniyyət bəzi istisnaat ilə böylə məmləkətdən məmləkətə keçdikcə ilərisi abad və gerisi viran olaraq tərk etdigi ölkə bir növ mədəniyyəti-müstəhasəsi şəklinə giriyor. Şimdi yenə kəmakan mədəniyyət Şərqdən Qərbə doğru hərəkətinə davam edərək, Amerikadan Yapona keçdi. Yapondan yenidən Çinə və bütün Asiyaya keçmək üzrədir. Avropayı "Sarı təhlükə" namilə Asiya mədəniyyəti təhdid ediyor. Avropanın üzərinə Şərqdən mühib bir mövc gəliyor. Rusiya-Yapon müsadiməsi bu dalğaya qarşı ilk müdafiə oldusa da, lakin əncamı böyük bir müvəffəqiyyətsizlikdən ibarət qaldı ki, bunun nəticəsində Avropanın sərmayədarlıq mədəniyyəti təməlindən sarsıldı. Avropa üçün müstəmləkə yolları bağlandı və əllərindəki müstəmləkələr də təhlükə təhtinə girdi. Bu surətlə Avropa üçün ictimai denilən üçüncü inqilabi-əzim başlıyor ki, bunun ilk meydanı da Rusiya oluyor. Bunu Avropa pək gözəl anlıyor və anladığı üçündür ki, hər an hürriyyətdən dəm vurduqları halda bu gün Rusiya hökumətinə para ilə müavinətə qeyrət edərək, camaatının meyli ziddinə gediyor. Zatən bu anda bütün əski dünya, başdan-başa Çinin Bəhri-mühiti-kəbir sahilindəki Honq-Konq adlı şəhərindən bəda ilə Portəgizin Bəhri-mühit-i Ətlası sahilindəki paytaxtına, yəni Lisbona qədər atəşi-ixtilal içində çırpınıb duruyor. Bu günlərdəki teleqraflara diqqət ediniz. Çinin, Hindin, Almaniyanın, Fransanın, İtaliyanın, Romaniyanın və ilaxir bir çox şəhərlərində iğtişaşlar, ixtilallar, əmələ tətilləri görülür ki, əksəri sosialist və demokrat hərəkatından və sərmayədarlıq mədəniyyəti ilə mübarizədən ibarətdir.

Əxirən Avstriyada məbus intixabi qanuni-amiyun üsulunda təbdil olunub, intixabati-ümumi və külli oldu. Finlandiya əyaləti-mümtazəsində şu keçən mayis ayında açılan Seym məclisi bu dəfə intixabati-ümumiyyeyi-külliyyə qaydası ilə vücuda gəlib, hətta qadınlar belə seçmək və seçilmək haqqına malik oldular. Şimdi əqvami-turaniyyədən bulunan finlərin millət məclisində yigirmiyə qədər qadın məbusəlik vəzifəsilə mükəlləfdir... İngiltərə hökuməti isə bu son zamanlarda yer məsələsində nəhayət sosializməyə meyil ilə ikinci

cəmaət üçün istimlaki-ərazi əsasını qəbul edərək bu əmr üçün məbləğ təxsisinə qərar verdi.

Əski mədəniyyət yavaş-yavaş pozulmaya, yıxılmaya və tərəfdaranı da ənqazından təşəkkül edəcək bir təbəqədə keşiş Petrovun dediyi kibi müstəhasələr halına girməyə üz tutuyor. Ancaq bu müstəhasələr hənuz canlıdırlar, diridirlər. İştə yeni peyda olan bir təbəqeyi-mədəniyyətin məxluqatı da bu canlı müstəhasələrlə mübarizəyə girişərək bunları hər növ asari-həyatdan məhrum etmək istiyorlar. Bütün inqilab ixtilalatı buradan nəşət ediyor. Bu ixtilalatın ən böyük meydanı isə əski dünyanın ortasındakı Rusiya ilə qonşusu bulunan İrandır. Ancaq Rusiyada hər iki tərəf yekdigərlərinə qarşı məqulanə və nizam dairəsində hərəkət etdikləri halda İranın inqilabçıları ilə müstəhasələrinin mübarizəsi bir "kor döyüşündən" ibarətdir. Rusiyada həm hökumətin, həm cəmaətin ilk düşündüyü şey bir kərrə vətənin səlamətidir. İranın nə cəmaəti və nə də hökuməti məmləkətin bir təhlükəyə düşmək ehtimalına zərrə qədər əhəmiyyət verdikləri yoxdur. Bəridəki inqilab bir inqilab təkamülüdür. Ötədəki isə bir inqilabi-təzəlzülidür.

* * *

Rusiya II Dövlət Dumasının mücahidatına dair "Füyuzat" bacardığı qədər məlumat verməyə çalışdı. Bu mücahidatın əsası ərazi məsələsi olduğunu "Yer, insan və həqayiqi-ictimaiyyə" sərlövhəli məqalədə bəyan etmiş idik. Mayıs ayının onunda baş vəzir Stolıpin bu məsələ xüsusunda Dumadakı firqələrin proqramı dairəsində irad nitq edən məbuslara cavab verib uzun bir layihədə yer haqqında hökumətin məramnaməsini bildirməyə və qəbul etdirməyə çalışdı. Bu məramnamə I Dumada hökumətin ərazi xüsusunda tutduğu politikaya nisbətən cüzi bir tərəqqi sayıla bilərdi. Çünki Stolıpinin bəyanatından anlaşıldığına görə hökumət bir bədəl nəqdi müqabilində olsa da bəzi şərait daxilində bir növ istimlaki-cəbri əsasını qəbul edərək və hətta istimlak məsarifinin bir qismini də öz üzərinə almağı dər öhdə etdiyini elan ediyordi. Ancaq Stolıpinin nitqi heyəti-ümumiyyəsi etibarilə dumanın təmayülatına və əksəriyyəti-ara ilə qərar verəcəyi layiheyi-qanuniyyəyə qarşı "müsaidə edəməm" sözündən ibarət oldu. I Duma ilə hökumətin başlıca ixtilafı qayət mühüm olan bu ərazi məsələsində idi. Hətta I Dumanın dağılmasının əsbabından



biri də bu idi. Bu surətlə II Dumanın da gəmisi əmvac arasında dönüb dolaşdıqdan sonra gəlib I Duma kibi eyni şablarə təsadüf etdi. Bundan sonra hökumət ilə duma arasındakı ixtilaflar getdikcə çoxalmağa başladı ki, bunların çoxu da I Dumada cərəyan edən əhvalı andırıyordı. Vaqiən, bu duma I Dumanın dağılmasına bais olan məsələlərdə ehtiyat ilə davranmağa çalışıb, bunların müzakirat həllini əlindən gəldiyi qədər təxirə salıyordı. Əfvi-ümumi maddəsi də iştə bu məsələlərdən biri idi. Məlumdur ki, amnistiya denilən əfvi-ümümi taciimperatorunun preroqativası, yəni bir imtiyazi-məxsusidir. Guya bu məsələyə müdaxilə etməyə vəzi-qəvanin vəzifəsilə mükəlləf olan Dumanın haqqı yox idi. Axirüləmr bu məsələ də mövqei-müzakirəyə qondu. Məbusanın bir qismi müzakiratın əleyhində, bir qismi də lehində bulundu. Nəhayət, məclis əksəriyyəte-ara ilə əfvi-ümumi məsələsi dumanın ümumi məclisində qabili-müzakirə olub-olmayacağı anlaşılmaq üçün maddəyi-əksəri hüquqşünasından mürəkkəb bir komissiyaya həvalə etdi. Sağ firqələrlə bərabər hökumət heç buna da razı deyil idi. I Dumada müttəfiqən ləğvinə dair hökm edilən edam cəzasına gəlincə bu məsələ şimdiyə qədər ikinci dumada müzakirə edilmədi belə. Hal və keyfiyyət böylə ikən bu son həftələr zərfində öylə vüquat zühur etdi ki, hökumət bu Dumadan dəxi ürkməyə başladı. İki ay əqdəm imperator həzrətlərinin həyatına sui-qəsd edildiyi məlum oldu. Mayıs ayının yeddisində ictima edən Duma məclisi ittifaq ara ilə bu sui-qəsdə qarşı bəyani-nifrət və protesto elədi. Ancaq bu protest əsnasında məclisin sol tərəf əzaları məclisdə bulunmadılar: Bunlar miyanında bir kaç keşiş dəxi var idi. Bilaxərə bu keşişlərə protest zamanı nə üçün məclisdə bulunmadıqları sual edildi. Bunlar cavab verdilər ki, o əsnada Dumada, ələlxüsus sollar arasında şüyu buldu ki, sui-qəsd maddəsi irticapəsənd olan sağ firqələrin provokasiya niyyətilə ixtira etdikləri bir şeydir. Zatən şimdiyə qədər bu sui-qəsdin mahiyyəti anlaşılamadı. Buna cürət edənlər anarxistlərdən ziyadə irticapəsəndlərin qara dəstələri olması möhtəməldir. Bu münasibətlə Sarskoye Seloda "ittifaqi-əsgəri" əzasından yigirmiyə qədər adam tövqif olunub, bunların içində əsgərlər də var idi... Digər tərəfdən hökumət və polis məmurları günün birində ansırın "təcavüzatdan məsun" ədd olunan Dövlət Dumasındakı bütün sosial-demokrat fraksiyasının məclis müzakiratına daxil olub sabahlara qədər təhriyyat icrasilə bir neçə zatı tövqif etdi... Hər nə hal isə protest əsnasında məbusandan bir çoxunun məclisdə bulunmaması Dumanı ehtimal

hökumətin nəzərindən bir az düşürdü. Çox keçmədən bir neçə maddə bu halı daha ziyadə təşdid elədi. Hökumət tərəfindən tənzim və təklif olunan bir neçə qanun layihələrini Duma rədd etdi. Əfalicinaiyyənin mətbuatda mədh və sənası əleyhindəki qanun layihəsi böylə rədd olunanlar qəbilindəndir. Lakin hökuməti ən ziyada Duma haqqında şübhə və vəsvəsəyə ilqa edən atidəki məvaddır.

Məlumdur ki, bir müddətdən bəri Dumanın sağ firqələri tələb ediyordılar ki, Duma, Rusiya ölkəsinin hər tərəfində hökmfərma olan terrora, yəni tədhiş və ixafə niyyətilə edilən əfala qarşı bəyani-nifrət edib bunları zəm və təqbih etsin. Duma isə bu xüsusda əsla əcələ göstərmiyordi. Nəhayət, mayısın 16-da Duma 146 rəyə qarşı 215 rəyin əksəriyyətilə qərar verdi ki, "terrorun zəm və təqbihinə dair olan təklifi mütaliə və müzakirə etmək maddəsi Duma vəzaifinin xaricindədir. Bu surətlə Duma məzkur məsələ haqqında bir növ bitərəfliyi iltizam edib bəyani-əfkardan istinkaf etdisə də, şübhəsizdir ki, Dumanın bu hərəkəti nə sağlara və nə də hökumətə xoş gəlmədi... Zatən ötədən bəri iki bir-birinə təmamilə zidd olan firqə II Dövlət Dumasının dağıdılmasını istiyorlardı. Bunlardan birisi başçıları Pruşkeviçlər, Kruşevanlar, Bobrinskilər olan monarxistlərdir. Bunlar keçən ay Moskvada ictima edib orada şəşəəli mövkiblərlə qüvvətlərini aləmə göstərmək istədilər. Lakin nəticə məmullarının xilafına çıxdı. Aləm bunların qayət qüvvətsiz və zəif bulunduqlarını anladı. Bunların ümid etdikləri yüz minlərcə cəmaət yerinə mövkiblərinə beş-altı mindən ziyadə iştirak edən adam bulunmadı. Bununla bərabər Dövlət Dumasının dağıdılması üçün bunlar orada əllərindən gəldiyi qədər bağırıb çağırdılar. Dumanın dağılmasını arzu edən digər firqə isə sosial-demokratlardır. Hökumət monarxistləri himayə etdigi halda bunların Rusiyada ictimaına razı olmadığından bunlar da məmaliki əcnəbiyyədə diyarbədiyar dolaşıb, nəhayət, ingilis hürriyyətindən bilistifadə London şəhərində ictima edə bildilər. Bu ictimaə Dövlət Dumasının sosial-demokrat əzaları iştirak etdiyi kimi məclislərinə İtaliyadan məşhur rus ədibi Qorki dəxi gəlmiş idi. Bunları rus hökuməti xəfiyyələri fövqəladə bir diqqətlə təqib və təcəssüs etməklə bərabər müzakiratlarının nədən ibarət bulunduğu iycə anlaşılamadı. Lakin bunlar da ayrı bir nöqteyi-nəzərdən şimdiki Dumanın davamını istəmirdilər. Hətta Peterburq şəhərinin Dumadakı vəkili Aleksinskinin şu Londra ictimaında "Böylə bir Duma bizə lazım deyildir" dediyi məlumdur. Bu kibi əhval göstərirdi ki, əqsayi-eser



firqələri kadetlərə rəğmən Dumanın bəqa və davamı uğrunda hərəkati-mötədilanədə bulunmayıb təriqi-ifratpərvəranəyə sapacaqlar. Lakin ən ziyadə "böylə Duma lazım deyildir" – deyib qeylü qal çıxaranlar sağlar idi. Axirüləmr bu Dumanın hökumətə də lazım olmadığı anlaşılaraq II Duma, iyunun üçündə südur edən iradeyi-imperatori ilə yeni intixabata qədər tətil olundu.

* * *

İran haqqında, İran inqilabatı haqqında da bir fikir edinmək istər idik. İran inqilabı bir inqilabi-təzəlzüldür dedik. Bu təzəlzülün nəticəsi isə İranın bu an bir xaos, bir həyula halına girməsidir. Məlum, ya həyula hər bir şəkili-müəyyəndən mübərradır. Şəkli olmayan bir maddeyi tövsif və tərifin nə qədər müşkül olduğunu təsəvvür buyurunuz. Nə qanuni-əsasidə bir şəkili-müəyyən var, nə intizami-daxilidən məhrum olan məclisi-millinin mücahidatından bir nəticə və nə də ruhsuz, odsuz olan "Məclis" qəzetəsində yazılan şeylərdən bir məna çıxarmaq oluyor. İkidə, birdə şəhərlərdə ixtilallar, gurultular, patırtılar, tətillər oluyor, dükan-bazar bağlanıyor. Xalq postaxanalara, teleqraf başlarına qoşuyor, səbirsizliklə Tehrandan bir xəbər gözliyor. Sonra bir teleqraf gəliyor ki, şah "qanuni-əsasi"yi imzaladı. Anlamıyoruz ki, bu qanuni-əsasi kaç dəfə daha imzalanacaqdır! Hökumət bir gün məşrutə, bir gün məşruə oluyor, daha sonra nə məşrutə və nə də məşruə oluyor. İran həyulayi-ixtilaliyyəsi içində xəyal-məyal seçilən bir şey varsa, o da köhnə təbəqənin ənqazi-təzəlzülü altında qalmaqdan qorxan müstəhasələrin çapalayıb durması, yəni hənuz canlı, zihəyat bulunmasıdır. Bu müstəhasələrin ən irisi şimdiki sədr-əzəm Atabəgi-Əzəm Mirzə Ələsgər xandır. Bu müstahaseyi-istibdad Paris muzexanalarını təzyin etmək lazım gəlirkən İran torpağına nəql olundu. İranın bütün asari-ətiqəsi şimdiyə qədər heç bahasına gəmilər dolusu ilə Firəngistana nəql olunurkən, şimdi İran ayılıb asari-ətiqəsini, müstəhasələrini artıq Avropaya vermək istəmədiyindən Atabəyin öz muzexanalarında bulunmasına lüzum gördü. Məhəmmədəli şah məiyyətilə düşündü, daşındı, ətrafında guya adam qəhətliyindən naşi Atabəy əzəmi nəzdinə cəlbə məcbur oldu. Nə qədər ki, Atabəy İran torpağına əyaq basmamışdı, İranda təcəddüdat və islahati-nizami dairəsində yavaş-yavaş gurultusuzca, qansızca yolunda davam ediyordi. Lakin bu müstəhaseyi-

əzimə İrana daxil olur olmaz, hər tərəfdə ixtilal atəşləri alovlanıb bu atəşlərin hərarəti ilə sair müstəhasat da yenidən canlanıb rollar oynamağa başladılar... İran gəmilərindən daima və rus gəmilərindən də keçən ay tətil nəticəsində müvəqqətən məhrum olan Kaspi dənizinin üzərində günün birində "Baryatinski" adlı bir vaporun hərəkət etdiyi göründü. Bu vapor Petrovsk şəhərindən İrana qayət mühüm bir müstəhasə nəql ediyordı. Eyni zamanda Bakıda bir müstəhasə muzesi bina etmək istəyən İran mücahidləri səhvən Mirzə Abbas xanı Baryatinsk gəmisində səyahət edən müstəhasəyə bənzədərək bu zatı yaraladılar... Lakin ötədə Baryatinski gəmisi kəmali-əmniyyətlə Ənzəliyə vasil oldu. Ənzəli camaəti isə müstəhasənin hənuz canlı olmasından təvəhhüş edərək gəmiyi tüfənglə, xəncər-bıçaqla qarşılayıb iskələyə yanaşmağa müsaidə etmədilər... Sonra işə Məclisi-milli müdaxilə elədi. Məclis Ənzəli camaətinə dedi ki, İran paytaxtin böylə bir müstəhasə ilə zinətlənməsi əlzəmdir. Ənzəlilər məclis əzasına etimad edib ona yol verdilər...

Bir müddətdən sonra eşitdik ki, Atabəy Əzəm yenidən Məhəmmədəli şah tərəfindən sədr-Əzəm nəsb olundu və yeni bir kisvə ilə məclisi-milliyə gəlib məbusanə dedi ki, mən artıq mamut müstəhasəsi degiləm, şimdi fil oldum. Xortum və dişlərimə diqqət ediniz. Bunlar istibdad dövrünə aid şəkildən çıxıb hürriyyət təbəqəsinə məxsus bir hala girmişdir. Mən də hürriyyət və məşrutiyyət dövrü məxluqatından oldum... Artıq mamut kibi vəhşilik etməyib fil kibi yük daşıyacağam. Məclis də buna inandı.

Nəticədə, İran müstəhasələri hər tərəfdə canlandılar, canlandılar *da, camaətin başına bəla kəsildilər... Hər tərəfdən bir vaveyladır* qopuyor, hər tərəfdə bir vəhşətdir hökmfərma oluyor. İsfahan, ağayi-Nəcəfilərin, Şiraz Qəvamülmülklərin, Axund Hacı ağa Möhsünlərin, Azərbaycan əkinçiləri Hacı Məhəmməd Tağıların Təbriz xalqı şahın imarətində guya həbs olunan Qaradağlı Rəhim xan və oğlu övnəsinin, Ənzəli Ərfəüssəltənələrin, Zəncan Əsədüddövlələrin, Xorasan Asəfüddövlələrin zülm və istibdadından bizardırlar.

Rəştə, Qəzvinə varıncaya qədər bütün İran şəhərləri şuriş və ixtilal içindədir. Səbr və təhəmmülü qalmayan camaət çox yerlərdə vəhşətamiz hərəkata məcbur oluyor. Təbrizdən qovulan müctəhid Mirzə Həsən yaxayı ucuz qurtardı. Əxirən Hacı Qasım Ərdəbili adlı xəsis bir tacir yenə köhnə üsul ilə buğdanı anbarlara həbs edib zəxairin bahalanmasına çalışmaq istiyordi. Kəndisinə bu xüsusda bəzi ixtiratda bulunan əncümən əzasını təhqir etdiyindən xanənin pəncərəsindən eşiyə atılıb nəşi təhəvvürə gələn camaət tərəfindən parça-parça edildi.

Lakin İran ölkəsinə açılan yaraların ən təhlükəlisi Girmanşah ilə, İrəvan sərhədinə yaxın Maku xanlığından gəliyor. Lurustan hakimi olan şahın bəradəri Salarüddövlə həm İrana, həm İranın qanuni-əsasisinə, həm mənsub bulunduğu xanədani-qacariyə xəyanətdə bulunaraq, elani-üsyan edib başına 20000 qədər əşqiya cəmilə bütün o tərəfləri bir hərb meydanına çevirmişdir. Bu son teleqraflara görə guya Tehrandan göndərilən əsakir hökumətə qarşı müqavimət edəmiyərək ricət ediyormiş... Maku xanlığına gəlincə İran hökumətinin burada şimdiyə qədər heç bir tədbir ittixaz edəməməsi ciddən şayani-təəssüfdür. Bilinmiyor ki, Səniüssəltənələr, Səddüddövlələr, Təbatəbailər, bu xüsusda nə düşünüyorlar. Halbuki, burada məsum olan biçarə camaətin qanları sel kibi axıyor. Arvad-uşaq vətəndən dərbədər düşüb min məsaib içində hüdudu keçərək, rus torpağına iltica ediyorlar. Şu Maku xanlığı müsibətlərində, şu hövlnak faciələrdə İqbalüssəltənələr, İzzətüllah xanlar, Əliəkbərxan Əkrəmüddövlələr, Pənah xanlar bir taqım şübhəli rollar oynayorlar. Bunların ən ədəbsizi, ən xunxarı isə keçənlərdə Makudan tərd olunan Murtuzaquluxandır. Bu hərif gəlib 40 günə qədər İrəvanda qaldıqdan sonra başına min qərib kürd topladı və bunlarla yenidən Makuya övdət edib Makuyi mühasirə etdi. Nəticədə əhaliyə edilməyən zülm və sitəm qalmamışdır. Aldığımız xəbərlərə görə əhalidən və hürriyyət mücahidlərindən beş yüzə qədər adam qırılmışdır ki, bunların içində millət mücahidi məşhur Həbibbəy Asinli də şəhid olmuşdur.

Bütün bu əhvaldan İran müstəhasələrinin hənuz canlı bulunaraq İran ölkəsini anarxiya təriqilə məhv və inqiraz uçurumlarına sürüklədikləri anlaşılıyor... Lakin eyni zamanda da hər tərəfdən bir "Ya sahibüzzəman!" fəryadıdır qopuyor.

***Ə.H.***

*"Füyuzat", 1907, №19*

